
500
SUAL-CAVAB
ƏSRİN İMAMI MEHDİ
SAHİBƏZ-ZAMANLA (Ə)
TANIŞLIQ
ƏLİƏSĞƏR RİZVANİ

# ƏSRİN İMAMI MEHDİ SAHİBƏZ–ZAMANLA (Ə) TANIŞLIQ


:Müəllif

Əli Əsğər Rizvani



:Çap nəşriyyat

Şəhriyar

:Digital nəşriyyat

İsfəhan Qaimiyyə adına komputer araşdırmalar mərkəzi

# Mündəricat

# ƏSRİN İMAMI MEHDİ SAHİBƏZ–ZAMANLA (Ə) TANIŞLIQ

## Kitab haqqında

(Kitabın adı:....Əsrin İmamı Mehdi Sahibəz–zamanla (ə

(tanışlıq (Məhdəviyyətlə bağli şübhələrə cavab

Müəllif:.........Əli Əsğər Rizvani

Tərcümə edən:..................................Məhəmməd Əhməd

Nəşr edən:...................Şəhriyar

Çap tarixi:..........................۲۰۰۶

Çap növbəsi:..................Birinci

Tiraj:.................................۲۰۰۰

səh:۱

## Ön söz

İslamın, xüsusi ilə də Əhli-beyt məktəbinin fundamental mövzularından biri “Məhdəviyyət” məsələsidir. İslamın əzəmət və İslam hökmlərinin əbədilik nişanəsi olan bu mövzu bütün dinlərdə təsbit olunmuşdur və qurtuluş məsələsi dini amallar sırasında dinlərin prinsipial məsələlərindən biri kimi öz yerini tutmuşdur. Qeyri-ilahi .ideologiyalarda və firqələrdə də hansısa formada bu mövzu ilə rastlaşmaq olur

Həzrət Məhdinin (ə) zühuru ilə müşayiət olunan böyük vəd mövzusu bəşər tarixi boyu köklü mövzulardan olmuşdur. Belə ki, müqəddəs, dini kitablar, eləcə də, İslamdan öncəki və sonrakı əsərlər bu mövzunun həqiqiliyinə şəhadət vermişlər. Əgər tarix boyu bu mövzu ilə bağlı şübhələr ortaya çıxmışsa, bu özü də uyğun mövzunun müxtəlif cəmiyyətlərdə aktuallığını göstərir. Bütün dinlər və ideoloji məktəblər uyğun mövzu ilə bağlı araşdırmalar aparmışlar. Amma bu məsələyə hərə bir tərəfdən yanaşmış və mövzu hərtərəfli araşdırılmamışdır. Bununla belə, bütün tərəflər süquta uğramış cəmiyyəti paklığa çağıracaq, elm və mərifət, ədalət və ehsan ruhunu bəşəriyyətə qaytaracaq bir şəxsin zühuruna şəhadət vermişlər. Hamı inanır ki, bir gün həqiqət bütünlüklə aşkarlanacaq, vəd olunmuş zühur işığında xalq ədalətə və Allahla yaxınlığa .nail olacaq, yer və zaman tarazlıq və səbata çatacaq

İslam alimləri tükənməz vəhy çeşməsindən və məsumların ölməz kəlamlarından faydalanaraq böyük vədin (həzrət Mehdinin (ə) zühurunun), onun xüsusiyyətlərinin və görüşünün təsvirini vermiş, nəql, tarix və əqlə istinad edərək Məhdəviyyət maarifini formalaşdırmışlar. Tarix boyu uyğun mövzu ilə bağlı suallar cavablandırılmışdır. İndi də müxtəlif kitablar, risalələr və məqalələr vasitəsilə ilə İslam ümmətinə yetərli məlumatlar verilir. Əlinizdəki kitabın tərtibinin də konkret səbəbləri vardır. Bu :səbəbləri nəzərdən keçirək

Tarix boyu Məhdəviyyət mövzusu ilə bağlı suallar və şübhələr olmuş, İslam alimləri .١ müxtəlif formalarda onları cavablandırmışlar. Amma uyğun suallara, adətən, nəqli və tarixi cavablar verilmişdir. Bu istiqamətdə yetərincə hədis və tarixi kitablar tərtib olunmuşdur. Hədis kitablarından Şeyx Tusinin “Əl-ğeybət”, Şeyx Səduqun “Kəmalud-din”, Seyyid Sədrəddin Sədrin “Əl-Məhdi (ə)”, Mühəddis Nurinin “Nəcmus-saqib” kitablarını misal göstərmək olar. Tarixi kitablar arasında Seyyid Məhəmməd Sədrin .“Məvsulətul-imamul-Məhdi (ə)” kitabı diqqəti cəlb edir

Əsrimizdə uyğun mövzu ilə bağlı yaranmış suallar, adətən, fəlsəfi xarakterli olur. Bu .٢ sayaq sualları öncə əqli dəlillərə, sonra tarixi və nəqli məlumatlara əsaslanaraq cavablandırmaq olar. Bu gün Məhdəviyyət mövzusunun yetərincə şəffaf açıqlanması .üçün əqli, fəlsəfi, kəlami cəhətləri nəzərə almaq zəruridir

Əlbəttə ki, əqli və kəlami baxımdan verilən cavablar uyğun boşluğu müəyyən həddə .۳ doldurmuşdur. Amma bu kitablar da dövrümüzün ehtiyaclarını tam şəkildə ödəmir. Məhdəviyyət məsələsini əqli yönümdən açıqlayan müəlliflərdən biri böyük mütəffəkir Şəhid Seyyid Məhəmməd Baqir Sədr olmuşdur. Onun "Bəhsun-həvləl-Məhdi (ə)" .kitabında uyğun mövzu ilə bağlı əsaslı araşdırmalar aparılmışdır

Şübhəsiz ki, İslam düşmənləri öz ideoloji hücumlarında zəif nöqtələri hədəfə alırlar. .۴ Onlar Məhdəviyyətə hücumda da zəif nöqtələri aşkar edib hay-küy salırlar, bu mövzuya ən kövrək nöqtələrdən zərbə vurmağa çalışırlar. İslam inqilabından sonra düşmən müqəddəs ayinlərimizə, xüsusi ilə Məhdəviyyət mövzusuna daha amansız hücuma keçdiyindən alimlər və qələm əhli bu dini bünövrəni möhkəmləndirmək üçün həmişəkindən daha çox çalışmışlar. Onlar düşmənin fəlsəfi yönümlü iradlarına əqli və .kəlami bəhslərlə sərt cavab vermişlər

Əlinizdəki kitab da bu prinsip üzərində formalaşmışdır və onda Məhdəviyyət mövzusu nəqli, əqli və tarixi dəlillərə əsasən araşdırılmışdır. Kitabda səy göstərilmişdir ki, .düşmənin məhz zəif nöqtələrə yönəlmiş şübhələri aradan qaldırılsın

Hazırkı kitabın səciyyəvi xüsusiyyəti onun öz araşdırmalarında kəlami, fəlsəfi dəlillərə əsaslanmasıdır. Cəhd göstərilmişdir ki, uyğun mövzu müxtəlif, xüsusi ilə əqli dəlillər əsasında şəffaf şəkildə təqdim olunsun. Məqsəd Məhdəviyyət mövzusu il bağlı bütün şübhələri aradan qaldırmaqdır. Ümumi oxucu kütləsinin hazırkı kitabdan faydalana bilməsi üçün mövzular sual-cavab şəklində tərtib olunmuşdur. Belə bir forma Məhdəviyyət məsələsi ilə bağlı suallara cavab axtaranlar üçün yetərli mənbə ola bilər. Ümid edirik ki, bu işimiz İmam-Zamanın (ə) diqqətini cəlb etsin, həqiqət axtaranlar üçün faydalı olsun. Bütün elm adamlarından nöqsanlarımızın bağışlanmasını diləyir və onların kitabın nöqsanları ilə bağlı qeydlərini bizə çatdırmalarını xahiş edirik. Sonda bu işdə yardım göstərənlərə, xüsusi ilə həzrət höccətül-İslam-vəl-müslimin Hüseyn Əhmədiyə təşəkkürümüzü bildiririk. Müqəddəs Cəmkəran məscidinin yayım üzrə məsulu olan bu şəxs müxtəlif mərhələlərdə müəllifə yaxından kömək göstərdi. Kitabın ".ərsəyə gəlməsində zəhmət çəkən bütün insanlara Allah-təaladan mükafat diləyirəm

,Əli Əsğər Rizvani Kaşani. Hicri ۱۴۲۵-ci il

## Şəkk–şübhə

?Sual: ١. Etiqadi məsələlərə münasibətdə şəkk-şübhə yaranması düzgündürmü

Cavab: Öncə belə düşünmək olar ki, dində şəkk pis işdir və qəlbin qaralmağını göstərir. Çünki məqsəd insanın yəqinə, əminliyə çatmasıdır. İman yəqinliklə müşayiət olunmalıdır. Amma şəkk-şübhə insanın iman və yəqinliyə çatmasına kömək göstərsə, onu yaxşı saymaq olar. İman insanın əldə etməli olduğu bir həqiqətdir. Amma o, öncədən mövcud olmur. İnsan şəkk etməsə, yəqinə çatmaz. Quran insanı yəqinə çatdırmaq üçün onun genetik etiqadını şübhə altına alır. Ona görə də Quranda belə buyurulur: "Ata-babaları nadan və ağılsız olduqları halda, onlar ata-babalarına tabe (olmalıdırlarmı?"(١

Şəhid Mütəhhəri buyurur: "Cəmiyyətdə bu sayaq şəkk-şübhələrin olmaması təhlükəlidir. Şəkk-şübhə olmadıqda insanların dini durumunda daşlaşma, bəlkə də, çürümə gedir. Hovuzda uzun müddət saxlanılan saf su qoxuduğu kimi, dini durum da hərəkətsizlikdən tənəzzülə uğrayır. Xalqın dini durumu aram, hərəkətsiz vəziyyətdə qaldıqda, şəkk-şübhə qamçısı yemədikdə onların etiqadına avamlar rəhbərlik edir. (Avam qabağa getdikdə isə daim özündən bir şey quraşdırır..."(٢

Amma bəzi şəklər bir növ xəstəlikdir. Məsələn, namaz, dəstəmaz və digər ibadətlərdə, paklıq məsələlərində çox şəkk, vəsvəsə. Bu qəbildən olan şəkk-şübhələr xəstəlik .kimidir. Çox şəkk etmək bir növ xəstəlikdir

?Sual: ٢. Allah həqiqəti axtaran insanı həqiqətə çatdıracağına zamin durmuşdurmu

Cavab: İnsanlar öz həyatlarında, adətən, şəkk-şübhə baxımından böhran keçirirlər. Məhz bu məqamda insan həssas bir hala düşür. Xüsusi ilə, ətraf mühitdəki düşüncələr, bəzən də müxtəlif təbliğatlar onun qarşısını kəsir. Əgər insan, doğrudan da, həqiqəti axtarırsa Allah ona yol göstərəcək. Allah-təala buyurur: "Bizim yolumuzda cihad və (təlaş edənləri, şübhəsiz, öz yollarımıza hidayət edəcəyik."(٣



---

.Bəqərə", ١٧٠" [١]-١

Amma bu o demək deyil ki, alimlərin heç bir vəzifəsi yoxdur. Əslində onların çiynində ağır məsuliyyət var və alimlər ağıla gələn şəkk-şübhələri mümkün yollarla aradan .qaldırmalı, hamıdan öncə gənc nəsli əminliyə çatdırmalıdırlar

?Sual: ۳. Şəkk-şübhələr qarşısında vəzifəmiz nədir

Cavab: Bəzilərinin fikrincə, insan istənilən bir yaşda istənilən bir məlumatı qeyd-şərtsiz dinləyə bilər. Onlar belə bir ayəyə istinad edirlər: "Bəndələrimə müjdə ver; o kəslər ki, sözü dinləyər və onun ən gözəlinə tabe olarlar."(۱) Hansı ki, bu şərif ayə gözəl sözü seçməyi bacaran alimlər və nəzər sahibləri haqqındadır. Adi bir insan istənilən bir yaşda, səthi məlumatla yaxşını pisdən seçə bilməz. Digər bir ayədə buyurulur: "Onlar (Allahın hidayət etdiyi və düşüncə sahibi olan kəslərdir."(۲

Bu səbəbdən də etiqadını mötəbər mənbələrlə möhkənməndirməmiş, şübhələrə cavab vermək gücü olmayan insan bu meydana qədəm qoymamalıdır. İnsan dövrü tanımalı, bu günü və gələcəyi üçün proqram hazırlamalıdır. Bir yerdə oturub, yalnız sarsıdıcı şübhələr və zəhərli təbliğatlarla üzləşdikdə çarə ardınca qaçmaq düzgün deyil. Xəstəliyin qarşısını almaq üçün uşaq peyvənd edildiyi kimi, biz də şübhələri qabaqlayaraq, onlara cavab tapmalıyıq ki, müxaliflərlə üzləşdiyimiz vaxt özümüzü .itirməyib yetərli cavab verə bilək

(İmam Sadiq (ə) buyurmuşdur: "Dövrü tanıyan kəsə şübhələr hücum çəkməyəcək."(۳

Həzrət Əli (ə) buyurmuşdur: "Öz dövrünü tanıyan insan hazırlığı yaddan (çıxarmayacaq."(۴



---

.Zümər", ۱۷, ۱۸" [۴] -۱

.Zümər", ۱۸" [۵] -۲

.Kafi", c.۱, s. ۲۷; "Tohəful-uqul", s. ۳۵۶; "Bihar", c. ۷۵, s. ۲۶۸" [۶] -۳

Kafi", c.۸, s. ۲۳; "Əmali", s. ۴۰۰; "Tovhid", s. ۷۴; "Tohəful-uqul", s. ۹۸; "Bihar", c. ۷۴, s. " [۷] -۴ .۲۸۷

## Məhdəviyyət mövzusunun təsirləri

?Sual: ۴. Dövrümüzdə Məhdəviyyət mövzusunun hansı təsir və faydaları var

Cavab: Bəziləri elə düşünürlər ki, Məhdəviyyət mövzusunun araşdırılması hazırkı dövr üçün faydasızdır. Onlar elə güman edirlər ki, hər dövrün öz aktual mövzuları var, Məhdəviyyət mövzusu isə gələcəyə aiddir və biz bugünkü vəzifələrimizə əməl (etməliyik...(۱

Məhdəviyyət mövzusunun bu günümüz üçün bir sıra faydaları var və həmin :faydalardan bəzilərini nəzərdən keçiririk

Həzrət Mehdinin (ə) qiyamı mövzusu böyük bir ictimai və İslami fəlsəfəyə malikdir. .۱ Bu mövzu ilhamverici ideya olmaqdan əlavə İslam ideallarının tanınmasında çox (münasib bir vasitədir.(۲

Bütün yer üzünü əhatə edəcək İslam hökumətinin qurulması vədi müxtəlif təsirlərə .۲ malikdir. Onlardan bəziləri fəlsəfi və dünyəvi, bəziləri islami, bəziləri mədəni və tərbiyəvi, bəziləri siyasi, bəziləri iqtisadi, bəziləri ictimai, bəziləri insani, bəziləri isə təbiidir.(۳) İnsan həzrət Mehdinin (ə) əhatəli proqramlarından faydalanmaqla İslamın .gerçək ideallarına yaxınlaşa bilər

Yer üzündə tarix boyu müxtəlif mədəni, siyasi, ictimai inqilablar baş vermişdir. Bu .۳ inqilabların əksəri ya ilk addımda məğlubiyyətə uğramış, ya da müxtəlif problemlərlə üzləşərək düşmənlərin öhdəsindən gəlməmişdir. Yalnız şiə məzhəbinin Məhdəviyyət mövzusuna baxışı cəmiyyətdə optimist ruhiyyə yaradır və xalqı ümidsizlikdən qurtarır. Şiə əqidəsinə əsasən, dövrün imamı həzrət Mehdi (ə) diridir, hazırdır və əməllərimizi görür. Həssas məqamlarda ondan kömək alınır. Psixologiya baxımından belə bir inanc .şiələrin ruhiyyəsində dərin iz qoyur

Əsrin imamının nə vaxt hökumət quracağı müəyyən olunmadığından bu zühur hər .۴ an gözlənilir. Buna görə də, Məhdəviyyət mövzusunu gündəmdə saxlamaq, zühur .xüsusiyyətlərini və həmin dövrdəki vəzifələrimizi öyrənmək zəruridir

Zühur dövründə ümumdünya tövhid hökumətinə nail olmaq üçün müəyyən şərtlər .۵

var. Bu şərtlərdən bəzisi bəşəriyyət tərəfindən



---

۱- [۸] “Əl-Məhdiyyul-muntəzər”, s. ۲۱۴.

۲- [۹] “Tarixi fəlsəfə baxımından Mehdi (ə) inqilabı”, Şəhid Mutəhhəri, s. ۵۷.

۳- [۱۰] Həmin mənbə.

həyata keçməlidir. Bəşəriyyətin hərcəhətli təkamülü, ali düşüncə səviyyəsinə çatması bu şərtlərdəndir. Zühur dövrünün amallarından xəbərdar olmalıyıq ki, onun .yaxınlaşmasını istəyib həzrətin zühuru üçün zəmin yaradaq

Məhdəviyyət mövzusu yalnız gələcəklə bağlı problemlərə aid mövzu deyil. Bu mövzu .۶ həmişəlik imamət mövzusudur. Allahın dəlilləri batil olmasın deyə, istər hazırda, istər .qeybdə məsum imamın mövcudluğu zəruridir

İslam peyğəmbərindən (s) nəql olunmuş rəvayətlərdə oxuyuruq: "Hər kəs öz (dövrünün rəhbərini tanımadan ölsə, cahiliyyət dövründə ölmüş kimidir."(۱

Məhdəviyyət mövzusunda qeyb, qeyb fəlsəfəsi, qeybin təsirləri və bərəkəti, qeyb .dövründə imamın mövcudluğu məsələlərindən danışılır

.Beləcə, Məhdəviyyət mövzusu qeyb əsrində şiələrin vəzifələrindəndir

**Ümumdünya ədalət hökumətinin fəlsəfəsi**

?Sual: ۵. Ümumdünya ədalət hökumətinin zəruriliyi fitrət yolu ilə necə sübuta yetir

Cavab: Bəşəriyyətin xilaskarının zühururuna inam bütün insanlarda mövcuddur. Belə bir düşüncə əsl insani xarakterdən qaynaqlanır. Çünki bəşəriyyət fitrətən əhatəli kamilliyə çatmaq istəyindədir. O bilir ki, belə bir kamal yalnız tövhidi ədalət .hökumətinin sayəsində gerçəkləşə bilər

Şəhid Sədr buyurur: "Mehdiyə etiqad təkcə dini çalarlı İslami bir inanc deyil. Bu inanc müxtəlif dinlərdən, firqələrdən olan insanların arzu-istəklərinə cavab verir. Bu inam xalqın fitri ilhamının təcəllasıdır. İnsanlar aralarındakı əqidə və məzhəb ixtilaflarına baxmayaraq inanırlar ki, yer üzündə vəd olunmuş gün çatacaq və səmavi risalətlərin ((missiyaların) son məqsədi həyata keçəcək..."(۲

:Dəlillər fitrəti müxtəlif bəyanlarla məlumatlandıra bilər

Birinci bəyan: a) İnsan öz daxilində ümumdünya tövhidi ədalət hökumətinə ehtiyac duyur; b) Bu hökumət mövcud olmalıdır. Bu həqiqətə olan meyl təyindirsə, şübhəsiz ki, təyin olunan da olmalıdır; v) Bu həqiqətin kamil nümunəsi həzrət Mehdinin (ə)

.Nəticə: Ümumdünya ədalət hökuməti zərurətdir

İkinci bəyan: a) İnsan dünyanın bugünkü vəziyyətindən məyus olub üstün bir hökumət .ümidi ilə yaşayır; b) Belə bir ümid uyğun hədəfin gerçəkləşməsi üçün dəlildir

.Nəticə: Ümumdünya ədalət hökuməti zərurətdir

Üçüncü bəyan: a) İnsan fitrətən zülmə nifrət edir; b) İnsan nifrət etdiyi şeyin .məhvindən şadlanır; v) Bəşər təklikdə bu işin öhdəsindən gələ bilməz

.Nəticə: Proqram və işində zülmdən əsər-əlamət olmayan hökumətin bərpası zəruridir

?Sual: ۶. Ədalət istəyi fitrətdəndirmi

Cavab: Nəzər sahibləri arasında belə bir suala cavab axtarılır ki, şəxsi mənafelərdən ?uzaq ədalət istəyi fitri olaraq insanın daxilində mövcuddurmu

İslamın nəzərincə, insanın daxilində ədalət istəyi mövcuddur. Hətta mənafelər təmin olunmasa da, bu istək yerində qalır. Əgər insan düzgün tərbiyə olunsa, o, özü ədalət sorağında olar. Bu müddəanın sübutu üçün varlığını ədalət yolunda qurban vermiş insanları göstərmək olar. Ədalət onların şəxsi mənafelərinə zidd olduqda belə, uyğun .yoldan çəkinməmişlər

Əksinə, əksər qərb filosofları belə düşünürlər ki, insanın batinində belə bir istək yoxdur. Elə bu fikirlə də dünyanı müharibə alovuna qərq etmişlər. Onlar bildirirlər ki, ədalət zəif kişilərin uydurmasıdır. Guya zəif kişilər güclü kişilərlə baş-başa gəldikdə çarəsiz qaldıqlarından ədalət sözünü ortaya atıb canlarını qurtarmaq istəyirlər. Onlar öz fikirlərinə belə bir dəlil göstərirlər ki, hətta ədalət tərəfdarı olan şəxs qüdrət əldə .etsə, o da başqaları kimi hərəkət edəcək

Məşhur alman filosofu Nitsşe yazır: “Çox olub ki, zəiflərin haqq-ədalətdən dəm vurduğunu görüb gülmüşəm. Baxıb görürəm ki, onlar yalnız pəncələri olmadığı üçün ədalətdən danışırlar. Deyirəm: Ey çarəsiz! Əgər sənin pəncən olsaydı, heç vaxt belə ”.sözlər danışmazdın

Bu zümrə özü də iki hissəyə ayrılır: Onların bir dəstəsi deyir ki, ədalət bir arzu olaraq

soraqlanmamalı, insan güc-qüvvə axtarışında olmalıdır. Digər bir qrup isə belə düşünür ki, yalnız fərdi mənafeni qorumaq xatirinə ədalətə üz tutmaq lazımdır. Guya .ədalət fitri istək deyil. Bertrand Rassel bu zümrəyə məxsus alimlərdəndir

Amma bütün bu sözləri bir kənara qoyub fitrətimizə müraciət etsək, görərik ki, ədalət .bəşər fitrətindən doğan mövzulardandır

:Ədalət istəyinin fitri olmasını bir neçə yolla sübut etmək olar

Batinə diqqət və psixoloji durumların araşdırılması; Çünki fitri meyllər insanın .١ .ruhundan qaynaqlanır, ruha aid olan hadisədir

Psixoloji fəaliyyətlər və bu fəaliyyətlərlə bağlı rəftarların araşdırılması ilə məşğul .٢ .olan psixoloqların mülahizələrinə müraciət etməklə

Sual: ٧. Ümumdünya ədalət hökumətinin zəruriliyini fəlsəfi dəlillərlə sübut etmək ?olarmı

Cavab: İslam fəlsəfəsi təbiət aləmində "qəsre-daim" və "qəsre-əksəri" müddəalarını .mümkünsüz sayır

Qəsre-daim" dedikdə varlıq aləmindəki həqiqətlərdən birinin öz ömür dönəmində" hansısa təbii xüsusiyyətdən məhrum olması başa düşülür. Məsələn, od yansın, amma onun heç bir istiliyi olmasın. Başqa bir misal: yaşadığımız dünyada elə bir güc olsun ki, yaranışdan bu günədək odun istiliyinin qarşısını alsın. İslam bütün bunları mahal, .mümkünsüz sayır. Belə bir hadisənin mümkünsüzlüyü fəlsəfədə sübuta yetirilmişdir

Qəsre-əksəri" dedikdə isə təbiətin öz ömrünün əksər dövründə zati səciyyələrdən" məhrumluğu nəzərdə tutulur. Fəlsəfədə bu da mümkünsüz sayılmışdır. Varlıq aləmində qanun şəkli almış bu fəlsəfi baxışdan məlum olur ki, zülm-sitəm daimi deyil .və bəşər tarixində onun ədalətlə əvəz olunacağı bir gün var

Bu fəlsəfi baxışa əsasən, bəşəriyyətə ömür boyu zülm edilməsi mümkünsüzdür. Demək, bəşəriyyət üçün xoş gün gələsidir. Şübhəsiz, elə bir gün gələcək ki, bəşəriyyət vəhşilərin əsarətindən qurtulacaq və ətrafındakıların mehr-məhəbbət kölgəsində .ömür sürəcək

Sual: ٨. Ümumdünya ədalət hökumətinin zəruriliyini təkamül yolu ilə necə sübut etmək ?olar

Cavab: İnsan kamala çatmaq istedadı və xüsusiyyəti olan rüşeyim kimidir. Ondakı daxili istedadların çiçəklənməsi üçün xarici amillərə ehtiyac var. İnsanın təkamülü hərtərəfli olduğundan zaman ötdükcə onun təbiət və cəmiətə bağlılıqları azalır, iman və əqidəyə bağlılığı güclənir. Bu yolu, tədricən adlayan insan gələcəkdə mənəvi .azadlığa çatır, yəni əqidə və imana sıx bağlanır

Bu baxışa əsasən, daxili ziddiyyət insanın xüsusiyyətidir. Onun maddi və mənəvi meylləri arasında qarşıdurma var. İnsanın daxilindəki çəkişmə istər-istəməz cəmiyyətdə qruplar arasındakı çəkişməyə çevrilir. Bir cəbhədə kamil insan, digər bir !cəbhədə qeyri-yetkin insan

Nəticə: Bəşərin qeybi bir qüvvəyə, ilahi rəhbərə ehtiyacı var. Bəşəriyyət belə bir rəhbərin yardımı ilə yer üzündə ədaləti, tövhidi, kamilliyi genişləndirib, müxalif .qüvvələri aradan götürə bilər

Sual: ٩. Ümumdünya ədalət hökumətinin zəruriliyini əqli dəlillərlə sübuta yetirmək ?olarmı

Cavab: Ayə və rəvayətlərə əsasən, insan əbəs yaradılmamışdır. Onun yaranışında xüsusi bir məqsəd izlənilmişdir. Bu məqsəd insanın kamilliyə çatması, yəni ilahi görüşə .nail olmasıdır. Belə bir məqam isə hərtərəfli yəqinlik və bəndəliklə əldə olunur

Kəlam elmində sübuta yetirilmişdir ki, Allahın lütfü bir zərurətdir. Lütf prinsipinə əsasən, Allah-təala yaranış məqsədindən yayındıran işləri aradan götürməli, ali məqsədə doğru yol açmalıdır. Keçmiş tarixə müraciət etməklə öyrənirik ki, belə bir məqsəd bütün bəşər cəmiyyətləri üçün külli şəkildə gerçəkləşməmişdir. Nəticə alırıq ki, yaranış məqsədini gerçəkləşdirmək üçün Allah zəmin yaratmalıdır. Bu zəmin isə bütün yer üzünü bürüyəcək ədalət hökumətinin təşkilidir. Həmin hökumət ali məqsədə .çatmaqda bəşəriyyətə yardım göstərəsidir

Sual: ١٠. Ümumdünya ədalət hökumətinin zəruriliyini tarixi hadisələrə istinad etməklə ?sübuta yetirmək olarmı

Cavab: Keçmiş və müasir tarixə müraciət etdikdə məlum olur ki, bəşəriyyət tarix boyu müxtəlif zülm-sitəmlərə, qətl-qarətlərə düçar olmuşdur. Xüsusi ilə də müvəhhid (təkallahçı) insanlar həqiqətin müdafiəsində suçlanaraq müxtəlif şəkillərdə .incidilmişlər

Qurani-Kərim «Uxdud əshabı» haqqında söz açır. Bildirilir ki, müxaliflər böyük bir xəndək qazıb onda yetərincə əzəmətli bir tonqal qaladılar. Onların məqsədi möminləri

(və müvəhhidləri diri-diri bu odda yandırmaq idi.(١)



---

.bax: “Büruc”, ١-٨ [١٣] -١

Tarixdə oxuyuruq ki, Misir fironu yalnız yuxusuna əsaslanaraq neçə böyük cinayətlərə əl atdı. Yuxusundan əndişələnən bu kəs öz vücudunu qorumaq üçün misilsiz cinayətlər .törətdi

Tarixin digər bir səhifəsində Həccac ibn Yusif Səqəfi haqqında danışılır. O, İraqda ٢٠ (illik hakimiyyəti dövründə dəhşətli cinayətlər törətdi.(١

ci dünya müharibəsində günahsız insanlar amansızlığa düçar oldu. Rəsmi-١ statistikaya görə bu müharibədə öldürülənlərin sayı ٢٢ milyona çatmışdır. Çox keçməmiş ikinci dünya müharibəsi başladı. Bu müharibə ٧٠ milyon insanın həyatına .son qoydu

Əlcəzairin işğalı zamanı fransalılar ٢ milyondan artıq müsəlmanı qətlə yetirdilər. Vyetnam müharibəsində yüz minlərlə günahsız insan amerikalılar tərəfindən .öldürüldü

Ötən ٥٠ ildə İsrail qəsbkarlarının çəkmələri altında yüz minlərlə fələstinli öldürüldü, .yaralandı və ev-eşiyindən didərgin düşdü

Bəşəriyyətin gələcəyini, müxtəlif millətlər arasındakı düşmənçilikləri bir qədər araşdırsaq, bəşəriyyəti necə böyük bir təhlükə gözlədiyinə şahid olarıq. Bu gün bir çox ölkələr bir-birlərini məhv etmək üçün kütləvi qırğın silahları hazırlayır. Bu silahlar yer kürəsini bir neçə dəfə məhv etmək üçün bəsdir. Samuyel Hantiqton kimi Amerika ideoloqlarının hazırladığı mədəniyyətlərin savaşı proqramı Amerika siyasətçiləri üçün başlıca plan olmuşdur. Bütün bunları nəzərə aldıqda bəşəriyyət hansı gələcəyə ümid ?edə bilər? Uyğun problemlərin həll yolu nədir

Görəsən bəşəriyyət öz gücü ilə bütün dünyanı səadətə çatdıracaq proqram hazırlayıb onu həyata keçirə bilərmi? Şübhəsiz, bu mümkünsüzdür. Çünki bu vaxtadək həmin iş görülməmişdir. Bundan sonra da insan Allah-təalanın göstərişləri, qeybi məlumatlar olmadan bir şey bacarmayacaq. Nəzərdə tutulan xoşbəxtliyə çatmaq üçün Allah tərəfindən qeybi bir xilaskarın gəlişi, bəşəriyyəti mövcud bəlalardan xilas etməsi .(zəruridir. Bu şəxs zühuru vəd olunmuş həzrət Mehdidir (ə

?Sual: ۱۱. Bəşəriyyətin qeybi yardımlara ehtiyacı varmı

Cavab: Bəziləri elə düşünürlər ki, bu gün elmi-texniki tərəqqiyə nail olmuş bəşəriyyətin .qeybi yardımlara ehtiyacı yoxdur

səh:۱۲

---

.Mürucuz-Zəhəb”, c. ۳, s. ۱۶۶, ۱۶۷“ [۱۴] -۱

Amma bilməliyik ki, bəşəriyyətin büdrəmələrinin mənşəyi təkcə nadanlıq deyil. Əgər problemləri doğuran təkcə nadanlıq olsaydı, elm və texnika köməyə gəlib bəşəriyyəti xilas edə bilərdi. Amma mövcud çətinliklərin məlumatsızlıqdan əlavə də amilləri var. Zaman ötdükcə problemlərin artımı uyğun yardımlara ehtiyacdan danışır. Bəşəriyyətə problem yaradan digər amilləri nəzərdən keçirək: cilovlanmamış nəfs istəkləri , şəhvət və qəzəb, tamahkarlıq, vəzifəpərəstlik, komfort istəyi, bir sözlə, bugünkü bəşəriyyəti yolundan azdıran mənafepərəstlik! Bu gün elm bəşəriyyətin ən böyük düşməninə çevrilmişdir. Elm öz-özlüyündə işıq olsa da, bu işıqdan hansı yolda istifadə olunması mühümdür. Elm hədəfi müəyyənləşdirmir. O, məqsədə çatmaq üçün, sadəcə, bir .vasitədir

Vil Dorant deyir: "Biz texnika baxımından güclənmiş, məqsəd baxımından yoxsullaşmışıq."(۱) Elm və texnologiya dövrünün insanı şəhvət və qəzəb baxımından qədim insanlardan fərqlənmir. Elm nəfs azğınlıqlarının qarşısını ala bilməmişdir. Elmi inkişaf faşizmin mahiyyətini dəyişə bilməmiş, əksinə, primitiv qılıncdan atom .bombasına çevrilərək çirkin məqsədlərin həyata keçməsi üçün vasitə olmuşdur

Rassel deyir: "Hazırkı dövr elə bir dövrdür ki, heyrət hissi zəifliklə birlikdə hamını bürümüşdür. Elə bir savaşa doğru hərəkətdəyik ki, təqribən, kimsə onu istəmir. Elə bir (savaş ki, bəşər növünün böyük bir hissəsini yoxluq aləminə göndərəcək..."(۲

İnsan maddi və zahiri amillər əsasında mühakimə aparsa, bu bədbinliklərə haqq qazandırar. Bu bədbinlikləri aradan qaldırmaq üçün isə qeybi yardımlara iman zəruridir. Belə bir inam bədbinliyi nikbinliklə əvəz edir və insan inanır ki, bəşəriyyətin .səadəti, rifah və kamilliyi, əmin-amanlığı gələcəkdədir və bəşəriyyətin yolunu gözləyir

Bəli, ilahi məktəbdə tərbiyə almış şəxs belə deyir: Ola bilməz ki, dünya bir neçə dəlinin əli ilə viran qoyulsun. Dünya təhlükə qarşısındadırsa da, Allah keçmişdə möcüzə göstərib bəşəriyyətə yardım etdiyi kimi indiki şəraitdə də ağılları heyran qoyacaq iş ...görməklə öz xilaskarını göndərəcək



---

."Fəlsəfənin ləzzətləri" [۱۵]-۱

Şəhid Mütəhhəri buyurur: “Bu düşüncə hər şeydən öncə təbiət aləmindəki gedişata, tarixi təkamülə, gələcəyə inamdan, bəşəriyyətin xoş gələcəyinə nikbinlikdən (doğur...”(١)

?Sual: ١٢. Nə üçün peyğəmbərlərin dövründə ümumdünya ədalət hökuməti qurulmayıb

Cavab: Bu sual başqa şəkildə də verilə bilər: nə üçün ümumdünya ədalət hökuməti bəşər tarixinin sonunda gerçəkləşəcək? Görən bu iş təsadüfidir, yoxsa nəyəsə əsaslanır? Deyə bilərik ki, fərdin təkamülü və nəticədə ədalətli hökumətin qurulması :üçün iki əsas amil gerçəkləşməlidir

Xarici amil: Cəmiyyətin hər bir üzvü yaranış məqsədi olan ədalət və kamalın .١ mənasını anlamalıdır. Eləcə də, bu məqsədə aparan yol tapılmalıdır. Nə qədər ki, bəşər düşüncəsi bu həqiqətləri anlamır, düzgün məqsədə çatmaq üçün peyğəmbərlərə .möhtacdır

Daxili amil: Bu böyük məsuliyyət və hədəfi dərk edəcək düşüncə. Belə bir məqsədə .٢ çatmaq üçün insan vücudunda şüur yetkinləşməlidir. Şüurun yetkinləşməsi üçün isə :növbəti şərtlər ödənməlidir

a) Ağıl, Allaha itaətin, Allaha münasibətdə xüzu və xüşunun (mütiliyin) əhəmiyyətini ;dərk etməlidir

.v) İnsan ədalət və onun təsirlərini bilməlidir

:Bu daxili amil bir neçə yolla ödənə bilər

.Uyğun iman və ixlas cəmiyyətdəki fərdlərdə möcüzə şəklində yaranmalıdır (١

Belə bir ehtimal möcüzə qanunu ilə uyğun gəlmir. Çünki möcüzənin əhatəsi məhduddur. Hansı ki, məqsədə çatmaq üçün möcüzədən başqa digər yollar var. Uyğun tələb insan tərəfindən azad, ixtiyari şəkildə ödənməlidir. İnsanın kamilliyi onun .ixtiyari şəkildə gördüyü işdən asılıdır. Möcüzə isə deyilənlərə ziddir

Bəşəriyyət heç bir məcburiyyət olmadan ali düşüncəyə çatmalıdır ki, Allahın ( ٢ .rəhbərliyi altında uyğun ali məqsədi həyata keçirə bilsin

Bəşəriyyətin mövcud xüsusiyyətlərini araşdırdıqdan sonra belə bir nəticəyə gəlirik ki, hələ ki insan nəzərdə tutulan kamil məqsədi



---

.Mehdi (ə) inqilabı”, s. ۵, ۷“ [۱۷] -۱

dərk edəcək düşüncəyə çatmamışdır. Çünki o yarandığı gündən kamil ədalətin tətbiqi üçün zəruri olan iki şərtə malik deyil: Kamil formada ədaləti tanımaq; həqiqəti .tanıdıqdan sonra onun həyata keçirilməsi üçün fədakarlıq hazırlığı

Hətta bəşəriyyət kamil ədaləti tanısa da, hələ ki, bu məqsədə çatmaq üçün praktiki hazırlığa malik deyil. Çünki ən üstün dövrlərdən olan peyğəmbər dövründə də İslam .yolunda fədakarlıq məsələsində səhabələrlə problemlər olmuşdur

Allah-təala səhabələrdən bəzilərinə etirazla buyurmuşdur: "Ey iman gətirənlər! Nə !?üçün sizə "Allah yolunda cihada doğru hərəkət edin" deyildikdə ağırlaşırsınız

Yoxsa axirət əvəzinə dünya həyatı ilə razılaşmısınız?! Hansı ki, dünya həyatı matahı (axirətlə müqayisədə cüzidir."(١

Belə bir nəticəyə gəlirik ki, hələ ki, bəşəriyyət ümumdünyəvi bir hökumətin təşkilinə .hazır deyil və xilaskarın zühuru üçün şərait yaranmamışdır

Seyyid Rza Sədr deyir: "Bir gün gələcək ki, bəşəriyyət güclü və agah rəhbərliyin hakimiyyəti altında yaşamaq qabiliyyəti əldə edəcək. Belə bir qabiliyyət onun təkamülündən ibarətdir. Kamilləşməmiş bəşəriyyətin ədalətli hakimiyyət altında yaşamaq ləyaqəti yoxdur. Əslində belə bir toplum ədalətli hakimiyyəti qəbul etmir. Uyğun hakimiyyətin zorla qəbul etdirilməsi yetərsizdir. Zülm-sitəm ədalət üçün nərdivan ola bilməz. Zülmlə qurulan hakimiyyət ədalətli deyil. Onun yalnız adı ədalətli ola bilər. Naqis bəşəriyyət ədalətli hakimiyyəti qəbul etmir. O, belə bir hakimiyyətdən uzaq olmaq istəyir. Həzrət Əli (ə) buyurmuşdur: "Bu xalq məndən yorulub, mən isə bu xalqdan". Sonra həzrət ədalətdən qaçan xalqa nifrin edərək buyurmuşdur: "Pərvərdigara, məni onlardan al." Ədalətli hakimiyyət xalqın razılığı ilə qurulmalıdır. Xalq belə bir hakimiyyətin sorağınca gəzməlidir. Ədalətli hakimiyyət istəyən insanlarda heyvani sifətlər insani sifətlərin kölgəsində qalır."(٢) Rəvayətlərdə isə digər bir nöqtəyə işarə olunmuşdur. İmam Baqir (ə) buyurur: "Bizim dövlət və hakimiyyətimiz sonuncu dövlət və hakimiyyətdir. Hakimiyyət heç bir ailə üçün əbədi deyil. Yalnız bizdən öncə hakimiyyətə çatıb onu başa çatdıranlar istisnadır. Əgər hakimiyyətdə bizim yolumuzu müşahidə etsələr, deməsinlər ki, əgər biz də hakimiyyətə çatsaydıq, bu sayaq

rəhbərlik edərdik. Allah-təalanın “Aqibət pəhrizkarlar üçündür” buyuruğuna işarə (olunur.”(١

?Sual: ١٣. Bu dünyada ədalətli hökumətin qurulmasına hansı zərurət var

Cavab: Bəziləri ümumdünya ədalət hökumətinin zəruriliyinə inandıqdan sonra deyirlər: “Əgər axirət aləmində ədalət əhatəli şəkildə bərpa olunacaqsa, bu dünyada belə bir ”?hökumətin təşkilinə nə ehtiyac var

:Bu irada cavab olaraq belə deyə bilərik

İbadət və Allahla görüşə yetişmək yaranış hədəfi sayılmışsa, demək, belə bir .١ .hökumət dünya həyatı başa çatmamış yer üzündə gerçəkləşməlidir

Bəşəriyyətin belə bir hökumətə fitri meyli var. Buna görə də uyğun hakimiyyət .٢ .dünya həyatında qurulmalıdır

Qəsre-daim” və “qəsre-əksəri” (daimi və əhatəli zülm) mümkünsüz olduğundan“ .٣ insan təbiət aləmində özü üçün zülm-sitəmin olmadığı, əhatəli və ədalətli bir .hakimiyyət görməlidir

Təkamül insan üçün axirət aləmində yox, bu dünyada qiymətlidir. İnsan fitrətən .۴ kamillik sorağında olduğundan kamilliyə hərəkət üçün şərait olmalıdır. Həzrət .Mehdinin (ə) zühuru dövründə belə bir şərait yaranacaqdır

?Sual: ١۴. Elm, ağıl və təcrübə olan yerdə imama nə ehtiyac var

Cavab: Bəziləri düşünürlər ki, elm və texnika əsrində rəhbərə ehtiyac yoxdur. Onların nəzərincə, bəşəriyyət günbəgün müstəqilləşir və kamilləşir, onun qeybi yardımlara ...ehtiyacı azalır, ağıl və elm tədricən boşluqları doldurur

Əslində isə elm və texnika əsrində bəşəriyyət üçün daha böyük təhlükələr yaradır. Əsas təhlükə tamahkarlıq, məqampərəstlik, bir sözlə, nəfsə itaətdən doğur. Məgər elm və texnikanın inkişafı insanlardakı təqva, haqpərəstlik, iffət meyllərini təmin edə .bilirmi? Əslində iş tamam başqa cürdür

Bugünkü elm bəşəriyyətin ən böyük düşməninə çevrilmişdir. Nə üçün belə olub? Belə cavab vermək olar ki, elm həqiqətən də, çıraq, işıqdır. Əsas məsələ odur ki, bəşəriyyət bu çıraqdan hansı yolda istifadə edir. Öz məqsədinə çatmaq üçün elm və texnikadan yararlanan



---

.Əl-ğeybət", s. ۴۷۲; "Bihar", c. ۵۲, s. ۳۳۲" [۲۰] -۱

bəşəriyyətin məqsədi nədir? Əgər bəşəriyyət yanlış bir yol tutarsa, bu çıraq ona nə dərəcədə faydalı ola bilər? Elm insana doğru yol göstərməkdə acizdir. Bu dinin işidir. .Elm insan və onun meyllərindən savay hər şeyə hakim ola bilir

Vil Dorant texnika əsrinin insanı haqqında deyir: “Biz texnika baxımından güclənmiş, məqsəd baxımından yoxsullaşmışıq.”(۱) Elm və texnika əsrinin insanı öz qəzəb və şəhvət baxımından qədim insanlardan fərqlənmir. Elm insanı azğın nəfs istəklərindən !xilas edə bilməmişdir

## Ümumdünyəvi olmaq

?Sual: ۱۵. Ümumdünyəvi olmaq nə deməkdir

Cavab: Belə görünür ki, ümumdünyəvilik haqqında nə qədər izah verilsə də, indiyədək aydın və yığcam bir tərif yoxdur. Əlbəttə ki, bunun səbəbləri var. Əvvəla, bu həqiqət hələ ki təkamül həddinə çatmamışdır. İkincisi, tərif verənlərin hər biri onun müəyyən .cəhətini önə çəkir

:Bununla belə, bəzi tərifləri nəzərdən keçiririk

Bəziləri ümumdünyəviliyi ictimai bir hadisə sayırlar. Bu baxışa əsasən ictimai və . ۱ .mədəni əlaqələrə kölgə salan coğrafi məhdudiyyətlər aradan götürülür

Bir başqaları ümumdünyəviliyi bütün yer üzündə ictimai rabitələrin dərinləşməsi kimi .۲ təqdim edir. Bildirilir ki, coğrafi baxımdan bir-birindən uzaq məkanlar arasında möhkəm bağlılıq yaranır. Hər bir məhəldəki ittifaqlar kilometrlərlə uzaqda baş vermiş .hadisəyə qoşulur

Müasirimiz olan məşhur sosioloq Harvey ümumdünyəviliyi zaman və məkan kimi iki .۳ məhdudiyyət məfhumunun daşıyıcısı kimi təqdim edir. Ümumdünyəvilik məsafələri .qısaldan anlayış kimi tanıtdırılır

?Sual: ۱۶. Ümumdünyəviliyin tarixi kökləri hansı dövrdən rişələnmişdir

Cavab: Ümumdünyəviliyin tarixi köklərini bəşər tarixinin başlanğıcına aid etmək olar. Sosioloqların və arxeoloqların nəzərinə əsasən, bəşər həyatı məhdud ailə həyatından,

meşə və mağaralardakı həyatdan başlamışdır. Həmin həyat tədricən tayfa və qəbilələrin su



---

۱- [۲۱] "Fəlsəfənin ləzzətləri".

hövzələrin kənarındakı həyatı ilə əvəz olunmuşdur. Daha sonra kəndlər və kiçik məntəqələr formalaşmış, növbəti mərhələdə şəhərlər təşkil olunmuşdur. Tədricən şəhərlərdə ölkələr və dövlətlər yaranmışdır. Göründüyü kimi bəşərin həyatı ümumdünyəviliyə doğru hərəkətdədir. Yəni zaman keçdikcə təfriqələr azalır, toplumlar artır. Bu hərəkət son əsrlərdə daha da sürətlənmişdir. Bu hərəkət müasir .rabitə sistemləri sayəsində ümumdünyəviliyə doğru sürətlənməkdədir

?Sual: ١٧. Qəriblərin ümumdünyəviliyə ("qloballaşma") can atmaqda məqsədi nədir

Cavab: Belə görünür ki, üç mühüm, eyni zamanda fərqli hadisə ilə üzbəüz gəlmişik. Ya :səhvən, ya da biganəlikdən hər üç hadisə ümumdünyəviləşmə adlandırılmışdır

;Ümumdünyəviləşmənin təbii və tədrici gedişatı .١

;("Qərbin apardığı ümumdünyəviləşmə ("qloballaşma .٢

.Amerikanın apardığı ümumdünyəviləşmə .٣

Ümumdünyəviləşmə tədrici, təbii inkişaf yolu keçməklə hazırkı əsrdə yüksək elmi-texniki nailiyyətlərə nail olsa da, dünyanın hegemon qüvvələri tərəfindən müdaxilələrə məruz qalır. Bu proses bəzən dünya iqtisadiyyatında və siyasətində öz mənafeyini güdən qüvvələrə xidmət edir. Onlar bu prosesi qloballaşma adlandırırlar. Bir sözlə, qərbin inkişaf etmiş sənayeçiləri qloballaşmanı, yəni ümumdünyəviləşməni öz mənafeləri üçün istifadə edirlər. Təbii ki, bu müdaxilələr uyğun prosesi təbii .məcrasından çıxarır

Xüsusi ilə də, Amerikanın apardığı qloballaşma prosesi əslində ümumdünyəviləşmə yox, amerikalaşmadır. Onların məqsədi bütün yer üzünü Amerikaya tabe etməkdir. Əslində belə bir proses təbii ümumdünyəviləşmə ilə daban-dabana ziddir. Demək, təbii ümumdünyəviləşmə ilə Qərb və Amerikanın qloballaşması arasında qaçılmaz fərqlər mövcuddur. İqtisadiyyatın qloballaşdırılması böyük yatırımlar, hegemonçu hökmranlıq, qeyri-bərabər paylaşma ilə müşayiət olunur. Bu proyekt bütün dünyaya .dünya kapitalizminin, qeyd-şərtsiz rəqabət hökmranlığının böyük qələbəsidir

Hərbi, siyasi, hətta iqtisadi sahədə Amerikanın qloballaşma proyekti, şübhəsiz ki, onun

siyasətlərinə, strateji mənafelərinə xidmət edir. Başqa sözlə, Amerikanın irəli sürdüyü .qloballaşma proyektinin amerikalaşma adlandırsaq, daha düzgün olar

səh:۱۸

?Sual: ١٨. Ümumdünyəviləşmənin hansı mənfi cəhətləri var

Cavab: Ümumdünyəviləşmə tədrici, təbii bir təkamül yolu keçib müasir dövrdə elmi-texniki tərəqqi ilə müşayiət olunan inkişaf mərhələsinə çatsa da, onun bir sıra mənfi :təsirləri də var. Bu təsirlərdən bəzilərini nəzərdən keçirək

Beynəlmiləl səviyyədə vahid və nüfuzlu rəhbərliyin olmaması, rəqabət və . ١ ;düşmənçiliyin güclənməsi

Fəsadın, açıq-saçıqlığın, fahişəliyin, qərbin pozğun mədəniyyətinin yayılması və . ٢ ;ümumbəşəri əxlaqi və mənəvi dəyərlərinin aradan götürülməsi

;Bəzi ölkələrdə iqtisadi tarazlığın pozulması .٣

İstehsal proseslərinin avtomatlaşdırılması və mexanikləşdirilməsi ilə əlaqədar . ۴ ;işsizliyin artımı

Narkotik maddə qaçaqçılığı, insan alveri kimi cinayətləri, eləcə də, SPİD kimi . ۵ ;xəstəliklərin bütün dünyaya yayılması

Qərb mədəniyyətinin digər mədəniyyətlərə hakim olub, dünya səviyyəsində . ۶ .yayılması

?Sual: ١٩. Dini mənbələrdə ümumdünyəviləşmə mövzusuna toxunulurmu

Cavab: Qurani-Kərimdə və İslam rəvayətlərində ümumdünyəviləşmə və ümumdünyəviləşdirmə mövzularına toxunulmuşdur. Amma İslam dinində uyğun iki anlayış fərqi məna və məfhuma malikdir. Ümumdünyəviləşmə öz təbii məcrasından .çıxmazsa, İslamın irəli sürdüyü ümumdünyəvi hökumət üçün zəmin yarada bilər

:İndi bu mövzu ilə bağlı bəzi ayə və rəvayətləri nəzərdən keçirək

Biz Tövratdan sonra Davudun Zəburunda da yazdıq ki, mənim saleh bəndələrim" .١ (hökmən yer üzünə varis olacaqlar."(١

Allah sizlərdən iman gətirib yaxşı işlər görənlərə vəd edir ki, onları hökmən yer" .٢

üzünə hakim edəcək. Necə ki, əvvəlkilərə yer üzünün xilafətini bağışladı. Onlar üçün bəyəndiyi din və ayin bərqərar edəcək, qorxularını əmin-amanlığa çevirəcək..."(٢)

٣. "O (Allah) bir kəsdir ki, Öz rəsulunu müşriklərin xoşu gəlməsə də dinlərə qalib etmək üçün hidayət və haqq dinlə göndərdi."(٣)



---

١- [٢٢] "Ənbiya", ١٠٥.

٢- [٢٣] "Nur", ٥٥.

٣- [٢٤] "Səff", ٩.

Nəql olunur ki, həzrət Əli (ə) bu ayəni tilavət etdiyi vaxt öz yaxınlarından soruşdu: “Bu qələbə hasil olubmu?” Dedilər: “Bəli.” Həzrət buyurdu: “Xeyr, and olsun canım əlində olan kəsə, yer üzündə heç bir abadlığın qalmayacağı sübh və axşam “la ilahə illəllah” sədasının eşidiləcəyi zaman bu qələbə aşkar olar.(١) İmam Baqir (ə) buyurmuşdur: “Həqiqətən, bu qələbə Məhəmməd (s) ailəsindən olan Mehdi (ə) qiyamı zamanı gerçəkləşəcək. Həmin vaxt yer üzündə həzrət Məhəmmədin (s) risalətini qəbul ”.etməmiş bir kəs də qalmayacaq

Sual: ٢٠. İslamın təqdim etdiyi ümumdünyəvilik və ümumdünyəviləşmə prinsiplərinin ?hansı imtiyazları var

Cavab: Qeyd olunduğu kimi, İslamda uyğun mövzulara fərqli yanaşma mövcuddur. Ümumdünyəvilik və ümumdünyəviləşmə İslamda fərqli xüsusiyyətlərə malikdir. Bu :xüsusiyyətlərdən bəzilərini nəzərdən keçirək

Vahid ümumdünyəvi İslam hökuməti saleh, üstün dini şəxsiyyətə malik, məsum .١ insanların rəhbərliyi ilə idarə olunur. Həmin cəmiyyətdə Allah qanunu hakimdir. Qərbin .təqdim etdiyi ümumdünyəvi hökumətə isə hegemon qüvvələr rəhbərlik edəsidir

İslam baxışına əsasən, cəmiyyətdəki bütün işlərin mehvəri Allah və Onun .٢ .göstərişləridir. Qərbin ümumdünyəvi hökuməti isə bəşəri qanunlarla idarə olunur

İmam Mehdinin (ə) ümumdünyəvi hökuməti əxlaq, cəmiyyət, əmin-amanlıq .٣ prinsipləri üzərində qurulmuşdur. Qərbin ümumdünyəvi hökumətində isə mənəviyyata .heç bir yer ayrılmır

İmam Mehdinin (ə) ümumdünyəvi hökumətinin xüsusiyyətlərindən biri elmi .٤ tərəqqidir. Qərbin qloballaşmasında isə mütərəqqi texnologiyalar yalnız supergüclərin .inhisarındadır. Onlar digər ölkələrin daim onlardan asılı olmasında maraqlıdırlar

Həzrət Mehdinin (ə) ümumdünyəvi hökuməti həyatı və dini təlimlərə əsaslanan .٥ hökumətdir. Hansı ki, qərb qloballaşması nəzərdə tutulmuş və ya gözlənilməyən siyasi, iqtisadi, texnoloji tərəqqinin nəticəsidir və istismarçı hegemonlarla sıx .rabitədədir

۶. Həzrət Mehdinin (ə) ümumdünyəvi vahid hökuməti canişinlik prinsipinə əsaslanır, Allah tərəfindən təsdiqlənir və haqq tərəfindən



---

۱- [۲۵] "Məcməul-bəyan".

qəbul olunur. Qloballaşma isə yalnız bəşər istəyinə əsaslanır, eyni zamanda siyasi və .iqtisadi fırıldaqçılıqla müşayiət olunur

Həzrət Mehdinin (ə) ümumdünyəvi hökuməti ağılın hakimiyyətidir. Qloballaşma isə .٧ .nəfs istəklərinin üzərində qurulmuşdur. Zühur dövründə insanların ağılı kamala çatır

İmam Baqir (ə) buyurmuşdur: “Bizim Qaim (həzrət Mehdi) qiyam etdiyi vaxt əlini xalqın ”.başına qoyar, onların ağlını kamilləşdirib, düşüncələrini inkişaf etdirər

Həzrət Mehdinin (ə) ümumdünyəvi hökumətində bəşəriyyətin bilik və ağılı tərəqqi .٨ etdiyindən təbiətin bütün iqtisadi imkanları açılar, xalqın əlində geniş sərmayələr yaranar. Eləcə də, düzgün bölgü aparırlar...(١) Hansı ki, dünyaya hakim olan iqtisadi .quruluşlarda dəhşətli iqtisadi problemlər mövcuddur

Həzrət Əlinin (ə) buyuruğuna əsasən, Həzrət Mehdinin (ə) ümumdünyəvi vahid .٩ hökumətində möminlər onun ətrafında toplanar, həmin hakimiyyətdə bir nəfər olsun kafir və azğın şəxs tapılmaz.(٢) Hansı ki, bugünkü qərb qloballaşmasında gerçək .möminlərə yer yoxdur, hakimlərin ətrafında azğın insanlar toplaşmışdır

Həzrət Mehdinin (ə) hökumətində zalım hakimlər, onların azğın ətrafları ciddi .١٠ cəzalandırılar.(٣) Çünki həzrətin hökuməti ədalət prinsipi üzərində qurulasıdır. Qloballaşmada isə vəziyyət tam başqadır. Bu prosesdə cinayətkarlar sülhməramlı, .ədalətsevərlər terrorist adlandırılır

Ümumdünyəviləşmə prosesi sürətlə genişlənməkdə olsa da, onun qaranlıq .١١ nöqtələri çoxdur. Jan Mari Gino bu barədə deyir: “Ümumdünyəviləşmə təcrübəsində cəmiyyətin vəziyyəti qəfildən gözü açılan korun vəziyyəti ilə müqayisə oluna bilər... Fərdin qloballaşma ilə vasitəsiz qarşılaşması sərxoş edicidir...”(٤) Hansı ki, Mehdi hökumətinin xüsusiyyətləri rəvayətlərdə və hədislərdə dəqiqliklə sadalanır, bu hökumətin cəmiyyətlə bağlı proqramları yetərincə təsvir olunur. Bu hökumətə .münasibətdə hansısa nöqsan tapmaq mümkünsüzdür

Qərbin qloballaşması əslində qərb və Amerikanın dünyaya siyasi və iqtisadi .١٢ hökmranlığından ibarətdir. Bu proses qarşıdurmalarsız və düşmənçiliksiz ötüşmür.

prosesə qoşulmağa razı deyil. Hansı ki, Həzrət Mehdi (ə) hökumətinin məqsədi bütün yer üzündə qırğınların kökünün kəsilməsi və yer üzündə qırğınlara son qoyulmasıdır. (Quranın buyurduğu kimi, "xalqın qorxusu əmin-amanlıq və asayişə çevriləcək."(١)

İctimai və ideoloji baxımdan qloballaşma mədəniyyətlərin yaxınlaşmasından .١٣ danışır. Amma aydın məsələdir ki, qərblilərin iddiasına zidd olaraq, dünya parçalanmaya doğru gedir. Mədəniyyətlərin savaşı, yeni ideologiyaların ortaya çıxması dünyanın simasını dəyişəcəkdir. Yaranmış qarşıdurmalar yer üzündə asayişi pozasıdır. Hansı ki, Həzrət Mehdinin (ə) zühuru dövründə insanlar ixtilafdan, mədəni və siyasi qarşıdurmadan çəkinəcək, xalq könüllü olaraq vahid bir mədəniyyəti qəbul .edib, onun sayəsində asudə bir həyat sürəcək

## Tətbiqi xilaskarlıq

?Sual: ٢١. Tarix məqsədsizdirmi

Cavab: Məşhur "Qərb mədəniyyətinin süqutu" əsərinin müəllifi alman mütəfəkkiri Osvald Spinqler tarixi canlı bir varlıq kimi fərz edir və onu periodik sayır. Onun nəzərincə, hər bir tarixi dövr min il çəkir. Bir dövrün ardınca onun yerini başqa bir dövr .tutur

Onun nəzərincə, tarixi gedişatda təkamül yoxdur və tarix bir-birinin ardınca gələn mədəniyyətlər məcmusudur. Bir mədəniyyətin qürubundan sonra o biri mədəniyyət tülu edir. Əslində onun baxışına əsasən dünya tarixi mədəniyyətlərin həyat və (ölümünün tükənməyən yaranış və inkişafından bir təsvirdir.(٢

Uyğun nəzəriyyəyə belə bir sual ünvanlaya bilərik: Tarixin yeni dönəmi özündən ?əvvəlki dönəm kimidir, yoxsa yetkinlik baxımından fərqlənir

Əgər hazırkı dönəm əvvəlki dönəmin eyni olsa, onu həmin dönəmin davamı saymaq olar. Belə ki, yeni bir dönəmdən danışmağa dəyməz. Bir dönəmi özündən əvvəlki dönəmdən nöqsanlı saymaq gerçəkliyə ziddir. Üçüncü hal hər bir dönəmin özündən əvvəlki dönəmdən kamil olmasıdır. Sual oluna bilər ki, bu kamillik həmin dönəmin özündən qaynaqlanır, yoxsa xarici amil var? Əgər bu kamillik onun daxilindən qaynaqlanırsa, tarixin təkamül nəzəriyyəsi

.düzgündür. Dönəmin inkişafı xarici amillərlə bağlıdırsa, bu materialist bir baxışdır

Digər bir tərəfdən, haqqında danışılan nəzəriyyə xarici gerçəkliyə ziddir. Çünki bəşər həm mənəvi, həm də maddi baxımdan təkamüldədir. Hər bir əsr özündən əvvəlki əsrin .təcrübələrindən faydalanır və onu inkişaf etdirərək irəli aparır

?Sual: ٢٢. Materialistlər dünyanın sonu haqqında nə düşünür

Cavab: Materialistlər bəşər tarixinin gələcəyi ilə bağlı dörd nəzəriyyə irəli sürmüşlər. :Bu nəzəriyyələrin hər birinin bəşəriyyəti səadətə çatdıracağı bildirilir

;Bəşəriyyətin elmi-texniki tərəqqinin vasitəsi ilə xoşbəxtliyə çatması .١

;Qanunları dəyişmək yolu ilə parlaq gələcəyin əldə olunması .٢

;Yer üzünün birqütblü edilməsi yolu ilə xoşbəxtliyin təmini .٣

.Materializm baxımından parlaq gələcəyin təsviri .۴

?Sual: ٢٣. Bəşəriyyət yeni texnologiyalar vasitəsi ilə xoşbəxt ola bilərmi

Cavab: Bəziləri belə düşünürlər ki, bəşəriyyətin yalnız maddi dirçəlişi cəmiyyətin səadətə və rifaha çatmasını təmin edə bilər. Bu baxışa əsasən, bir o qədər də uzaq .olmayan gələcəkdə bəşəriyyət xoşbəxtliyə qovuşasıdır

Uyğun baxışa cavab olaraq deyə bilərik ki, elm bəşəriyyəti xoşbəxt etmək, ədaləti təmin etmək gücündə deyil. Bəli, elm və texnika inkişafdadır. Amma bu inkişaf insanı yalnız maddi baxımdan təmin edə bilər. Amma ədalətli bir quruluşda maddi təminat .varsa, xoşbəxtlik də var. Ədalətsiz qurluşda isə maddi təminat həlledici rol oynamır

Bəşəriyyət öz yolunu təkcə maddi baxımdan azmamışdır. Əlbəttə, problem təkcə maddi durum olsaydı, elm və texnika məsələni həll edə bilərdi. Əslində isə tamam başqa amillər var: Cilovlanmayan nəfs istəkləri; şəhvət və qəzəb; tamahkarlıq; .məqampərəstlik; üstünlük istəyi; ləzzət ardınca qaçmaq

Bir sözlə, bütün bəşərin yoluxduğu nəfspərəstlik! Buna görə də elm bəşəriyyətin ən

böyük düşməninə çevrilmişdir. Doğurdan da, elm çıraqdır. Amma bu çıraqdan hansı yolda istifadə olunması mühümdür. Elm yanacağı ağıl olan bir çıraqdır. O hədəfi .müəyyənləşdirmir, sadəcə, hədəfə çatmaq üçün vasitədir

Yenə də Vill Dorantın məşhur sözü yada düşür. “Biz texnika baxımından güclənmişik, ”.məqsəd baxımından yoxsullaşmışıq

Bu səbəbdən də elm və texnologiya zalım hökumətin ixtiyarına verildikdə bəşəriyyət :bir sıra problemlərlə üzləşir. O cümlədən bu hökumət

;Bəşərin məhvinə aparır .۱

;Yalnız varlı təbəqənin rifahı üçün sə`y göstərir .۲

.Ədalətsiz olduğundan elm bəşəriyyətə zülm üçün vasitəyə çevrilir .۳

?Sual: ۲۴. Dünyanın sonunda liberalizm hakim ola bilərmi

Cavab: Bəzi qərb mütəfəkkirləri iddia edirlər ki, bir gün bütün yer üzündə liberalizm, yəni hərcəhətli azadlıq hakim olacaq. Onlar liberalizmi bəşəriyyət üçün yeganə xilas yolu bilirlər. Liberalizmin mədəni, siyasi və iqtisadi növləri varsa da, adətən, birinci .mənadakı liberalizm nəzərdə tutulur

?Sual: ۲۵. Tarixin sonu barədə Fokoyama nə düşünür

Cavab: Amerikada yaşayan müasir Yapon yazıçısı Fokoyama tarixin sonunda Hegel tarixinə əsaslanan bir nəzəriyyənin hakim olacağını bildirir. O deyir: Tarix kamilləşməkdədir; Bu təkamül həm mənəvi, həm də maddidir; hər iki kamilləşmə tarixin sonuna aparır; mənəvi kamillik ۱۸۰۶-cı ildə Napoleonun məğlubiyyət dövrünə təsadüf edir; maddi kamillik təxirə düşmüşdür, hazırkı liberalizm dövrü hegel tarixinin (sonudur və bəşər xoşbəxtliyinin qaynağıdır.(۱

:Bu baxışa münasibətdə belə deyə bilərik

.Bu nəzəriyyə tarixin sonu ilə bağlı İslam baxışlarını nəzərdən qaçırmışdır .۱

Bu irqçi düşüncə Amerikanın öz xarici və daxili siyasətində xoşbəxtliyə çatdığına və .۲ .bu xoşbəxtliyi bütün dünyaya dadıracağına inanır

Bu nəzəriyyəyə əsasən,kim qalibdirsə, o da üstündür. Hansı ki, tarixdə bir çox .۳

.qaliblər zalımlar zümrəsindən olmuşdur

?Sual: ۲۶. Marşal Mak Lovhan liberalizm hakimiyyətini necə təhlil edir

:Cavab: O dünyanın gələcəyi və liberalizm haqqında belə deyir



---

.Xarici siyasətdə nəzəri araşdırmalar", s. ۱۸۲" [۳۲] -۱

a) Əməliyyat və informasiya inqilabı bəşəriyyətin bir-biri ilə rahatca əlaqə saxlamasına .səbəb olmuşdur

.b) Belə bir yaxınlıq təbii olaraq vahid ümumdünya hökumətinin təşkilini zəruriləşdirir

.v) Bu məntəqənin mədəniyyəti və ictimai quruluşu öz hakimiyyətini müəyyənləşdirir

.q) Liberalizm düşüncəsi bütün ideologiyalardan daha çox maraq doğurmaqdadır

.d) Qalib düşüncə tərzi yayıldıqca digər ideologiyalar və düşüncələr onda həll olacaq

(Nəticə: Tarixin sonunda liberal demokratiya ideologiyası qalib ideologiya olacaq.(١)

Yuxarıdakı mülahizələrə cavab olaraq deyə bilərik ki, böyük informasiya inqilabına heç bir şübhə yoxdur. Amma bunu da qeyd etməliyik ki, hamının bir-biri ilə əlaqə saxlaya .bilməsi xoşbəxtlik deyil. Xoşbəxtliyin digər amilləri və dəlilləri mövcuddur

Liberalizm vahid dünya hökumətinin ehtiyaclarına cavab verə bilmədiyindən belə bir hakimiyyətə iddialı ola bilməz. Demək olar ki, bütün dünya mütəfəkkirləri yalnız dünya və insan həqiqətini özünə ehtiva edən bir məktəbin ümumbəşəriliyinə inanırlar. Tarixin sonunadək yaşamaq istəyən məktəb dünya və insanı olduğu kimi tanımalı, onları .düzgün dəyərləndirməlidir

Liberalizmin də Marksizm kimi problemləri var. Bu iki məktəb insan fitrəti ilə bir araya .sığmır. Onlar insanın əslini görməməzliyə vurub, işə ortadan başlamaq istəyirlər

Bu gün qərbin aparıcı ideologiyalarında mövcud olan nöqsanları üzə çıxarmaq asan .deyil. Çünki qərbin bər-bəzəkli zahiri insanların göz və qulağını tutmuşdur

Olsun ki, dünyada ən çox nailiyyət qazanmış dövlət Amerikadır. Maddi baxımdan bu ölkə digərlərindən öndədir. Amma doğurdanmı Amerika idealdır? Amerika və qərbin :bir çox problemləri var. Bu problemlərdən bəzilərini nəzərdən keçirək

Məqsədsizlik – liberalist ölkələrdə, hətta Amerikada etiraf olunur ki, cəmiyyətə . ١ puçluq ruhiyyəsi hakimdir. Yəni gündəmdə "biz hara gedirik", "biz nə axtarırıq" kimi suallar durur. Bu sayaq ciddi sualları doğuran hakim ideologiyaların cəmiyyət və insanı

Ailə böhranı – cəmiyyətin ilkin hüceyrələri ailədir. Bəşər cəmiyyətində bu . ٢ hüceyrələrin ən zəifi qərbdədir. Artıq qərbdə ailə heç bir əhəmiyyət daşımır. Qərb cəmiyyətində ailə yox, fərd əsas götürülür. Bu səbəbdən də həmin cəmiyyətlərdə .qanunsuz doğulan körpələrin sayı təsəvvür olunmayacaq həddə çatmışdır

Pis vərdişlər – qərb cəmiyyətindəki puçluq ruhiyyəsi gənc nəsli pis vərdişlərə . ٣ yoluxmuşdur. Əgər gənclərin spirtli içkilərə aludəliyi ilə bağlı statistikaları nəzərdən keçirsək, bu rəqəmlər bizi dəhşətə gətirər. Bəli, pis vərdişlərə, alkoqolizmə və .narkotikaya çıxış yolu kimi baxan qərb cəmiyyəti məhv olmaqdadır

Amansızlıq – amansızlıq ruhiyyəsi yalnız gənclərdə yox, hətta uşaqlarda tüğyan edir. .٤ Xüsusi ilə Amerikada hər an gənclərin və uşaqların törətdiyi vəhşiliklərə şahid ola bilərik. Əgər bu hadisələr bütün dünyaya nümayiş etdirilsə, həmin cəmiyyətlərdəki .problemlərin dərinliyindən xəbər tutarıq

Əmin-amanlığın olmaması – xüsusi ilə Amerikanın əksər böyük şəhərlərində . ٥ .şəxsiyyətini azca qoruyan insanlar axşam düşəndən bayıra çıxmırlar

Yoxsulluq – Amerikada rəsmi statistik göstəricilərə görə xalqın ١٣ -١٤ faizi . ٧ yoxsulluqdan aşağı səviyyədə yaşayır. İki yüz əlli milyonluq bir cəmiyyətdə bu faizin arxasında otuz-qırx milyon insan dayanır. Hansı əsasla belə bir cəmiyyət ideal ?sayılmalıdır

Cinsi azğınlıq – ailə təməli dağıldıqdan, insanların əksəri ümidsizliyə qapıldıqdan . ٨ sonra, xüsusi ilə Amerika cəmiyyətində cinsi azğınlıq zirvə həddinə çatmışdır. Qeyri-qanuni uşaqların doğulması qərbi, xüsusi ilə Amerikanı ağuşuna almış ən böyük .bəlalardandır

Çərçivəsiz informasiya şəbəkəsi – Amerika və qərbin ciddi problemlərindən biri . ٩ onlardakı informasiya şəbəkəsinin heç bir hədd-hüdud gözləməməsidir. Təəssüf ki, digər ölkələrdə də uyğun halın təqlidi ilə rastlaşırıq. Hazırda qərb informasiya şəbəkəsi tam açıq-saçıqdır. Bu şəbəkələrdə əxlaqsızlıq təbliğ olunur, insanların şəxsiyyəti alçaldılır. Əksər insanlar öz şəxsi məsələlərinin bu şəbəkələrdə yayımlanacağından .qorxu keçirir

Yetərsiz təhsil sistemi – qərb və Amerikanın bütün dünyaya yeritmək istədiyi təhsil .۱۰
sistemi əslində tam yetərsizdir. Qərbin əksər

təhsil müəssisələrində mühacirlər çalışır və onlar öz maaş müqabilində maşın tək .işləyirlər

Xəstə iqtisadiyyat – bəziləri elə düşünürlər ki, qərb iqtisadi baxımdan dünyanın .١١ behiştidir. Hansı ki, Amerika dünyanın ən böyük borcu olan ölkəsidir. Onun daxili və xarici borclarının miqdarı insanın ağlını başından çıxarır. Əlbəttə ki, bu borclar çox .mahir şəkildə ört-basdır edilir

Dünya bazarlarından asılılıq – Amerika sənayesi asılı bir sənayedir. Bu sənayenin .١٢ .dünya bazarı ilə əlaqələri qısa müddət kəsilərsə, o iflic olar

Əgər liberalizmin hakim olduğu qərb və Amerikada vəziyyət belədirsə, hansı əsasla !?onlardan nümunə götürmək olar

?Sual: ٢٧. Dünyanın sonu haqqında Taflerin nəzəri nədir

Cavab: “Üçüncü dalğa” kitabının müəllifi amerikalı jurnalist Elvin Tafler tarixin sonu və :liberalizmin tarixi haqqında deyir

...a) Dövrümüz “ən çox” dövrüdür. Ən çox tamaşaçısı olan film ən yaxşı film sayılır

b) XIX əsr və XXI əsrin birinci yarısında üstünlük meyarı dünya səhnəsində siyasi qüdrət idi. Getdikcə siyasətin yerini iqtisadiyyat tutdu. Bir gün iqtisadiyyat öz yerini elmə verəsidir. Çünki gələcəkdə dünya səhnəsində yalnız elm və məlumatı yüksək .olan ölkələr qüdrət sahibi olacaqlar

.v) Gələcəkdə elmi-texniki qüdrətin ümdə mehvəri qərb olacaq

q) Liberal demokratiyanın nöqsanları olsa da, bəşər cəmiyyəti üçün ən yaxşı yol bu .ideologiyadır

.Nəticə: Dünyanın gələcəyi qərb liberalizminindir

:Yuxarıdakı iddialara cavab olaraq belə deyə bilərik

Bu nəzəriyyə tarixin sonu yox, növbəti tarixə aid ola bilər .١

Birinci müqəddimədə insanın istəyi istənilən bir şeyin meyarı sayılır. Hansı ki, ölçü .۲ əqlin hökmü və nəql olunanlardır. Allah-təala buyurur: “Çox olur ki, xeyirinizə olan bir şeyi xoşlamırsınız. Çox olur ki, zərərinizə olan bir şey istəyirsiniz.”(۱)

İkinci müqəddimədə hərbi güc dünya səhnəsində siyasi qüdrət meyarı sayılır. Hansı .۳ ki, zor gücünə siyasi hökmranlıq və xalqın istismarı iğtişaş və istibdaddan savay .ərmağan gətirmir



---

.Bəqərə”, ۲۱۶“ [۳۴] -۱

Məqsədə çatmaq üçün heç bir çərçivə gözləmədən istənilən bir üsuldan .۴
?faydalanmaq insanın ağıl və fitrətinə uyğundurmu

Siyasi nəzəriyyəçinin vəzifəsi gələcək haqqında öz zənn-gümanını bəyan etmək yox, .۵
.cəmiyyətin xeyrini nəzərə alaraq proqram hazırlamaqdır

Kapitalizm quruluşu cəmiyyətə xoşbəxtlik, yoxsa ciddi təbəqələrarası qarşıdurma .۶
?gətirib

Elə buna görə də Tafler belə deyir: "Cəmiyyətimizin (qərb cəmiyyətinin) üzləşdiyi
(problemlərin sonu yoxdur."(۱

?Sual: ۲۸. Hantinqton tarixin sonu haqqında nə düşünür

:Cavab: Qərb nəzəriyyəçisi Samuel Hantinqton tarixin sonu haqqında deyir

a) Gələcəkdə millətlər və qruplar arasında baş verəcək əsas qarşıdurma ideologiya və
.iqtisadiyyat sahəsində yox, mədəniyyət, sivilizasiya sahəsində olacaq

b) Dünyada səkkiz mədəniyyət cərəyandadır: qərb, konfusiçilik, yapon, İslam, Hindu,
.Slavyan, Ortodoks, Latın Amerikası mədəniyyətləri

.v) Mədəniyyətlərin dialoqu mühümdür

.d) Mədəni özünüdərk tərəqqidədir

.q) Qərbin rəftarı digər mədəniyyətlərdə özünüdərkin tərəqqisinə səbəb olmuşdur

ş) İslam və qərb arasındakı ۱۴۰۰ illik kin-küdurət yüksəlməkdədir və bu iki mədəniyyət
.qanlı qarşıdurmalar astanasındadır

.c) Sonda İslam və konfusiçilik birləşərək qərb mədəniyyətinə qarşı duracaq

Nəticə: Mədəniyyətlərin savaşı dünya savaşının son təkamül mərhələsidir və sonda
(qərb mədəniyyəti qalibdir.(۲

:Uyğun baxışa iradlarımızı bildiririk

.Nəzəriyyəçi mədəniyyətin təfsirini verməmişdir .١

.Mədəniyyətlərin üz-üzə gələcəyinə dəlil göstərilmir .٢

Nəzəriyyəçi “sivilizasiya” anlayışını “mədəniyyət” anlayışı ilə qatışıq salır. Hansı ki, bu .٣ iki məfhum fərqlidir. Sivilizasiyanın elmi və görünən tərəfləri var. Mədəniyyət isə daha çox zehn və mənəviyyata aiddir. Sənət, fəlsəfə, hikmət, ədəbiyyat, e`tiqad mədəniyyətin əhatə



---

Modern mədəniyyətə doğru”. Elvin və Haydi Tafler, s. ٩٦, ٩٧“ [٣٥] -١

.Mədəniyyətlər üzbəüz”, s. ٢٢, ٢٣“ [٣٦] -٢

dairəsindədir. Sivilizasiya isə daha çox insanın cəmiyyətdəki maddi ehtiyaclarını əks etdirir. Sivilizasiya daha çox ictimai, mədəniyyət isə fərdi yönümə malikdir. Sivilizasiya insanın cəmiyyətdəki təkamülünü təmin edir. Mədəniyyət isə fərdi təkamül yönümünü .işıqlandırır. Sivilizasiya və mədəniyyət əlaqəli də olsa, fərqli anlayışlardır

Nəzəriyyəçi qərbə aydın bir tərif vermək əvəzinə, onu Amerika mehvər olmaqla“ .۴ vahid bir mövcud sayır. Hansı ki, Bzejinski qərb nizamındakı daxili fəsadı Amerikanın .qüdrətini hədələyən bir amil kimi göstərir

Nəzəriyyəçi iki mədəniyyət arasındakı ziddiyyəti tarixi zərurət sayır və bu ziddiyyətin .۵ aradan qaldırılmasını mümkünsüz bilir. Beləcə, qərb İslam sivilizasiyasının çiçəkləndiyi ölkələrə qarşı hərbi qüdrətini genişləndirir. Hansı ki, mədəniyyət ixtilafı adlanan bu ixtilaf qərbin çirkin siyasətindən qaynaqlanır. Bu ixtilafları məsihilik və İslamın ayağına yazmaq olmaz. Vill Dorant deyir: “Məhəmməd (s) məsih dini ardıcıllarına nöqsan tutsa da, onlara qarşı nikbin münasibətdədir. O, məsih ardıcılları ilə öz ardıcılları arasında dostluq rabitələrinin olması istəyindədir.۳۷

Robson deyir: “Yalnız müsəlmanlar öz dinlərinə möhkəm bağlanmaqla digər dinlərlə (müdara ruhunu saxlaya bilirlər.”(۱

Adam Metz isə belə deyir: “İslam hakimiyyəti dövründə kilsələr və sovmiyələr elə tə`sir bağışlayırdı ki, sanki məsihi hakimiyyətindədirlər. Bir çox ölkələrdə mövcud olan (bu sayaq müdara ənənsi qərbə heç orta əsrlərdə də tanış deyildi.”(۲

?Sual: ۲۹. Mütərəqqi bəşəri qanunlar insanı kamilləşdirə bilərmi

Cavab: Bəziləri iddia edirlər ki, bəşəriyyət tarix boyu qazandığı təcrübələr əsasında onu xoşbəxtliyə çatdıracaq qanunlar tənzimləyə bilər. Guya, çətinlikləri araşdırıb, .onların həlli yolunu müəyyənləşdirməklə son məqsədə yetişmək mümkündür

:Uyğun mülahizələrə belə cavab vermək olar

Bəşəriyyət vəhy və qeyb aləminin yardımı olmadan hansı yolun daha xeyirli . ۱ olduğunu müəyyənləşdirə bilməz. Vəhyə müraciət etmədən İslami göstərişləri əldə .etmək mümkünsüzdür

۲. Bir qrupun və şəxsin mənafeyinə xidmət edən qanunlar, adətən, cəmiyyətin ehtiyaclarına cavab vermir. Bütün bəşəriyyətin ehtiyaclarına cavab verəcək qanunları yalnız ilahi məqama malik olanlar tənzimləyə bilər.

۳. İnsanlar arasında düşüncə və səliqə fərqləri olduğundan vahid qanunların tənzimlənməsi mümkünsüzdür.

Sual: ۳۰. Dünyanın birqütblü olması bəşəriyyəti xilas edə bilərmi?

Cavab: Bəziləri iddia edirlər ki, bəşəriyyətin zülm və ədalətsizlikdən yeganə çıxış yolu dünyanın təkqütblü olması, başqa sözlə, qüdrətli bir hakimiyyətin öz prinsiplərini başqa hökumətlərə diktə etməsidir. Bəziləri Amerikanın bütün imkanlara malik olduğunu əsas götürərək onun bütün dünyaya diktəsini çıxış yolu sayırlar.

Dünyanın təkqütblü edilməsi hələ uzaq keçmişdən filosoflar və alimlər tərəfindən araşdırılmış bir məsələdir.

Yunan filosofu Ziv miladdan üç yüz il öncə deyirdi: “Bütün bəşəriyyət vahid quruluşa tabe olmalıdır ki, öz xoşbəxtliyini əldə edə bilsin.” Zivin müasiri olmuş İsgəndər öz gücünə arxalanaraq alimin nəzəriyyəsini həyata keçirmək istədi. Yunan yazıçısı Baltak miladdan yüz il öncə vahid hökumət haqqında deyirdi: “Xalq çalışmalıdır ki, vahid bir quruluş təşkil etsin və vahid qanunlara tabe olsun.”

Amerika filosofu Vilyam Luid (۱۸۳۸) deyir: “Nə qədər ki, dünyaya vahid bir hökumət başçılıq etmir, bəşəriyyət dostluq və dinc yanaşı yaşayışa nail olmayacaq.”(۱)

Məşhur İtalyan ədibi Dante deyir: “Yer üzündə sülh və əmin-amanlığın hakim olması üçün bütün yer əhli vahid hökumətə tabe olmalıdır.”(۲)

Rassel deyir: “Bəşəriyyət bütün insanları öz bayrağı və şüarı altında toplayacaq xilaskarın intizarındadır.”

Ata Corc Buş deyir: “Dünyanın yeni nizamı birləşmiş ştatların rəhbərliyi altında bütün dünyada sülh və demokratiyadan ibarətdir.” O konqresdəki çıxışında belə demişdir: “Həm əxlaqi dəyərlərə, həm də dünya nizamını qoruyacaq vasitələrə malik olan

Amerikanın özündə Birləşmiş Ştatların dünyaya hakimliyinin mümkünlüyünü rədd .١ .edən Kisincer kimi nəzəriyyəçilər var

Bzejinski Amerikanın çarəsizliyini təsvir edərək deyir: “Bu gün Amerika dünyaya hakimlik iddiasında olsa da, bu sahədə onunla rəqabətə girən tapılmasa da, Birləşmiş ”.Ştatların qüdrət və mövqeyi bir çox sahələrdə təhlükədədir

Dünyanın təkqütblü olması prinsipinin qəbulu üçün güclü zəmin yoxdur. Xüsusi ilə .٢ .Amerikanın tənəzzüldə olan iqtisadi durumu onun bu sayaq iddialarına cavab vermir

Nəzəriyyəçilər unudurlar ki, dünya xalqları heç vaxt biganələrin hakimiyyətini qəbul .٣ .etməyəcək

Biz prinsipcə bu nəzəriyyəni rədd etmirik. İnanırıq ki, bəşəriyyətin yeganə qurtuluş yolu ümumdünya ədalət hökumətinin təşkilidir. Amma belə bir hökumət yalnız ilahi .göstərişlər və məsum imamın rəhbərliyi altında gerçəkləşə bilər

?Sual: ٣١. Marksistlər tarixin təkamülünə hansı üsulla don geyindirirlər

Cavab: Marksistlər tarixi təbiətin bir hissəsi sayırlar. Onların nəzərincə, tarix təbiətin taleyini yaşayır. Mərhum Şəhid Mütəhhəri Marksistlərin uyğun mövzu ilə bağlı baxışı haqqında deyir: “Tarix daimi bir cərəyan, insan, insan təbiəti və cəmiyyət arasındakı rabitə, inkişafda olan qüvvələrlə tənəzzüldə olan qüvvələr arasında daimi bir çəkişmədir. Sonda sərt və inqilabi bir cərəyan bu gedişi inkişafda olan qüvvələrin xeyrinə başa vuracaq. Bir sözlə, tarix ziddiyyətlərin təkamüllə nəticələnən ...çəkişməsidir

Fikri donmuş, keçmişə bağlı bir güruhla gələcəyə bağlı, düşüncəsi işıqlı güruh arasında çəkişmə güclənir və nəhayət, partlayış həddinə çatır. Cəmiyyət inqilabi bir addımla .keçmiş quruluşu yeni quruluşla əvəz edir. Beləcə, tarixin yeni bir mərhələsi başlayır

Tarixin bu yeni mərhələsi də tale baxımından ötən mərhələyə oxşayır... Bu mərhələ də öz yerini onu inkar edənə verir. Tarix bu sayaq təbiətə oxşar şəkildə ziddiyyətlər .arasından ötüb keçir

Təbiət və tarixə münasibətdə bu sayaq düşüncə tərzi dialektik təfəkkür adlandırılmışdır. Çünki onlar bütün ictimai dəyərləri istehsal vasitələrinə bağlı bilirlər. Biz tarixə bu sayaq baxışı "alət baxışı" adlandırırıq. "Alət baxışı" dedikdə tarixi proseslərə münasibətdə

xüsusi təfəkkür tərzini» nəzərdə tuturuq. Bu tarix “tarixi materializm”» (adlandırılmışdır...”(١)

:Dialektik üsulla tarixin təkamülünə don geyindirilməsinə müəyyən iradlarımızı bildiririk

Təkamülə istehsal vasitələri baxımından qiymət vermək olmaz. Çünki istehsal .١ vasitələrinin təkmilləşdirilməsi öz növbəsində fitri kamillik hissindən qaynaqlanır və .insanın ixtirası əsasında gerçəkləşir

Tarixi təkamülə istehsal vasitələri prizmasından baxış bütün dini, əxlaqi və insani .٢ .dirçəlişləri təhrif edir. Bu nəzəriyyə insanlıq məqamına xəyanət kimi dəyərləndirilir

Tarixi gerçəkliklər bu nəzəriyyənin puçluğunu sübuta yetirir. Bir əsr öncə bəzi ölkələr .٣ kapitalizm mərhələsini keçməmiş sosializmə adladılar. Bir sıra kapitalist ölkələr isə .kapitalizmin zirvəsinə çatsalar da, sosializmə keçmədilər

.Tarixə dialektik baxış problemlər və böhranlar yaratmaq məqsədi ilə aranı qarışdırır .٤

Dialektik baxışa əsasən, tarixin təkamül prosesi məcburidir və qarşısıalınmazdır. .٥ Yəni hər bir cəmiyyət növbəti mərhələyə keçməklə kamilləşir. Hansı ki, bu baxış yanlışdır. Çünki uyğun hərəkətin əsas amili insandır və insan azad varlıqdır. Tarix bəzən irəli gedir, bəzən geri qalır. Bəşərin sivilizasiya tarixi bir silsilə tərəqqi, sonra .tənəzzüldən başqa bir şey deyil

Bəşəriyyətin təkamül yolu maddi təbiətin əsarətindən qurtuluşa, iman və.٦ ideologiyaya doğru uzanmışdır. Seyyid Məhəmməd Sədr deyir: “Hərəkət daim inkişafa doğru olmur. Bəzən geriyə hərəkət də müşahidə olunur. Necə ki, dəmir rütubətə düşdükdə torpağa çevrilir. Bəzən də hərəkət heç bir səmərə vermir. Necə ki, qədim (cəmiyyətin bəzi qalıqları hələ də inkişaf etməmişdir...”(٢)

?Sual: ٣٢. Tarixin təkamülünə insani-fitri baxış nədir

Cavab: İnsani-fitri baxış alət-dialektik baxışla daban-dabana ziddir. İnsani-fitri baxışa əsasən istər fərd, istər cəmiyyət üçün insani dəyərlər əsasdır. Bu baxışa əsasən, insanın daxilində bir silsilə münasibətlər mövcuddur. İnsanın xaricə ehtiyacı ağacın

torpağa, suya və işığa olan ehtiyacı kimidir. Ağac sadalanan xarici amillərdən



---

.Tarixi fəlsəfə baxımından Mehdi (ə) qiyamı", s. ۱۸, ۲۱ [۴۲] -۱

.Əlyəvmul-məvud", s. ۸۳" [۴۳] -۲

kömək alaraq öz yolunu gedir. Demək, insan yenidən qurulmamalı, sadəcə, inkişaf .etdirilməlidir

Bu baxışa əsasən, tarix də təbiət kimi öz xarakterinə uyğun kamilləşməkdədir. Təkamül həm təbiətin, həm də tarixin içindən qaynaqlanır. İnsan hərtərəfli təkamülə malik olduğundan tədricən mühitə bağlılıqlardan xilas olur. Onun maddi bağlılıqları zaman keçdikcə əqidə bağlılıqları ilə əvəz olunur. Nəhayət, bir gün insan sırf ideoloji bağlılıqlara malik olur. Daxili fərdi ziddiyyət insanın xüsusiyyətlərindəndir. Onun daxilindəki maddi yönümlə ruhani yönüm mübarizədədir. Bu hisslərdən biri insanı aşağı, digəri yuxarı çəkir. Fərdi istəklər insanı tənəzzülə uğradırsa, ideoloji istəklər insanı yüksəyə qaldırmaqla fərd çərçivəsindən çıxarır. Yuxarıya meyl bəşəriyyəti .əxlaqi, dini, elmi və əqli məqsədlərə yönəldir

Keçmiş və gələcək tarix boyu insanın çəkişmələri tədricən ideoloji xarakter alır. İnsan zaman keçdikcə öz kamal mərhələsinə, “ideal insan, ideal cəmiyyət” mərhələsinə yaxınlaşır. Bu təkamülün son istəyi İslamın “Mehdi (ə) hökuməti” adlandırdığı kamil hökumətdir. Həmin mərhələdə insan üçün heç bir batil, heyvani, eqoist hökumətdən .əsər qalmır

Demək, insan ilahi xaraktera malik bir mövcuddur. Onun haqpərəst, özünəhakim, təbiət və mühitin məcburiyyətindən azad bir təbiəti vardır. Marksizm isə insanın zatən şəxsiyyətli olduğunu qəbul etmir, onu hiss və meyl baxımından fərqli mövcud saymır. Bu səbəbdən də marksizm ideologiyasına əsasən, insan maddi, zora məhkum bir mövcuddur, maddi şəraitin əsarətində olan istehsal vasitəsindən başqa bir şey deyil. .Guya insanda mövcud olan müqəddəslik onun daxilindən yox, mühitdən gəlir

?Sual: ٣٣. Ümumdünyəvi ədalət hökumətində rəhbərliyə nə ehtiyac var

Cavab: Hər bir islahatçı hökumətin hərəkatın əvvəlindən sonunadək onun önündə getmiş rəhbərə ehtiyacı var. Heç bir qiyam və hərəkat rəhbərsiz həyata keçib yaşamır. Əgər ən kiçik hərəkatlarda rəhbərə bir bu qədər ehtiyac varsa, bütün dünyanı bürüyəcək islahatçılığın, şübhəsiz ki, rəhbərə ehtiyacı qaçılmazdır. Böyük ilahi məqsədi həyata keçirəcək qurumun yaradılması və ona nəzarət üçün bütün zəruri şərtlərə malik rəhbərə ehtiyac var. Bütün yer üzündə ədaləti bərpa edə biləcək bu rəhbər

?Sual: ٣٤. Yer üzündə ədaləti bərpa edəcək şəxsin hansı xüsusiyyətləri olmalıdır

Cavab: Ağıl hökm edir ki, bütün yer üzündə ədaləti bərpa edəcək şəxsin bu mühüm vəzifəni həyata keçirə bilməsi üçün müəyyən xüsusiyyətləri olmalıdır: Öz dəvətində doğruçu olmalı; düzgün və yığcam plan əsasında hərəkət etməli; heç bir zəif nöqtəsi olmamalı; pak məqam sahibi olmalı; Allah tərəfindən təsdiqlənməli; fədakar .köməkçilərə malik olmalıdır

Məşhur Fransa ədibi Volter deyir: "Əgər insana saleh bir şəxs hakim olsa, o sanki (vətənindədir. Qeyri-saleh şəxs hakim olduqda isə o insan vətənsiz kimidir."(١

Məşhur İrlandiya mütəfəkkiri Bernard Şou bəşəriyyətin xilaskarı haqqında deyir: "O diri, böyük qüvvə və kamil ağıl sahibi, xalqı özünə cəzb edə biləcək ən ali insan (olmalıdır. Onun ömrü uzundur, üç yüz ildən çox..."(٢

?Sual: ٣٥. Quran tarixin təkamülünü necə qiymətləndirir

Cavab: Qurani-Kərimi nəzərdən keçirdikdə görürük ki, bu ilahi kitab tarixin təkamülündə insani-fitri prinsipi əsas götürür. Quranda bildirilir ki, yaranışın əvvəlindən haqq və batil arasında savaş olmuşdur. Quran bir tərəfdən İbrahim, Musa, İsa, Məhəmməd (ə) və onun mömin ardıcıllarının mübarizəsini xatırladır, digər bir tərəfdən Nəmrud, Firon, yəhudi zalımları, Əbu-Süfyan kimilərinin müxalifətini yada salır. Bu mübarizədə bəzən haqq, bəzən batil qalib gəlir. Əlbəttə ki, bu qələbə və .məğlubiyyətlərin bir sıra ictimai, iqtisadi və əxlaqi amilləri olmuşdur

Quran baxımından, tarixin əvvəlindən mövcud olmuş cihad maddi yox, mənəvi və .insani mahiyyətə malik olmuşdur

?Sual: ٣٦. Quran baxımından parlaq gələcəyin hansı xüsusiyyətləri var

:Cavab: İslamda parlaq gələcəyin bir sıra xüsusiyyətləri var

Bəşəriyyətin gələcəyinə nikbinlik; ٢. Ədalətin genişlənməsi; ٣. İnsanın insanla . ١ rabitəsi; ٤. Qanuna münasibətdə insanlar arasında kamil bərabərliyin yaranması; ٥. Təbii sərvətlərdən bəhrələnmə və beytül-malın bölüşdürülməsi; ٦. Bəşəriyyətin

yetkinləşməsi; ٧. Bütün yer üzündə abadlıq; ٨. Dünya ədalət hökumətinin sayəsində savaşlara son qoyulması; ٩. Yeni ayin və üsul; ١٠. Bütün cəmiyyətlərdə tövhid .prinsipinin yayılması

?Sual: ٣٧. İnsanların təkamül yolu parlaq gələcəyə ümid verirmi

Cavab: Şübhəsiz ki, səthi nəzər saldıqda dünyanın faciəyə doğru getdiyini görürük. .Amma diqqətlə baxdıqda uzaq üfüqlərdə qurtuluş sahilinin nişanələri gözə dəyir

İnsan özünü tanıdığı gündən heç vaxt aram həyat sürməmişdir. O, daxili bir amilin təhriki ilə özünü və yaşadığı cəmiyyəti irəli aparmağa çalışmışdır. Bu böyük amil insanı aram buraxmayıb həmişə təkamülə sövq edəsidir. O, insandakı qüvvələri problemlərlə mübarizəyə səfərbər edir, insanı maddi kamilliklərlə yanaşı əxlaqi kamilliklərin də mövcud olduğu cəmiyyətə doğru çağırır. Həmin cəmiyyətdə savaşdan, çəkişmədən, viranlıqdan, bir sözlə, təkamülə zidd olan bir şeydən əsər yoxdur. Həmin cəmiyyətdə yalnız sülh və ədalət hakimdir. Həmin cəmiyyətdə yaşayan insanda maddi və mənəvi .təkamülə mane olan təcavüz və istismar ruhundan əsər yoxdur

?Sual: ٣٨. Yaranış nizamı bəşəriyyətə parlaq gələcək üçün ümid verirmi

Cavab: Varlıq nizamı müxtəlif nizamlar məcmusudur. Bütün varlıq aləminə hakim olan nizamlı və ümumi qanunların mövcudluğu bütün varlıq aləminin vahid bir tam olduğunu göstərir. Varlıq aləmindəki nəzm, qanun və hesab onun əsas .xüsusiyyətlərindən sayılır

?Bu aləmin tərkib hissəsi olan insan ümumi yoldan çıxıb, istisna bir yol tuta bilərmi

Əgər bütün varlıq aləmi vahid proqram əsasında hərəkətdədirsə, bəşər cəmiyyəti ?hərc-mərclik, zülm-sitəm yolunu seçməklə bu yoldan kənara çıxa bilərmi

Görən aləmdəki ümumi vəziyyət bəşəriyyəti ümumi nizama tabe olmaq barədə düşündürməməlidir? İnsan ətrafdakı qanunauyğunluqları nəzərə alıb öz fitri yoluna ?qayıtmağa, varlıq aləmi ilə həmrəng olmağa borclu deyilmi

Nəticə: Yaranış nizamı insanların düzgün bir ictimai quruluşu qəbul etməsi üçün

Sual:٣٩. Təsirin əks təsir doğurması təkcə fizikaya aid qanun deyil. Divara vurulan cisim həmin qüvvə ilə üstümüzə qayıdır. Uyğun qanun cəmiyyət üçün də öz gücündə qalır. .İstənilən bir inqilabı doğuran amil inqilabdan öncə həmin cəmiyyətdəki təzyiqlərdir

Bu qanun bizə deyir: Dünyanın bugünkü durumu inqilab vəd edir. Müharibələr, zülm-sitəmlər, ayrı-seçkiliklər, ədalətsizliklər və təzyiqlər bir gün öz cavabını tapmalıdır. Bir gün baş verəcək inqilab, şübhəsiz ki, dünyanın bu gün qarşılaşdığı zora cavab .verəsidir

Sonda, zora cavab istəyi millətlərin günbəgün artan agahlığı sayəsində cəmiyyətlərin batinindən vulkan kimi püskürəcək, bu gün dünyada hakim olan quruluşlar yenisi ilə əvəzlənəcək. Yeni nizamda nə silahlanma yarışı olacaq, nə də bugünkü yorucu dartışmalar. O, bəşər cəmiyyətinin xoşbəxt gələcəyindən xəbər verən digər bir .işartıdır

?Sual: ٤٠. İctimai zərurətlər cəmiyyəti sülh və ədalət çalarlı həyata sövq etmirmi

Cavab: İctimai zərurət dedikdə bəşər cəmiyyətinin elə bir mərhələyə çatması nəzərdə tutulur ki, həmin mərhələdə nəyəsə ciddi bir ehtiyac yaransın. Amma bu zərurət o qədər ciddi olmalıdır ki, onu ən azı mütəfəkkirlər və rəhbərlər qəbul etsinlər. Uyğun hal ictimai şüurun yuxarı səviyyəyə çatmasından asılıdır. Daha sonra cəmiyyətdə elə bir .durum yaranmalıdır ki, artıq əvvəlki kimi yaşamaq mümkünsüz olsun

XVII və XVIII əsrlərdə elm və texnikanın sürətli inkişafını müşahidə edən insanlar elə düşünürdülər ki, XX əsr behişt olacaq. Kimsənin ağlına gəlmirdi ki, texnologiya dövrünün insanı yoxsulluq içində yaşayacaq. Bəli, elm və texnologiya inkişaf etdikcə yeni problemlər yarandı. Dünya müharibəsi ifriti elm və texnologiya tərəqqisini öz dəhşətli kölgəsi altında qoydu. Həyatın nə dərəcədə təhlükəli olduğunu insanlar yalnız indi anlamağa başlamışdır. Artıq insanlar anlayırlar ki, gözlənilən təhlükələrin qarşısını .almaq üçün mövcud qanunlar yetərsizdir və yeni bir nizama ehtiyac var

Artıq bir zaman çatıb ki, dünyadakı silahlanma yarışına, günbəgün artan çaxnaşmalara son qoymaq, dünyanı növbəti müharibə təhlükəsindən xilas etmək üçün ümumdünya ədalət hökumətinin varlığı zərurətə çevrilir. Artıq hamı hiss edir ki, saxta sərhədlər

aradan götürülməli, bütün dünya əhli vahid bir bayraq altında vahid qanunlarla .yaşamalıdır

səh:۳۶

Təsirin əks təsir doğurması qanunu ümumdünyəvi bir hökumətin zəruriliyini göstərən .digər bir amildir. Bu amil dünya əhalisini sülh və ədalət dolu bir həyata çağırır

Sual: ۴۱. Cəmiyyəti dəyişmək üçün tədrici islahatlar bəs edir, yoxsa köklü inqilab ?lazımdır

Cavab: İctimai islahatların hansı yolla həyata keçirilməsi fərqli münasibətlər doğuran bir məsələdir. Bir çoxları “reformizm” adlanan tədrici islahatların tərəfdarıdır. Digər bir qrup cəmiyyətlərdəki çaxnaşmaların qarşısının yalnız inqilab yolu ilə aradan qaldırılmasını mümkün sayır. Digərləri isə belə deyir: “Cəmiyyətlərdəki fəsad dərəcəsi fərqlidir. Tamamilə fəsada uğramış cəmiyyətlərdə tədrici islahatlar səmərə verə bilər. Amma fitnə ağuşuna düşmüş cəmiyyətdə vəziyyəti yalnız köklü inqilab dəyişə bilər. :Üçüncü baxışın daha çox tərəfdarı var. Bu baxışa əsasən

Tədrici islahatlar həmişə sağlam bünövrə və nümunələr üzərində qurulur. Əks- . ۱ .təqdirdə yeni nümunələr və bünövrələr soraqlamaq lazım gəlir

Tədrici islahatlar yalnız sağlam yolla gerçəkləşir və bu prosesdə cəmiyyətdən . ۲ düşüncə hazırlığı tələb olunur. Belə bir zəmin olmadıqda inqilab, qüdrət məntiqi ilə .danışmaq lazım gəlir

Fəsadın kök atdığı cəmiyyətdə qüdrət ünsürləri islaha mane olur. Cəmiyyətin bütün .۳ həssas mərkəzləri onların əlindədir və onlar istənilən bir tədrici proqramı asanlıqla müvəffəqiyyətsizliyə uğradırlar. Belə bir nizamı yalnız qəfil inqilabla dağıtmaq .mümkündür

Əzəmətli inqilabi qüvvəni, adətən, uzun müddət eyni hərarətdə saxlamaq olmur. . ۴ .İnqilabi qüvvədən vaxtında istifadə olunmadıqda o öz gücünü itirir

Tarixdən məlum olur ki, fəsadın kök atdığı cəmiyyətlərdə həmin cəmiyyətin düşüncə .۵ .sahibləri, xüsusi ilə peyğəmbərlər və övliyalar inqilab yolunu seçmişlər

Dünyanın zülm-sitəm üzərində qurulmuş bugünkü vəziyyətini islah etmək üçün ədalətli bir quruluşun canişinliyinə ehtiyac var. Belə bir dəyişiklik üçün əzəmətli bir .inqilab qaçılmazdır

?Sual: ۴۲. Ümumdünya ədalət hökumətinə çatmaq üçün hansı hazırlığa ehtiyac var

Cavab: Biz nə qədər nikbin və ümüdvar olsaq, bilməliyik ki, dünyada kök atmış siyasi oyunbazlığı və istismarçılığı aradan

götürmək, bəşəriyyəti vahid bir bayraq altında toplamaq üçün ümumi hazırlıq zəruridir. Son əsrdə baş vermiş sürətli dəyişikliklər belə bir hazırlığın hələ ki əlçatmaz olduğunu göstərmir. Hər halda dünyanın belə bir hökuməti qəbul etməsi üçün :aşağıdakı hazırlıqlara ehtiyac var

Düşüncə və mədəniyyət hazırlığı: Yəni dünya əhalisinin düşüncəsi elə inkişaf . ١ .etmişdir ki, məsələn kimsə üçün irqi, milli, coğrafi fərqlər mühüm olmasın

.İctimai hazırlıq: Bəşəriyyət zülmdən yorulmalı və can-dildən ədalət istəməlidir .٢

Texnoloji hazırlıq və rabitə hazırlığı: İnkişaf etmiş sənaye olmadan uyğun məqsədə .٣ .çatmaq mümkünsüzdür

Bəli, əgər möcüzə ilə gerçəkləşirsə də, nəzərdə tutulan quruluş inkişaf etmiş texniki vasitələrsiz təsəvvür olunmur. Unutmayaq ki, möcüzə ictimai nizamın daimi idarəsi .üçün, səmavi bir göstərişin haqq olmasını sübuta yetirmək üçündür

### Fərəc (həzrət Mehdinin (ə) zühuru ilə qurtuluş) intizarı

?Sual: ٤٣. İntizar nə deməkdir

Cavab: İntizar insanda hazırlıq yaradan ruhi bir keyfiyyətdir. İntizarın ziddi ümidsizlikdir. İnsanda intizar hissi gücləndikcə onun hazırlığı da artır. Əgər insan kiminsə yolunu gözləyirsə, vəd olunmuş vaxt yaxınlaşdıqca görüşə hazırlıq da yüksəlir. Bəzən intizar halı elə bir həddə çatır ki, insanın gözündən yuxusunu alır. Deməк, gözlənilən işə və ya kəsə məhəbbət artdıqca intizar dərəcəsi də artır. İntizarı çəkilən şəxsə eşq çox olduqca görüşə hazırlıq səviyyəsi də yüksəlir. İntizarı çəkilən şəxsin (müntəzirin) yubanması ağır bir dərdə dönür. Belə ki, gözü yola dikilmiş insan bütün .dərdlərini, problemlərini yaddan çıxarır

?Sual: ٤٤. İntizarın hansı xüsusiyyətləri var

Cavab: İntizar ilkin olaraq həyat xüsusiyyətidir. İnsan həyatının mahiyyəti gələcəyə intizar və ümidlə çox bağlıdır. Belə ki, intizarsız həyatın mənası yoxdur. İntizar olmadıqda həyatın davamı üçün həvəs olmur. Hazırkı həyat sabah və sabahlara doğru

təlaşdan ibarətdir. Hərəkət isə intizarsız mümkünsüzdür. İntizar həyatın davamına ümiddir və hazırkı həyatı mənalandırır. Həyatın davamı üçün enerji verən intizardır. Elə .bu səbəbdən həyatın mahiyyəti intizarla qırılmaz şəkildə bağlıdır

Həyatın davamı haqqında düşünən hər bir insan bütün hərəkətlərini uyğun intizar .yoluna istiqamətləndirir

İslami rəvayətlərdə oxuyuruq ki, peyğəmbər ümməti üçün ən fəzilətli əməl (həzrət Mehdinin (ə) zühuru) intizarıdır. Yəni intizarın əməli xüsusiyyəti həyata yol tapmaqdır. Uyğun səbəblərindən biri bu ola bilər ki, həzrət Mehdinin (ə) davamçıları özlərini imama çatdırmağa səy göstərsinlər. İmam öz zühuru intizarında olduğu kimi, ümmət .də öz imamının intizarını çəksin

İntizar halında ən yaxşı yol qeybdə olan imamla bağlılıq, həmdərdlikdir. İntizar və onun həqiqi mənasından xəbərsizlik düşüncəsizliyə və imamın qəm-kədərinə biganəliyə səbəb olur. Olsun ki, qeyb dövründə həqiqətən intizarda olmaq, yəni imamın cəmiyyətdə hüzurunu gözləmək ona beyətin ilkin yoludur. Çünki hüzurun intizarında olmaq vəd olunmuş imamın məqsədlərini yada salır, agahlıq üçün zəminə yaradır. İntizar çəkməmək zühurdan öncə və zühur vaxtı qəflət, düşüncəsizlik, biganəlik .mənasındadır

İntizarda olan cəmiyyəti ən sarsıdıcı hadisə belə məyus edə bilmir. Belə bir cəmiyyət daim öz imamına iqtida edib məqsəddən yayınmır. O elə bir imamdır ki, əsrlər boyu .davam edən üzücü hadisələrdən sarsılmamış, öz yolundan dönməmişdir

Həzrət Mehdi (ə) buyurmuşdur: “Allah bizimlə olduğundan bir başqasına ehtiyac yoxdur. Haqq bizimlədir və kimlərinsə bizdən kənarlaşması heç vaxt bizi ”.qorxutmayacaq

Bəli! İmam Mehdi (ə) belə bir intizardadır. O, sarsılmaz imanla həyatın bir çirkin qaranlığında möhkəm dayanmışdır. İntizarda olan cəmiyyət gözünü yola tikərək imamın uyğun xüsusiyyətini yaxşı tanımalı və imkan həddində onun kimi intizar .çəkməlidir

?Sual: ۴۵. İntizar hansı səciyyələrdən təşkil olunmuşdur

:Cavab: Xilaskarın zühuru intizarı üç xüsusiyyətə malik olmasa, zühur gerçəkləşməz

Əqidə səciyyəsi: İntizarda olan şəxs xilaskarın zühuruna və onun yardımına əmin .۱

.olmalıdır

.Nəfs səciyyəsi: İntizarda olan şəxs daim hazırlıq halında olmalıdır .۲

Əməli səciyyə: İntizarda olan şəxs daim əməl və rəftarı ilə xilaskarın zühuru üçün .۳ .ictimai və fərdi zəmin yaratmalıdır

.Bu üç səciyyədən biri yoxdursa, intizar məna kəsb etmir

?Sual: ۴۶. İntizarın neçə növü var

:Cavab: Fərəc (həzrət Mehdinin (ə) zühur) intizarı iki növdür

.Qurucu, təşviqedici, məsuliyyət yaradan intizar: bu, bəlkə də ən fəzilətli ibadətdir .۱

Ayə və rəvayətlərdən məlum olur ki, həzrət Mehdinin (ə) zühuru haqqın batil üzərində qələbəsi ilə başa çatan mübarizə halqalarındandır. İnsan əməldə haqq əhlindən olarsa, bu səadətə şərik olar. Məsum imamlar və rəhbərlər intizarın yetərincə dolğun təsvirini verərək onu bir əməl saymışlar. Həzrət Peyğəmbər (s) buyurur: "Mənim (ümmətimin ən fəzilətli əməli fərəc intizarıdır."(۱

İmam Sadiqdən (ə) nəql olunmuş digər bir rəvayətdə oxuyuruq: "Ən böyük əməl fərəc (intizarıdır."(۲

Hazırlığın və zəmin yaratmağın əhəmiyyətini imam Sadiqin (ə) bir buyuruğundan öyrənmək olar: "Sizin hər biriniz bir oxla da olsa, qeybdə olan imamın zühuru üçün (hazırlıq görməlisiniz."(۳

Dağıdıcı, iflicedici intizar: Bəziləri Məhdəviyyət, həzrət Mehdinin (ə) qiyamı dedikdə .۲ elə başa düşürlər ki, zühur sırf partlayış mahiyyətli bir hadisədir. Onların nəzərincə, bu zühur yalnız və yalnız zülm bütün yer üzünü bürüyəndə və bir nəfər olsun haqq .tərəfdarı tapılmayanda baş verəcək

Belə bir düşüncə islahatlarla zidd olduğundan, fitnə-fəsadı müqəddəs hərəkat üçün başlanğıc saydığından dialektikanın oxşarı adlandırılmalıdır. Dialektikada islahatlarla müxalifətçiliyin səbəbi mübarizənin daha da alovlu olmasıdır. Uyğun təfəkkür bir növ .arzu olunan məqsədə çatmaq üçün fitnə-fəsada rəvac verməyə çağırır

.Bu baxış dini fəaliyyətləri süstləşdirdiyindən heç bir İslam ölçüsünə sığmır

?Sual: ۴۷. İntizarın hansı ictimai təsirləri var

Cavab: İntizarın insan həyatının müxtəlif sahələrinə geniş təsiri var. Ən böyük təsir ictimai məsuliyyət və xeyirxahlıq yönümlərində özünü göstərir. Çünki intizar halında insanpərvərlik səciyyəsi var. İntizarda olan insanın imamın məqsəd və amalları ilə

qırılmaz bağlılığı mövcuddur. Zühur intizarında olan şəxs bu yolda addım atır. Uyğun hədəflərə doğru hərəkət edir. Onun bütün meylləri və seçimləri



---

۱- [۴۶] "Kəmaluddin", s. ۶۴۴.

۲- [۴۷] "Bihar", c. ۷۵, s. ۲۰۸.

۳- [۴۸] "Bihar", c. ۵۲, s. ۳۶۶.

nəzərdə tutulmuş məqsəd çərçivəsindədir. İmam Mehdi (ə) qəmlilərin həmdərdi, .məzlumların həqiqi yardımçısı, imkansızların hamisidir

Demək, intizarda olan cəmiyyət və insan imamın istək və hədəflərinə uyğun əməl etməli, məzlumlara və məhrumlara yardım göstərməli, dərdlilərin dərdinə məlhəm qoymalı, xalqın problemlərini gücü həddində həll etməlidir. Əgər bu şərtlər ödənsə, intizarda olan cəmiyyətdə məhrumlar, yoxsullar, əlacsız xəstələr, problemli insanlar .qalmaz

Olsun ki, bəzi rəvayətlərdə rastlaşdığımız "fərəc intizarı özü fərəcdir" təbiri intizar çəkən cəmiyyətdə xalqın bir çox problemlərinin aradan qalxmasına işarədir. Belə bir cəmiyyət öz imamının məqsədlərini ən azı öz mühitində gerçəkləşdirir. Bu səbəbdən (də imam Riza (ə) buyurur: "Fərəc intizarı fərəcdəndir."(١)

?Sual: ۴۸. İntizar səciyyəsi intizarda olanların hərbi hazırlığına necə təsir göstərir

Cavab: İntizar hər şeydən öncə bir əqidədir. Bu əqidə növbəti mərhələdə əməldə aşkara çıxır və intizarda olan insan öz coğrafi, mədəni, ideoloji ərazisinin, eləcə də, həmməsləklərinin keşiyində durur. O, yaxın və uzaq üfüqləri diqqətlə izləyir, düşmən ordusundakı bütün hərəkətləri nəzarətdə saxlayır, ideoloji, coğrafi səngərini .düşməndən müdafiə edir, hazırlıq əldə etdikdə hücuma da keçir

Beləcə, intizarda olan cəmiyyət daim hərbi hazırlığa çağırılır. O, hərbi vasitələr və qüdrət əldə etməyi özünə vəzifə bilir. Fəqihlər cihad kitabında "mürabitə" və "rəbat" ünvanlı mövzulardan söz açır. Yəni möminlər sərhədlərdə mövqe tutub hazır .olmalıdırlar ki, düşmənin hücumuna layiqincə cavab verib ölkələrini xilas edə bilsinlər

Mürabitə və rəbat sözlərinin digər mənası imamla rabitə qurmaq, imamın xidmətində dayanmaq, imamın göstərişlərini həyata keçirməkdir. Bilin ki, möminlərin cəmiyyəti öz imamları ilə rabitə qurmalı, imamın vilayət ipindən yapışmalı, onunla peyman bağlayıb yardım göstərməlidir. Belə bir mürabitə hər bir fərdə "eyni" (bütün hallarda) vacibdir. (Bu rabitə iman sütunlarındandır və bu sütunsuz əməllər qəbul olmur.(٢

İmam Sadiq (ə) “Ali-İmran” surəsinin ٢٠٠-cü ayəsinin təfsirində belə buyurur: “Çətinliklər qarşısında dözümlü olun, vəzifələrinizin icrasında möhkəmlik göstərin, (imamlarla rabitə qurun.”(١)

İmam Sadiq (ə) nəql olunmuş digər bir rəvayətdə “rabitul” sözünün imamın yanında (olmaq mənasını bildirdiyi bəyan olunur.(٢)

?Sual: ٤٩. İntizarın gerçəkləşməsində səbir xüsusiyyətinin nə kimi təsiri var

Cavab: İntizarın əsil ruhu müqavimət və səbirdir. Nəzərdə tutulan məqsədin gerçəkləşməsi intizarında olan kəs məqsədə çatanadək möhkəm və dözümlü olmalı, .süstləşməməlidir

O hər bir çətinliyi dözümlə qarşılamalıdır. Səbir və dözümünü əldən vermiş insan intizarı da əldən verir. Çünki səbir və dözüm intizar şərtidir. Bu səbəbdən də hədislərdə .fərəc intizarı haqqında danışılarkən səbir xüsusiyyətinə toxunulur

İmam Riza (ə) buyurmuşdur: “Dözün, fərəc intizarı necə də gözəldir.”(٣) Zühur üçün vaxt təyin olunmamışdır. Bu hadisə gözlənilmədən baş verəsidir. Bu səbəbdən də hər .an intizarda olmaq lazım gəlir

?Sual: ٥٠. Fərəc intizarı nədir

Cavab: Sonda haqqın batilə qələbə çalacağına, bütün insani dəyərlərin qüvvəyə minəcəyinə, ideal bir cəmiyyətin qurulacağına, Mehdi adlı bir şəxs tərəfindən bütün bu məqsədlərin həyata keçiriləcəyinə inam azca fərqlə bütün İslam məzhəblərində .mövcuddur

Bu düşüncə hər şeydən çox təbiət nizamının hərəkətinə və tarixin təkamülünə nikbinliklə, gələcəyə ümid və dünyanın sonuna bədbin baxışın rədd edilməsi ilə müşayiət olunur. (İslamdan fərqli olaraq bir çox digər nəzəriyyələrdə dünya həyatının .(sonu qaranlıq və puçdur

Hər şeyin belə bir xoş sonluqla başa çatacağına ümid İslam rəvayətlərində “fərəc .intizarı” adlandırılmışdır

?Sual: ۵۱. Fəlsəfi məktəblər fərəc intizarını dəyərli sayırmı



---

.Təfsire-Əli ibn İbrahim", c. ۱, s. ۱۲۹" [۵۱] -۱

.Əl-Ğeybət", Nemani, s. ۱۹۹" [۵۲] -۲

.Bihar", c. ۵۲, s. ۱۲۹" [۵۳] -۳

Cavab: Dünyanın sonunda xilaskarın zühuru intizarı və bəşəriyyətin mövcud vəziyyətindən xilası təkcə İslam və digər səmavi dinlərə aid deyil. Bir sıra qeyri-dini fəlsəfi məktəblər də belə bir nəzəriyyəyə inanırlar. Rassel deyir: "Xilaskarın intizarı və nicatverici zühura etiqad təkcə səmavi dinlərə yox, qeyri-dini və materialist ".məktəblərə də aiddir. Onlar da bəşər cəmiyyətini xilas edəcək şəxsin intizarındadır

?Sual: ٥٢. Yəhudilərin müqəddəs kitabında fərəc intizarı haqqında danışılırmı

Cavab: Yəhudilərin enişli-yoxuşlu tarixində vəd olunmuş xilaskarın zühuru ilə bağlı məlumatlar var. Müqəddəs kitablardan olan "Əhdi-qədimdə" Davudun nəğmələri kitabında ٣٧-ci nəğmədə oxuyuruq: "Şər adamların və zalımların varlığı səni məyus etməsin; Çünki zalımların nəsli yer üzündən kəsiləcək. İlahi ədalətin intizarında olanlar yer üzünə varis olacaq. Allahın lənətinə gələnlər arasında təfriqə düşəcək. O kəslər ".salehdir ki, yer üzünə varis olub, tarixin sonunadək yer üzündə ömür sürəcəklər

Rum valilərinin Fələstinə hökmranlığı zamanı ilahi yardıma intizar həyəcanı zirvə həddinə çatdı. Bu səbəbdən də Yəhya "Tövbə edin, fələklər yaxındadır" deyərək nida çəkdiyi vaxt xalq onun çağırışına can-dildən səs verdi. Yəhyanın sözləri eşidənlərin qəlbini silkələdi, məzlumlar bu sözlərdən şövqə gəldi, onların qəlbində Məsihin intizar .şövqü daimi olaraq alovlanırdı

?Sual: ٥٣. Məsih (xilaskar) intizarı nə deməkdir

Cavab: Yəhudilər möhnət dolu tarixləri boyu ümid etmişlər ki, bir gün Məsih gələcək, dünyaya hakim olub onları zillət girdabından xilas edəcək. İndi də Fələstini işğal etmiş sionistlər qəsbkar İsrail rejiminin banisinin ildönümünün sonunda ibadət şeypurlarını üfürdükdən sonra bu sayaq dua edirlər: "Allahımızın iradəsi budur ki, Onun lütfü ilə (azadlıq üfüqünü görək və Məsiha surunun səsi qulaqlarımıza nəvaziş versin."(١

Bəli – İsrail qövmünü öz qaranlıq keçmişi ilə xoşbəxt gələcək intizarında olması çox təbiidir. Bu həmin qövmdür ki, xilaskar kimi onlara üz tutmuş həzrət Musanı tərəddüdlə qarşıladı. Bu ruhiyyə hələ də onlardan əl çəkməmişdir. Yalnız həzrət Davudu padşah seçməklə

bu qövmün arzusu yerinə yetmiş oldu. Davud yəhudi padşah nümunəsi olaraq əbədi xilaskarlıq simvoluna çevrildi. Əslində bəzi peyğəmbərlər və hikmət sahibləri də onu (məsih kimi tanıyırlar.(١

Davud və Süleyman əsrini yəhud qövmünün düşüncəsində Məsiha amanlarının çiçəklənməsi dövrü saymaq olar. Məsiha ümidi Bəni-İsrail hökumətinin ikiyə .bölünməsi ilə (həzrət Süleymandan sonra) daha da ciddiləşdi

Peyğəmbərlər nəinki şövq atəşini diri saxlayır, hətta Məsiha məfhumunu daha da genişləndirirdilər. Onlar inanırdılar ki, Allah tərəfindən xilaskar göndəriləcək şəxs .əksər peyğəmbərlər tərəfindən qəbul olunmuşdur

İşəya"nın verdiyi xəbərlərdə xilaskar haqqında aşkar məlumatlar var. Yəhud" qövmünə təsəlli verən xilaskarlıq ideyası həmin şəxsin öncəgörmələrində təsvir olunmuşdur. Xilaskar ideal ədalətli hökumət qurası, həmin dövrdə bütün yer üzü ilahi mərifətə bürünəsidir. Necə ki, sular dənizi örtür. Bu hadisə Bəni-İsrail dininin bütün yer üzünə yayılmasından sonra baş verəsidir. Möminlərin bayrağı ucalası, ümmətlər (xilaskarı tələb edəsidir.(٢

Həmin xəbərlərdə oxuyuruq: "Axır əyyamda Allah evinin damı dağların qülləsində (qərar tutacaq. Bütün ümmətlər ona doğru yola düşəcək..."(٣

Səfənyanın bəzi xəbərləri İşəyanın xəbərlərindən əhatəlidir. Onun nəzərincə, məsiha əsri bütün yer üzünün islah dövrüdür. Çünki həmin dövrdə bütün ümmətlərə pak din veriləcək və onlar birlikdə "Yəhvə" deyə çağıracaqlar. Hamı birlikdə ona ibadət edəcək. Məsihanın ardıcılı olan Təlmud belə təsvir olunur: O, Davud səltənətindən olan bir şəxsdir. Onun müqəddəsliyi yalnız təbii bəxşişləri səbəbindəndir. Müşrik ümmətlər onun əli ilə məhv ediləcək, Bəni-İsrail qüdrətə çatacaq. ("Yəhud ayinində Məsiha (intizarı", s.۶۵

?Sual: ۵۴. Fərəc intizarı ilə bağlı mütləq rəvayətlər dedikdə nə başa düşülür

Cavab: Bəzi şiə və sünni rəvayətlərində fərəc intizarı məsələsi ümumi şəkildə qeyd (olunur. Bu qəbil rəvayətlərdə həzrət Mehdinin (ə

---

۱- [۵۵] “۲۵ ,۳۷:۲۴ ,”Hizqiyal“ ;۳۰:۹ ,”Ərəmya“ ;۳:۵ ,”Huşə.

۲- [۵۶] “۳:۹ ,”Səfənya“ ;۱۱:۱۰ ,”İşəya.

۳- [۵۷] “۲-۴ :۲ ,”Səfənya.

zühuru qeyd olunmur. Həzrət peyğəmbərdən nəql olunmuş hədisdə oxuyuruq: ("İbadətlərin ən üstünü fərəc intizarıdır."(١

(Başqa bir rəvayətdə həzrətin dilindən belə nəql olunur: "Fərəc intizarı ibadətdir."(٢

Başqa bir rəvayətdə isə belə buyurulur: "Mənim ümmətim üçün ən fəzilətli əməl Allah-(təalanın fərəc intizarıdır."(٣

Şeyx Səduq nəql edir ki, imam Riza (ə) buyurmuşdur: "Fərəc üçün səbir və intizar necə də gözəldir! Məgər Allahın "siz intizar çəkin, Mən də intizardayam" buyurduğunu eşitməmisinizmi? Səbiri yaddan çıxarmayın! Çünki fərəc ümidsizlikdən sonra gəlir. (Doğrudan da, sizdən əvvəlkilər sizdən daha səbirli idi."(۴

Mərhum Məclisi imam Sadiqin (ə) dilindən belə nəql edir: "Pəhrizkarlıq, iffət, qurtuluş (və səbrlə fərəc intizarı imamların dinindəndir."(۵

Termizi həzrət Peyğəmbərin (s) dilindən belə nəql edir: "İbadətlərin ən üstünü fərəc (intizarıdır."(۶

Fərəc intizarı dedikdə zahirən həzrət Mehdinin (ə) zühuru nəzərdə tutulur. Müxtəlif firqələrdə məxsus hədislərdə həzrət xalqı zülm-sitəmdən xilas edən şəxs kimi .tanıtdırılır

Şeyx Səduq imam Sadiqdən (ə) belə nəql edir: "Bizim Qaimin (həzrət Mehdinin (ə)) (şiələrinin xoş halına! O kəslər ki, qeyb dövründə onun intizarındadırlar."(٧

Belə bir məna sünni əhlinin rəvayətləri ilə də uyğun gəlir. Onlar həzrət Mehdinin (ə) .dünyaya gəlişinə inanmasalar da, onu bəşəriyyətin xilaskarı kimi qəbul edirlər

Dəlillər əsasında ümumi hədisləri müəyyənləşdirib onları həzrət Mehdinin (ə) qiyamına tətbiq etmək olar. Əsas məsələ hökm və mövzu arasındakı tənasübdür. Bir bu qədər .mühüm sayılan fərəc intizarı, şübhəsiz ki, vəd olunmuş günün intizarıdır



---

.Bihar", c. ۵۲, s. ۱۲۵; "Kəmaluddin", s. ۲۶۷" [۵۸] -۱

۲- [۵۹] “Bihar”, c. ۵۲, s. ۱۲۲; “Cameus-Səğir”, c. ۱, s. ۴۱۶.

۳- [۶۰] “Bihar”, c. ۵, s. ۱۲۲.

۴- [۶۱] “Kəmaluddin”, s. ۶۴۵.

۵- [۶۲] “Bihar”, c. ۵۲, s. ۱۲۲.

۶- [۶۳] “Sünəne-Termizi”, c. ۵, s. ۲۲۵.

۷- [۶۴] “Kəmalud-Din”.

?Sual: ۵۵. Xilaskarın intizarının hansı imtiyazları var

Cavab: Sünnə əhli həzrət Mehdinin (ə) fərəc intizarını qəbul etsə də, onun dünyaya gəlişinə inanmır. İmamiyyə şiə məzhəbi və bəzi digər İslam məzhəblər bu əqidədədirlər ki, xilaskar hal-hazırda mövcuddur, əməl və rəftarlarımızı, eləcə də, müsəlmanların problemlərini görür. Bu sayaq intizar daha böyük təsirə malikdir və cəmiyyətdə ümid ruhunu gücləndirir. Fərəc həqiqətinə inanan, amma xilaskarın həyatda olduğunu və əməlləri müşahidə etdiyini qəbul etməyən kəs intizardan bir o qədər də faydalanmır. İmamın (ə) dünyada olduğuna inanan kəs isə əmindir ki, çətinliyə düşdükdə imam onun yardımına yetişəcək. Bu sayaq etiqadın insan ruhiyyəsinə böyük təsiri var. Belə bir təsir sadəcə fərəcə etiqadın təsiri ilə müqayisəyə .gəlməz

Şiələr imamın dünyada olması ilə müşayiət olunan intizara inandıqlarından tarix boyu .məyus olmamış, problemlərə boyun əyməmişlər

Şiə insan həmişə özünü xilaskarla yanaşı hiss edir və bu hiss onun tərbiyə və imanına .böyük təsir göstərir

?Sual: ۵۶. Fərəcin (zühurun) təxirə düşməsi qəlbi daşlaşdırmırmı

Cavab: Hər bir möminə, bəlkə də hər bir insana vacibdir ki, fərəcin təxirə düşməsindən məyus olmasın. İnsan mənzil başına çatmaq üçün səbir ipinə sarılmalıdır. Qəlb imanı üçün yeganə çıxış yolu budur. Allah heç vaxt vədinə xilaf çıxmır. İnsan keçmiş ümmətlərin böyük çətinliklərindən sonra Allah-təalanın yardımı ilə xilas olduğunu yada saldıqda arxayınlaşır. Eləcə də, fitrət və daxili meylə müraciət etdikdə xilaskarın .zühuruna batini meyl insana ümid verir

İmam Sadiq (ə) "Hədid" surəsinin ۱۶-cı ayəsi ilə bağlı buyurmuşdur: "Bu ayə qeyb dövrünün insanlarına ünvanlanmışdır. Qeyb dövrü digər dövrlərdən fərqlənir. Allah-təala öz höccətinə (xilaskara) şəkki şiələrə qadağan etmişdir. İnsan düşünməməlidir (ki, Allah yer üzünü hətta bir göz qırpımı höccətsiz qoya bilər."(۱

?Sual: ۵۷. Uzun-uzadı fərəc intizarı yorucu deyilmi

Cavab: Əgər intizar kamil bir hazırlıqla müşayiət olunsa, nəinki yorucu olmaz, hətta insanda daimi bir ümid yaradar. İntizarda olan mömin daim xilaskarın yolunu gözləyir. Belə bir insan daim öz məhbubuna çatmaq eşqi ilə gecədən gündüzə, gündüzdən .gecəyə çıxır

Digər bir tərəfdən, həqiqi xilaskarın intizarı insanı imam tərəfindən hər an feyzlərdən .qidalandırır və yorğunluğu aradan aparır

Əsrin imamının intizarında bir çox təsirlər və bərəkətlər var. Vaxtı çatanda bu barədə .danışacağıq

?Sual: ۵۸. Xilaskarın intizarının hansı təsirləri var

:Cavab: İntizarın zəruriliyi və əhəmiyyətini müxtəlif baxımlardan araşdırmaq olar

İntizar ümumdünyəvi bir hərəkat üçün hazırlıqdır. Belə bir hazırlıq dövrünə malik .۱ .olmayan istənilən bir inqilab naqis və səmərəsizdir

İntizarın əhəmiyyətindən danışarkən yalnız bunu qeyd etmək kifayətdir ki, . ۲ düşmənlər onu öz istismarçı hökmranlıqları üçün təhlükə sayırlar. Mişel Foker və Kler Beryer Mehdi təfəkkürü ilə mübarizə haqqında danışarkən öncə imam Hüseynin (ə) qiyamını, sonra həzrət Mehdinin (ə) intizarını şiəliyin iki möhkəm sütunu kimi tanıtdırırlar. Teləviv konfransında Bernard Luis, Maykl Emci, Cenşer, Bronberq və Martin Kramer kimiləri bu məsələ üzərində ciddi dayanmışlar. Onlar şiələr haqqında danışarkən deyirlər: "Şiələr imam Hüseynin adı ilə qiyama başlayır, imam Mehdinin (ə) adı ilə qiyamlarını qoruyurlar."(۱) Alman tədqiqatçısı Marvin deyir: "Şiələrə ümid verən mühüm ictimai məsələlərdən biri onların əsrin imamına etiqadları və bu imamın (zühurunu gözləməlidir."(۲

Rus tarixçisi Petruşevski bu barədə yazır: "۱۳-cü əsrin qiyamlarını İranda bərpa edən ".Mehdi intizarına inam yetərincə uca bir məqamdır

İntizar dövrü fitnə-fəsad, problemlər dövrüdür. Belə bir dövrdə şiələrə ruh verən diri .۳

.və hazır imamın İntizarına bağlılıqdır

Çirkin sifətlərdən uzaqlıq, əxlaqi fəzilətlərin əldə olunması intizarın digər . ۴ :faydalarındandır. İmam Sadiq (ə) buyurmuşdur



---

.Məcəlleyi-baztabe-əndişe", xordad, ۸۰, c. ۱۹۳" [۶۶] -۱

.İslam Siyasəti", Marvin, s. ۴۹, ۵۰" [۶۷] -۲

Həzrət Qaimin (ə) (Mehdinin) yaxınlarından olmaq istəyən hər kəs intizar çəkməli,“
”.eyni zamanda pəhrizkar və əxlaqlı olmalıdır

Düşüncənin işə salınması və bəsirət intizarın nəticələrindəndir. Fitnə-fəsad insanları .۵ qəflətdə saxlamaqdan əlavə, cəmiyyətin düşüncəsində şəkk-şübhə yaradır. Yalnız həqiqi intizarda olan kəs yetkin agahlığa çatdığından oyaqdır və şübhələrə təslim .olmur

İmam Sadiq (ə) buyurmuşdur: “Xoş o insanların halına ki, bizim Qaimimizin (ə) qeybəti (dövründə göstərişlərimizə əməl edir və nəticədə qəlbi hər növ batildən uzaq olur.”(۱

İntizar insanı əmələ sövq etdiyindən və cəmiyyəti hərəkətə gətirdiyindən şəriətin .۶ .qorunmasında dəyərli bir amildir. İntizar fərdi və ictimai islah amilidir

.İntizar insanı əmələ sövq etdiyindən xilaskarın zühuru üçün zəmin yaradır .۷

**Başqa dinlərin xilaskarın zühuruna baxışı**

?Sual: ۵۹. Digər dinlər və millətlər xilaskarın zühuruna inanırmı

Cavab: Xilaskarın zühuruna etiqad reallıq, ədalətin davamı, fitri bir həqiqət olduğundan .bütün millətlərdə və dinlərdə belə bir inanc mövcuddur

Məhəmməd Əmin Zeynəddin deyir: “Cəmiyyətin islahına etiqad bəşər tarixi boyu düşüncələrdə yer tapmışdır. Bu inanc təkcə İslama aid deyil. Hələ islamdan öncə səmavi dinlərdə bu məsələyə toxunulmuşdur. Hətta xilaskarın xüsusiyyətləri və onun görəcəyi işlər haqqında açıqlamalar verilmişdir. Onlar xilaskarı “Mehdi”, onun islahçı dəvətini “Məhdəviyyət” adlandırmasalar da, belə bir əqidə mövcuddur. Bu əqidə hətta ”...zərdüştilikdə və brahmançılıqda da nəzərə çarpır

:Səmavi və qeyri-səmavi dinlərdə belə inanclarla rastlaşırıq

;Yəhudilər Üzeyrin və ya Minhas ibn Azir ibn Harunun qayıdışına inanırlar .۱

;Məsihilər İsanın qayıdışını gözləyirlər .۲

;Zərdüştilər Bəhram şahın qayıdacağı ümidindədirlər .۳

;Hindular Fişnovanın qayıdışını gözləyirlər .۴

;Məcusilər Uşidrin qayıdacağına inanırlar .۵

...Buddistlər Buddanın zühuru intizarındadırlar .۶



---

.Həmin mənbə, s. ۱۲۳ [۶۸] -۱

?Sual: ۶۰. Zühur gününün təsviri nə vaxtdan mövcuddur

Cavab: Zühur gününün təsviri yaranışın başlanğıcından verilmişdir. Çünki bu gün o, yaranışın əsas hədəfidir. Bu məsələnin aydınlaşması üçün bəzi nöqtələri nəzərdən :keçirək

Ümumdünya ədalət hökumətinin qurulması üçün iki ödənməlidir: geniş mənada .۱ ədalət məfhumu ilə tanışlıq və yer üzündə ədalətin bərpası yolunda fədakarlığa hazırlıq. Yaranışın başlanğıcından bəşəriyyətdə bu iki şərt xüsusiyyət olmamışdır. Peyğəmbərlərə bəşəriyyətdə məhz bu iki xüsusiyyəti tərbiyə etmək tapşırılmışdır. Peyğəmbərlər ədalətin tanıtdırılması məsələsində müvəfəqiyyətə çatsalar da, tarix boyu insanlarda zəruri fədakarlıq hissini tərbiyə edə bilməmişlər. İkinci şərtin .ödənməməsi peyğəmbərlərin yox, xalqın təqsiridir

Peyğəmbərlər tarix boyu xalqın nəzərinə çatdırmışlar ki, yaranışın əsas məqsədi .۲ həmin ümumdünya ədalət hökumətinin qurulmasıdır. Allah-təala buyurur: “Zikrdən (Tövratdan) sonra Zəburda yazdıq ki, saleh bəndələrin yer üzünə (hakimiyyətə) varis (olacaqlar.”(۱

Digər bir ayədə oxuyuruq: “Biz yer üzünün müstəzəflərinə minnət qoyub, onları yer (üzünün rəhbərləri və varisləri qərar vermək istəyirik.”(۲

Başqa bir ayədə buyurulur: “O, müşriklər xoşlamasalar da, öz peyğəmbərini bütün (dinlərə qalib etmək üçün hidayət və haqq dinlə göndərən kəsdir.”(۳

Heç bir peyğəmbərin ümumdünya ədalət hökuməti qurmaq üçün şəraiti olmamışdır. .۳ :Çünki belə bir hökumətin qurulması üçün zəruri olan iki şərt ödənməmişdir

a) Peyğəmbərlər ədalət məfhumunun geniş mənasını xalqa aydınlaşdırsalar da, bəşəriyyətin belə bir həqiqəti dərk etmək üçün ağıl gücü olmamışdır. Ona görə də keçmiş peyğəmbərlərin məqsədi xalqın əqidəsini möhkəmləndirmək olmuşdur. Həzrət Musadan İslam peyğəmbərinin besətinədək olan dövrdə, xüsusi ilə İslam .hökumətində bu məsələ ətraflı şəkildə bəyan olunmuşdur

b) Hazırkı dövrədək heç bir ümmətdə ümumdünya ədalət hökuməti yolunda tam

.fədakarlıq göstərmək hazırlığı olmamışdır



---

.Ənbiya”, ۱۰۵“ [۶۹] -۱

.Qəsəs”, ۵“ [۷۰] -۲

.Saf”, ۹“ [۷۱] -۳

Həzrət Nuh ۹۵۰-il öz qövmünü haqq-ədalətə dəvət etdi. Amma yalnız kiçik bir qrup ona iman gətirdi. Həzrət İbrahimin dəvətini qəbul etmək əvəzinə insanlar onu oda atdılar. Həzrət Musanın qövmü onun Fələstin hakimləri ilə mübarizəyə çağırışını rədd edib (dedilər: "Sən və sənin Allahın onlarla savaşsın, biz burada oturmuşuq."(۱

Həzrət İsanın həvariləri Allahın qüdrətinə şəkk etdilər. Onlar İsaya xitabən dedilər: "Ey (İsa ibn Məryəm! Allahında bizim üçün səmadan nazil etmək qüdrəti varmı?"(۲

?Sual: ۶۱. Hindu ayinlərində xilaskar kimdir

Cavab: Hinduların müqəddəs kitablarında da xilaskarın zühuru haqqında müjdələr var. Bu kitablarda deyilir: "Dördüncü dövrün axırlarında yer əhli fəsada çəkilər və onların əksəri kafir olar. Onlar böyük günahlar edərlər və hakimləri alçaq bir şəxs olar. Həmin dövrün insanları bir-birini yırtan canavara bənzəyər. Kahinlər və din adamları yolunu azar, haqq oğruların əlinə düşər, təqvalı və zahid insanlar alçaldılar... Həmin vaxt "Brəhman Kəla", yəni şücaətli bir dindar zühur edər və öz iti qılıncı ilə yer üzündə (fəsadın kökünü kəsər. O pak insanları hifz edəcək."(۳

Şakomuni kitabında deyilir: "Dünya hakimiyyəti aləmin yaranmışlarının ağası nəslindən olan böyük "Kəşnin" əlinə keçəcək. O şərq və qərb dağlarına hakim olacaq. Bütün ilahi (dinlər bir dinlə əvəz olacaq. Adı Qaim olan bu şəxs Allahın dinini canlandıracaq."(۴

Hindu kitablarından olan Vişn-cok kitabında yazılır: "Dünyanın sonunda hakimiyyət Allahı sevən və Onun xalis bəndələrindən olan bir şəxsin əlinə keçəcək. Onun adı (Xoşbəxtdir."(۵

Hindu kitablarından olan "Bask" kitabında yazılır: "Dünya həyatı adi bir şəxsin hakimiyyəti ilə tamamlanacaq. O, mələklərin, cin və insanların rəhbəridir. Haqq onunladır. O, suya, quruya, dağlara hakim



---

.Maidə", ۲۴" [۷۲]-۱

.Maidə", ۱۱۲" [۷۳]-۲

olacaq. Göylərdə və yerdə olandan xəbər verəcək. Ondan böyüyü dünyaya (gəlməmişdir.”(۱

Upanişad” kitabında deyilir: “O, dünyanın axırlarında zühur edər. Ağ ata süvar olar,“ əlində yalın qılınc tutar. Quyruqlu ulduz tək işıq saçar. Bütün rəzil insanları həlak edər, (yeni bir həyat qurar. Paklığı yer üzünə qaytarar.”(۲

?Sual: ۶۲. Buddizm kimi xilaskar sayır

Cavab: Buddizmin banisi Budda adı ilə tanınan Sidharta Cutuma adlı bir şəxsdir. O, Nepalda dünyaya gəlmişdir. Buddistlər onu Allahın oğlu sayırlar və inanırlar ki, dünyanın axırlarında bu şəxs zühur edəcək. Budda zühur edib yer üzündəki çətinliklərə son qoymalıdır. Onlar deyirlər: “Budda vəzifəsini başa vurmaq üçün cəsədi ilə birlikdə .səmaya qalxmışdır. Növbəti dəfə yerə qayıdar ki, sülh və bərəkəti xalqa qaytarsın

Buddizmin iki böyük məzhəbi var: ifrata varıb Buddanı Allahın oğlu sayan şimal məzhəbi; bir o qədər də ifrata varmamış cənub məzhəbi. Onlar əsasən şərqi Asiya .məntəqəsində məskunlaşmışlar

?Sual: ۶۳. Zərdüştilər kimi xilaskar sayır

Cavab: Zərdüştilərin “Zənd” adlı məşhur kitabında Yəzdan və Əhrimənin (haqla batilin) əbədi savaşından danışıldıqdan sonra deyilir: “Nəhayət, Yəzdan qələbə çaldıqdan və Əhrimənin nəsli kəsildikdən sonra yer üzündə əsl xoşbəxtlik bərqərar olar. Adəm (övladları xoşbəxtlik və bərəkətə çatarlar.”(۳

Camasibnamə” kitabında zərdüştilər haqqında deyilir: “Haşimilər nəslindən cüssəli bir“ şəxs zühur edər, cəddinin dini və böyük bir qoşunla İrana üz tutar. Yer üzünü (abadlaşdırıb, ədaləti bərpa edər.”(۴

Həmin kitabda İslam peyğəmbərinin (s) nübüvvəti müjdə verildikdən sonra deyilir: “Peyğəmbər qızının nəslindən bir şəxs xilafətə çatar, yer üzündə haqqı bərpa edər. O, İslam peyğəmbərinin (s) yer üzündəki son xəlifəsidir və onun hakimiyyəti qiyamət (gününədək davam edər...”(۵

---

۱- [۷۷] "Bəşarəte-zühur", s. ۱۸.

۲- [۷۸] "Upanişad", s. ۷۳۷.

۳- [۷۹] "Bəşarətul-əhdeyn", s. ۲۳۷, ۲۳۸.

۴- [۸۰] "Bəşarətul-əhdeyn", s. ۲۴۳, ۲۴۴.

۵- [۸۱] "Bəşarətul-əhdeyn", s. ۲۷۳.

Avestanın şərhi olan “Zənde-Bəhmən” kitabında zərdüştün dilindən belə nəql olunur: “Suşyansın zühurundan öncə yer üzünü yalan, dinsizlik, açıq-saçıqlıq bürüyər. İnsanlar Allahdan uzaq düşüb zülm və fəsada uğrayarlar. Bu dəyişikliklər dünyanı qarışdırar və xilaskarın zühuru üçün şərait yaranar. Zühur zamanının əlamətləri var: Səmada qəribə hadisə baş verər və bu hadisə zühur nişanəsidir. Mələklər onun izni ilə dünyanı xəbərdar etmək üçün göndərilər...”(١)

Yenə də “Zənde Bəhmən Yəsən” kitabında oxuyuruq: “Bundan sonra Suşyans” dünyanı paklayar və sonra qiyamət qopar.”(٢)

Həmin kitabda deyilir: “Suşyans sonuncu gələn kəsdir və Zərdüşti xilas edər.”(٣)

Sual: ۶۴. Yəhudilər kimi xilaskar sayır?

Cavab: Yəhudilərin müqəddəs kitabını araşdırdıqda məlum olur ki, bu kitablarda böyük vədlə bağlı işarələr vardır. Əksər Yəhudi kitablarında, o cümlədən Davudun Zəburunda uyğun məlumatlarla rastlaşırıq.

Qurani-Kərimdə buyurulur: “Həqiqətən, zikrdən (Tövratdan) sonra Zəburda yazdıq ki, yer üzünə saleh bəndələrim varis olacaq.”(۴)

Davudun Zəburunda oxuyuruq: “Pərvərdigarə! Öz hakimiyyətini bərpa et, ədalətini Məlik övladına əta buyur ki, xalqla yaxşı mühakimə aparsın, əldən düşənlərə insaf etsin... Bütün padşahlar ona müti olub, bütün millətlər xidmətində durar...”(۵)

Sual: ۶۵. Nə üçün həzrət Məsih (xilaskar) bu vaxtadək sağdır?

Cavab: Həzrət Məsihin bu günədək sağ qalmasının ağlımız dərk edən bir sıra səbəbləri var:

١. Həzrət İsada başqa peyğəmbərlərdə olmayan bir xüsusiyyət var. Atasız dünyaya gəlməsi, ölüləri diriltməsi, səmaya qalxması onu fərqləndirən səciyyələrdir.

٢. Onun diriliyi imam Mehdinin (ə) qeybə çəkilməsini mümkün edən dəlillərdəndir. Çünki həzrət Məsihin yaşı iki min ili aşdığı halda hələ ki, həzrət Mehdi (ə) bu qədər yaşamamışdır. Həzrət Xızırın ömrünün uzunluğu da rəvayətlərdə belə izah olunur.

---

۱- [۸۲] "Camasibnamə", s. ۲۵.

۲- [۸۳] "Zənde Bəhmən Yəsən", s. ۱۹.

۳- [۸۴] Həmin mənbə, s. ۱۵۰.

۴- [۸۵] "Ənbiya", ۱۰۵.

۵- [۸۶] "Əhde-qədim", n. ۷۲.

Şeyx Səduq “Kəmalud-din” kitabında İmam Sadiqin (ə) dilindən belə nəql edir: “Bəli, Allah həzrət Qaim (Mehdi (ə)) üçün uzun bir ömür müəyyənləşdirəndə bilirdi ki, bu həqiqət bəndələri tərəfindən inkar olunacaq. Ona görə də, Qaimin (ə) ömrünün (uzunluğuna dəlil olsun deyə, saleh bəndəsinin ömrünü uzatdı…”(۱

Sual: ۶۶. Ümumdünya ədalət hökumətinin təşkilində həzrət Məsihin iştirakının səbəbi ?nədir

Cavab: Həzrət Məsihin həzrət Mehdinin (ə) təşkil edəcəyi hökumətdə iştirakının bir sıra :səbəbləri var

Məsihilər (xristianlar) dünya əhalisinin böyük bir hissəsini təşkil edir. Ona görə də .۱ həzrət Məsihin səmadan nazil olması və həzrət Mehdiyə (ə) iqtida etməsi bütün .məsihilərin həzrət Mehdiyə (ə) təslim olması ilə nəticələnəcək

Həzrət Məsihin bu hökumətin təşkilində iştirakı və bütün məsihilərin həzrət Mehdiyə .۲ (ə) tabe olması ilə ədalət qiyamı daha tez və asan qələbə qazanacaq. Məsihilər həzrət Mehdiyə (ə) iman gətirdiyindən yer üzünün böyük bir hissəsində qan tökülmədən .ədalət bərqərar olacaq

?Sual: ۶۷. Həzrət İsa yerə qayıdacaqmı

Cavab: Quran və İncilin buyuruqlarına əsasən səmaya qalxmış həzrət İsa tarixin .sonunda yerə enəcək

Yuhanna İncilində deyilir: “Sizə deyirəm eşidin: Mən gedirəm və yenidən sizə doğru (qayıdacağam.(۲

:Quranda da həzrət İsanın qayıdışına işarə olunmuşdur

(O (İsa) beşikdə və qoca vaxtında xalqla danışar.”(۳“ .۱

Bildiyimiz kimi, həzrət İsa göyə qalxdığı vaxt onun ۳۰ yaşı vardı. Onun qoca yaşında .xalqla danışması səmadan enəcəyinə işarədir

Bütün məsihilər ölümündən qabaq ona (məsihə) iman gətirər və qiyamət günü (İsa)“ .۲

(onlara şahid olar.”(۴

Ayədəki “bihi” və “məvtihi” əvəzlikləri həzrət İsaya işarədir. Ayədən aydın olur ki, (həzrət İsa dünyanın axırlarında səmadan nazil olacaq və xalq ona iman gətirəcək.(۵



---

۱- [۸۷] “Kəmalud-din”, s. ۳۵۷.

۲- [۸۸] “Əhdi-cədid”, Yuhanna İncili, s. ۳۳۹.

۳- [۸۹] “Ali-İmran”, ۴۶.

۴- [۹۰] “Nisa”, ۱۵۹.

۵- [۹۱] “Səhihe-buxari”, c. ۴, s. ۱۴۳.

(Həqiqətən, İsa qiyamət üçün aşkar bir əlamətdir. Ona şəkk etməyin.”(١ .٣

:Şiə və sünni rəvayətlərində də həzrət İsanın qaydışına işarə olunmuşdur

Buxari həzrət Peyğəmbərin (s) dilindən belə nəql edir: “İmam aranızda olduğu halda (Məryəm övladı yanınıza enən zaman nə edəcəksiniz?!”(٢

Şeyx Səduq Məhəmməd ibn Müslim Səqəfiyə istinad edərək imam Baqirin (ə) dilindən belə nəql edir: “Qaim (xilaskar) bizdəndir... İsa ibn Məryəm enib onun arxasında (namaza duracaq”.(٣

?Sual: ۶٨. Həzrət İsa haraya enəcək

Cavab: Rəvayətlərdən məlum olur ki, həzrət İsa dünyanın axırlarında Dəməşq .ərazisinə enəcək

Təbərani həzrət Peyğəmbərin (s) dilindən belə nəql edir: “İsa ibn Məryəm Dəməşqdə (bəyaz minarənin kənarında enəcək.”(۴

İbn-Kəsir deyir: “Dəccal (zalım hakim) meydana çıxar və həmin vaxt həzrət Məsih səmadan enər. O sübh namazı vaxtı Dəməşqdə bəyaz minarənin kənarında nazil (olar.”(۵

?Sual: ۶٩. Məsihilər kimi xilaskar sayır

Cavab: Həzrət İsa xalqa müjdə vermək üçün gəlmişdi. “İncil” yunan sözüdür və “xoş xəbər” mənasını bildirir. Bu müjdə ilahi bir qiyamdan, başqa sözlə, yer üzünə hakim .olacaq tövhid hökumətindən danışırdı

Müqəddəs kitabda oxuyuruq: “Bütün şəhərləri ilahi hökumətlə müjdələmək mənə (vacibdir və mən bundan ötrü göndərilmişəm.”(۶

Mətta İncilində deyir: “Həzrət İsa bütün şəhərləri və kəndləri gəzirdi və xalqa təlim (verir, onları müjdələyirdi.”(٧

Həzrət Məsihin kəlamlarında “insan övladı” təbiri tez-tez gözə dəyir. Mətta İncilində

deyilir: “Burada olanların arasında elələri var ki, göyə çəkilən insan övladını (görməyincə ölümü dadmazlar.”(٨

səh:٥٤

---

١- [٩٢] “Zuxruf”, ٦١.

٢- [٩٣] “Səhihe-Buxari”, c. ٤, s. ١٤٣.

٣- [٩٤] “Kəmalud-din”, ٣٣١.

٤- [٩٥] “Əl-Məcəmul-Kəbir”,c. ١, s. ٢١٧.

٥- [٩٦] “Əl-fətn vəl-məlahim”, s. ١٧٢.

٦- [٩٧] “Əhdi-Cədid”, s. ٢٠٥.

٧- [٩٨] “Mətta İncili”, ٩:٦٢:٣٥.

٨- [٩٩] “Əhde-Cədid”, “Mətta İncili”, s. ٨٢-٨٤.

Kitabın başqa bir yerində deyilir: “Günəş şərqdən doğub hər yeri işıqlandırır. İnsan (övladının gəlişi də belədir.”(١

Eyni mənbədə oxuyuruq: “Hazır olun, onu gözləmədiyiniz saatda insan övladı (gələcək.”(٢

İnsan övladı” dedikdə nə nəzərdə tutulur? (Məsihilər bu ifadəni Həzrət Məsihə aid“ etmək istəyir. Amma bütün dəlillər uyğun təbirin həzrət Məsihə yox, həzrət Mehdiyə :(ə) aid olduğunu göstərir

a) Yuhənna İncilində həzrət Məsihin dili ilə deyilir: “Mən əzəmət tələbində deyiləm. Onu (tələb edən və hökm verəcək kəs var.”(٣

b) Mətta İncilində deyilənlərdən aydın olur ki, “insan övladı” Məsih deyil. Həmin şəxs .dünyanın axırlarında zühur edəcək və İsa ibn Məryəm ona tabe olacaq

?Sual: ٧٠. İncil kitablarında xilaskarın nə vaxt zühur edəcəyi bildirilirmi

Cavab: İncil kitablarından belə görünür ki, ümumdünya ədalət hökuməti yer üzündə .dünyanın axırlarında qurulacaq

Həzrət İsa bu hökumətin qurulması üçün müqəddimə haqqında deyir: “Tezliklə müharibələr və şayiələr haqqında eşidərsiniz. Məbada şikayətlənəsiniz. Çünki bu (hadisələr qətidir, amma dünyanın sonunu bildirmir.”(٤

Eyni mənbədə oxuyuruq: “Sonadək qalacaq kəs xilas olar.”(٥) Deyilənlər həzrət Peyğəmbərdən (s) nəql olunmuş rəvayətə uyğundur və həzrət Mehdinin (ə) dünyanın (axırlarında zühur edəcəyinə işarədir.”(٦

?Sual: ٧١. Həzrət Mehdinin (ə) hakimiyyəti genişdirmi

Cavab: “Əhde-Cədid” kitabından məlum olur ki, insan övladı üçün “Allahın ərşi” kimi təbir olunan həzrət Mehdinin hakimiyyəti bütün yer üzünü bürüyəcək. Luqa İncilində deyilir: “Gələcəkdə şərq və qərbdən, şimal və cənubdan insanlar gəlib Allahın ərşində süfrə

---

۱- [۱۰۰] Həmin mənbə, s. ۱۰۴.

۲- [۱۰۱] Həmin mənbə, ۲۴:۱۰۵:۴۴.

۳- [۱۰۲] “Həmin mənbə, “Yuhanna İncili”, s. ۳۱۷.

۴- [۱۰۳] “Mətta İncili”; ۱۰۲.

۵- [۱۰۴] “Həmin mənbə, ۲۴:۱۰۳:۱۳.

۶- [۱۰۵] “Əl-Ğeybət”, Tusi, s. ۱۷۸.

başına oturacaq.”(۱) Merqis İncilində deyilir: “Bundan öncə bütün aləmə müjdə (verilməsi vacibdir.”(۲

İslami rəvayətlərdə də bu mövzuya işarə olunmuşdur. İmam Baqir (ə) buyurur: “Qaim (bizdəndir, onun hökuməti şərqdən qərbə aləmi əhatə edəcək.”(۳

Əbu-Davud həzrət Peyğəmbərin (s) dilindən belə nəql edir: “Allah onun (Mehdinin) (dövründə müsəlmanlardan savay bütün millətləri məhv edəcək.”(۴

?Sual: ۷۲. İncil kitablarında xilaskarın yardımçıları necə tanıtdırılır

Cavab: Məsihilərin incil kitablarında bəşəriyyətin xilaskarın yardımçılarını tanımaq üçün :bəzi xüsusiyyətlər bəyan olunur

İtaət – Merqis İncilində deyilir: “Hər kəs bir körpə kimi Allahın ərşini qəbul etməsə, .۱ .oraya daxil olmayacaq.” Uşaq kimi dedikdə mütləq itaət nəzərdə tutulmuşdur

Hökmlərə əməl – Mətta İncilində deyilir: “Hər “ya Rəbb, ya Rəbb” deyən Allahın .۲ ”.ərşinə daxil olmayacaq. Yalnız Allahın istəyinə əməl edənlər səmalardadır

Yoxsulluq – Luqa İncilində deyilir: “Xoş olsun halınıza, ey fəqirlər! Sizin üçündür .۳ Allahın ərşi. Xoş olsun halınıza, ey aclar! Gələcəkdə tox olacaqsınız. Xoş olsun halınıza, ey ağlayanlar! Çünki gələcəkdə güləcəksiniz.” Səma mülkü (ərşi) dedikdə zühur ”.dövrünün nəzərdə tutulması lazımdır

?Sual: ۷۳. İncil kitablarında xilaskarın əlamətlərinə işarə olunmuşdurmu

Cavab: Mətta İncilində deyilir: “İsa zeytun bağında əyləşdiyi vaxt şagirdləri onun yanına gəlib sual verdilər: “Bu hadisə nə vaxt baş verəcək, sənin gəlişinin və dünyanın sonunun əlamətləri nədir?” Suala cavab olaraq deyilir: “Tezliklə savaşların xəbərini (eşidərsiniz. Məbada, şikayətlənəsiniz. Çünki bu hadisələr qətidir.”(۵



---

.Luqa İncili ۱۳:۲۴۲:۲۹ [۱۰۶]-۱

.Merqis İncili” ۱۳:۱۶۶:۱۰“ [۱۰۷]-۲

۳- [۱۰۸] “Kəmalud-din”, s. ۳۳۰.

۴- [۱۰۹] “Sünəne-Əbu-Davud”, c. ۲, s. ۳۱۹.

۵- [۱۱۰] “Mətta İncili”, ۲۴:۱۰۲:۶.

Başqa bir yerdə deyilir: “İnsan övladı əzəmətə çatdıqda, mələklərin ona yoldaşlıq etdiyi halda ərşə oturar və bütün ümmətlər onun yanında toplanar...”(١)

Luqa İncilində deyilir: “Fərisiyyun ondan soruşdu: Allahın ərşi nə zaman gələr?” O cavab olaraq buyurdu: “Allahın ərşi qəfildən gələr.”(٢)

Eyni mənbədə oxuyuruq: “Müharibələr və fitnələr haqqında eşitdikdə şikayətlənməyin. Çünki öncə bu işlər baş verməlidir. Amma bu hələ dünyanın sonu deyil.” Sonra buyurdu: “Tezliklə ümmət ümmətə, məmləkət məmləkətə qiyam qaldırar. Şiddətli zəlzələlər, aclıqlar və qəhətliklər çox yeri əhatə edər. Tezliklə dəhşətli işlər və böyük nişanələr görünər.”(٣)

Sual: ٧٤. Əgər hər bir din xilaskarı öz ardıcılı sayırsa, bu ixtilaf necə həll ola bilər?

Cavab: Dünyanın xilaskarının kim olması barədə dinlər arasında fikir ayrılığı var. Hər kəs öz din başçısını həmin zühurun rəhbəri sayır. Əsas ixtilaflara nəzər salaq:

١. Səmavi müjdələr qeybi xəbər olduğundan hər bir dinin tərəfdarları təəssüb göstərərək xilaskarı öz dinlərinə aid edirlər.

٢. Müxtəlif din və məktəblərin alimləri həzrət Mehdinin (ə) şəxsiyyətini tanımadıqlarından xilaskarın onlardan olacağını düşünürlər.

Bu ixtilafın qarşısını almaq üçün bir sıra tədbirlər görülməlidir:

١. Müjdələrin və müqəddəs kitablarda xilaskarla bağlı bəyan olunmuş mötəbər kəlamların fərqləndirilməsi.

٢. Ehtimallara yer vermədən xilaskarın müqəddəs kitablarda bəyan olunmuş sifətlərinin araşdırılması.

٣. Tarixi həqiqətlərin araşdırılması və bu həqiqətlərin müqəddəs kitablarda qeyd olunmuş sifətlərlə müqayisəsi; bu yolla xilaskarın həqiqi sifətlərinin müəyyənləşdirilməsi.

٤. Başqalarının da həqiqəti əldə etməsi üçün həzrət Mehdinin (ə) tanıtdırılması;

müşahidə edirik ki, bəzi məsihilər xilaskarın İslam mənbələrindəki təsviri ilə tanış olduqdan sonra İslam və şiəliyə üz tutur, Məhdəviyyət mövzusunu qəbul edirlər. Belə :nümunələrdən bəzilərini nəzərdən keçirək



---

۱- [۱۱۱] “Mətta İncili”.

۲- [۱۱۲] “Luqa İncili”, ۱۷:۲۵۲:۲۰.

۳- [۱۱۳] Həmin mənbə.

Qazi Sabati Məsihi – Bu şəxs həzrət Peyğəmbərin (s) uyğun mövzu ilə bağlı .۱ müjdəsini araşdırdıqdan, yəhudi və məsihilərin təfsirlərindəki ziddiyyətləri üzə çıxardıqdan sonra deyir: "Nəticə budur ki, nəzərdə tutulan şəxs İslamın tanıtdırdığı həzrət Mehdidir. Çünki uyğun mənbələrdə xilaskar haqqında belə deyilir: "O təkcə eşitməklə cəzalandırmır." Bu məlumat müsəlmanların mövqeyi ilə uyğun gəlir. Onlar deyirlər ki: "Bu sifət həzrət Mehdinin (ə) xüsusiyyətlərindəndir." İmamiyyə şiələrinin əqidəsi budur ki, xilaskar imam Həsən Əsgərinin (ə) övladıdır, hicri ۲۵۵-ci ildə dünyaya gəlmişdir, anasının adı Nərcisdir. O sonradan qeybə çəkilər və bir gün Allahın izni ilə (zühur edər. Bütün bunlar həqiqətə daha yaxındır."(۱)

Əllamə Məhəmməd Sadiq Fəxrul-İslam – Bu şəxs öncə məsihi olmuş, sonra uzun .۲ araşdırmalar aparıb müsəlmanlığın şiə məzhəbini qəbul etmişdir. O, yəhudi və məsihilərə qarşı yazdığı "Ənisul-İslam" kitabında bütün müjdələrin həzrət Mehdinin (ə) .zühuruna aid olduğunu bildirir

Əllamə Məhəmməd Riza Rizai – Bu şəxs öncə yəhudi olmuş, sonradan İslamı qəbul .۳ etmişdir. O, öz "Mənqule-Rizai" kitabında xilaskar müjdəsinin həzrət Mehdiyə (ə) aid .olduğunu bildirir

?Sual: ۷۵. Tövrat və İncil təhrif olduğu halda bu mənbələrə hansı əsasla istinad olunur

Cavab: ۱. Məhdəviyyət mövzusu ilə bağlı elə ayə və rəvayətlər mövcuddur ki, bu .mövzunun isbatı üçün digər mənbələrə ehtiyac qalmır

Digər səmavi kitablara müraciət edilməsinin səbəbi mövzunu isbata yetirmək yox, .۲ .təsdiqləməkdir

Digər müqəddəs kitablardakı müjdələrə müraciət etməkdə məqsəd həmin din .۳ .ardıcıllarını haqq olan İslam dininə yönəltməkdir

Kimsə iddia etmir ki, digər müqəddəs kitablar bütünlüklə təhrif olunmuşdur. Həmin .۴ .kitabların yalnız müəyyən hissələrinin təhrifindən danışılır

Digər səmavi kitablarda uyğun mövzu ilə bağlı məlumatların təhrif olunmamasının .۵ .sübutu həmin məlumatlara İslam mənbələrində də işarə olunmasıdır

Müqəddəs kitabların bəzi müjdələri tarixi gerçəkliklə uyğun gəlir. Məsələn, dünyanın .۶
xilaskarı İsmail nəslindən və ən üstün qadın



---

.Əlbərahinus-Sabatiyyə", s. ۲۰۷, ۲۰۸" [۱۱۴] -۱

nəslindən olan ١٢-ci imamdır. Onun dünyaya gəlişi siyasi çaxnaşmalar dövrünə təsadüf edir. Bu səbəbdən də Allah həmin xilaskarı zühur dövrünədək zalımlardan .qoruyur

?Sual: ٧۶. Nə üçün əvvəlki səmavi dinlərin qanunları tam şəkildə icra olunmayıb

Cavab: Cəmiyyətdə ədalətin və ilahi qanunların bərpası üçün iki mərhələdən keçmək :zəruridir

İctimai qanunların alim və adil kəs tərəfindən tənzimlənməsi mərhələsi: bu mərhələ .١ .peyğəmbərlərin və kitabların göndərilməsi ilə gerçəkləşmişdir

İlahi qanunların tətbiq mərhələsi: bu mərhələnin gerçəkləşməsi üçün bəşər . ٢ :cəmiyyətində iki şərt ödənməlidir

a) Bəşər cəmiyyətinin düşüncə baxımından kamala çatması və həmin qanunları dərk ;edib iman gətirməsi

b) Bu qanunları icra edən şəxs alim, iqtidarlı və məsum olmalıdır ki, həmin qanunları .bütün yer üzündə işə sala bilsin

Sual: ٧٧. Nə üçün İslam peyğəmbərinin dövründə ümumdünya tövhid hökuməti ?qurulmamışdır

Cavab: Bəşəriyyət bir körpə kimi öncə təhsil almağa ehtiyaclıdır. Yetərincə .məlumatlandıqdan sonra insan son təkamülə çata bilər

Bu səbəbdən də ilahi rəhbərlər nəzərdə tutulan hədəfin həyata keçməsi üçün şərait yaranmamış dünya ədalət hökuməti ilə bağlı addım atmırlar. Bu onların yox, hələ ki .hazırlıqsız cəmiyyətin nöqsanıdır

?Sual: ٧٨. İslamın zühurundan sonra hüzur hadisəsi necə təsvir olundu

:Cavab: Bu sualı cavablandırmaq üçün öncə müqəddiməyə ehtiyac var

İslam dini ümumdünya ədalət hökumətinin tarixin sonunda qurulması üçün ən kamil .١

proqram təqdim edir. Çünki İslam son səmavi şəriətdir. Digər bir tərəfdən, İslam dini bütün dünyanı dəvət edir. İslamdan öncə bəşəriyyətin bu proqramı dərk etmək gücü yox idi. Bu səbəbdən də uyğun mövzu İslamın zühuru dövründə aktuallaşdı. İslam peyğəmbəri ümumdünya ədalət hökuməti haqqında yalnız bəşəriyyətin düşüncəsi .yetkinləşdikdən sonra bəyanat verdi

۲. İslam peyğəmbəri, ondan sonrakı məsum imamlar və bir çox səhabələr zühur proqramı haqqında xalqa müjdə vermişlər. Çünki bu

proqramın əsl icraçıları onlardır. Bu böyük şəxsiyyətlər var gücləri ilə çalışıb, xalqın düşüncəsini hazırlamaq üçün uyğun mövzunu müxtəlif yollarla sübuta yetirdilər. O :cümlədən

;a) Ümumdünya ədalət hökumətinin qurulmasında əsas məqsədin bəyanı

b) Bu hökumətin rəhbəri kimi İslam peyğəmbəri nəslindən olan məsum imamın ;tanıtdırılması

.v) Zühurdan öncə bütün yer üzünü bürüyəcək zülm-sitəm haqqında məlumat

Xalqın hazırlanmasında həzrət Mehdinin (ə) özünün də xüsusi payı var. O da həzrət .٣ Peyğəmbər (s) və sair imamlar kimi bu məqsəd yolunda çalışmışdır. Xalqla təkrar-təkrar görüşməklə öz mövludu və varlığını sübuta yetirmiş, qeyb və zühur mövzularını .tam şəkildə açıqlamışdır

#### Məhdəviyyətin müdafiəsi

?Sual: ٧٩. Müsəlmanlar arasında Məhdəviyyətə şəkk edən ilk şəxs kim olmuşdur

Cavab: Tarixi mənbələrdə bildirilir ki, Müaviyə Bəni-Haşimdən olan bir dəstəyə xitabən dedi: "Haşimi padşah və Qaim Mehdinin (ə) sizdən olması barədə gümanınız batil əqidədir. Mehdi əslində İsa ibn Məryəmdir. Hakimiyyət ona verilənədək bizim (əlimizdədir."(١

Həmin məclisdə iştirak edənlərdən biri də İbn-Abbas olmuşdur. O, Müaviyəni tarixi təhrif etməsinə və İslam əqidəsi ilə əylənməsinə qarşı çıxaraq dedi: "Sən dedin ki, biz Mehdinin (ə) hakim olacağını güman edirik. Güman şirkdir, necə ki, Allah-təala (buyurur: "Kafirlər düşünürlər ki, heç vaxt ayağa qaldırılmayacaqlar."(٢

Hamı şəhadət verir ki, bizim üçün mülk və hökumət var. Dünyanın ömründən bir gün qalmış olsa, Allah-təala bizlərdən birini yer üzü zülmə qərq olduqdan sonra ədaləti bərpa etmək üçün göndərər. Sən deyirsən ki, Mehdi İsa ibn Məryəmdir. İsa Dəccala qarşı çıxmaq üçün göndərilir. Dəccal onu görəndə məhv olar. Bizim imamımız isə İsa (ibn Məryəmin iqtida edəcəyi kəsdir...(٣

?Sual: ٨٠. Sünni alimlərindən Məhdəviyyət əqidəsini inkar edən varmı

Cavab: Sünni alimlərindən bəziləri Məhdəviyyət əqidəsini açıqlayan rəvayətləri inkar etmişlər. Belə alimlərdən bəziləri ilə tanış olaq:

١. İbn Xəldun – Bu şəxs Məhdəviyyət mövzusunu İslamın məşhur mövzularından saysa da, "rəvayətçini şübhə altına almaq onu təsdiqləməkdən öndə gəlir" prinsipini əsas götürərək Məhdəviyyət rəvayətlərini etibarsız saymışdır.(١)

٢. Məhəmməd Əbu-Zöhrə -bu şəxs də İbn-Xəldunun yolunu davam etdirmiş və demişdir: "Sünni alimləri arasında bu hədislərin doğruluğu haqqında tərəddüd var. Bu səbəbdən də uyğun əqidə sünnə əhli tərəfində təsdiqlənmir."(٢)

٣. Səd Məhəmməd Həsən (Əzhər şeyxlərindən) – Bu şəxs də Məhdəviyyət hədislərini tənqid edərək əvvəlki alimlərin yolunu getmişdir.(٣)

٤. Məhəmməd Fərid Vəcdi – O deyir: "Bir çox hədis alimləri Məhdəviyyət hədislərini zəif saymışdır..."(٤)

٥. Əhməd Əmin Misri – Bu şəxs də ibn-Xəldunun münasibəti ilə razılaşmışdır.(٥)

۶. Şeyx Cəbəhan – Bu şəxs də Məhdəviyyət hədislərini etibarsız sayanlardandır.(۶)

٨. Şeyx Saih Liviyayi – Bu şəxs də Məhdəviyyət hədislərini tənqid edənlərdəndir.(٧)

Məhdəviyyət hədislərinə müxaliflərin ümumi istinadgahı İbn-Xəldun olduğundan onun sözlərinə xülasə şəkildə cavab veririk:

١. İbn-Xəldun Məhdəviyyət hədislərini tənqid edərkən yalnız bəzi rəvayətləri nəzərdə tutur. Hansı ki, mötəbər mənbəsi olan başqa hədislər də var. Doktor Bəstəvi öz kitabında Məhdəviyyət mövzusunda ۴۶ etibarlı hədis nəql edir.(٨)



---

١- [١١٨] "Tarixe-ibn Xəldun", c. ١, s. ٣١١, ٣٢٢.

٢- [١١٩] "Əl-İmamus-Sadiq", s. ٢٣٩.

-۳ [۱۲۰] “Əl-Məhdiyyə fil-İslam”, s. ۶۹.

-۴ [۱۲۱] “Dairətul-Məarif, Qərne Əşrin”, c. ۱۰, s. ۴۸۱.

-۵ [۱۲۲] “Əl-Məhdi vəl- Məhdəviyyət”, s.۱۰۸»

-۶ [۱۲۳] “Təbdidul-Zülam”, s. ۴۷۹, ۴۸۰.

-۷ [۱۲۴] “Tərasəna və Məvazinul-Nəqd”, s. ۱۸۷.

-۸ [۱۲۵] “Əl Məhdiyyul-Muntəzər Fi-əhadisul-səhihə”.

İbn-Xəldun səhəbələrdən yalnız bəzilərinin adını çəkir. Hansı ki, Məhdəviyyət . ۲ hədisləri çoxları tərəfindən nəql olunmuşdur. Şeyx Əbdül-Möhsin ibn Həmdül-İbad (Məhdəviyyət hədisi nəql edən ۲۶ səhabənin adını göstərir.(۱

Həmin müəllif deyir: "İbn-Xəldun ricalçı (hədisçi) yox, tarixçidir. Onun mülahizələrinə .۳ (əsasən hədis zəif sayılmır..."(۲

İbn-Xəldunun "təsdiqdən öncə şübhə" prinsipi bütün sünnə əhli tərəfindən qəbul . ۴ olunmur. Bəziləri kiçik bir səbəblə rəvayətçiyə şübhə edir. Hansı ki, şübhə sübuta yetirilməlidir. İbn Həcər Əsqəlani, Qazi Səbki, Xətib Bəğdadi, Nəvəvi, Səxavi, Süyuti və Sənədi kimi alimlər uyğun qaydanı qəbul etmir. Doktor Əbdül-Həkim Bəstəvi deyir: "Rəvayətçi şübhə doğursa belə, hər şübhə rəvayəti etibardan salmır. Yalnız ciddi (şübhələr əsasında rəvayəti etibarsız saymaq olar...(۳

İbn-Xəldun hədisləri hesablamadığından onların "təvatir" (yetərlilik) həddini keçdiyini .۵ .bilmir. Əslində bu həddə çatan hədisin sənədini araşdırmağa ehtiyac yoxdur

Sual: ۸۱. Nə üçün sünni alimləri Buxari və Müslim Məhdəviyyət hədislərini öz ?kitablarında zikr etməmişlər

Cavab: Sünnə əhlinin Məhdəviyyət mövzusuna iradlarından biri budur ki, onların tanınmış alimləri Buxari və Müslim bu barədə bir söz deməmişdir. "Səhihe-Buxari" və "Səhihe-Müslim" mənbələrində Məhdəviyyət hədislərinin nəql olunmaması uyğun .mövzuya etimadsızlıq yaradan səbəblərdəndir

Əhməd Əmin Misri deyir: "Səhihe-Buxari" və "Səhihe-Müslim" hədis kitablarında bu sayaq (Məhdəviyyət) hədislərə yer verilməməsi onların iftixarıdır. Amma digər hədis (kitablarında uyğun hədislərə yer ayrılmışdır."(۴

Bu sayaq iradlar şeyx Məhəmməd Əbu zöhrə, Səd Məhəmməd Həsən, Hüseyn Sai Liviyayi Məğribi, Seyyid Məhəmməd Rəşid Riza, Şeyx İbn-Məhmud kimi qərb yönümlü .sünnə alimləri tərəfindən də irəli sürülmüşdür

.Digər sünni alimləri uyğun irada kəskin etiraz etmişdir

---

۱- [۱۲۶] “Əqidətul əhləs-sünnə vəl-əsər fi Məhdiyyul-Muntəzər”, s. ۱۲۸.

۲- [۱۲۷] Həmin mənbə.

۳- [۱۲۸] “Əl-Məhdiyyul-Muntəzər fi əhadisul-səhihə”, s. ۳۶۴, ۳۶۵.

۴- [۱۲۹] “Əl-Məhdi vəl-Məhdəviyyə”, s. ۴۱.

Doktor Bəstəvi deyir: “Güman edirlər ki, Buxari və Müslim Məhdəviyyət hədislərini zəif sayaraq nəql etməmişlər. Bu yanlış gümandır. Çünki həmin iki kitab bütün hədisləri əhatə etmir və müəlliflərin belə bir iddiası olmamışdır.”(١)

Buxari deyir: “Mən öz kitabımda mötəbər hədisləri nəql etmişəm. Amma kitabımın həcminə görə nəql etmədiyim etibarlı hədislər də çoxdur.”(٢)

Müslüm ibn Həccac, Quşeyri deyir: “Mən öz kitabımda bütün etibarlı hədisləri nəql etməmişəm. Məqsədim yalnız yığcam hədisləri zikr etmək olub.”(٣)

Hakim Nişapuri deyir: “Buxari və Müslim iddia etmir ki, onların kitabında olmayan hədislər etibarsızdır.”(۴)

İbn Qeyn Cəvziyyə deyir: “Məgər Buxari deyibmi ki, mənim kitabımda nəql olunmayan hədis batildir? Buxari öz kitabında nəql etmədiyi bir çox hədisləri də etibarlı saymışdır.”(۵)

Əbdül-Möhsin ibn Həmdül-İbad deyir: “Etibarlı hədislər “Səhiheyn” kitablarında nəql olunduğu kimi başqa kitablarda da nəql olunmuşdur. Məsələn, “Muvta”, “Səhihe-ibn Xəzimə”, “Səhihe ibn Həbban”, “Müstədrəke-hakim”, “Cameye-Termizi”, “Sünəne-Əbu-Davud”, Sünəne-Nəsayi”, “Sünəne ibn-Mace”, “Sünəne-Dar Qutni, “Sünəne-Beyhəqi” kimi kitablarda “Səhiheyndə” olmayan bir çox etibarlı hədislər var”(۶)

Buxari və Müslimin Məhdəviyyətlə bağlı hədislərə tamamilə diqqət yetirməməsi düzgün deyil. Çünki bu müəlliflər həzrət Mehdinin (ə) zühuru ilə bağlı bəzi məsələlərə işarə etmişlər. Məsələn:

a) Dəccalın meydana çıxması – Buxari, xüsusi ilə də Müslim, Dəccalın meydana çıxması ilə bağlı xeyli hədis nəql etmişdir.(٧)

İbn-Həcər Əsqəlani Abərridən nəql etməklə Dəccalın əhvalatını həzrət Mehdinin (ə) zühuru ilə əlaqələndirmişdir.(٨)

۱- [۱۳۰] “Əl Məhdiyyul-Muntəzər fil-əhadisul-Səhihə”.

۲- [۱۳۱] “Müqəddimeyi-ibn-Səlah”, s. ۲۱, ۲۲.

۳- [۱۳۲] Həmin mənbə.

۴- [۱۳۳] “Müstədrəke-Hakim”, c. ۱, s. ۲.

۵- [۱۳۴] “Zadul-Məad”.

۶- [۱۳۵] “Əl imamul-Məhdi ində əhlis-sünnə”, c. ۲, s. ۴۴۵.

۷- [۱۳۶] “Səhihe-Buxari”, c. ۴, s. ۱۴۳; “Səhihe-Müslim”, c. ۱۸, s. ۵۸, ۸۵ (Nəvəvinin şərhi ilə).

۸- [۱۳۷] “Təhzibul-təhzib”, c. ۹, s. ۱۲۵.

b) İsa ibn Məryəm – Buxari Əbu-Hüreyrəyə istinadən nəql edir ki, peyğəmbər buyurmuşdur: "İmamınız aranızda olduğu halda Məryəm övladı nazil olan vaxt halınız (necə olacaq?"(١

(Müslim də eyni məzmunda hədis nəql etmişdir.(٢

Bu rəvayətlərdə həzrət Mehdidən (ə) başqası nəzərdə tutula bilməz. Çünki "Səhihe-Buxarini" şərh edənlərin hamısı rəvayətdəki imam sözünün həzrət Mehdiyə (ə) işarə .olduğunu bildirirlər

v) Mal bəxşişi – Müslim Cabir ibn Əbdullah Ənsariyə istinadən nəql edir ki, həzrət Peyğəmbər (s) buyurmuşdur: "Sonda ümmətim üçün elə bir xəlifə gələr ki, hesab (aparmadan çoxlu mal bağışlayar."(٣

Digər rəvayətlərə müraciət etdikdə uyğun hədisdə həzrət Mehdinin (ə) nəzərdə .tutulduğu məlum olur

İbn Əbu Şeybə həzrət Peyğəmbərin (s) belə buyurduğunu nəql edir: "Fitnə-fəsad tüğyan etdiyi bir vaxt əhli-beytimdən bir şəxs zühur edəcək və onun ətası (böyükdür."(۴

q) Beyda əhvalatı – Müslim "Səhihdə" həzrət Peyğəmbərin (s) belə buyurduğunu nəql edir: "Bir şəxs bir evə sığınar və onun üstünə qoşun göndərilər. Bu qoşun Beyda (məntəqəsinə çatdıqda yerə gömülər."(۵

Digər rəvayətlərə müraciət etdikdə məlum olur ki, Beyda məntəqəsində qoşunun yerə (gömülməsi həzrət Mehdinin (ə) zühur əlamətlərindəndir.(۶

?Sual: ٨٢. Məhdəviyyət hədislərində ziddiyyət varmı

Cavab: Seyyid Rəşid Riza və ustad Səih Məğribi Məhdəviyyət hədislərində ziddiyyət olduğunu iddia etmişlər. Seyyid Rəşid Riza deyir: "Mehdi hədislərindəki ziddiyyəti aradan qaldırmaq çətindir." O nümunə olaraq müxtəlif hədislərdə xilaskarın bəzən ("Həsəni", bəzən "Hüseyni", bəzən "Abbasi", bəzən "Ələvi" adlandırılmasını göstərir.(٧

Əvvəla, ziddiyyət sabit hökmlərə də aiddir. Buna görə də bir şeyin həqiqətini inkar

etmək üçün ziddiyyətlərə istinad etmək



---

۱- [۱۳۸] "Səhihe-Buxari", c. ۴, s. ۱۴۳.

۲- [۱۳۹] "Səhihe-Müslim", c. ۱, s. ۹۴.

۳- [۱۴۰] "Səhihe-Müslim", c. ۸, s. ۱۸۵.

۴- [۱۴۱] İbn Əbu-Şeybə, "Əl-Müsənnəf", s. ۶۷۸.

۵- [۱۴۲] "Səhihe-Müslim", c. ۸, s. ۱۶۷.

۶- [۱۴۳] "Mustədrəke-hakim", c. ۴, s. ۵۲۰.

۷- [۱۴۴] "Turasəna və məvazinul-nəqd", s. ۱۸۷; "Təfsire-Əl Minar", c. ۹, s. ۴۹۹-۵۰۱.

yanlışdır. İxtilafsız məsələ olmadığından, belə çıxır ki, etiqadi məsələləri də qəbul .etməməliyik

İkincisi, ziddiyyət yaradan istənilən bir məsələyə münasibətdə sübuta yetiriləsi .həqiqət var. Bu səbəbdən də fikir ayrılığı məsələnin həqiqəti üçün sübut ola bilməz

?Sual: ٨٣. Məhdəviyyət hədisləri yalnız şiə mənbələrindədirmi

Cavab: Sünnə əhlindən bəzi şəxslər elə güman edirlər ki, Məhdəviyyət hədisləri bütünlüklə şiələr tərəfindən quraşdırılmışdır. Onlar bu hədisləri nəql edənləri şiəlikdə .ittiham edərək onların dediyini əsassız sayırlar

Doktor Bəstəvi öz iradını bildirdikdən sonra deyir: "Rəvayətin qəbul olunma meyarı rəvayətçinin ədalətli olmasıdır. Onun əqidəsi nəql etdiklərinə şübhə yaratmamalıdır. Yalnız İslamdan xaric olmuş rəvayətçi mötəbər sayılmaya bilər. Əksər müasir və qədim alimlər belə düşünür." Sonra Əli ibn Mədyənin dilindən nəql edir ki, əgər yalnız (şiə olduqları üçün kufəlilərin nəql etdiyi rəvayətlər inkar olunsa, kitablar puça çıxar."(١

:Müəllif sözünə belə davam edir

Rəvayətlərə münasibətdə onu nəql edənin şiə olması ölçü götürülə bilməz. Axı bir" çoxları şiə olmadıqları halda bu mövzuda hədis nəql etmişlər." Sözünün sonunda müəllif deyir: "Mehdi (ə) ilə bağlı rəvayətlərin çoxu şiə olmayanlar tərəfindən nəql olunmuşdur. Şiələr tərəfindən nəql olunan rəvayətlərin də digər məzhəblərdən (şahidləri var. Demək, bu mövzuya şübhələr aradan qalxır."(٢

?Sual: ٨۴. Yalançı Mehdilik iddiaları Məhdəviyyət etiqadının mənfi təsiri deyilmi

Cavab: Əhməd Əmin deyir: "Məhdəviyyət etiqadının mənfi təsirindən tarix boyu müsəlman inqilabları baş vermişdir. Hər bir əsrdə özünü Mehdi adlandıran bir şəxs (xalqı özünə itaətə çağırmış, İslam cəmiyyətində bir çox problemlər yaratmışdır..."(٣

Əvvəla, kimlərinsə özünü Mehdi elan etməsi bir həqiqətdir. Amma bunun günahı həzrət Mehdinin (ə) xüsusiyyətlərini yetərincə xalqa çatdırmamış alimlərin üzərinə düşür. Bu həm də fırıldaqçılara səh:۶۵

١- [١۴۵] "Əl-Məhdiyyul-Muntəzər fil-əhadisul-səhihə", s. ٣٨٠.

٢- [١۴۶] Həmin mənbə.

٣- [١۴٧] "Zəhyul-İslam", c. ٣, s. ٢۴۴.

.aldanan xalqın günahıdır. Əslində Məhdəviyyət inancının böyük bərəkətləri var

İkincisi, kimlərinsə Mehdilik iddiasına düşməməsi üçün uyğun əqidəni inkar etmək düz olmaz. Əgər bu yol seçilsə, kimlərsə peyğəmbərlik iddiasına düşməsin deyə .peyğəmbərlik məsələsi də inkar olunmalıdır

Üçüncüsü, Mehdilik iddiasına düşənlər xalqı yalnız bir neçə gün aldada bilər. Amma Allahın lütfü və həzrət Mehdinin yardımı ilə, eləcə də, həqiqi alimlərin zəhmətləri .sayəsində fırıldaqçılar ifşa olunub cəmiyyətdən rədd edilir

?Sual: ۸۵. Məhdəviyyətə etiqad insanı əməldən çəkindirmirmi

Cavab: Bəziləri deyirlər ki, Məhdəviyyətə inamın zərərli təsirlərindən biri xalqın .mübarizədən çəkilib, yalnız Allahdan qurtuluş gözləməsidir

Əslində həzrət Mehdinin (ə) zühuru intizarı müsəlmanların əlini yanına salıb oturması üçün səbəb ola bilməz. İntizar insanları dini vəzifələrinin icrasına və zühur üçün hazırlıq .görməyə sövq edir

Bu səbəbdən də fərəc intizarı ən üstün əməllərdən sayılmışdır. Məlum olur, intizarın əməli yönümləri var və intizar çəkən şəxs özünü əməl baxımından da xilaskarın .zühuruna hazırlamalıdır

Sual: ۸۶. Məhdəviyyətə etiqad İslam cəmiyyətindəki siyasi təzyiqlərin nəticəsində ?yaranmamışdırmı

Cavab: Bəzi qərb yönümlü müsəlman ziyalıları iddia edirlər ki, Məhdəviyyət inancı .cəmiyyətdəki siyasi təzyiqlərdən qaynaqlanır

Şərqşünas Fan Floten deyir: “Abbasilərin zülm-sitəmi əməvilərin zülm-sitəmindən az olmamışdır. Sıxıntılar nəticəsində əzilən sinif özünü ümidvar etmək istəyi ilə Məhdəviyyət inancına bağlanmışdır. Onlar bu yolla ruhi sarsıntılarını yüngülləşdirməyə (çalışmışlar...”(۱

Digər bir şərqşünas Donaldson deyir: “Çox ehtimal ki, Bəni-üməyyə hakimlərinin ciddi (siyasi sıxıntıları nəticəsində Məhdəviyyət nəzəriyyəsi formalaşmışdır.”(۲

Əhməd Əmin Misri deyir: “Məhdəviyyət əqidəsinin əsas yaranış amili həzrət Əlinin (ə) şəhadətindən və Müaviyənin hakimiyyətə gəlməsindən sonra şiələrin üzləşdiyi sıxıntılar olmuşdur. Bu sıxıntı



---

.Əs-səyadətul-ərəbiyyə”, s. ۱۳۲“ [۱۴۸] -۱

.Əqidətuş-şiə”, s. ۲۱۳“ [۱۴۹] -۲

Həsən ibn Əlinin (ə) Müaviyəyə beyəti və Hüseyn ibn Əlinin (ə) şəhadətindən sonra daha da güclənmişdir. Həmin vaxt şiələr taktikanı dəyişərək aşkar dəvətdən çəkinmiş (və zülmə qarşı gizli mübarizə yolu seçmişlər..."(١

Məhəmməd Əbdül-Kərim Ətfəm deyir: "Əslində Mehdiyə etiqad imamın qeybindən öncə yaranmışdır. Bu əqidə Kərbəla hadisəsindən sonra, əməvi hökumətinin şiələri sıxıntıya salması nəticəsində ortaya çıxmışdır. Bütün bu sıxıntılar şiələrin Məhdəviyyət əqidəsi üçün zəmin hazırlamışdı. Məhdəviyyət şiələri mövcud vəziyyətdən qurtarsa da, (bir arzu olaraq onların həyatına mənfi təsir göstərmişdir."(٢

:İradlarımızı bildirək

Tarix boyu istər müsəlman, istər qeyri-müsəlman məzlumlar siyasi təzyiqlərə məruz .١ qalmışlar. Amma bu o demək deyil ki, sıxıntı keçirənlər Məhdəviyyət etiqadını uydurmuşlar. Əksinə, Allah-təala Öz məsləhətinə uyğun olaraq, yer üzündə ədaləti .bərpa etmək üçün Öz xilaskarının zühurunu müəyyənləşdirmişdir

Öncə qeyd etdiyimiz kimi, Məhdəviyyət mövzusu bəşər fitrətinin tələbidir. Əql, . ٢ Quran və rəvayətlər bu həqiqəti təsdiqləyir və müsəlman icması, bəzi qərb yönümlü .ziyalılar istisna olmaqla, Məhdəviyyətə inanırlar

Məhdəviyyət və həzrət Mehdinin (ə) zühuru intizarı kamil şəkildə dərk olunduqda .٣ heç bir mənfi təsirə malik olmur. Bu inancın yetərincə müsbət təsirləri var. İntizar insanda ümid ruhiyyəsi yaradır, cəmiyyət həzrətin zühuru üçün münasib zəmin .yaratmağa çalışır

?Sual: ٨٧. Xilaskara əqidə və Məhdəviyyət inancı təkcə şərqə məxsusdurmu

Cavab: Fan Floten deyir: "Şərq ruhiyyəsi ümumi şəkildə qeybi xəbərlər sorağındadır. Onlarda qeyb pərdələrinin açılmasına, gələcəkdən xəbər tutmağa meyl böyükdür. Bəli, xilaskarın zühuruna etiqad şərq təbiətinə uyğundur və bu etiqad cəhalət və (istibdad nəticəsində yaranmışdır."(٣

:Sualı cavablandıraq

۱. Bu əqidə təkcə şərqə aid deyil, əksər dinlərdə, məktəblərdə və ayinlərdə onun oxşarı var.



---

۱- [۱۵۰] "Zəhyul-İslam", c.۳, s.۲۴۱.

۲- [۱۵۱] "Ən-nəzəriyyətul-siyasiyyətul-məasirətuş-şiətul-imamiyyə", s.۸۶.

۳- [۱۵۲] "Əs-səyadətul-ərəbiyyə", s.۱۰۷.

.Məhdəviyyət insan fitrətindən qaynaqlanan bir əqidədir .٢

Qeyd olunduğu kimi, Məhdəviyyət ayə və rəvayətlərə, icmaya və bütün din və .٣ .məktəblərə uyğun əqidədir

İngilis filosofu Bertrand Rassel deyir: "Dünya hamını birləşdirib, bir bayraq və bir şüar (ətrafında toplayacaq xilaskarın intizarındadır."(١

Nisbilik nəzəriyyəsinin banisi Eynşteyn deyir: "Sülh-səfanın bütün yer üzünü bürüyəcəyi və insanların dost və qardaşcasına yaşayacağı gün bir o qədər də uzaq (deyil."(٢

?Sual: ٨٨. "Məhdəviyyət əqidəsi digər cəmiyyətlərdən və əqidələrdən götürülməyibmi

Cavab: Bəziləri Məhdəviyyət əqidəsini İslama kənardan gəlmiş əqidə kimi qəbul .edirlər

Culd Zeyher deyir: "Mehdi (ə) əqidəsinə qayıdış qeyri-islami prinsiplərdəndir. Əslində (bu əqidə əfsanə və qeyri-real işlərdəndir."(٣

Saih Əli Hüseyn deyir: "Qeyb və qayıdış əqidəsi və nəzəriyyəsi yəhudilər və məsihilər (arasında müştərək əqidədir. Şiə məzhəbi yalnız bu iki mənbədən təsirlənə bilər..."(۴

Doktor Əbdür-Rəhman Bədəvi deyir: "Müsəlmanlar arasında Mehdi (ə) əqidəsini (Kəbul-Əhbar yaymışdır".(۵

:Bütün bu iddiaların cavabı var

Quran və mütəvatir rəvayətlərə əsasən həzrət Mehdinin (ə) zühuruna inam əsl .١ İslam əqidəsidir. Bu məsələyə digər dinlərdə də işarə olunmuşdur. Uyğun əqidəni .əfsanə saymaq üçün heç bir əsas yoxdur

Bu əqidə təkcə şiələrə aid deyil. Peyğəmbər səhabələri də ayə və rəvayətlərə .٢ əsasən Məhdəviyyətə inanmışlar. Bütün İslam tarixi boyu şiə və sünni məzhəbindən .olan böyük alimlər Məhdəviyyəti qəbul etmişdir

Belə əqidənin yəhudilərə və məsihilərə aid olması o demək deyil ki, İslamda bu əqidə .۳ ola bilməz və o hökmən başqa dinlərdən götürülmüşdür. Əksinə, digər səmavi dinlərdə də uyğun əqidənin mövcudluğu Məhdəviyyətin insan fitrətindən .qaynaqlandığını və Allah tərəfindən təqdir olunduğunu göstərir



---

.Elmin cəmiyyətə təsiri", s. ۵۶" [۱۵۳] -۱

.Nisbiyyət anlayışı", s. ۳۵" [۱۵۴] -۲

.Əl-əqidə vəş-şəriə", s. ۲۱۸" [۱۵۵] -۳

.Tərasəna və məvazinul-nəqd", s. ۱۸۴" [۱۵۶] -۴

.Məzahibul-İslamiyyin", c. ۲, s. ۷۶, ۷۷" [۱۵۷] -۵

İslam cəmiyyətində Məhdəviyyət əqidəsi Kəbul-əhbar tərəfindən yayılmamışdır. .۴ Allah və Onun peyğəmbərləri, xüsusi ilə İslam peyğəmbəri (s) və onun məsum əhli-beyti (ə) cəmiyyəti Məhdəviyyət məsələsindən məlumatlandırmışlar.

Sual: ۸۹. Məhdəviyyət İslamın dünyaya hakim ola bilməsindən qaynaqlanırmı?

Cavab: İordaniya universitetində fəlsəfə bölməsinin rəisi Doktor Səlman Büdur Məhdəviyyət haqqında deyir: "İslam peyğəmbərinin hökuməti İslam və digər dinlərin müjdə verdiyi ədalət hökumətinin mücəssəməsi idi. Bir çox müsəlmanlar elə həmin dövrdə ədalət hökumətinin dünyaya yayılmasını arzulayırdı. Bu arzu gerçəkləşmədi. Amma hələ də İslam mütəfəkkirləri, xüsusi ilə imamiyyə şiələri bu arzu ilə yaşayır."(۱)

Həzrət Peyğəmbərin (s) dövründə İslam bütün yer üzünə yayılmasa da, əvvəla, İslam haqqında bir din olaraq bütün dünya xəbər tutdu və həzrət Peyğəmbər (s) bütün yer əhlini İslama dəvət etdi.

İkincisi, Quran və həzrət Peyğəmbər (s) İslamın bütün yer üzünə yayılacağına xəbər vermişlər. Müsəlmanların bu amaldan məyus olub Məhdəviyyətə üz tutması fikri yanlışdır.

Doktor Əbdül-Cəbbar Şərarə deyir: "Elm və mərifət iddiasında olan bir qrup insanın elə qədim dövrdən hazırkı dövrədək İslam cəmiyyətində şübhə yaratması təəccüb doğurur. Əslində, onların iddiası düşüncələrinin darlığını göstərir. Culd Zeyher, Fəlhauzen, Fan Floten, Mak Donald, Bernard Levis, Monteqri, Vat və Masinyon kimi şərqşünaslar və onların şagirdləri şərq təfəkküründən qidalandıqları halda heç bir dəlil gətirmədən Məhdəviyyət məsələsini şübhə altına alırlar. Hansı ki, aşkar və qəti dəlillər onların nəzərinə çatdırılır. Fundamental şəkildə sübut olunmuşdur ki, dünyanın axırlarında həzrət Mehdi (ə) zühur edəcək. Bu əqidəni sünnə əhlindən olan Bərzənçi, Şövkani və başqaları mütəvatir hədislərə əsaslanaraq qəbul edirlər..."(۲)

Sual: ۹۰. Müsəlmanlar yekdil olaraq Məhdəviyyət əqidəsini qəbul edirlərmi?

Cavab: Müsəlmanlar arasında müxtəlif məzhəbi ixtilaflar olsa da, onlar Məhdəviyyət əqidəsinə münasibətdə yekdildirlər. Bu əqidə

hansısa məzhəbə aid deyil. İmamiyə, zeydiyyə, maliki, hənəfi, şafeyi, hənbəli, hətta vəhhabi firqəsində də Məhdəviyyət məsələsi qəbul olunur. Bütün məzhəblər inanır ki, peyğəmbər nəslindən olan bir şəxs qiyam edib, yer üzünü bürümüş zülm kökünü .kəsəcək və ədaləti bərpa edəcək

Əksər sünni alimləri bu əqidənin bütün müsəlmanlara aid olduğunu bildirir. Hətta bəzi .sünni fəqihləri bu əqidəni inkar edənlərin qətlini vacib saymışlar

Əhməd Əmin Misri Məhdəviyyət məsələsini prinsipcə inkar etsə də, onu sünnə əhlinin (aşkar əqidələrindən sayır.(١

?Sual: ٩١. Hansısa sünni alimi Məhdəviyyət hədislərini mütəvatir (yetərli) sayırmı

Cavab: Hədis elmində ixtisas sahibi olan bir qrup sünni alimi Məhdəviyyət hədislərini mütəvatir, yetərli sayırlar. İbn Qəyyim Covziyyə, Cəlaləddin Süyuti, Əbül-Həsən Məhəmməd ibn Hüseyn ibn Asim Səhəri, Əllamə Minavi, Hafis ibn Həcər Əsqəlani, Qazi Şəvkani, ibn Həcər Heytəmi, Təftazani, Qurmani Dəməşqi, Məbar Kəfuri, Əhməd ibn Məhəmməd ibn Siddiq, Səfarini Hənbəli, Seyyid Məhəmməd Siddiq Həsən, Əbül-Xətib Məhəmməd Şəmsül-Həqq Əzim Abadi, Şeyx Əbül-Hüseyn Abiri, Bərzənçi, Şeyx Məhəmməd Xızr Hüseyn, Əbül-Əla Məvdudi, Əhməd Zeyni Dehlan, Şeyx Mənsur Əli Nasif, Şeyx Nəsirəddin Əlbani kimi məşhur sünni alimləri Məhdəviyyət hədislərini .mütəvatir sayırlar

?Sual: ٩٢. Mütəvatir olmayan bir hədisə inanmaq olarmı

Cavab: Sünnə əhli Məhdəviyyət mövzusunu həzrət Peyğəmbərin (s) müjdələrindən saydıqları üçün, eləcə də bu mövzu ilə bağlı mötəbər rəvayətlər olduğundan, hətta .rəvayətlər mütəvatir həddə çatmamışsa belə, uyğun etiqadı vacib sayırlar

Həmud ibn Əbdüllah Təvicəri deyir: “Peyğəmbərin (s) aşkar şəkildə bəyan etdiklərinə iman gətirmək hər bir müsəlmana vacibdir. Belə bir iman həzrətin peyğəmbərliyinin etirafı və ona şəhadətdir…” Sonra müəllif Əhməd ibn Hənbəl və Əbu Məhəmməd (Müqəddəsidən eyni iddiaları nəql edir.(٢

١- [١۶٠] "Əl-Məhdi vəl-Məhdəviyyə", s. ١١٠.

٢- [١۶١] "İthaful-Cəmaət", c. ١, s. ۶.

O digər bir məqamda deyir: “Qeybi xəbərlərə iman gətirmək üçünmü təvatirlik şərt deyil. Bir qeybi xəbərin həzrət Peyğəmbərin (s) tərəfindən nəql olunduğu sübuta yetirsə, deyilənə iman gətirmək vacibdir. Uyğun məsələ ilə bağlı hədislərin mütəvatir saya çatmasının əhəmiyyəti yoxdur. Bu sünni əhlinin mövqeyidir.” Sonra müəllif öz iddiasını sübuta yetirmək üçün “Nəbə” ayəsinə istinad edir.(١)

Doktor Məhəmməd Əhməd İsmail Müqəddəm deyir: “Peyğəmbər tərəfindən düzgün yolla gəlib çatmış hədisə inanmaq hər bir müsəlmana vacibdir. Belə bir inam İslam peyğəmbərinin risalətinə şəhadət şərtidir…”(٢)

Sual: ٩٣: Məhdəviyyət hədislərinin düzgünlüyü kimlər tərəfindən təsdiqlənir?

Cavab: Bir qrup sünni alimi Məhdəviyyət hədislərini həqiqi sayır, onlardan bir qrupu isə bu hədisləri təvatir həddə bilir. Termizi, Əbu-Cəfər Əqili, Bərbəhari, Məhəmməd ibn Hüseyn Abiri, Hakim Nişapuri, Beyhəqi, Bəğəvi, İbn-Əsir, Qurtubi, İbn Mənzur, İbn-Təymiyyə, Cəmaləddin Məzzi, Zəhəbi, İbn Qəyyim Cəvziyyə, İbn-Kəsir, Təftazani, Nurəddin Heysəmi, Şeyx Məhəmməd Cəzri Şafei, Əhməd ibn Əbu-Bəkr Buysəri, İbn Həcər Əsqəlani, Süyuti, Şeyx Əbdül Vəhhab Şüərani, İbn Həcər Heytəmi, Mətqa Hindi, Şeyx Məri ibn Yusif Müqəddəsi Hənbəli, Məhəmməd ibn Əbdul Rəsul Bərzənçi, Məhəmməd Əbdül-Baqi Rəzəqani, Əbül-Əla İraqi, Şeyx Məhəmməd ibn Əhməd Səfarini Hənbəli, Seyyid Məhəmməd Mürtəza Zübeydi, Şeyx Məhəmməd ibn Əli Səbban, Məhəmməd Əmin Suyidi, Şəvkani, Məhəmməd ibn Həsən ibn Mömin Şəbələnçi, Əhməd ibn Zeyni Dehlan, Şihabəddin Əhməd ibn İsmail Əlvani Şafei, Əbül-Bərakat Alusi Hənəfi, Məhəmməd Bəlbəsi Şafei, Əbül-Təyyib Əzim Abadi, Məbar Kəfuri, Şeyx Mənsur Əli Nasif, Şeyx Xızr Hüseyn Misri, Əbül-Əla Məvdudi, Nasirəddin Əlbani, Şeyx Əbdül-Möhsin ibn Həmdül-İbad, Şeyx Həmud ibn Əbdüllah Təvicəri, Şeyx Əbdül-Əziz ibn Əbdüllah ibn Baz Məhdəviyyət hədisini qəbul edən alimlərdəndir.



---

١- [١۶٢] Həmin mənbə, s. ٧.

٢- [١۶٣] “Əl-Məhdi və fiqhu şiratus-saə”, s. ٢٣, ٢۴.

?Sual: ۹۴. Hansı səhabələr Məhdəviyyət hədisini nəql etmişdir

Cavab: Səhabələr arasında Məhdəviyyət hədisini nəql edənlər çoxdur. Onlardan bəzilərinin adını çəkək: İmam Əmirəl-möminin (ə), Əbu-Əmamə Bahili, Sudəy ibn Əclan, Əbu-Əyyub Ənsari, Əbu-Səid Xidri, Əbu-Səlmi, Əbül-Tüfeyl Amir ibn Vasilə, Əbu-Leyla, Əbu-Vail, Əbu-Hüreyrə, Ənəs ibn Malik, Suban Məvlan Rəsulullah, Cabir ibn Səmərə, Cabir ibn Əbdüllah Ənsari, Cabir ibn Əbdullah Sədəfi, imam Hüseyn ibn Əli, Səlman Farsi, Təlhə ibn Übeydüllah, Abbas ibn Əbdül-Mütəllib, Əbdürrəhman ibn Ouf, Əbdül-Rəhman ibn Hərs, Əbdullah ibn Abbas, Abdullah ibn Ömər ibn Xəttab, Əbdullah ibn Əmr ibn As, Əbdullah ibn Məsud, Osman ibn Əffan, Osman ibn Əbül-As, Əl-Qəmə ibn Əbdullah, Əli Əl-Hilali, Əmmar ibn Yasər, Ömər ibn Xəttab, İmran ibn Həsin, Əmr ibn As, Əmr ibn Mərrə Cəhəni, Ouf ibn Malik, Qətadə ibn Neman, Qərrə ibn Əyas Məzəni, Kəb ibn Əl-Qəmə, Məaz ibn Cəbəl, Fatimeye-Zəhra, Ümmü-Sələmə, .Ayişə, Ümmü-Həbibə və başqaları

Sual: ۹۵. Sünnə əhli həzrət Mehdi (ə) və onun zühurunu inkar edənlər haqqında hansı ?hökmü verir

Cavab: Bəzi sünnə alimləri həzrət Mehdinin (ə) zühuruna imanı vacib saymışlar. .Bəziləri isə bu həqiqəti inkar edənləri kafir hesab edirlər

Əhməd ibn Məhəmməd ibn Siddiq deyir: "Həzrət Mehdinin (ə) zühuruna iman vacibdir "...və bu zühura etiqad peyğəmbərin təsdiqi olduğu üçün qətidir

Bu təbir Hənbəli, Nasirəddin Əlbani, Əbdül-Möhsin ibn Məhəmməd Əl-İbad tərəfindən də işlədilmişdir.(۱) Şafei fəqihi İbn Həcər bildirir ki, Mehdinin (ə) inkarı köklü şəkildə sünnənin inkarına apararsa, küfrə səbəb olar. Kim belə etsə, qətli vacibdir. Əgər inkar sünnə yox, imamlarla düşmənçilikdəndirsə, həmin şəxs cəzalandırılmaqla bu işdən (çəkindirilməlidir..."(۲

Əhməd ibn Məhəmməd ibn Siddiq Ğəmari Əzhəri Məhdəviyyət hədisləri haqqında deyir: "Bu hədislər mütəvatirdir (yetərli həddədir), onları inkar edənlər bidətçi və azğın (sayılır."(۳

---

Əl-İzaət”, s. ۱۴۶; “Əl-Təməddunul-İslami”, ۲۲-ci say, s. ۶۴۳; “Əl-cəmaətul-“ [۱۶۴] -۱
.İslamiyyə”, ۳-cü say

.Əl-Bürhan”, s. ۱۷۸“ [۱۶۵] -۲

.Əl-Məhdiyyul- Muntəzər”, s.۵“ [۱۶۶] -۳

?Sual: ۹۶. İslam tarixində kimlər Məhdəviyyət mövzusunu nəzmə çəkmişlər

Cavab: Bir mövzunun nəzmə çəkilməsi onun həqiqət olmasını göstərən əlamətlərdəndir. Məhdəviyyət də bu qəbil mövzulardandır. Uyğun mövzu tarix boyu diqqət mərkəzində olmuş, nəzmə çəkilmişdir. Məhdəviyyəti nəzmə çəkənlərin bəzilərini yada salaq: İmam Əli (ə) Zeyd ibn Əli ibn Əl-Hüseyn, imam Sadiq (ə), imam Riza (ə), imam Həsən Əskəri (ə), ibn Əbil-Hədid Mötəzili, Mühyiddin ibn Ərəbi, Məhəmməd ibn Təlhə Şafei, Sədrəddin Qunuyi, Şeyx Əbdül-Rəhman Bistami, Fəzl ibn .Ruzbəhan, Məhəmməd ibn Tulun, Kimeyt ibn Zeyd Əsədi

?Sual: ۹۷. Məhdəviyyət əhvalatı nə vaxtdan qələmə alınmağa başlamışdır

Cavab: Müxtəlif mənbələri nəzərdən keçirdikdə məlum olur ki, Məhdəviyyət mövzusu prinsipial mövzulardan olmuşdur. Bu mövzu təkcə Mehdinin (ə) mövludundan öncə şiələr arasında yayılmamışdır. Həzrət Peyğəmbərin (s) vəfatından başlayaraq şiə və sünnilər arasında bu müqəddəs hərəkat müşahidə olunur. Bu da öz növbəsində Məhdəviyyət məsələsinin prinsipial İslam mövzularından olduğunu göstərir. Yanlış fikirdir ki, Məhdəviyyət mövzusu imam Həsən Əsgərinin (ə) şəhadətindən sonra .ortaya çıxıb

Qısa şəkildə deyə bilərik ki, Məhdəviyyət mövzusu hicri ikinci əsrin əvvəllərindən qələmə alınmışdır. Rical kitablarından məlum olur ki, bu mövzu şiə cəmiyyətində imam .Sadiqin (ə) dövründən yazıya alınmışdır

Şeyx Tusi “Əl-fehrest” kitabında nəql edir ki, Əli ibn Yəqtin ibn Musa Bağdadi Əsədi bu .mövzuda kitab tərtib etmişdir

?Sual: ۹۸. Məhdəviyyət mövzusu hansı üsullarla bəyan olunmuşdur

Cavab: Məhdəviyyət mövzusu müxtəlif firqələrin alimləri tərəfindən çeşidli şəkildə :təsnif olunmuşdur

Rəvayət yolu - Məhdəviyyət əhvalatının təfərrüatı qeybə iman nümunələrindən . ۱ sayılır. Bu yolun bəzi səciyyələri var: Bəziləri yalnız Quran ayələrinin təfsiri sayılan hədislər nəql etmişlər. Bəzilərisə öz kitablarında Məhdəviyyətlə bağlı bütün hədisləri

.toplamışlar. Şiə və sünnilər ikinci yola hər biri xüsusi bir şəkildə yanaşmışdır

:İmamiyyə alimləri Məhdəviyyətlə bağlı mövzunu üç növdə bəyan etmişlər

a) Şiələr tərəfindən nəql olunmuş hədislərə istinad edilmişdir. Misal olaraq “Kifayətul-.muhtədi fi mərifətul-Məhdi”, “Biharul-ənvar” kitablarını göstərmək olar

b) Şiə rəvayətlərinin sünnilər tərəfindən nəql olunmuş rəvayətlərlə təsdiqi. Nümunə .olaraq “Kəşful-ğəmmə”, “Əttəraif”, “İsbatul-hudat” kitablarını göstərmək olar

v) Sünnilərə Məhdəviyyət mövzusunu qəbul etdirmək üçün yalnız sünni rəvayətlərinə istinad edilmişdir. Nümunə olaraq “Əl-Məhdi”, “Əl-Məhdiyyul-Məvludul-Muntəzər” kitablarını göstərmək olar. Sünnə əhli də uyğun məsələyə münasibətdə müxtəlif :üsullardan istifadə etmişdir

a) “Əxbarul-Məhdi”, “Camiul-əhadisul-varidə fil-Məhdi” kimi kitablarda yalnız sünni .mənbələrinə istinad olunmuşdur

b) Şiə və əhli-beyt rəvayətləri nəql olunmuşdur. “Əl-Məlahim”, “Əqdud-durər fi əxbarul-müntəzər”, “Əl-bürhan fi əlamətu Məhdi axiruz-zəman” kitablarını misal .göstərmək olar

v) İmamiyyə əqidəsinin sübutu üçün Məhdəviyyət məsələsində əhli-beyt (ə) rəvayətlərinə istinad olunmuşdur. “Yənabiul-məvəddət”, “Fəraidul-səmteyn” .kitablarını misal göstərmək olar

Dəlil və kəlam yolu – Bu yolla gedən müəlliflər Məhdəviyyət mövzusunu dəlillər .٢ əsasında bəyan etmişlər. Uyğun yanaşmanın məqsədi Məhdəviyyətlə bağlı şübhələri aradan qaldırmaqdır. Misal olaraq Şeyx Müfidin kitablarını göstərmək olar. Seyyid Mürtəzanın “Əl-Müqniə fil-ğeybə”, Şəhid Seyyid Məhəmməd Baqir Sədrin “Bəhsun .hovləl-Məhdi” kitabları da bu qəbildəndir

Əlaqələndirmə yolu – Məhdəviyyət mövzusundakı üsullardan biri şiə əqidəsi ilə digər .٣ İslam məzhəbləri arasındakı yaxınlıq mövzusudur. Bu sayaq söhbətlərə Şeyx Müfidin, Seyyid Mürtəzanın, Şeyx Tusinin kitablarında rast gəlmək olar. Sırf bu mövzuda yazılmış kitablar arasında yeddinci əsr alimlərindən olan Əbu Əbdüllah Hümeydan ibn Yəhya Qasimi Həsəni, Şeyx Mehdi Fətlavi, Nəcməddin Əsgərinin kitabları mühüm yer

.tutur

Tarixi təhlil yolu – Bu yolu seçən müəlliflər Məhdəviyyət mövzusunu müxtəlif tarixi .۴ yönümlərdən işıqlandırmışlar. Şəhid Seyyid Məhəmməd Sədrin “Tarixul-ğeybətul-Suğra”, «Tarixul-ğeybətul-kubra», «Tarix ma bədəl-zühur» kitabı uyğun üsulla yazılmış .mühüm kitablardandır

Dinlərarası yaxınlıq üsulu – Bəziləri Məhdəviyyət mövzusunu bəyan edərkən daha .۵ böyük miqyas götürmüş, müxtəlif dinlərdə uyğun mövzu ilə bağlı məlumatlara əsaslanmışdır. Doktor Sadiqinin "Bəşarətul-əhdeyn", Seyyid Əyyubun "Əl-məsihul-.Dəccal" kitabları uyğun üsulda yazılmış kitablardandır

Tarixi fəlsəfə təhlili yolu – Bəziləri bu mövzuya tarixi təkamül prizmasından .۶ yanaşmışlar. Şəhid Mütəhhərinin "Tarixi fəlsəfə baxımından Mehdi (ə) qiyamı" kitabı .həmin qəbildəndir

?Sual: ۹۹. Mehdilik iddiasının ortaya çıxması həmin zühurun labüdlüyünü göstərmirmi

Cavab: Məhdəviyyət əqidəsi İslam cəmiyyətinə o qədər nüfuz etmişdir ki, hətta bəziləri bu əqidədən istifadə edərək Mehdilik iddiasına düşmüşlər. Xoşbəxtlikdən .zaman ötdükcə belə yalan iddialar aradan qalxmışdır

Əhməd Əmin Misri "Əl-Məhdiyyə fil-İslam" kitabında bildirir ki, Mehdilik iddiası bu əqidənin puçluğunu göstərir. Əslində isə belə deyil. Tarix boyu kimlərinsə Mehdilik iddiasına düşməsi bu əqidənin düzlük göstəricisidir və cəmiyyətdə uyğun əqidənin .nüfuzundan danışır

Bir sahədə yalançı iddiaçıların olması sübut götürülərsə, peyğəmbərlik məsələsi də !?şübhə altına düşər. Məgər tarixdə peyğəmbərlik iddiası edən yalançılar az olmuşdur

?Sual: ۱۰۰. Kimlər Mehdilik iddiasına düşmüşlər və kimlər Mehdi (ə) kimi tanıtdırılmışdır

:Cavab: Bu sayaq iddia edənlər çox olmuşdur. Məsələn

;Muxtar tərəfindən Mehdi (ə) olması iddia edilən Məhəmməd ibn Hənəfiyyə .۱

;Xalqın Mehdi (ə) kimi tanıtdırdığı Musa ibn Təlhə .۲

;Bir çoxlarının Mehdi (ə) kimi tanıdığı Əbu-Haşim ibn Məhəmməd ibn Hənəfiyyə .۳

;Ömər ibn Əbdül-Əziz .۴

;Əbdüllah ibn Müaviyə ibn Əbdüllah ibn Cəfər .۵

۶. İmam Sadiqin (ə) oğlu İsmail (Bəziləri onun ölümünü inkar etmiş və Mehdi (ə) olduğunu bildirmişlər);

۷. Mötəzililərin Mehdi (ə) kimi tanıtdırdığı Məhəmməd ibn Əbdüllah ibn Həsən. Əbül-fərəc İsfəhani deyir: “Kimsə onun Mehdi (ə)

".olmasına şəkk etmədi. Hətta Bəni-haşimdən olanların bir dəstəsi ona beyət etdi

Mənsur Abbasinin oğlu Mehdi Abbasi. (Atası ona "Mehdi" ləqəbi vermişdi ki, bu .٨ .(bəhanə ilə xalqdan beyət ala bilsin

?Sual: ١٠١. Zeydiyyə əqidəsində olanlar Mehdini (ə) inkar edirmi

Cavab: Əhməd Əmin Misri "Zəhiyul-İslam" kitabında iddia edir ki, zeydiyyə əqidəsində .olanlar Mehdini (ə) inkar etmişlər

Əhməd Əminin iddiası kökündən yanlışdır. Zeydiyyə kitablarına müraciət etdikdə .görürük ki, onlar da digər İslam firqələri kimi həzrət Mehdinin (ə) qiyamına inanırlar

Zeydiyyə firqəsinin böyük alimlərindən olan Məcdəddin ibn Məhəmməd ibn Mənsur Həsəni "Ləvamiul-ənvar" kitabında "Əxbarul-Məhdi" adı altında fəsil tərtib etmiş və .həzrət Mehdi (ə) ilə bağlı bir çox hədislər nəql etmişdir

O uyğun fəsildə yazır: Məhəmməd (s) ailəsindən olan imamlar həzrət Mehdi (ə) haqqında müjdə vermişlər. Onlar Mehdinin (ə) intizarını çəkirdilər. Hər bir imam (özündən sonrakı imama bu barədə vəsiyyət etmişdir."(١

Bu şəxs həzrət Mehdi (ə) haqqında bir çox rəvayətlər nəql etdikdən sonra deyir: "Həzrət Mehdi (ə) və onun əhli-beytdən olması ilə bağlı rəvayətlər təvatir (yetərli) (həddədir."(٢

Kitabın başqa bir bölməsində oxuyuruq: Son imamla bağlı peyğəmbərdən və ələvi imamlardan yetişmiş xəbərlər qeyd olunanlardan çoxdur. "Nəhcül-bəlağəni" şərh edən ibn Əbil-Hədidin uyğun mövzu ilə bağlı söylədikləri həqiqətdir. Bütün müsəlman (firqələri yekdil olaraq düşünür ki, dünya yalnız onun zühurundan sonra sona çatır."(٣

(Eyni fikirlər zeydiyyə imamı İbn-Həmzənin "Əş-şafi" kitabında nəql olunmuşdur.(٤

İbn Həmzənin dediklərindən məlum olur ki, o hətta həzrət Mehdinin (ə) dünyaya (gəlişinə də inanır.(٥

Zeydiyyə alimlərindən olan Qazi Hüseyn ibn Nasir Məühəlla "Mutməhul-amal"

kitabında Məhdəviyyət hadisəsindən söz açır. O



---

۱- [۱۶۷] "Ləvamiul-Ənvar", c. ۱, s. ۵۷.

۲- [۱۶۸] Həmin mənbə.

۳- [۱۶۹] Həmin mənbə.

۴- [۱۷۰] "Kitabul-Şafi", c. ۱, s. ۷۸.

۵- [۱۷۱] Həmin mənbə, s. ۷۹.

deyir: “Həzrət Mehdi (ə) haqqında mütəvatir həddə çatmış hədislər nəql (olunmuşdur.”(١)

?Sual: ١٠٢. Məhdəviyyətə etiqad xalqı xeyir əməldən çəkindirmirmi

.Cavab: Öncə Məhdəviyyətə etiqad və imamın intizarı mövzularını açıqlamaq lazımdır

Məhdəviyyət o vaxt zərərli ola bilər ki, insan intizar adı altında bir bucağa çəkilib cəmiyyətdən ayrılsın; elə düşünsün ki, yer üzündə zülmün genişlənməsi imamın .zühurunu tezləşdirəcək və imam tənhalıqda yer üzünü islah edəcək

Başqa cür də düşünmək olar. Əslində bilməliyik ki, bizim əlimizi yanımıza salıb boş dayanmağımız bu zühuru yubandırır. Belə bir yanaşma insanı təşviq edir. Xilaskarı gözləyənlər özləri saleh fərdlərdir. Bu səbəbdən də İslam rəvayətlərində fərəc intizarı .ən fəzilətli əməl sayılmışdır

**Məhdəviyyətlə bağlı yekdil fikirlər**

?Sual: ١٠٣. İslam məzhəbləri imamın (ə) zühurunu prinsipcə yekdil qəbul edirlərmi

Cavab: Prinsipcə bütün İslam məzhəbləri peyğəmbər nəslindən olan həzrət Mehdinin (ə) zühur məsələsini qəbul edirlər. Hamı inanır ki, dünyanın axırlarında yer üzünü zülm-.sitəm bürüdükdən sonra Mehdi (ə) adlı bir şəxs zühur edib ədaləti bərpa edəcək

a) Şiə alimlərindən - Şəhid Sədr deyir: “Həqiqətən, dünyanın ümumdünyəviləşdirilməsi istiqamətində həzrət Mehdinin (ə) zühuruna etiqad peyğəmbər hədislərində ümumi, əhli-beyt (ə) rəvayətlərində xüsusi şəkildə bəyan olunmuşdur. Bu məsələyə o qədər (böyük diqqət ayrılır ki, heç bir şəkk-şübhəyə yer qalmır...”(٢)

Şeyx Məhəmməd Riza Müzəffər deyir: “Dünyanın axırlarında Fatimə (s) övladlarından olan Mehdinin (ə) zühur məsələsi və yer üzü zülmə büründükdən sonra onda ədalətin hakim olması peyğəmbərdən mütəvatir (yetərli) şəkildə nəql olunmuşdur və rəvayət (kitablarında yer tutmuş məsələlərdəndir.”(٣)

۱- [۱۷۲] “Mutməhul-amal”, s. ۱۸۵.

۲- [۱۷۳] “Bəhsun hovləl-Məhdi (ə)”, s. ۱۰۳, ۱۰۴.

۳- [۱۷۴] “Əqaidul-imamiyyə”, s. ۷۷.

b) Sünni alimlərindən – Nasirəddin Əlbani deyir: “Bilmək lazımdır ki, Mehdi (ə) və onun (zühur məsələsi haqqında bir çox etibarlı hədislər nəql olunmuşdur.”(١

Şeyx Əbdül-Möhsin ibn Həmdül-İbad deyir: “Həqiqətən, həzrət Mehdi (ə) haqqında hədislər sünnə əhli kitablarında o qədərdir ki, bu məsələyə şübhə etmək çətin olur. Mənbələrdən xəbərsiz, elm əhlinin dedikləri ilə tanış olmayan cahil və höcətkeş (insanlar bu məsələyə şübhə edə bilər...”(٢

Şeyx Əbdül-Əziz ibn Əbdüllah ibn Baz deyir: “Mehdi (ə) mövzusu aşkar bir mövzudur və bu mövzudakı hədislər bəlkə də mütəvatir həddədir. Elm əhli bu hədislərin təvatir (həddə çatdığını bildirir...”(٣

?Sual: ١٠۴. Bütün İslam məzhəbləri həzrət Mehdinin (ə) zühuruna etiqadı vacib sayırmı

Cavab: Bütün məzhəblərdə belə bir etiqad var ki, dünyanın axırlarında həzrət .Mehdinin (ə) zühuru qeybi məsələlərdəndir və bu məsələyə etiqad etmək lazımdır

a) Şiə alimlərindən – Şeyx Səduq deyir: “Həzrətin halından xəbərsiz ona iman gətirmək düzgün deyil. Yalnız həzrətin qeyb dövründə şənindən xəbərdar olmaqla belə bir (etiqaddan faydalanmaq olar.”(۴

b) Sünni alimlərindən – Nasirəddin Əlbani yazır: “Həqiqətən, həzrət Mehdinin (ə) zühuruna əqidə sabit bir əqidədir və peyğəmbərdən etibarlı vasitələrlə nəql olunmuşdur. Ona görə də bu həqiqətə iman vacibdir. Quranda qeybə iman pəhrizkarların xüsusiyyəti kimi tanıtdırılır. Mehdinin (ə) zühuruna inam da qeybi (işlərdəndir...”(۵

Əbdül Möhsün ibn Həmdül-İbad yazır: “Məhdəviyyətin təsdiqi və ona iman İslam Peyğəmbərinin (s) risalətinə imandandır. Çünki peyğəmbərin təsdiq etdiyi mövzulara iman da peyğəmbərə iman sayılır. Bu əslində qeybə imandır və Allah-təala möminləri (qeybə inandıqlarına görə mədh etmişdir...”(۶



---

.Ət-təməddunul-islami”, hicri ١٣٧١-ci il“ [١٧۵] -١

۲- [۱۷۶] "Camətu-İslamiyyə", ۳-cü say.

۳- [۱۷۷] Həmin mənbə.

۴- [۱۷۸] "Kəmalud-din", c.۱, s. ۱۹.

۵- [۱۷۹] "Təməddune-İslami", Dəməşq çapı.

۶- [۱۸۰] "Əl-cəmaətul-İslamiyyə", Hicaz çapı.

Sual: ١٠٥. Həzrət Mehdinin (ə) hökumətinin əhatəsi ilə bağlı məzhəblərin mövqeyi ?necədir

Cavab:Həzrət Mehdinin (ə) hökumətinin əhatəli olmasına etiqad Məhdəviyyətə .etiqaddandır

Allah-təala buyurur: "Allah sizlərdən iman gətirib saleh iş görənlərə yer üzündə xilafət (vəd etmişdir.(١

Əhməd ibn Hənbəl həzrət Peyğəmbərin (s) dilindən belə nəql edir: "Yer üzü zülm-sitəmlə dolar. Həmin vaxt nəslimdən olan bir şəxs zühur edər, ٧-٩ gün ərzində bütün ".yer üzünə sahib olar. Həmin vaxt bütün yer üzündə ədalət bərpa edilər

İmam Baqir (ə) buyurmuşdur: "İmam Qaim (ə) Mehdi (ə) ٣٠٩ il yer üzündə hakim olar. Kəhf əhli də mağarada bu qədər qalmışdı. Həzrət yer üzü zülmə büründükdən sonra (ədaləti bərpa edər. Allah onun üçün dünyanın şərqini və qərbini fəth edəcək..."(٢

?Sual: ١٠٦. Xilaskarın ləqəbi haqqında məzhəblər nə deyir

Cavab: Şiə və sünnilər tərəfindən nəql olunmuş rəvayətləri nəzərdən keçirdikdə .məlum olur ki, xilaskarın ləqəbinin Mehdi (ə) olduğunu hamı yekdil şəkildə qəbul edir

Hakim Nişapuri ibn Səid Xidriyə istinad edərək həzrət Peyğəmbərin (s) dilindən deyir: ("Mehdi biz əhli-beytdəndir".(٣

Həzrət peyğəmbər buyurmuşdur: "Həzrət Mehdi (ə) başının üzərində bulud dayanmış halda zühur edər. Bulud arasında bir kəs nida edər: "Bu Allahın xəlifəsi Mehdidir (ə), (ona itaət edin."(٤

?Sual: ١٠٧. Həzrət Mehdi (ə) kimin nəslindəndir

Cavab: Bütün müsəlmanlar yekdil olaraq qəbul edirlər ki, həzrət Mehdi (ə) Peyğəmbər (s) ailəsindəndir. Səd ibn Müsəyyib deyir: "Ümmü-Sələmənin yanında idim. Həzrət Mehdidən (ə) söhbət düşdü. Ümmü-Sələmə dedi: "Həzrət Peyğəmbərdən (s) belə (eşitdim: "Mehdi (ə) Fatimə (s) övladlarındandır."(٥

---

۱- [۱۸۱] “۵۵ ”Nur.

۲- [۱۸۲] “Bihar”, c. ۵۲, s. ۳۹۰.

۳- [۱۸۳] “Müstədrək”, c. ۴, s. ۵۵۷.

۴- [۱۸۴] “Bihar”, c. ۵۱, s. ۸۱.

۵- [۱۸۵] “Sünəni ibn Macə”, c. ۲, s. ۱۳۶۴.

Əbu-Səid Xidri deyir: "Həzrət peyğəmbərdən (s) eşitdim: "Yer üzünü zülm-sitəm bürüməmiş qiyamət qopmaz. Sonra ailəmdən olan bir şəxs qiyam qaldırar və yer (üzündə ədaləti bərpa edər."(١

(İmam Baqir (ə) buyurmuşdur: "Mehdi (ə) Fatimə övladlarındandır."(٢

?Sual: ١٠٨. Həzrət İsanın göydən enməsi ilə bağlı İslam məzhəblərinin mövqeyi nədir

Cavab: Müxtəlif rəvayətlərdə bildirilir ki, həzrət Mehdi (ə) zühur edən zaman həzrət .İsa səmadan enib namazda ona iqtida edəcək

Buxari Əbu-Hüreyrəyə istinadən Peyğəmbərin (s) dilindən belə nəql edir: "Özünüzdən (olan şəxs sizə imam ikən Məryəm övladı enəndə halınız necə olar?!"(٣

İmam Baqir (ə) buyurmuşdur: "Yer onun üçün fırlanacaq, xəzinələr ona açılacaq, hakimiyyəti şərq və qərbi bürüyəcək. Allah-təala müşriklər ikrah duysa da, onun vasitəsi ilə Öz dinini aşkarlayacaq. Həmin vaxt yer üzü bütünlüklə abad olar, Məryəm (oğlu İsa Ruhullah enib Mehdinin (ə) arxasında namaza durar."(٤

?Sual: ١٠٩. Həzrət Mehdinin (ə) zühuru üçün nə vaxt şərait yaranacaq

Cavab: Bütün İslam ümməti yekdil olaraq bu fikirdədir ki, Allah-təala həzrət Mehdinin .(ə) zühurunu bir gecədə müəyyənləşdirib imzalayar

Əhməd ibn Hənbəl nəql edir ki, həzrət Peyğəmbər (s) buyurdu: "Mehdi (ə) biz əhli-(beytdəndir. Allah onun zühurunu bir gecədə həyata keçirəcək."(٥

Şeyx Səduq imam Hüseynin (ə) dilindən nəql edir: "Mənim övladlarımdan olan şəxsin qiyamında həzrət Yusifdən, həzrət Musadan bir sünnə var və o, biz əhli-beytin (canişinidir. Allah-təala onun zühurunu bir gecədə həyata keçirər."(٦



---

.Müsnəde-Əhməd", c. ٣, s. ٣٦" [١٨٦] -١

.Bihar", c. ٥١, s. ٤٣" [١٨٧] -٢

.Səhihe-Buxari", c. ٤, s. ١٤٣" [١٨٨] -٣

۴- [۱۸۹] “Bihar”, c. ۵۲, s. ۹۱.

۵- [۱۹۰] “Müsnəde-Əhməd”, c. ۱, s. ۸۴.

۶- [۱۹۱] “Kəmalud-din”, c. ۱, s. ۳۱۷.

Sual: ١١٠. Həzrət Mehdinin (ə) ümumdünya ədalət hökuməti haqqında İslam ?məzhəblərinin mövqeyi nədir

Cavab: İstər şiə, istər sünni mənbələrində nəql olunmuş bir çox hədislərdən məlum olur ki, yer üzü zülm-sitəmə qərq olduqdan sonra həzrət Mehdi (ə) zühur edib yer .üzündə ədaləti bərpa edəcək

Əbu-Səid Xidri həzrət Peyğəmbərin (s) belə buyurduğunu nəql edir: "Yer üzü zülm-sitəmə qərq olmamış qiyamət qopmaz. Həmin vaxt əhli-beytimdən bir şəxs zühur edib (yer üzündə ədaləti bərpa edər.(١

Şeyx Tusi imam Sadiqin (ə) dilindən belə nəql edir: "Bizim Qaim (ə) (Mehdi (ə)) zühur edər. (Həzrət Əli (ə) ilə Musa ibn Cəfərə işarə edərək buyurdu) O bu şəxsin (nəslindəndir. Yer üzü zülm-sitəmlə dolduqdan sonra o, ədaləti bərpa edər".(٢

### İmam Mehdinin (ə) mövludu

?Sual: ١١١. Sünni alimlərindən həzrət Mehdinin (ə) anadan olmasını etiraf edən varmı

Cavab: Sünni alimlərindən bir qrupu imam Həsən Əsgərinin (ə) Mehdi (ə) adlı övladının dünyaya gəlişini etiraf etmişlər. Həmin alimlərdən bəzilərinin adını yada salaq: Əllamə Şəmsəddin Qazi ibn Xəlkan Şafei, Əllamə Səlahəddin Xəlil ibn Eybək Səfədi, İbn-Əsr Cəzri, Əllamə Mirxand, Əli ibn Hüseyn Məsudi, Məhəmməd Fərid Vəcdi, Əbül-Fəda İsmail ibn Əli Şafei, Sebt ibn Cozi, Məhəmməd ibn Təlhə Şafei, Şəmsəddin Məhəmməd ibn Tulun Hənəfi, Mirzaməhəmməd ibn Rüstəm Bedəxşi Şafei, Əhməd ibn Hucr Heytəmi Şafei, Məhəmməd ibn Yusif Gənci Şafei, Arif Əbdül Vəhhab Şərani Hənəfi, Mühyiddin Ərəbi, Mömin ibn Həsən Şəbələnci Şafei, Şeyx Süleyman Qunduzi Şafei, Şeyx Məhəmməd ibn Əli Səbban Şafei, Səfiyuddin Əbdül-Mömin Bağdadi, Zeynəddin Ömər ibn Virdi, Əbül-Əbbas Əhməd ibn Əli Qələqşəndi Şafei, Əbu-Əbdüllah Yaqut Həməvi, Məhəmməd Əmin Bağdadi (Süyudi), İbn-Xəldun, Əbül-Fəth Məhəmməd ibn Əbdül-Kərim Şəhristani, Nurəddin ibn Səbbağ Maliki, Nurəddin Əbdül-Rəhman Cami Hənəfi, Molla Əli Qari Hənəfi Məkki, Fəzl ibn Ruzbəhan, Cəmaləddin Məhəmməd ibn Yusif Zirəndi Hənəfi, Əhməd Əmin Misri, Sədrəddin Həməvini, Əttar Nişapuri, Cəlaləddin Bəlxi Rumi, Sədrəddin Qəvnəvi, Hüseyn ibn Məhəmməd Diyarbəkri

Maliki, Əhməd ibn Yusif Əbül-Əbbas Qurmani Hənəfi, Şəmsəddin Zəhəbi Şafei, Fəxr Razi Şafei, Şeyx Əbdüllah ibn Məhəmməd Şəbravi Misri Şafei, İbn İmad Dəməşqi Hənbəli, Məhəmməd ibn Əbdür-Rəsul Bərzənci Şafei, Əbül-Bərəkat Neman ibn .Məhmud Alusi Hənəfi və başqaları

?Sual: ۱۱۲. Sünnə əhlindən kimsə imam Əsgərinin (ə) övladını xilaskar kimi qəbul edirmi

Cavab: Bəzi sünni alimləri imam Həsənin (ə) Mehdi (ə) adlı övladının yalnız dünyaya gəlişinə inanırlar. Onun xilaskar olmasını isə şiələrə aid əqidə bilirlər. Bəzi sünni alimləri isə həm Mehdinin (ə) mövluduna, həm də onun hazırda sağ olmasına inanırlar. Bu :alimlərdən bəzilərini yada salaq

Məhəmməd ibn Yusif Gənci Şafei deyir: "İmam Həsən Əsgərinin (ə) özündən sonra .۱ (bir oğlu qalıb və o, vəd olunmuş imamdır."(۱

Əbdül-Vəhhab Şərani Hənəfi deyir: "Dünyanın sonunda Mehdinin zühuruna ümid .۲ var. O, imam Həsən Əsgərinin (ə) övladlarındandır. Onun mövludu hicri ۲۵۵-ci il Şəbanın ortasına təsadüf edir. O hazırda sağdır və həzrət İsa ilə görüşəcək. Yaşı ۷۰۶- (ya çatmışdır. Şeyx Həsən İraqi mənə belə xəbər verib."(۲

(Nurəddin Əbdür Rəhman Came Hənəfi deyir: "O yer üzündə ədaləti bərpa edər."(۳ .۳

Qazi Bəhlul Behcət Əfəndi deyir: "On ikinci imam hicri ۲۵۵-ci il Şəbanın ۱۵-də dünyaya .۴ gəldi. Onun iki qeyb dövrü var: kiçik qeyb və böyük qeyb. Allah ona izin verdiyi vaxt yer (üzündə ədaləti bərpa edəcək".(۴

Sədrəddin Həmvini həzrət Peyğəmbərdən (s) nəql etdiyi hədisdə deyir: "Həqiqətən, .۵ (övladlarımdan ۱۲-cisi qeybə çəkilər... Nəhayət, Allah-təala ona zühur icazəsi verər."(۵

:Şeyx Fəridəddin Əttar Nişapuri öz qəsidəsində deyir .۶

Minlərlə övliya əl açıb göyə

.Mehdini istərlər "ya Allah" deyə

,Ya Rəbb, göndər gəlsin böyük xilaskar

---

۱- [۱۹۴] “Kifayətul-Talib”, s. ۳۱۲.

۲- [۱۹۵] “Əl-yəvaqit vəl-cəvahir”, c. ۲, s. ۱۲۷.

۳- [۱۹۶] “Şəvahidun-Nübuvvə”,s. ۱۰۴.

۴- [۱۹۷] “Əl-Mühakimə fi tarixi Ali-Muhəmməd”, s. ۲۴۶.

۵- [۱۹۸] “Fəraidus-sitmin”, c. ۲, s. ۱۳۲.

.Ədalət dünyada görünsün aşkar

:Cəlaləddin Rumi həzrət Mehdini (ə) belə nəzmə çəkir .۷

,Kişilər sərvəri Əliyə salam

...Ərənlər hünəri Əliyə salam

Haqqı yer üzündə bərpa edəsi

.Mehdi adlı diri vəliyə salam

Sədrəddin Qəvnəvi şagirdlərinə belə vəsiyyət etmişdir: "Dünyadan köçəcəyim gecə .۸ qəlb iştirakı ilə ۷۰۰۰۰ dəfə "la ilahə illəllah" deyin və salamımı həzrət Mehdiyə (ə) ."çatdırın

Əhməd ibn Yusif Əbül-Əbbas Qurmani Hənəfi deyir: "Höccət Məhəmmədin, Saleh .۹ Xələfin atasını dünyadan köçəndə ۵ yaşı vardı. Allah-təala Yəhyaya uşaq yaşında hikmət öyrətdiyi kimi, ona da az yaşında hikmət təlim etdi. Alimlər yekdil olaraq bu "...rəydədir ki, Mehdi (ə) dünyanın sonunda zühur edəcək qaimdir

?Sual:۱۱۳. Məhdəviyyət hədislərini nəql edən müəlliflər hansı mənbələrə istinad edib

Cavab: Bəziləri deyirlər ki, qədim müəlliflər tarixi məsələlər, eləcə də, Məhdəviyyət mövzusu ilə bağlı hədisləri mənbəni araşdırmadan nəql etmişlər. Sonra yeni bir yanaşma nəzərə çarpır. Sonradan rəvayətlər araşdırılmış, "səhih", "həsən", "qəvi", "zəif" qruplarına ayrılmışdır. Amma belə bir yanaşma tarixi rəvayətlərə, o cümlədən, ...Məhdəviyyət rəvayətlərinə aid deyil

:Uyğun iradları cavablandıraq

Qədim imamiyyə hədisçiləri son həddə səy göstərərək bu məsələyə ehtiyatla . ۱ yanaşmış və hədislər toplamışlar. Bu alimlərdən biri də Kuleynidir. Kuleyni hədisçilər arasında öz diqqət və ehtiyatı ilə seçilir. Şeyx Tusinin də uyğun istiqamətdə ciddi səyləri olmuşdur. O istinad etdiyi şəxslərə çox diqqətlə yanaşmışdır. Şeyx Səduq istinad etdiyi şeyxləri yaxşı tanımış, onların iman və ədaləti haqqında məlumat

.toplamışdır. Bu alim tanımadığı kəsdən rəvayət nəql etməmişdir

Biz əminik ki, Məhdəviyyət hədislərini nəql edən bu böyük alimlər nəql etdikləri . ٢ hədislərin düzlüyünə inanmışlar. Onlar zəif cəhətləri aradan qaldıra bilən mötəbər dəlillərə əsaslanaraq uyğun hədisləri əminliklə nəql etmişlər. Şeyx Səduq və Tusi kimi alimlərin həqiqəti sübuta yetirməkdən başqa məqsədi olmamışdır. Uyğun mövzunu araşdırmaqda Şeyx Səduqun yeganə məqsədi Məhdəviyyətlə bağlı şübhələri aradan .qaldırmaq olmuşdur

İlk üç əsrdə yazılmış və Məhdəviyyət mövzusunu açıqlayan mənbələr şeyx Səduq, .۳ .Tusi və Nemaninin istinadgahı olmuşdur

Rəvayətlərin dörd yerə bölünməsi son dövrə aid olsa da, Şeyx Tusi öz dövründə .۴ .hədislərə xüsusi üslubda yanaşmışdır

Şeyx Bəhayi hədisləri dörd qismə böldükdən sonra deyir: "Qədim alimlər belə bir bölgü aparmamışdır. Onlar əminlik yaradan dəlillərə malik hədisləri səhih (düzgün) :saymışlar. Bu dəlillərə nəzər salaq

.a) Hədisin rəvayətçilər arasında məşhur۴۰۰ qaynaqdan nəqli

.b) Hədisin iki və ya daha artıq mötəbər qaynaqda təkrarı

v) Hədisin imam səhabələri və səhabələr icması tərəfindən təsdiqlənən qaynaqda .mövcudluğu

q) Hədisin imamlara təqdim olunmuş və imamlar tərəfindən təsdiqlənmiş kitabda mövcudluğu. Übeydullah ibn Əli Hələbinin imam Sadiqə (ə) təqdim etdiyi kitabı misal (göstərmək olar.(۱

(d) Hədisin qədim alimlər tərəfindən etibarlı sayılan kitabda nəqli.(۲

:Rical (hədis) alimləri məchul hədisləri iki qismə ayırırlar .۵

.a) İstilahi məchul: Bu qrupa rical alimləri tərəfindən cəhalati qeyd olunanlar daxildir

b) Lüğəvi məchul: Bu qrupa vəziyyəti məlum olmayan, rical kitablarında adı çəkilməyənlər daxildir. Birinci qrupdan olan hədislər zəif sayılır və onları araşdırmağa ehtiyac yoxdur. İkinci qrupdan olan hədislərin araşdırılmasına ehtiyac var. Müəyyənləşdirilməlidir ki, həmin rəvayətçinin adı nə üçün kitablarda qeyd olunmamışdır? Bunun səbəbi həmin şəxsin həm məşhurluğu, həm də cəhaləti ola (bilər.(۳

Olsun ki qədim alimlər rəvayətçinin sədaqət və ədalətini əsas götürmüşlər. Yəni .۶ öncə rəvayətçinin ədalətli olması yox, ədalətsiz olması sübut olunmalıdır. Bu səbəbdən

də ədalətin sübutuna ehtiyac duyulmur. Az adamların ədalətini sübuta yetirmək olar. .Mütəfəkkirlər bu üsulu qəbul edir

Rəvayətin etibarlı olmasının müəyyənləşdirilməsi üçün yalnız qaynağı araşdırmaq .٧ bəs etmir. Əminlik müxtəlif yollarla yarana bilər. Nəzərdə saxlamalıyıq ki, əksər şiə .alimlərinin mənbələrində rəvayətin düzlüyü müxtəlif baxışlardan öyrənilmişdir



---

.Ricale-Nəccaşi", s. ٢٣٠" [١٩٩] -١

.Vəsailuş-şiə", c. ٣٠, ١٩٧, ١٩٨" [٢٠٠] -٢

.Mirdamad", "Ər-rəvaşeh", s. ۶٠, ۶١" [٢٠١] -٣

?Sual: ۱۱۴. Həzrət Mehdinin (ə) mövludunu xəbər verən rəvayətlər zəifdirmi

Cavab: Bəziləri deyirlər ki, müəlliflər Mehdinin (ə) mövludundan danışan rəvayətlərin zəif olduğunu bildikləri halda, onları nəql etmişlər.

:Uyğun iradlara cavab verək

۱. Bu mövlud haqqında yetərincə etibarlı sənədlər olduğundan zəif rəvayətləri araşdırmağa ehtiyac yoxdur. Bu əqidə şiə və sünni hədisçiləri tərəfindən qəbul olunmuşdur.(۱)

۲. Aşkar etiqadi və kəlami məsələlərlə bağlı hədislər şiələr tərəfindən etibarlı sayılır. Bu məsələləri ağıl da təsdiqləyir. Aşkar etiqadi məsələlərin hədislərin araşdırılması yolu ilə təsdiqi zəruri deyil. Məhdəviyyət də bu qəbil məsələlərdəndir.

۳. Həzrət Mehdinin (ə) mövludundan xəbər verən hədislər təvatir (yetərlilik) həddindən çoxdur. Bu baxımdan da onların araşdırılmasına ehtiyac yoxdur. Mütəvatirlik əksəriyyət tərəfindən meyar qəbul olunmuşdur. Mütəvatir xəbəri nəql edən rəvayətçilərinin hər birinin ədalətli olması şərt deyil.

۴. İmam Əsgərinin (ə) yaşadığı dövrdəki siyasi vəziyyəti araşdıran şəxs anlayır ki, məhz həmin dövrün siyasi sıxıntıları səbəbindən bir çox rəvayətçilər həzrət Mehdinin (ə) mövludundan xəbərsiz qalmışdır. Bir çox hədisçilər rəvayəti nəql edərkən adlarını gizlətmiş, mövcud rejimin təzyiqlərindən çəkinmişlər.

?Sual: ۱۱۵. Həzrət Mehdinin (ə) mövluduna əminlik yaradan hansı amillər var

Cavab: Bir xəbərin mütəvatir olması yəqinlik yaradır. Həzrət Mehdinin (ə) mövluduna yəqinlik yaradan bəzi mövzuları nəzərdən keçirək:

۱. ۲۱۴ hədis həzrət Mehdinin (ə) mövludunu təsdiqləyir.(۲)

۲. Həzrət Mehdinin (ə) doğum ilini göstərən rəvayətlər.(۳)

۳. Həzrət Mehdinin (ə) fərdi xüsusiyyətlərindən danışan rəvayətlər.(۴)

(Həzrət Mehdinin (ə) imamlığını təsdiqləyən rəvayətlər.(۵ .۴



---

۱- [۲۰۲] Nasirəddin Əlbani, “Silsilətul-əhadisul-səhihə”, c. ۴, s. ۳۵۸.

۲- [۲۰۳] “Kəmalud-Din”, s. ۴۰۷.

۳- [۲۰۴] “Bihar”,c. ۵۱.

۴- [۲۰۵] “Kəmalud-din”, s. ۴۷۵.

۵- [۲۰۶] “Kəmalud-Din”, s. ۴۳۵.

(Müqəddəs nahiyə (imamın nümayəndəliyi) tərəfindən çıxarılan fərmanlar.(۱) .۵

.Bəni-Abbas hökuməti tərəfindən imam Mehdinin (ə) qətli üçün görülən tədbirlər .۶

.Kiçik qeyb dövründə həzrət Mehdi (ə) tərəfindən dörd səfirin təyin olunması .۷

Müxtəlif ölkə və şəhərlərdə müqəddəs nahiyənin (imamın nümayəndələrinin) . ۸ .vəkilləri

.Həzrət Mehdi (ə) ilə baş tutmuş görüşlər .۹

.Həzrət Mehdinin (ə) kitablarda qeyd olunmuş möcüzələri .۱۰

.Tarixçi alimlərin imam Əsgərinin (ə) övladı olmasını etiraf etmələri .۱۱

.İmam Mehdinin (ə) mövludunun şiə icması tərəfindən qəbulu .۱۲

.Genetika mütəxəssislərinin imam Əsgərinin (ə) övladı olmasını təsdiqləməsi .۱۳

.Yalançı səfirlərin mövcudluğu .۱۴

.Hər bir məsum imamın həzrət Mehdinin (ə) mövludunu təsdiqləməsi .۱۵

Sual: ۱۱۶. Həzrətin mövludunu bildirən hədislər arasında səhih (düzgün) qaynağı olan ?hədis varmı

Cavab: Həzrət Mehdinin (ə) dünyaya gəlişini bildirən hədislər arasında etibarlı qaynağı :olan hədislərdən bəzilərini nəzərdən keçirək

Kuleyni "səhih sənəd" sayılan Məhəmməd ibn Əbdüllah və Məhəmməd ibn . ۱ Yəhyadan, onlar da öz növbəsində Əbdüllah ibn Cəfər Həmiridən nəql edir: "Mən Şeyx Əbu Əmr – Osman ibn Səid Əmri ilə birlikdə Əhməd ibn İshaqın hüzurunda idik. Əhməd ibn İshaq mənə işarə etdi ki, Əbu-Əmrdən imam Əsgərinin (ə) canişini haqqında soruşum. Əbu-Əmrə dedim: "Səndən heç bir şəkkim olmayan bir məsələ haqqında soruşmaq istəyirəm. İnanıram ki, yer üzü heç vaxt höccətsiz (ilahi rəhbərsiz) qalmır. Yalnız qiyamətdən öncə ۴۰ gün belə ola bilər. Həmin gün çatdıqda höccət götürülər və tövbə qapısı bağlanar. Amma əminliyimi artırmaq istəyirəm. İmam

,Əsgərinin canişinini görmüsənmi?” Əbu-Əmr buyurdu: “Bəli, and olsun Allaha



---

.Bu barədə ətraflı danışılacaq [۲۰۷] -۱

boyu belə idi.” Sonra gördüyü canişinin boyunu əli ilə göstərdi...”(۱) Hazırkı hədisi səhih sənədlə Şeyx Səduq da nəql etmişdir.(۲)

۲. Kuleyni səhih bir sənədlə Hüseyn ibn Əladan belə nəql edir: “İmam Sadiqə (ə) ərz etdim: “Yer üzü imamsız qala bilərmi?” Həzrət buyurdu: “Heç vaxt.”(۳)

۳. Müəllif digər bir sənədə əsasən imam Sadiqdən (ə) belə nəql edir: “Həqiqətən, yer üzü heç vaxt imamsız qalmaz.”(۴)

۵. Başqa bir səhih sənədlə Əbu-Haşim Cəfəridən belə nəql olunur: “İmam Əskəriyə (ə) ərz etdim ki: “Ey mənim ağam! Sizin övladınız varmı?” Həzrət buyurdu: “Bəli.” Ərz etdim: “Əgər sizə bir hadisə üz versə, harada ona müraciət edim?” Buyurdu: “Mədinədə.”

۶. Başqa bir səhih sənədə əsasən Məhmməd ibn Əli ibn Bilaldan belə nəql olunur: “İmam Əsgərinin (ə) şəhadətindən iki il öncə ondan bir məktub aldım. Məktubda həzrət öz canişini haqqında məlumat verirdi. Şəhadətindən üç gün öncə başqa bir məktub gəldi. Yenə həzrət canişini haqqında yazırdı.”(۵)

۷. Kuleyni səhih sənədə əsasən Zürarənin imam Sadiqdən (ə) eşitdiklərini nəql edir: “Həqiqətən, o uşaq üçün qiyamdan öncə qeyb dövrü var... Ey Zürarə! Bu həmin Müntəzirdir ki, dünyaya gəlişinə şübhə olunar....”(۶)

۸. Şeyx Səduq mötəbər sənədə əsasən Davud ibn Qasim Cəfəridən imam Hadinin (ə) belə bir buyuruğunu nəql edir: “Məndən sonra canişinim övladım Həsəndir. Ondan sonrakı canişini görməzsiniz. Onun adını çəkmək sizə halal deyil.” Onu necə çağırmaq haqqında soruşdum. Buyurdu: “Ali-Məhəmməd höccəti”;(۷)



---

۱- [۲۰۸] “Kafi”, c. ۱, s. ۳۲۹-۳۳۰.

۲- [۲۰۹] “Kəmalud-din”, s. ۴۴۱.

۳- [۲۱۰] “Kafi”, c. ۱, s. ۱۷۸.

۴- [۲۱۱] Həmin mənbə.

Sual: ۱۱۷. İmam Mehdinin (ə) dünyaya gəlişi haqqında daha hansı yollarla məlumat ?verilir

Cavab: İmam Əsgərinin (ə) səhabələrindən bir çoxu və başqaları imam Mehdinin (ə) dünyaya gəlişi haqqında xəbər vermişlər. Onun kiçik və böyük qeyb dövrlərində :görənlər də var. Onlardan bəzilərinin adını çəkək

Əbul-Fəzl Hüseyn ibn Həsən Ələvi deyir: "Samirada imam Mehdinin (ə) mövludunu .۱ (təbrik etmək üçün imam Əsgərinin (ə) yanına getdim."(۱

Əhməd ibn Məhəmməd deyir: "Zübeyri öldürdükdən sonra imam Əskəridən (ə) . ۲ məktub aldım. O yazırdı: "Bu, Allah və Onun övliyasına iftira yaxanın, canişinim olmamış məni öldürə biləcəyini düşünənin cəzasıdır. Allahın qüdrətini necə gördü?!" (Hicri ۲۵۵-ci ildə həzrətin oğlu oldu və ona Məhəmməd (ə) adı verildi."(۲

Əbu-Haşim Cəfəri deyir: "İmam Əskəriyə (ə) ərz etdim: "Sizin övladınız varmı?" . ۳ (Həzrət buyurdu: "Bəli..."(۳

Şeyx Sadiq imam Əsgərinin (ə) xidmətçisi Nəsiminin dilindən belə nəql edir: "Həzrət .۴ Mehdi (ə) anadan olandan bir gün sonra onun yanına getdim. Yanında olduğum vaxt səbir vurdum. Həzrət (ə) buyurdu: "Yərhəməkəllahu" ("Allah sənə rəhm etsin") Bu söz məni sevindirdi. Sonra həzrət buyurdu: "Sənə səbir vurmaq haqqında müjdə verimmi? (Bil ki, səbir vurmaq insanı üç gün ölümdən amanda saxlayar."(۴

Şeyx Tusi Nəsim və Mariyəyə istinadən belə nəql edir: "Həzrət Mehdi (ə) anasının .۵ bətnindən çıxdıqdan sonra iki dizi üstə oturdu, şəhadət barmağı ilə səmaya işarə etdi, sonra səbir vurdu və buyurdu: "Əlhəmdulillahi Rəbbil-aləmin və səlləllahu əla Muhəmmədin və alihi əbədən və daxərən ğəyri-mustənkəfə və la mustəkbər." Sonra həzrət (ə) sözünə belə davam etdi: "Zalımlar güman etdilər ki, Allahın höccəti gəlməyəcək. Əgər bizə danışmaq izni verilsəydi, bütün şəkk-şübhələr aradan (qalxardı.(۵

Şext Tusi Kamil ibn İbrahim Mədənidən bir rəvayət nəql edir. Kamil imam Əskəri (ə) .۶ ilə görüşündən danışır: "Külək əsdi, pərdə kənara çəkildi. Qəfildən ay tək nur saçan bir

uşaq göründü. Onun dörd



---

.Bihar”, c. ۵۱, s. ۱۷“ [۲۱۶] -۱

.Həmin mənbə [۲۱۷] -۲

.Kafi”, c. ۱, s. ۳۲۸“ [۲۱۸] -۳

.Kəmaluddin-din”, c. ۴۳۰“ [۲۱۹] -۴

.Əl-ğeybət”, Tusi, s. ۲۴۵“ [۲۲۰] -۵

yaşı olardı. Bəlkə də, mənə belə göründü. Mənə buyurdu: “Ey Kamil ibn İbrahim! Onun xitabı bədənimi lərzəyə gətirdi. İlhamlanıb, “eşidirəm, mənim ağam” dedim. Həzrət (buyurdu: “Sən Allahın vəlisi, höccəti, qapısının yanına gəlmisən.”(١

Əmr Əhvazi deyir: “İmam Əskəri (ə) öz övladını mənə göstərdi və buyurdu: “O, .٧ ”.məndən sonra sizin sahibinizdir

Şeyx Hürr Amili deyir: “Kuleyni və başqa müəlliflər mötəbər sənədlərə əsasən nəql edirlər ki, bir çox insanlar mövludundan sonra həzrət Mehdi (ə) ilə görüşmüşdür. Məhəmməd ibn İsmail ibn Musa ibn Cəfər, Həkimə binti Məhəmməd, Əbu-Əli ibn Mutəhhər, Xadim İbrahim ibn Əbdə, Əbu-Əbdüllah ibn Saleh, İbrahim ibn İdris, əmisi Cəfər ibn Əli, Əmr Əhvazi, Zərif Xadim, Farsi, Mədaini həzrət Mehdini (ə) görən (şəxslərdəndir.”(٢

Müaviyə ibn Həkim, Məhəmməd ibn Əyyub ibn Nuh və Məhəmməd ibn Osman Əmri .٨ deyir: “İmam Əsgəri öz mənzilində övladını bizə göstərdi. Biz ۴٠ nəfər idik. Həzrət buyurdu: “Bu məndən sonra sizin imamınız, mənim canişinimdir. Ona itaət edin və (məndən sonra parçalanmayın...(٣

?Sual: ١١٨. Həzrət Peyğəmbər (s) həzrət Mehdinin (ə) mövludundan xəbər vermişdirmi

Cavab: Bəli, bu barədə ١٠٧ hədisdə məlumat verilir. İbn Abbas həzrət Peyğəmbərdən (s) belə nəql edir: “Allah-təala yer üzünə nəzər saldı. Məni seçdi, peyğəmbər qərar verdi. Sonra ikinci dəfə nəzər saldı. Əlini seçdi və onu imam qərar verdi. Mənə əmr etdi ki, onu özümə qardaş, canişin, xəlifə və vəzir seçim. Əli məndəndir, mən də Əlidən. O qızımın əri, iki nəvəm Həsən və Hüseynin atasıdır. Agah olun! Allah-təala məni və onları öz bəndələri üçün höccət qərar vermişdir. Eləcə də, Hüseyndən olan imamlar müəyyənləşdirilmişdir və onlar qiyam edib mənim vəsiyyətimi qoruyacaq. Onlardan doqquzuncusu mənim əhli-beytimin qaimi, ümmətimin Mehdisidir. Görünüş, danışıq və hərəkət baxımından mənə ən çox oxşayan da odur. Uzun qeybətdən və azdırıcı (heyrətdən sonra zühur edər...”(۴

١- [٢٢١] Həmin mənbə, s. ٢٤٧.

٢- [٢٢٢] "İsbatul-Hudat", c. ٣, s. ٤٤٢.

٣- [٢٢٣] "Kəmalud-din", s. ٤٣٥.

٤- [٢٢٤] "Kəmalud-din", s. ٢٥٧.

?Sual: ۱۱۹. Həzrət Əli (ə) imam Mehdinin (ə) mövludunu xəbər vermişdirmi

Cavab: Əsbəğ ibn Nəbatə deyir: “Həzrət Əmirəl-mömininin (ə) yanına getdim. Dərin fikrə gedib, əlindəki çubuğu yerə vururdu. Ərz etdim: “Ya Əmirəl-möminin, nə olub bu qədər fikrə getmisiniz, yoxsa yerə rəğbətiniz artıb?” Həzrət buyurdu: “Yox, and olsun Allaha mən bir gün olsun belə, dünyaya rəğbət göstərməmişəm. Məndən olası birinin mövludu haqqında düşünürəm. O, mənim övladlarımdan on birincisidir. Adı Mehdidir. Yer üzü zülm-sitəmə büründükdən sonra ədaləti bərpa edəcək. Onunla bağlı heyrət (və qeyb dövrü var. Həmin vaxt kimi yolunu azar, kimi haqqı tapar...”(۱

?Sual: ۱۲۰. İmam Həsən (ə) həzrət Mehdinin (ə) mövludunu xəbər vermişdirmi

Cavab: Bəli, hədislərdən birində imam Həsən (ə) Müctəba belə buyurur: “Həzrət Peyğəmbərdən (s) sonra imamlar ۱۲ nəfərdir. Qardaşım Hüseyndən (ə) doqquz imam (qərar verilər və ümmətin Mehdisi (ə) onlardan olar.”(۲

?Sual: ۱۲۱. İmam Hüseyn (ə) həzrət Mehdinin (ə) mövludunu xəbər vermişdirmi

Cavab: Şeyx Səduq imam Hüseynin (ə) dilindən belə nəql edir: “Övladlarımın doqquzuncusunda Yusifin, Musa ibn İmranın sünnəsi var. O biz əhli-beytin qaimidir. Allah-təala onun işini bir gecədə gerçəkləşdirər.” (“Kəmalud-din”, s. ۳۱۷; “Bihar”, c. ۵۱, s. (۱۳۲,۱۳۳

Başqa bir rəvayətdə belə nəql olunur: “..Bu ümmətin qaimi mənim doqquzuncu (övladımdır. Odur qeyb sahibi. Odur sağ vaxtında mirası bölünən kəs.” (Həmin mənbə

Əbdürrəhman ibn Suləyt imam Hüseynin (ə) dilindən belə nəql edir: “On iki Mehdi bizdəndir. Onların birincisi Əmirəl-möminin Əli ibn Əbu-Talib, sonuncusu mənim doqquzuncu övladımdır. Odur qaim imam. Allah-təala yer üzü məhv olduqdan sonra (onu Mehdi (ə) vasitəsi ilə dirildəcək...”(۳



---

.Kafi”, c. ۱, s. ۳۳۸; “Kəmalud-din”, s. ۲۸۹“ [۲۲۵] -۱

.Bihar”, c. ۳۶, s. ۳۸۳“ [۲۲۶] -۲

Sual: ۱۲۲. İmam Səccad (ə) həzrət Mehdinin (ə) mövludu haqqında məlumat ?vermişdirmi

Cavab: İmam Zeynəl-Abidinin (ə) övladı ondan soruşdu: "Ey ata! Nə üçün qardaşımı "Baqir" adlandırdın? Həzrət bu vaxta qədər görmədiyim şəkildə gülümsündü və buyurdu: "Ey övladım! Həqiqətən, imamlar onun övladlarıdır. Onlardan olan bizim qaim qiyam edər, yer üzünü zülm-sitəm bürüdükdən sonra ədaləti bərpa edər. Odur imam, odur imamların atası, odur elm mədəni, elm qaynağı. Odur elmi yaran. And olsun Allaha! Allahın rəsuluna ən çox oxşayan da odur." Ərz etdim: "Ondan sonra yeddi imam var? Həzrət buyurdu: "Ondan sonra yeddi imam var və dünyanın sonunda qiyam (edəcək Mehdi (ə) onların arasındadır."(۱

?Sual: ۱۲۳. İmam Baqir (ə) həzrət Mehdinin (ə) mövludu haqqında məlumat vermişdirmi

Cavab: Bəli, Şeyx Səduq imam Sadiqdən (ə) nəql olunmuş müfəssəl bir hədisdə onun dilindən belə nəql edir: "Həqiqətən, tezliklə mənim altıncı övladım qeybə çəkilər. O, həzrət Peyğəmbərdən (s) sonra on ikinci imamdır. Onların birincisi Əmirəl-möminin, (sonuncusu Qaim, yer üzündə Bəqiyyətullah və Sahibəz-zamandır..."(۲

Başqa bir hədisdə imam Sadiqin (ə) belə buyurduğu nəql edilir: "Hər kəs bütün imamları qəbul edib Mehdini (ə) inkar etsə, bütün peyğəmbərləri qəbul edib həzrət Məhəmmədi (s) inkar edən kəs kimidir." Ondan soruşuldu: "Ey peyğəmbər övladı, "?övladlarından hansı Mehdidir

Həzrət buyurdu: "Yeddinci övladdan sonra beşincisi. O sizdən qeybə çəkilər və onun adını çəkmək halal deyil."(۳) Əbu Bəsirdən nəql olunmuş hədisdə belə nəql olunur: İmam Sadiqə (ə) ərz etdim: "Ey peyğəmbər övladı! Siz əhli-beytin (ə) qaimi kimdir?" Həzrət buyurdu: "Ey Əbu-Bəsir! O, övladım Musanın beşinci övladıdır. O çox üstün qadının övladıdır. Qeybə çəkilər və batil əhli ona şəkk edər. Allah-təala onun zühurunu (qərar verib, onun əli ilə yer üzünü şərqdən qərbə fəth edər..."(۴



---

.Bihar", c. ۳۶, s. ۳۸۸" [۲۲۸] -۱

۲- [۲۲۹] “Kəmalud-din”, s. ۳۳; “Bihar”, c. ۴۲, s. ۷۹.

۳- [۲۳۰] “Kəmalud-din”, s. ۳۳۳.

۴- [۲۳۱] “Kəmalud-din”, s. ۳۴۵; “Bihar”, c. ۵۱, s. ۱۴۶

Sual: ١٢٥. İmam Kazim (ə) həzrət Mehdinin (ə) mövludu haqqında məlumat ?vermişdirmi

Cavab:Yunis ibn Əbdür-Rəhman deyir: "Musa ibn Cəfərin yanına gedib ərz etdim: "Ey peyğəmbər övladı! Qaim sizsinizmi?" Həzrət buyurdu: "Mən qaiməm, amma yer üzünü Allahın düşmənlərindən təmizləyəcək qaim mənim övladlarımdan beşincisidir. Onun (uzun müddətli qeyb dövrü olacaq..."(١

Şeyx Səduq həzrət Musa ibn Cəfərin (ə) dilindən belə nəql edir: "Bir vaxt yeddinci (övladımın beşinci övladı qeybə çəkilər..."(٢

?Sual: ١٢۶. İmam Riza (ə) həzrət Mehdinin (ə) mövludu haqqında məlumat vermişdirmi

Cavab: Hüseyn ibn Xalid bir hədisdə deyir: "İmam Rizaya (ə) ərz olundu: "Siz əhli-beytdən olan qaim kimdir?" Övladımın dördüncü övladı, çox üstün qadının övladı! Allah onun vasitəsi ilə yer üzünü zülm-sitəmdən təmizləyər. Anadan olmasına şəkk edilən (kəs odur. Odur zühurundan öncə qeybə çəkilən..."(٣

:Dəbəl Xəzai deyir: "Mövlam imam Əli ibn Musa Riza (ə) üçün bir qəsidə oxudum

,Şübhə yox ki, zühur edəcək imam

.Allahın adıyla qopacaq qiyam

,Haqqı ayıracaq batildən hökmən

.Ləyaqətin qədər alasısan sən

İmam Riza (ə) şeri dinləyib ağladı. Sonra başını qaldırıb buyurdu: "Ey Xəzai! Ruhul-Qüds sənin dilinlə danışdı. Bilirsənmi, bu imam kimdir və nə vaxt qiyam edəcək?" Ərz etdim: "Xeyr, ey mənim mövlam. Yalnız bunu bilirəm ki, sizlərdən bir imam qiyam qaldırar, yer üzündə zülmün kökünü kəsib ədaləti bərpa edər." Həzrət buyurdu: "Həqiqətən, məndən sonra övladım Məhəmməd imamdır. Məhəmməddən sonra Həsən, Həsəndən sonra onun övladı qaim imamdır. O, qeybə çəkiləndə intizar, zühur (edəndə firavanlıq olar..."(۴

---

۱- [۲۳۲] "Elamul-vəri", s. ۴۳۳.

۲- [۲۳۳] "Kəmalud-din", s. ۳۵۹.

۳- [۲۳۴] "Bihar", c. ۵۲, s. ۳۲۱.

۴- [۲۳۵] "Bihar", c. ۴۹, s. ۲۳۷; ("Yənabiul-Məvəddət", c. ۳, s. ۳۰۹.

?Sual: ۱۲۷. İmam Cəvad (ə) həzrət Mehdinin (ə) mövludu haqqında xəbər vermişdirmi

Cavab: Bəli, ۹۰ hədisdə imam Cəvad (ə) həzrət Mehdinin (ə) dünyaya gəlişinə işarə etmişdir. Şeyx Səduq Əbdül-Əzim Həsənidən belə nəql edir: "Mən Məhəmməd ibn Əlinin yanına getdim. Soruşmaq istəyirdim ki, Mehdi odur, yoxsa başqası? Həzrət öncə belə buyurdu: "Ey Əbül-Qasim! Həqiqətən, bizim qaim Mehdidir. Onun qeybi dövründə (intizar çəkmək, zühuru vaxtı itaət etmək vacibdir. O mənim üçüncü övladımdır."(۱

Səduq Səqər ibn Əbu-Delfdən imam Cavadın (ə) belə bir buyurduğunu nəql edir: "Məndən sonra imam övladım Əlidir. Onun əmri mənim əmrim, onun sözü mənim sözümdür. Ona itaət mənə itaətdir. Ondan sonra övladı Həsən imamdır. Onun əmri atasının əmri, sözü atasının sözü. Ona itaət atasına itaətdir." Sonra imam susdu. Mən Həsəndən (ə) sonra kimin imam olacağı barədə soruşdum. İmam ağladı və buyurdu: ("Həqiqətən, Həsəndən sonra onun övladı, zühuru gözlənilən qaimdir..."(۲

?Sual: ۱۲۸. İmam Hadi (ə) həzrət Mehdinin (ə) mövludu haqqında məlumat vermişdirmi

Cavab: Səqər ibn Əbu Delf deyir: "İmam Hadi (ə) buyurdu: "İmam məndən sonra Həsən, Həsəndən sonra övladı qaimdir. O, yer üzünü zülm-sitəmə büründükdən sonra (ədaləti bərpa edəcək."(۳

Davud ibn Qasim Cəfəri deyir: İmam Əbül-Həsən Hadi (ə) buyurdu: "Məndən sonra (canişini görməzsiniz və onun adını çəkmək halal deyil..."(۴

Sual: ۱۲۹. İmam Həsən Əsgəri (ə) həzrət Mehdinin (ə) mövludu haqqında məlumat ?vermişdirmi

:Cavab: Bəli, çoxsaylı rəvayətlərdə bu məsələ öz əksini tapmışdır

Musa ibn Cəfər ibn Vəhəb Bağdadi deyir: "İmam Əsgəri (ə) buyurdu: "Sanki sizin məndən sonra canişinimlə bağlı ixtilaf salacağınızı görürəm. Agah olun! Həqiqətən, hər kəs peyğəmbərdən

۱- [۲۳۶] "Kəmalud-din", s. ۳۷۷; "Bihar", c. ۵۱, s. ۱۵۶.

۲- [۲۳۷] "Elamul-Vəri", s. ۴۳۶; "Bihar", c. ۵۰, s. ۲۳۹.

۳- [۲۳۸] "Bihar", c. ۵۰, s. ۲۳۹.

۴- [۲۳۹] "Kəşful-Ğəmmə", c. ۲, s. ۴۰۶»

sonra imamları təsdiqləyib onların övladını inkar etsə, bütün peyğəmbərləri qəbul edib (İslam peyğəmbərini inkar etmiş kimidir...”(١

Osman ibn Səid Əmri deyir: İmam Əsgərinin (ə) yanında olduğum vaxt ondan qiyamət gününədək yer üzünün höccətsiz qalmayacağı barədə atalarından nəql olunmuş rəvayət haqqında soruşdular. Rəvayətdə deyilirdi ki, hər kəs öz zamanının imamını tanımamış dünyadan köçsə, cahiliyyət dövründə ölmüş kimi sayılar. Həzrət buyurdu: “Bu, gün kimi həqiqətdir.” Həzrətə ərz etdilər: “Ey peyğəmbər övladı! Sizdən sonra höccət və imam kimdir?” Həzrət buyurdu: “Övladım Məhəmməd məndən sonra imam (və höccətdir. Onu tanımamış dünyadan köçən cahiliyyət dövründə ölmüş kimidir...”(٢

Əhməd ibn İshaq deyir: “İmam Həsən Əsgəridən (ə) belə eşitdim: “Həmd olsun canişinimizi tanıtdırmamış bizi dünyadan aparmayan Allaha! O (canişinimiz), xilqət və (əxlaq baxımından peyğəmbərə ən çox oxşayan şəxsdir...”(٣

Sual: ١٣٠. Nə üçün imamlardan heç biri həzrət Mehdinin (ə) şəxsiyyətini ?açıqlamamışlar

Cavab: Əvvəla, həzrət Peyğəmbərdən (s) başlamış imam Əsgəriyədək (ə) bütün .məsumlar imkan həddində həzrət Mehdinin (ə) şəxsiyyətini tanıtdırmışlar

İkincisi, bir çox rəvayətlərdən məlum olur ki, həzrət Mehdi (ə) siyasi baxımdan çox təhlükəli vəziyyətdə idi. Zalım hakimlər onun yer üzündə zülmə son qoyacağını .bildiklərindən onu aradan götürməyə çalışırdılar

Bu səbəbdən də məsum Əhli-beyt (ə) həzrət Mehdinin (ə) dünyaya gəlişi məsələsinə çox ehtiyatla yanaşırdılar. Onlar həm həzrət Mehdini (ə) xalqa tanıtdırmalı, həm də .onun üçün təhlükə yaratmamalı idilər

Sual: ١٣١. İmam Əsgərinin (ə) dövründə və həzrət Mehdi (ə) dünyaya gələn vaxt siyasi ?durum necə idi

Cavab: İmam Əsgəri (ə) hicri ٢٣٢-ci ilin rəbiul-əvvəl ayında dünyaya göz açmışdır. O, üç :Bəni-Abbasi hakimi ilə müasir olmuşdur

Mötəzz, Möhtədi, Mötəməd. Mötəməd Əhli-beytə (ə) xüsusi bir düşmənçiliklə yanaşırdı. O, göstəriş vermişdi ki, imam Əsgərinin (ə) şəhadətindən sonra onun evində axtarış aparılsın və övladı haqqında məlumat toplanılsın. Bu barədə hakimiyyəti Cəfər .məlumatlandırmışdı

Davud ibn Əsvəd deyir: İmam Əsgəri (ə) mənə bir əsa verib buyurdu: "Bunu Əmriyə çatdır." Yolda əsa sındı və gördüm ki, onun arasında məktub var. İmamın xidmətinə qayıtdıqda bu məsələni danışdım. Həzrət buyurdu: "Kimlərinsə bizi təhqir etdiyini görsən, tapşırılmış işin ardınca get və məbada cavab vermək fikrinə düşəsən və onu tanıtdırasan. Çünki biz çətin şəraitdəyik. Sən yoluna davam et, bil ki, sənin halından (xəbər tuturuq. Bunu yadında saxla."(١

Tarixi mənbələrdən məlum olur ki, imam öz səhabələrinə ona salam verməməyi (tapşırmışdı. Əks-təqdirdə onun üçün təhlükə yaranardı.(٢

Həzrət öz şiələri ilə görüş üçün yer müəyyənləşdirmişdi. O buyurdu: "Filan yerdə, filan (evdə gecə vaxtı müraciət edin. Məni orada taparsınız."(٣

Məhəmməd ibn Əbdül-Əziz Bəlxi deyir: "Sübh vaxtı qoyunsatanların məhəlləsində oturmuşdum. Birdən imam Əsgərinin (ə) öz mənzilindən çıxdığını gördüm. Ürəyimdə dedim ki, bu şəxsin Allah höccəti olduğunu desəm, məni öldürərlərmi? Həzrət mənim yanımdan keçdiyi vaxt şəhadət barmağını ağızına yaxınlaşdırıb sakit olmaq işarəsi verdi. Həmin gecə həzrətlə görüşdüm. O buyurdu: "Ya gizlətməlisən, ya da qətlə (yetiriləcəksən. Özünə görə Allahdan qorx."(۴

Mərhum Müqəddəs Ərdəbili buyurur: "Əgər hədisi, «bir kişi» ünvanı ilə nəql etsələr (nəzərdə imam Həsən Əsgəri (ə) tutulmuşdur."(۵

Bütün bu məlumatlar imam Əsgərinin dövründə və həzrət Mehdi (ə) doğulan zaman vəziyyətin çətin olduğunu göstərir. Bu səbəbdən də həzrət Mehdinin (ə) mövludu .gizlədilmişdir

Bu arada imam Əsgərinin (ə) iki vəzifəsi vardı: Həzrət həm övladının dünyaya gəlişini sübuta yetirməli, həm də bu işi elə görməli idi ki, onun həyatı üçün təhlükə

.yaranmasın

səh:۹۵

---

.Bihar”, c. ۵۰, s. ۲۸۳“ [۲۴۳] -۱

.Həmin mənbə, s. ۳۰۴ [۲۴۴] -۲

.Həmin mənbə [۲۴۵] -۳

.Bihar”, c. ۵۰, s. ۲۸۹“ [۲۴۶] -۴

.Cameul-Ruvat”, c. ۲, s. ۴۶۲“ [۲۴۷] -۵

Sual: ١٣٢. Abbasi dövləti zəif olduğu halda həzrət Mehdi (ə) üçün hansı təhlükə yarada ?bilərdi

Cavab: Bəziləri deyirlər ki, Abbasilər dövlətində işləri türklər əlinə aldığından xəlifələr çox zəif mövqeyə malik idi. Guya həmin dövrün siyasi vəziyyəti həzrət Mehdinin (ə) .dünyaya gəlişinin məxfi saxlanılması üçün əsas ola bilməz

:Uyğun iradı cavablandıraq

.Əgər Abbasi dövləti həmin dövrdə zəifləmişdirsə də, prinsipcə güclü dövlət sayılırdı .١

Abbasilər türklərin hakimiyyətə nüfuzunun qarşısını ala bilməsə də, Əhli-beytə (ə) .٢ .qarşı yekdil rəydə idilər

Abbasilər daxili müxaliflərlə mübarizəyə məşğul olsalar da, heç vaxt əhli-beytlə .٣ .mübarizəni yaddan çıxarmamışlar

?Sual: ١٣٣. İmam Əsgərinin (ə) şəhadətindən sonra siyasi vəziyyət necə idi

Cavab: Zalım hakimlər imam Əsgəri (ə) övladı Mehdinin (ə) zülmlə aparacağı mübarizədən xəbərdar olduqları üçün hər yolla onu qətlə yetirməyə çalışırdılar. Həzrət Mehdiyə (ə) qarşı üç dəfə terror planı cızıldı. Amma düşmən bu planları həyata keçirə bilmədi. İmam Əsgərinin (ə) şəhadətindən bir neçə gün sonra Abbasi Mötəməd belə bir cəhd etdi. Mötəməddən sonra hakimiyyətə gəlmiş Mötəzid iki dəfə imam Mehdini (ə) aradan götürməyə cəhd göstərdi. Ondan sonrakı xəlifələr isə uyğun cəhdlərin .nəticə vermədiyini görüb bu işdən ümidlərini üzdülər

Şeyx Tusi bu iki cəhddən birini “Əl-ğeybət” kitabında Rəşiqin dilindən nəql etmişdir: “Mötəzid Abbasi məni başqa iki nəfərlə imam Əsgərinin (ə) evinə göndərdi ki, həzrət Mehdini (ə) həbs edək. Biz imamın evində möcüzə ilə qarşılaşıb məqsədimizə çata (bilmədik...”(١

?Sual: ١٣٤. Nərcis Xatunun ilk maliki kim olub

:Cavab: Bu məsələyə münasibətdə üç baxış mövcuddur

١. Nərcis Xatun imam Hadinin (ə) mülkünə daxil oldu, sonra imam oğlu Əsgərini (ə) onunla evləndirdi. Rəvayətlərdə bu məsələyə işarə olunmuşdur.(٢)

səh:٩۶

---

١- [٢۴٨] “Əl-ğeybət”, s. ٢۴٨.

٢- [٢۴٩] “Bihar”, c. ۵١.

Nərcis Xatunun maliki imam Hadinin (ə) qızı Həkimə olmuşdur. İmam Hadi (ə) .۲ (bacısına demişdir: “Nərcisi oğluma ver...”(۱

İmam Hadi (ə) Nərcis Xatunu bir başqasından almış və bacısına bağışlamışdır. Bu .۳ .ehtimal daha güclüdür

?Sual: ۱۳۵. İmam Mehdinin (ə) varlığına və dünyaya gəlişinə iman fəlsəfi fərziyyədirmi

Cavab: Həzrət Mehdinin (ə) dünyaya gəlişi və varlığı əqli və fəlsəfi dəlillərə malik olsa .da, bu sahədə Quran və hədislərdə yetərincə dəlillər var

Həzrət Mehdinin (ə) mövludunu təsdiqləyən mütəvatir hədislərdən əlavə, səhih sənədli rəvayətlər də var. Bir çox mütəvatir məlumatlarda həzrətin varlığı sübuta .yetirilir. Bu barədə danışacağıq

Sual: ۱۳۶. İmam Əsgərinin (ə) şəhadətindən sonra şiələrdən imamət silsiləsinin ?kəsildiyini düşünənlər oldumu

Cavab: Əhməd Katib deyir: “Bəzi tarixçilər nəql edirlər ki, şiələr arasında imamətin dayandığını düşünənlər vardı. Bəzi rəvayətlərdən də belə görünür ki, xalq Allahın ”...qəzəbinə gəldikdə imamət cərəyanı dayana bilər

:Deyilənlərə belə cavab vermək olar

Tarixi mənbələrə müraciət etdikdə aydın olur ki, şiə cəmiyyəti bir əksəriyyət olaraq .۱ .imam Mehdinin (ə) mövluduna inanırdı

Şeyx Müfid və başqalarının bildirdiyi kimi, imam Əsgərinin (ə) vəfatından sonra şiələr .۲ ۱۴ firqəyə bölündü. Amma qısa bir müddətdən sonra alimlər və səhabələrin çağırışları (sayəsində hamı imam Mehdinin (ə) varlığı ilə bağlı yekdil rəyə gəldi.(۲

İmamətin kəsilməsindən danışan rəvayətləri diqqətlə nəzərdən keçirdikdə . ۳ ziddiyyətlə rastlaşırıq. Həmin rəvayətdə imam Baqirdən (ə) belə nəql olunur: “Əgər Allah-təala xalqa qəzəblənsə, bizi onlardan ayırar.” Əslində bu hədis həzrət Mehdinin ((ə) qeybə çəkilməsini sübut edir.(۳

Əgər ixtilaf bir şeyi batil saymaq üçün dəlil olsaydı, peyğəmbərlik məsələsi də şübhə .۴ altına alınmalı idi. Hansı ki, heç kim



---

۱- [۲۵۰] "Kəmalud-din", s. ۴۲۶»

۲- [۲۵۱] "Əl-füsulul-muxtarə", s. ۳۲۵.

۳- [۲۵۲] "Kafi", c. ۱, s. ۳۴۳.

belə bir iddiada deyil. Məgər peyğəmbər xəbər verməmişdimi ki, ondan sonra ümməti !?٧٣ firqəyə bölünəcək

?Sual: ١٣٧. Bir şəxsin dünyaya gəlişini fəlsəfi dəlillərlə sübut etmək olarmı

Cavab: Həzrət Mehdinin (ə) dünyaya gəlişinin, varlığının dəlili əslində mütəvatir həddə çatmış nəqli məlumatlardır. Uyğun mövzu ilə bağlı səhih sənədli rəvayətlər .mövcuddur. Bundan əlavə, bir çoxları imam Mehdi (ə) ilə görüşmüşlər

Şiə alimləri nəqli dəlillərdən əlavə həzrətin mövludunun sübutu üçün əqli və fəlsəfi dəlillər də göstərmişlər. Bu dəlillər uyğun mövzu ilə bağlı rəvayətlərlə analogiya təşkil .edir. Demək, bu sayaq dəlillərin heç bir eybi yoxdur

Sual: ١٣٨. Həzrət Mehdinin (ə) mövluduna və onun bu vaxtadək sağ olmasına etiqad ?zəruridirmi

Cavab: İmamət prinsipinə etiqad baxımından həzrət Mehdinin (ə) mövluduna və varlığına etiqad zəruridir. Şiəliyə görə imamət dinin üsuludur, yer üzü heç vaxt höccətsiz (imamsız) qala bilməz. Belə bir etiqadda olan insan həzrət Mehdinin (ə) mövluduna da inanır. Peyğəmbərdən nəql olunmuş mötəbər rəvayətlərə əsasən ondan sonra ١٢ imam var. Bu silsilə qiyamətədək davam edəcək. Bundan əlavə, hər bir .imam özündən sonrakı imamı təsdiqləmişdir

Tarixi baxımdan da şiə cəmiyyəti həzrət Mehdinin (ə) imamətini qəbul etmişdir. Digər bir tərəfdən, bilirik ki, imam Mehdini (ə) tanımaq hamının vəzifəsidir. Ona beyət etmək zəruridir. Beləliklə, imam Mehdi (ə) qeybdə olsa da, onun mövluduna və varlığına .etiqad vacibdir

Sual: ١٣٩. Nə üçün Quranda həzrət Mehdinin (ə) dünyaya gəlişi və varlığı məsələsi ?aşkar bəyan olunmur

Cavab: Əvvəla, Quranda bir çox əqidə və əməllə bağlı məsələlərə işarə olunmamışdır. Bu iş peyğəmbərin öhdəsinə düşmüşdür. Bununla belə, bütün əqidə və əməllərin .qaynağı Qurandır

İkincisi, Quranın bəzi ayələrindən məlum olur ki, hər bir dövrdə Allahın kamil və məsum bir höccəti mövcuddur. Bu ayələr haqqında növbəti söhbətlərimizdə .danışacağıq

Sual: ۱۴۰. Nə üçün uzaq gələcək üçün nəzərdə tutulmuş insan uzaq keçmişdə dünyaya ?gəlməlidir

səh:۹۸

Cavab: Bəzən soruşurlar ki, əgər Allah-təala yer üzündə ədaləti tarixin sonunda bərpa etmək istəyindədirsə, nə üçün ümumdünya ədalət hökumətinə rəhbərlik edəcək şəxsi xeyli müddət əvvəl yaratsın? Nə üçün həmin şəxs ehtiyac duyulan zamanda xəlq ?olunmamalıdır

:Uyğun iradları cavablandıraq

Əqli və nəqli dəlillərdən aydınlaşır ki, dövr heç vaxt ilahi höccətsiz, imamsız olmur. .١ Burada həm şəri, həm də yaranış amilləri rol oynayır. Bu məsələni qarşıdakı .söhbətlərimizdə isbat edəcəyik

Artıq alimlər tərəfindən qəbul olunmuşdur ki, varlıq tədrici hərəkət üzərində . ٢ qurulmuşdur. İstisnasız olaraq hər şey tədrici hərəkətdədir. Bu tədricilik Allahın qüdrətinə zidd deyil. Çünki Allah-təala göyləri və yeri bir anda yox, altı gün müddətində .xəlq etmişdir

Məgər Allah varlıq aləmini bir anda yarada bilməzdimi? Əlbəttə ki, yarada bilərdi! Nə üçün insanın nütfəsi ana bətnində ٩ ay qalmalı, təbii bir yol keçib insan formasına düşməlidir? Məgər Allah insanı bir anda xəlq edə bilməzdimi? Əlbəttə ki, O, buna qadirdir! Ümumdünya ədalət hökumətinə münasibətdə də eyni halla rastlaşırıq. Allah .tarixin sonunda baş verəcək işləri öncədən hazırlayır

İntizar fəlsəfəsini nəzərdən qaçırmaq olmaz. Dünyaya gəldiyi halda qeybə çəkilən .٣ kəslə hələ ki dünyaya gəlməmiş kəsin intizarı arasında böyük fərq var. Qeybdə olan .şəxsin intizarı daha böyük təsirə malikdir

Sual: ١۴١. Əgər həzrət Mehdinin (ə) dünyaya gəlişi gizli şəkildə baş vermişsə, mütəvatir ?(yetərli sayda) hədislər və icmanın rəyi xas götürülə bilərmi

Cavab: Mütəvatir dedikdə öncədən yalan danışmağa razılığa gəlməsi mümkün olmayan bir çoxlarının eyni bir xəbəri nəql etməsi başa düşülür. Həzrət Mehdinin (ə) dünyaya gizli şəkildə gəlişi bu mövzuda mütəvatir hədislərin mövcudluğuna zidd deyil. Çunki bu mövzuda imam Əsgəridən (ə) və başqalarından xeyli rəvayət nəql .olunmuşdur. Eləcə də, həzrət Mehdi (ə) ilə görüşənlərin sayı az deyil

Bəzi şiələrin ixtilafı da bu hədislərin mütəvatir olmasına zidd deyil. Çünki bu mövludun hansı şəkildə baş verməsi ilə bağlı ixtilaflar təbiidir. Şeyx Müfid bildirir ki, həzrət Mehdinin (ə) mövluduna müxalif olanlar alimlərin və səhabələrin izahatı, eləcə də, həzrətin möcüzələri vasitəsi ilə haqqı qəbul etdilər.(١)



---

١- [٢٥٣] "Əl-füsulul-muxtarə".

?Sual: ١۴٢. Həzrət Mehdinin (ə) mövludu ilə bağlı müxalifət şəkk-şübhə yaratmırmı

Cavab: Əhməd Katib həzrət Mehdinin (ə) mövludu ilə bağlı ixtilaflardan istifadə edərək .bu məsələyə biganəlik yaratmaq istəmişdir

Cavab olaraq deməliyik: Əvvəla, hər hansı mövzu ilə bağlı ixtilaf onun batilliyini yox, mövcudluğunu təsdiqləyir. Əgər ixtilaf olmasaydı, heç bir məsələ sübuta yetməzdi. .İstənilən bir mövzuya münasibətdə müxtəlif baxımlardan ixtilaf düşmüşdür

Məgər İslam ümməti həzrət Peyğəmbərin (s) buyurduğu kimi onun vəfatından sonra ٧٣ firqəyə bölünmədinmi?! Elə düşünmək olardı ki, bu parçalanma İslamı sarsıdar. Əslində isə belə olmadı. Bu parçalanmalar İslama münasibətdə heç bir şəkk-şübhə .yarada bilmədi

İkincisi, həmin dövrün siyasi təzyiqləri nəticəsində imamın dünyaya gizli gəlişinin .müxtəlif münasibətlərlə üzləşməsi təbiidir

Üçüncüsü, Şeyx Müfidin dediyinə əsasən, şiə cəmiyyəti çox keçməmiş həzrət Mehdinin (ə) mövludu ilə bağlı yekdil qərara gəldi. Alim deyir: "Həmin firqələrdən hazırda, hicri (٣٧٣-cü ildə ١٢ imamçı şiə firqəsindən başqa firqə qalmamışdır..."(١

Bəzilərinin həzrət Mehdinin (ə) mövludunu inkar etməsi əhli-beytin nəzərindən yayınmamışdır. Bu səbəbdən də uyğun məsələyə rəvayətlərdə işarə olunmuşdur. Şeyx Səduq səhih sənəd əsasında imam Musa (ə) ibn Cəfərdən (ə) belə nəql edir: ("Sahibəzzaman o kəsdir ki, onun haqqında "hələ doğulmamışdır" deyilər."(٢

?Sual: ١۴٣. İmam Əsgərinin (ə) vəfatından sonrakı əsr heyrət və şübhə əsri idimi

Cavab: Əhməd Katib deyir: "İmam Əsgərinin (ə) vəfatından sonra şiə cəmiyyətində imamət və həzrətin övladının mövludu ilə bağlı şəkk-şübhə yarandı." Müəllif yaranmış fikir ayrılığından istifadə edərək həzrətin mövludunun icma tərəfindən qəbul .olunmamasını sübuta yetirmək istəyir

Əvvəla, avam xalq arasında şəkk-şübhə təbii bir məsələdir. Həmin dövrün siyasi durumu və həzrətin qətlə yetirilmə ehtimalı tələb edirdi ki, bu mövlud gizli qalsın. Yalnız

.adamları bu məsələdən xəbər tutdu və onlar vasitəsi ilə hamıya məlumat çatdırıldı

İkincisi, uyğun mövzu ilə bağlı yaranmış ixtilaflar bu mövludun həqiqət olması dəlilidir. Yəni mövlud olmuşdur, sadəcə, bu iş məxfi baş verdiyindən bəziləri şübhəyə .düşmüşlər

Üçüncüsü, dəfələrlə qeyd olunduğu kimi, qeybin ilk dönəmlərində avam xalq tərəddüdə düşsə də, qısa bir müddət sonra məzhəb başçıları xalqı bu mövludun gerçəkliyinə inandırdılar. Beləliklə, şiə cəmiyyəti tam şəkildə şəkk-şübhədən çıxmış, .hamı həzrət Mehdinin (ə) mövluduna inanmışdır

Sual: ۱۴۴. Şəkk-şübhəni aradan qaldırmaq üçün alimlər və səhabələr hansı işləri ?görmüşlər

Cavab: Şübhəsiz ki, həzrət Mehdinin (ə) qeybindən sonra kütlə arasında şəkk-şübhə rəvac tapmışdır. Çünki xalq öz imamını görmürdü. Amma alimlərin və səhabələrin fədakarlığı sayəsində bu şübhə aradan qaldırıldı. Uyğun istiqamətdə görülən işlərdən biri münasib kitabların tərtibi idi. Bu kitablar arasında Məhəmməd ibn İbrahim Nemaninin "Əl-ğeybət", Əli ibn Babəveyh Qumminin "Əl-imamət vəl-təbsirə minəl-heyrət", Məhəmməd ibn Əli ibn Babəveyhin "İkmalud-din və itmamun-nemət", Şeyx Tusinin "Əl-ğeybət" kitabları diqqəti cəlb edir. Əli ibn Babəveyh öz kitabı haqqında (deyir: "Mən bu kitabda şəkk-şübhəni aradan qaldıra biləcək xəbərlər topladım..."(۱)

Sual: ۱۴۵. Digər dövrlərdə həzrət Mehdinin (ə) mövludu ilə bağlı şübhələri aradan ?qaldırmaq üçün kitablar yazıldımı

Cavab: Hər dövrün şiə alimləri özlərindən əvvəlki alimlərin yolunu davam etdirərək mövludla bağlı şübhələri aradan qaldıracaq kitablar tərtib etmişlər. Onlardan bəzilərini yada salaq: Əbu İshaq İbrahim ibn İshaq Əhməri Nəhavəndinin "Kitabul-ğeybət", Əbu-İshaq İbrahim ibn Əl-Ənmati Kufi Əsədinin "Kitabul-ğeybət", Əhməd ibn Hüseyn Əbdüllah Mehrani Abinin "Tərtibul-ədillə...", Əbül-Əbbas Əhməd ibn Əli Razinin "Əşşəfa vəl-cəla ənil-ğeybət", Əbül-Həsən Əhməd ibn Məhəmməd ibn İmran ibn Musanın "Əl-Ğeybət", Əşrəf ibn Azın "Əl-Ğeybət", Əbu Məhəmməd Həsən ibn Həmzənin "Əl-Ğeybət", Əbu-Məhəmməd Həsən ibn Məhəmməd ibn Yəhyanın

Təmimi Qəzvininin “Kitabul-ğeybət”, Əbül-Həsən Səlamət ibn Məhəmməd ibn İsmailin “Kitabul-ğeybət və kəşful-heyrət”, Əbülfəzl Abbas ibn Hişam Naşiri Əsədinin “Kitabul-ğeybət”, Əbül-Abbas Əbdüllah ibn Cəfər ibn Hüseyn Həmiri Qumminin “Kitabul-ğeybət”, Əbu-Məhəmməd Əbdül Vəhhab Madərainin “Kitabul-ğeybət”, Şeyx Müfidin “Kitabul-ğeybət”(Müəllifin başqa kitabları da var), Əbül-Qasim Əli ibn Hüseynin “Əl-məqnə fil-ğeybə”, Əli ibn Məhəmməd ibn Əli ibn Ömər ibn Riyahın “Kitabul-ğeybət”, Əbu Əli Katibin “Əzalətur-Ran ən qulubul-ixvan fil-ğeybət”, Əbu-Əbdullah Məhəmməd ibn Əhməd Səfvaninin “Kitabul-ğeybət və Kəşful-heyrət”, Məhəmməd ibn Zeyd ibn Əli Farsinin “Kitabul-ğeybət”, Əbül-Fəth Məhəmməd ibn Əli ibn Osman Kəracəkinin “Əl-bürhan...” Əbu-Bəkr Məhəmməd ibn Qasim Bəğdadinin “Kitabul-ğeybət”, Əbül-Nəzr Məhəmməd ibn Mənsur Əyyaşinin “Kitabul-Ğeybət”, Əbül-Fərəc Müzəffər ibn Əli ibn Hüseyn Həmədaninin “Kitabul-ğeybət” əsərləri.

Yuxarıda sadalanan kitablar hicri üçüncü əsrin sonunadək tərtib olan kitablardır.

Sual: ١۴۶. Həzrət Mehdinin (ə) mövludu ilə bağlı xəbərlərin kimlərinsə tərəfindən uydurulması mümkündürmü?

Cavab: Bəziləri iddia edə bilər ki, şiələr aldanaraq kimlərinsə uydurduğu rəvayətləri nəql edirlər.

Hansı ki, şiələr hər hansı bir məlumatı əsassız qəbul etmirlər:

١. Əgər hər hansı mütəvatir hədisin kimlərinsə tərəfindən uydurulduğunu ehtimal versək, bütün şəriətə şübhə ilə yanaşmalıyıq. Mütəvatirlik isə özü bir sübutdur.

٢. Əgər bu məlumatlar uydurulmuş olsaydı, ən azı şiə düşmənləri bu məsələni qabardardı. Hansı ki, əsrlərcə ötməsinə baxmayaraq belə bir ittiham irəli sürülməmişdir.

Sual: ١۴٧. Şiələrin qəbul etmədiyi icma prinsipinə əsasən həzrət Mehdinin (ə) mövludunu qəbul etmək olarmı?

Cavab: Əvvələn, şiə əqidəsi mötəbər dəlilə əsaslanan icmanı qəbul edir və belə bir icmanı sübut yolu sayır. Şiə cəmiyyətində mövcud olan icma da məhz belə icmadır.

İkincisi, şiələr həzrət Mehdinin (ə) mövludunu təkcə icma ilə sübuta yetirmir. İcmadan .əlavə əql, Quran və səhih rəvayətlər kimi başqa dəlillər var

?Sual: ۱۴۸. Mehdi (ə) haqqındakı xəbərlər dolaşıq deyilmi

Cavab: Əhli-beytdən (ə) həzrət Mehdi (ə) ilə bağlı nəql olunmuş rəvayətlərdə konkret bir şəxsin dünyaya gəlişindən xəbər verilir. Bildirilir ki, bu şəxs uzun müddət qeybdə qaldıqdan sonra zühur edəcək. Diqqət yetirsək, görərik ki, imamların hər biri zühur edəcək şəxsin neçənci övlad olmasını konkret qeyd edir. Rəvayətlərdə onun qeybə çəkiləcəyi, qeybin növləri, dünyaya gəlişinin məxfi olacağı, xalqın şəkk-şübhəyə düşəcəyi açıqlanır. Əlbəttə ki, bəzi qaranlıq məsələlər də var. Bu isə siyasi sıxıntılar olan bir cəmiyyət üçün tam təbiidir. Bütün bunlardan sonra həzrət Mehdi (ə) .mövzusunu dolaşıq saymaq düzgün olmaz

Sual: ۱۴۹. Əgər həzrət Mehdinin (ə) şəxsiyyəti aşkar idisə, nə üçün bir çoxları yalançı ?mehdilərə inanırdı

Cavab: Əhməd Katib deyir: "Əgər həzrət Mehdinin (ə) xilaskar olması aydın idisə, nə üçün bir çoxları həzrət Əlinin (ə), onun oğlu Hənəfiyyənin, imam Sadiqin (ə), imam Kazimin (ə), imam Hadinin (ə) oğlu Seyyid Məhəmmədin, hətta imam Əsgərinin (ə) "?Mehdi olmasını iddia edirdi

:Məsələni araşdıraq

Əgər həzrət Peyğəmbərdən (s) və Əhli-beytdən (ə) nəql olunmuş hədislərdə həzrət .۱ Mehdinin zühuru, onun imam Əsgərinin (ə) oğlu olması aşkar şəkildə bəyan olunmuşdusa, hansı əsasla başqalarını Mehdi (ə) saymaq olardı?! Amma bəziləri zülm-sitəmi şiddətli görüb, eyni zamanda bütün Əhli-beyti (ə) saydığından bəzən Məhdəviyyət ümidi ilə imamların sorağına gedirdi. Beləl期ri, adətən, sadəlövh və nadan .insanlar olmuşdur. Əlbəttə ki, uyğun məsələyə siyasi durumun da təsiri danılmazdır

Başqalarını Mehdi (ə) sayanlar qısa bir müddət sonra şiələrə qoşularaq öz . ۲ .iddialarından əl çəkmişlər

Bir məzhəbin əqidəsi onun alimləri ilə təsbit olunur. İmam Əsgərinin (ə) övladı . ۳ .Mehdinin (ə) zühuruna əqidə əksər şiə alimlərinin qəti fikridir

Haqqında danışılan dövr ziddiyyətli olduğundan bəziləri bir müddət başqalarını . ۴

Mehdi (ə) saymışlar. Amma qısa bir müddətdən sonra şəkk-şübhələr aradan .qalxmışdır

?Sual: ۱۵۰. İmam Əsgəri (ə) öz şəhadətindən öncə anasına vəsiyyət etmişdirmi

Cavab: Şeyx Müfid deyir: Bəziləri imam Əsgərinin (ə) vəqf və sədəqə işləri barədə öz anasına vəsiyyətini dəlil gətirərək həzrət Mehdinin (ə) mövludunu inkar edirlər. Hansı ki, bu işdə məqsəd Mehdinin (ə) mövludunu hakim rejimdən məxfi saxlamaq olmuşdur. Əgər bu vəsiyyətnamədə həzrət Mehdinin (ə) adı çəkilsəydi, onu mövcud rejimdən qorumaq mümkünsüz olardı. Bunu da qeyd etməliyik ki, uyğun vəsiyyətnamədə Bəni-Abbasi nümayəndələrinin şəhadəti qeyd olunmalı idi. Məgər imam Sadiq (ə) öz vəsiyyətnaməsində eyni məqsədlə övladının imamətini gizlətməmişdimi?! İmam (ə) bu məqsədlə vəsiyyətnamədə öncə Mənsur Abbasi, Rəbi, Qazi, kənizi Hümeydə Bərbəriyyənin adını çəkir, sonda övladı Musa ibn Cəfərin (ə) adını qeyd edir. Həzrət yaxın səhabələrinə öz övladının imamətini açıqlasa da, (vəsiyyətnaməsində onu qorumağa çalışır.(۱

Sual: ۱۵۱. İmam Əsgəridən (ə) nəql olunmuş mütəvatir mötəbər xəbərlər arasında ?həzrət Mehdinin (ə) imaməti haqqında məlumat varmı

Cavab: Həzrət Mehdinin (ə) imamətini müxtəlif yollarla sübut etmək olar. Uyğun :yanaşma bütün məsumların imamətinə aiddir

Öncə qeyd olunduğu kimi, imam Əsgəridən (ə) öz övladının imaməti haqqında .۱ .mötəbər hədislər nəql olunmuşdur

İmamət və yer üzünün höccətsiz qalmaması qəti dəlillərlə sübuta yetirilirsə, növbəti .۲ .imamın kim olması məsələsi səhih sənədli bir xəbərlə təsdiqlənir

Öncə işarə olunduğu kimi haqqında danışılan mövzu ilə bağlı həzrət Peyğəmbər (s) .۳ .və imamlardan yetərincə hədislər nəql olunmuşdur

Peyğəmbərliyin sübutunda ən ümdə yol möcüzə olduğu kimi, imamətin isbatında da .۴ bu yoldan faydalanmaq olar. Hər bir imamın özündən sonrakı imamı təsdiqləməsi də .etibarlı sübut yoludur

Bəzi imamlar haqqında bir mötəbər sənəd olsa da, mövcud xarici dəlillər insanda .۵ -əminlik yaradır. İmamlara münasibətdə Bəni

Üməyyə və Bəni-Abbasi hakimlərinin təzyiqləri, şübhəsiz ki, uyğun mövzunun aşkar .şəkildə nəql olunmasına maneçilik törətmişdir

Həzrət Peyğəmbərdən, imamlardan, eləcə də, imam Əsgəridən (ə) nəql olunmuş .۶ rəvayətləri nəzərdən keçirdikdə, həzrət Mehdinin (ə) möcüzələri ilə tanış olduqda aydınlaşır ki, həzrət Mehdinin (ə) imamət məsələsi mütəvatir xəbərlər yolu ilə sübuta .yetmişdir

Sual: ۱۵۲. İmamiyyə böyükləri imam Əsgərinin (ə) vəfatından sonra həzrət Mehdinin (ə) ?mövludunu yekdilliklə qəbul etmişdirmi

Cavab: Bəli, imam Həsən Əsgərinin (ə) vəfatından sonra səhabələr və imamiyyə şiə başçıları imam Mehdi (ə) mövluduna münasibətdə yekdil rəydə olmuşlar. İlkin vaxtlarda bu mövluda şəkk-şübhə ilə yanaşanlar vardısa, qısa bir müddətdən sonra alimlərin səyləri nəticəsində əsrin imamına möhkəm bir etiqad yarandı. "Əl-füzulul-muxtarə" kitabında Şeyx Müfid belə deyir: "Hicri ۳۷۳-cü ildə yalnız ۱۲ imamçı şiə firqəsi qalmışdı. Onlar imam Əsgərinin (ə) həzrət Peyğəmbərin (s) adını daşıyan övladının imamətinə inanırdılar, onun sağ olmasını qəbul edirdilər. Həzrət Mehdinin (ə) bir (zaman qiyam edəcəyinə kimsə şübhə etmirdi..."(۱

?Sual: ۱۵۳. Həzrət Mehdinin (ə) mövludu haqqında şiə tarixçiləri nə deyir

Cavab: Şiə tarixçiləri yekdil olaraq hicri ۲۵۵-ci ili həzrət Mehdinin (ə) doğum tarixi kimi qəbul edirlər. Bu alimlərdən bəzilərinin adını çəkək: Kuleyni, Şeyx Müfid, Ərbili, Şeyx .Tusi, Kəfəmi, Təbərsi, Əllamə Məclisi, Şeyx Bəhai

?Sual: ۱۵۴. İmam Mehdinin (ə) mövluduna inanmayan şəxsin hökmü nədir

Cavab: Həzrət Mehdinin (ə) mövludu və onun varlığı tarix boyu şiə inancı olduğundan və dini zərurət sayıldığından şiə icmasının rəyi budur ki, bu mövludu, imamın varlığını inkar edən şəxs şiəlikdən xaricdir. Bir inanc məzhəbdə zərurət sayılırsa, onun inkarı .üçün gətirilən dəlillər qəbul deyil

Qədim və müasir imamiyyə alimlərinin rəyinə görə imamət dinin üsullarındandır və istənilən bir zamanda məsum imamı insan dindən

.çıxmış sayılır. Belə bir şəxs sünnə əhli kimi zahirən müsəlman hökmündədir

?Sual: ۱۵۵. Həzrət Mehdi (ə) anadan olan vaxt kimlər onu ziyarət etmişdir

Cavab: Həzrət Mehdi (ə) anadan olan vaxt beş şəxsin onu ziyarət etdiyi bildirilir: İmam Cəvadın (ə) qızı Həkimə, doğuşu qəbul edən qadın, Nəsim və Mariyə, imam Əsgərinin (ə) kənizi.(۱)

Sual: ۱۵۶. İmam Əsgərinin (ə) həyatının son beş ilində həzrət Mehdini (ə) kimlər ?görmüşdür

Cavab: Həmin beş ildə həzrət Mehdini (ə) görənlər arasında aşağıda adı çəkilənlər olmuşdur: Məhəmməd ibn Osman Əmri (۴۰ nəfərlə birlikdə), Əbu-Harun, Yəqub ibn Mənquş, Əmr Əhvazi, imam Cəvadın (ə) qızı Həkimə, Məhəmməd ibn İsmail ibn Musa ibn Cəfər, Əbu-Nəsr Zərif-Xadim, Əbu Əli ibn Mutəhhər, Üqəyd-Xadim və İsmail ibn Əli Növbəxti, Nəsim, imam Əsgərinin (ə) səhabələri, fars bir kişi, Əbu-Əmr, İbrahim ibn Əbdə Nişapuri və onun xadimi, Rəşiq Sahibi Madəri, Kamil ibn İbrahim Mədəni, Əhməd ibn İshaq Qummi.(۲)

?Sual: ۱۵۷. Kiçik ("suğra") qeyb dövründə imamla kimlər görüşmüşdür

Cavab: Kiçik qeyb dövründə imamla görüşənlər çoxdur. O cümlədən: Məhəmməd ibn Osman Əmri, Turəyf və Əbu-Nəsr, Əzdi, İbrahim ibn İdris, Əbi-Əbdillah ibn Saleh, İbrahim ibn Məhzyar, Məhəmməd ibn İsmail ibn Musa ibn Cəfər və başqaları.(۳)

Mərhum Məclisi bir rəvayətdə kiçik qeyb dövründə imamla görüşmüş ۲۶۵ nəfərin adını çəkir.(۴)

?Sual: ۱۵۸. İmam Əsgərinin (ə) övladı olmasını irsiyyət alimləri təsdiqləyirmi

Cavab: Bəli, bu alimlərdən bir qrupu imam Həsən Əsgərinin (ə) Məhəmməd adlı, "Höccət", "Mehdi" (ə) ləqəbli övladı olduğunu bildirirlər. Bu alimlərlə tanış olaq: Kiçik qeyb dövründə yaşamış Səhl ibn Əbdillah ibn Davud ibn Süleyman Buxari, hicri V əsrin məşhur

۱- [۲۵۹] “Kəmalud-din”, ۴۳۰; “Əl-ğeybət”, Tusi, s. ۲۴۰-۲۴۲.

۲- [۲۶۰] “Kəmalud-din”, “Bihar”, “Əl-irşad”, “Kafi”, “Əl-ğeybət”.

۳- [۲۶۱] “Kəmalud-din”, “Əl-irşad”, “Yənabiul-Məvəddət”.

۴- [۲۶۲] “Bihar”, c. ۵۲, s. ۱-۷۷.

irsiyyətçi alimi Seyyid Əmri, hicri V əsrin tanınmış alimi Fəxr Razi Şafei, hicri Vİ əsrin alimi Müruzi Əzvər-Qani, Cəmaləddin Əhməd, hicri Xİ əsrin alimi Əbül-Həsən Məhəmməd Hüseyni Yəmani Sənani Zeydi, Məhəmməd Əmin Süyudi, Məhəmməd Veys Heydəri Suri, Əllamə Seyyid Məhəmməd ibn Hüseyn İbn Əbdüllah Hüseyni Səmərqəndi Mədəni, Şərif Ənəs Kətbi Həsəni, Seyyid Məhəmməd ibn Əhməd ibn .Həmkddin Nəcəfi, Şərif Ənəs Kutubi Həsəni

?Sual: ۱۵۹. İmam Mehdinin (ə) əmisi Cəfər onun mövludunu inkar etmişdirmi

Cavab: Cəfər bu mövludu inkar etmişsə də, bəzi səbəblərdən bunu nəzərə almamaq :lazım gəlir

.Möhkəm dəlillərə əsasən həzrət Mehdinin (ə) mövludu sübut olunmuşdur .۱

Ümmət yekdil olaraq bu rəydədir ki, Cəfər məsum olmamışdır. Adi zümrədən olan .۲ Cəfərin büdrəmə ehtimalları var. Necə ki, həzrət Yəqubun övladlarından bəziləri .yolunu azmışdır

Bəzi xəbərlərdən məlum olur ki, Cəfər yolunu azdığından imam Əskərinin (ə) övladı .۳ .olmasını inkar etmişdir

Ehtiyatla yanaşılası məsələlərdən biri budur ki, Cəfər layiq olmadığından imam .۴ .Əsgəri (ə) öz övladını ona göstərməmişdir

?Sual: ۱۶۰. Nə üçün Cəfər “yalançı” kimi tanınır

Cavab: İmamın müqəddəs nümayəndəliyi tərəfindən verilən məlumata əsasən, həzrət Mehdi (ə) Cəfər haqqında buyurmuşdur: “Heç şübhəsiz, bu şəxs Allaha iftira yaxır, iddiaları yalandır. İddialarını necə sübut edəcəyini bilmirəm. And olsun Allaha ki, o (halalı haramdan seçmir, yanlışı doğrudan ayıra bilmir…”(۱

Bu məlumatlardan aydınlaşır ki, Cəfəri ilkin olaraq həzrət özü “yalançı” adlandırmışdır. Sonralar Cəfər bu ləqəblə tanınmışdır. Bəziləri isə bildirirlər ki, Cəfər, sadəcə, imam .Cəfər Sadiqdən (ə) fərqləndirilmək üçün bu ləqəblə çağırılmışdır

?Sual: ۱۶۱. Cəfər hansı ləyaqətsiz işlər görmüşdür

Cavab: İmam Hadinin (ə) oğlu Cəfər qardaşı imam Əsgəri (ə) dünyasını dəyişdikdən sonra bir sıra ləyaqətsiz işlər görmüşdür. O cümlədən:

səh:١٠٧

---

١- [٢۶٣] "Əl-ğeybət", Tusi, s. ٢٨٨-٢٩٠; "Bihar", c. ۵٣, s. ١٩۵.

١. Özbaşına olaraq qardaşı imam Əsgərinin (ə) cənazə namazını qılmağa cəhd göstərmişdir.(١)

٢. İmamət və rəhbərlik iddiasında olmuşdur. Cəfər Abbasi vəziri Əbdüllah ibn Yəhya ibn Xaqana belə demişdir: "Qardaşımın məqamını mənə verin. Mən sizə ildə ٢٠٠٠٠ dinar ödəyəcəyəm."(٢)

٣. Cəfər qardaşının mülkünə sahib çıxmaq məqsədi ilə onun övladı olmadığını iddia etmişdir. Abbasi hökuməti Cəfərə icazə vermişdir ki, qardaşının mülkünə sahib dursun.(٣)

٤. Cəfər imam Mehdinin (ə) həbs olunması üçün hökuməti təhrik etmişdir.

Sual: ١۶٢. Nə üçün həzrət Mehdi (ə) öz əmisi Cəfəri həzrət Yusifin qardaşlarına oxşatmışdır?

Cavab: İmam Mehdi (ə) Məhəmməd ibn Osman Əmriyə tapşırığında buyurur: "Əmim Cəfərin və onun övladlarının tutduğu yol Yusifin qardaşlarının yolu kimidir..."(۴)

Oxşar cəhətləri nəzərdən keçirək:

١. Həzrət Mehdinin (ə) əmisi Cəfərin hökmünü peyğəmbər övladlarının hökmü kimi onların babalarının ixtiyarına verək və bu barədə danışmayaq.

٢. Yusifin qardaşları tövbə etdiyi kimi, Cəfər də tövbə etmişdir. Çünki bəziləri Cəfəri "təvvab" ləqəbi ilə çağırmışlar.

٣. Yəqubun övladları günaha batdıqda Allah Yəquba xatir onları bağışladı. Cəfər də imamın oğlu, imam qardaşı və imam əmisi olduğu üçün bağışlandı.

۴. Peyğəmbər övladları peyğəmbərlər kimi məsum olmur. Yəqubun övladları günaha batdığı kimi, imamın da övladı günaha bata bilər.

Sual: ١۶٣. Nə üçün peyğəmbərlərin və imamların bəzi övladları yolunu azır?

Cavab: Əvvəla, Cəfər imam övladı olsa da, ana tərəfdən zəmanət almamışdır. Aydın

məsələdir ki, məsum imamlar həm ata, həm də ana tərəfdən pakdırlar. Onların .övladları haqqında bu sözü demək olmaz

səh:۱۰۸

---

.Kəmalud-din",c. ۲, s. ۴۷۵" [۲۶۴] -۱

.Həmin mənbə, c. ۲, s. ۳۷۹ [۲۶۵] -۲

.Kafi", c. ۱, s. ۵۰۵" [۲۶۶] -۳

.Bihar", c. ۵۳, s. ۱۸۰" [۲۶۷] -۴

.Bu səbəbdən də peyğəmbər və imamların bəzi övladları yolunu azmışdır

İkincisi, olsun ki, peyğəmbərlərin və imamların həyatında bəzi problemlərin yaranması .onların ilahiləşdirilməməsi məqsədini daşıyır

Sual: ١۶۴. İmam Həsən (ə) və imam Hüseyndən (ə) sonra imamətin iki qardaşa ?ötürülməsi caizdirmi

Cavab: Əhməd ibn Katib iddia edir ki, imam Həsən (ə) və imam Hüseyndən (ə) sonra imamətin iki qardaşa ötürülməsinin mümkünsüzlüyü zəif məlumatdır və həmin vaxt bu ...məsələ icma tərəfindən qəbul olunmamışdır

Mütəvatir məlumatlar əsasında şiə məzhəbində qəbul olunmuşdur ki, imam Həsən (ə) .və imam Hüseyndən (ə) sonra imamət iki qardaşa ötürülə bilməz

İsmail ibn Əli Növbəxti deyir: "İmamlardan nəql olunmuş mütəvatir xəbərlərdən (bildirdik ki, Həsən (ə) və Hüseyndən (ə) sonra yalnız imamın övladı imam ola bilər."(١

.Əşəri Qummi və Əli ibn Həsən Növbəxti də bu əqidədə olmuşdur

:Məsələnin aydınlaşması üçün bəzi rəvayətlərə nəzər salaq

Kuleyni səhih sənədə əsasən imam Sadiqdən (ə) belə nəql edir: "Həsən və Hüseyndən (sonra heç vaxt iki qardaş imam olmayacaq."(٢

Digər bir səhih sənədə əsasən imam Sadiqdən (ə) belə nəql olunur: "Həsən və Hüseyn (sonra iki qardaş imamətə çatmaz."(٣

İsmail ibn Bəzh nəql edir ki, imam Rizadan (ə) belə sual olundu: "İmamət əmi və ya dayıya keçirmi?" Həzrət buyurdu: "Xeyr." Ərz olundu: "İki qardaşa necə?" Həzrət (buyurdu: "Xeyr".(۴

?Sual: ١۶۵. Şiələr imam Əsgərinin (ə) şəhadətindən sonra Cəfərə başsağlığı verdilərmi

Cavab: Əhməd Katib deyir: "Əbül-Ədyandan nəql olunmuş hədisə əsasən şiələr imam Əsgərinin (ə) vəfatından sonra Cəfərə başsağlığı verib, onun imamət məqamını təbrik

".etdilər

?Bəs əslində necə olub

Əbül-Ədyanın nəql etdiyi hədisə nəzər saldıqda görürük ki, Əhməd Katib bu . ١ hədisdən düzgün nəticə çıxarmamışdır. Əbül-Ədyan



---

[٢٦٨] -١ ."Kəmalud-din"

[٢٦٩] -٢ .Kafi", c. ١, s. ٢٨٥"

[٢٧٠] -٣ .Həmin mənbə, s. ٢٨٦

[٢٧١] -۴ .Həmin mənbə

deyir: "Qəfildən imam Əsgərinin (ə) qardaşı Cəfəri həyətdə gördüm. Şiələr onun ətrafında cəmləşib başsağlığı verir, təbrik edirdilər." Hədisdən yalnız bu aydın olur ki, həzrət Mehdinin (ə) imamətindən xəbərsiz şiələr Cəfərin imamətə çatdığını güman .etmişlər

Əhməd Katib iddia edir ki, Cəfəri təbrik edənlər arasında imam Mehdinin (ə) birinci .٢ naibi Osman ibn Səid də olmuşdur. Hansı ki, hədisdə bu şəxsin adı çəkilmir. Bir daha məlum olur ki, Əhməd Katib hansısa məqsədlə yalan danışır... Əbül-Ədyanın rəvayətlərinə müraciət etdikdə görürük ki, Cəfər öz iddiasında yalançı olmuşdur. Əbül-Ədyan deyir: "Həzrətin qapısına çatdığım vaxt gördüm ki, onu kəfənə bükmüşlər. Cəfər cənazəyə namaz qılmaq üçün önə keçdi. Namazın təkbirini demək istədiyi vaxt pərdənin arxasından çıxan uşaq Cəfərin əbasını çəkdi və buyurdu: "Kənara çəkil, əmi. Atamın namazını qılmağa mən daha layiqəm." Cəfər rəngi qaçmış vəziyyətdə kənara çəkildi. Uşaq qabağa keçdi və imam üçün cənazə namazı qıldı. İmam atasının qəbrinin yanında dəfn olundu. Sonra körpə buyurdu: "Ey Bəsri! Səndəki məktubun cavabını (mənə ver." Mən də onu həzrətə verdim..."(١

Sonra Əbül-Ədyan belə deyir: "Cəfəri belə görüb öz-özümə dedim: Əgər bu (Cəfər) imamdırsa, demək, əslində imamət batildir. Çünki, mən onu şərab içən, qumar (oynayan, tənbur çalan görmüşəm..."(٢

### Uşaq yaşlarında imamət

?Sual: ١۶۶. Uşaq yaşlarında imamətin mümkünlüyünü kimlər şübhə altına alır

Cavab: Həzrət Mehdi (ə) ilə bağlı ünvanlanmış suallardan biri də budur ki, insan uşaq ?yaşlarında imamət və xilafətə necə çatar

Sünnə əhli alimlərindən olan ibn Hicr Heytəmi deyir: "Pak şəriətdə təsbit olunmuşdur ki, körpə uşağın vilayəti, hakimiyyəti düzgün deyil. Bəs necə olur ki, şiələr beş yaşa (çatmamış uşağın imamətinə inanırlar?!(٣

Əhməd Katib yazır: "Allahın körpə uşağı müsəlmanlara rəhbər təyin etməsi ağılabatan (deyil."(۴

---

.Kəmalud-din",s. ۲۷۵-۲۷۶; "Bihar", c. ۵۲, s. ۶۷" [۲۷۲] -۱

.Həmin mənbə [۲۷۳] -۲

.Səvaiqul-mühriqə", s. ۱۶۶" [۲۷۴] -۳

.Tətəvvürəl-fikrul-siyasi", s. ۱۰۲" [۲۷۵] -۴

?Sual: ۱۶۷. Quran körpənin imamət və nübüvvətini təsdiq edirmi

Cavab: Quran baxımından körpənin nübüvvət və vilayəti nəinki mümkündür, hətta ilahi .kitabda bu mövzuda xəbərlər var

:a) Allah-təala həzrət Yəhyaya xitabən buyurur

Ey Yəhya! Sən bizim səmavi kitabdan möhkəm tut. Biz ona uşaq yaşlarında nübüvvət“ (məqamı verdik.”(۱

Fəxr Razi Allah-təalanın həzrət Yəhyaya buyuruğu haqqında deyir: “Şərif ayədə həqiqətən nübüvvət məqamı nəzərdə tutulmuşdur. Çünki Allah-təala Yəhyanın əqlini uşaq yaşlarında kamilləşdirdi və ona vəhy göndərdi. Allah-təala orta yaşlarında peyğəmbərliyə çatmış həzrət Musa və Məhəmməddən (s) fərqli olaraq, həzrət Yəhya (və İsanı uşaq yaşlarında peyğəmbərliyə seçdi.”(۲

b) Həzrət İsa haqqında isə belə buyurulur: “Məryəm körpəyə işarə etdi. Onlar dedilər: “Beşik uşağı ilə necə danışaq? O uşaq dedi: “Həqiqətən, mən Allahın bəndəsiyəm, O, (mənə səmavi kitab və nübüvvət şərəfi əta buyurdu...”(۳

Qunduzi Hənəfi imam Mehdinin (ə) dünyaya gəlişini qeyd etdikdən sonra yazır: “Deyirlər ki, Allah-təala ona uşaq yaşlarında hikmət əta etdi və aləmlərdəkilər üçün nişanə buyurdu. Necə ki, həzrət Yəhya və həzrət İsaya belə lütf etmişdi. Allah həzrət (Mehdinin (ə) ömrünü həzrət Xızrın ömrü kimi uzatdı.”(۴

Qütb Ravəndi və başqaları Yezid Kənasidən belə nəql edirlər: Həzrət Əbu-Cəfərdən (ə) soruşdum: “Həzrət İsa beşikdə danışdığı vaxt Allahın yer əhlinə höccəti idimi?” Həzrət buyurdu: “İsa həmin gün Allahın peyğəmbəri və mürsəl höccəti idi. Məgər belə bir buyuruğu eşitməmisən: “Mən Allahın bəndəsiyəm, O mənə kitab verib, məni peyğəmbər seçib, harada olsam vücudumu bərəkətli edib; nə qədər ki diriyəm, mənə namaz və zəkatı tapşırıb.” Ərz etdim ki, onda İsa beşikdə ikən Zəkəriyya Allahın höccəti idi? Həzrət buyurdu: “İsa həmin halda xalq üçün nişanə, həzrət Məryəm üçün Allah tərəfindən bir rəhmət idi. Danışıb təbir etdiyi halda onu eşidənlərə peyğəmbər və höccət idi. Sonra İsa susdu və iki il danışmadı. Həmin arada xalqa höccət Zəkəriyya

oldu. Onun vəfatından sonra Yəhya körpə yaşında kitab və hikmətə varis oldu. Allahın Yəhyaya



---

.Məryəm", ۱۲" [۲۷۶] -۱

.Təfsire-Fəxr-Razi", c. ۱۱, s. ۱۹۲" [۲۷۷] -۲

.Məryəm", ۲۹, ۳۰" [۲۷۸] -۳

.Yənabiul-məvəddət", s. ۴۵۴" [۲۷۹] -۴

müraciətini eşitməmisənmi?! İsa yeddi yaşına çatdıqda ilk nazil olan vəhy peyğəmbərlikdən xəbər verdi. Həmin vaxtdan İsa Yəhyaya və bütün xalqa höccət oldu. Ey Əba Xalid! Adəm yaranan gündən bir gün olsun belə, yer üzü ilahi höccətsiz (olmayıb..."(١

İrad tutulmasın ki, həzrət İsa ilə bağlı bəyanatlar qrammatik baxımdan keçmiş zamana aiddir, amma əslində gələcək zaman nəzərdə tutulur. Əvvəla, bu ehtimal keçmiş zaman formasına zahirən xilafdır və belə bir ehtimal üçün dəlil lazımdır. İkincisi, "nəbi" ilə "rəsul" arasında fərq var. Həzrət İsa ilə bağlı "rəsul" yox, "nəbi" təbiri işlədilmişdir. Belə bir nəticə çıxarmaq olar ki, azyaşlı olduğu üçün risalət məqamına .çatmamış İsa öncə nəbi məqamına çatmışdı

?Sual: ١۶٨. Tarixi baxımdan uşaqda imamət məqamı görünmüşdürmü

Cavab: Tarixə müraciət etdikdə görürük ki, körpənin rəhbərlik etməsi faktdır. Filosoflar, hikmət sahibləri deyir: "Bir işin mümkünlüyünün ən güclü dəlili onun baş ".verməsidir

Həzrət Peyğəmbər (s) hicrətin üçüncü ili "və ənzir əşirətəkə..." ayəsi nazil olduqdan sonra azyaşlı Əli ibn Əbu-Talibi (ə) canişinliyə təyin etdi və öz qövmünə göstəriş verdi (ki, onun əmrlərinə tabe olsunlar.(٢

Şeyx Müfid yazır: "Şiələr və sünni əhli yekdil olaraq bu rəydədir ki, həzrət Peyğəmbər ((s) yaşı az olmasına baxmayaraq, Əlini (ə) canişinliyə təyin etdi..."(٣

?Sual: ١۶٩. Uşağın imam olmasını ağıl təsdiq edirmi

Cavab: Bəziləri deyirlər ki, azyaşlı uşağın imamlığı ağla sığmır. Nəzərinizə çatdırmalıyıq ki, mahal, mümkünsüz iş üç qismdir: Zatən mahal (istənilən bir şəraitdə mümkünsüz); baş tutması mahal (səbəb olmadan bir işin baş verməsinin mümkünsüzlüyü); adi (.mahal (təbiət qanunlarına əsasən baş verməsi mümkünsüz olan möcüzə kimi işlər

Erkən yaşlarında imamət haqqında bunu deyə bilərik ki, bu iş nə zatən mahaldır, nə də baş verməsi mümkünsüzdür. Çünki Allah risalət və imamətin bütün şərtlərini bir körpədə ödəməyə qadirdir. Bundan əlavə, həzrət Yəhya və İsanın nəbiliyi deyilənlərə

.ən gözəl sübutdur



---

.Kafi”, c. ۱, s. ۳۸۲“ -۱

.Tarixe-Təbəri”, c. ۲, s. ۶۲, ۶۳; “Kamile-ibn-Kəsir”, c. ۲, s. ۴۰, ۴۱“ [۲۸۱] -۲

.Əl-füsulul-muxtarə”, s. ۳۱۶“ [۲۸۲] -۳

Məhəmməd ibn Həsən Səffar Əli ibn Əsbatdan belə nəql edir: “Əba-Cəfərin mənə yaxınlaşdığını gördüm. Həzrəti Misirdə yaxınlarıma təsvir etmək üçün onu diqqətlə nəzərdən keçirdim. O qəfildən səcdəyə düşüb buyurdu: “Allah peyğəmbərlik əmrində gətirdiyi dəlili imamət əmrində gətirdi.” Hikmət qırx yaşında əta olunduğu kimi, bir insana uşaq yaşlarında da əta oluna bilər.”(١)

?Sual: ١٧٠. Körpədə inkişaf etmiş düşüncə ola bilərmi

Cavab: Əqli inkişaf üçün hansısa yaş müəyyənləşməmişdir. Bəzilərində bu inkişaf beş yaşında müşahidə olunur. Bəli, Allah Öz qüdrəti ilə körpəyə kamil düşüncə əta edə .bilər

Əllamə Hilli deyir: “Uşağın xarakterində ata-ananın məhəbbətinə ehtiyac var. Körpənin ata-anadan uzaqlaşıb Allah-təalaya üz tutması ondakı düşüncənin kamilliyini ”.göstərir

Alim sözünün davamında yazır: Düşüncə ilə bağlı işlər və ilahi vəzifələr uşaq təbiətinə uyuşmur. Uşaq xaraktercə oyuna, əyləncəyə meyllidir. Əgər bir uşaq təbiətinə uyğun olmayan işlərə meyl göstərirsə, bu onun düşüncə baxımdan inkişafını göstərir.”(٢)

Səfvan ibn Yəhya deyir: “İmam Riza (ə) imam Cavadı (ə) imamət məqamına təyin etdiyi vaxt onun yaşı üçdən çox deyildi. Ona ərz etdim: “Sənə fəda olum! Övladının üç yaşı yoxdurmu?” Həzrət buyurdu: “Bir halda ki, İsa üç yaşında Allahın höccəti olub, bunun eybi yoxdur.”(٣)

İmam Cavada (ə) ərz etdilər: “Sizin yaşınız az olduğu üçün xalq imamət məqamınızı inkar edir.” Həzrət buyurdu: “Allah öz rəsuluna buyurub: “Ey mənim rəsulum! Ümmətə de ki, mənim və mənə tabe olanların yolu xalqı bəsirətlə Allaha doğru dəvət etməkdir.” And olsun Allaha! Həmin vaxt ona doqquz yaşlı Əlidən (ə) başqası tabe olmadı. Mənim də doqquz yaşım var.”(٤)

?Sual: ١٧١. Şiələr azyaşlı məsumların imamətinə inanırmı

Cavab: Əhli-beyt (ə) məktəbinin ardıcılları tarix boyu imamət əqidələrinin sübutu üçün böyük fədakarlıqlar göstərmişlər. Azyaşlı məsumun imamətinə şübhə Əhli-beyt (ə)

düşməni olan xəlifələrin yoludur. Bu məsələyə görə hakim qurluşla əhli-beyt (ə) və onların



---

.Bax: “Məryəm”, ۱۲; “Yusuf”, ۲۲; “Bəsairul-dərəcat”, s. ۲۵۸ [۲۸۳] -۱

.Kəşful-Murad”, s. ۳۸۸, ۳۸۹“ [۲۸۴] -۲

.Kafi”, c. ۱, s. ۳۸۳“ [۲۸۵] -۳

.Kafi”, c. ۱, s. ۳۸۴“ [۲۸۶] -۴

tərəfdarları arasında qarşıdurmalar olmuşdur. Bir çoxları zindana salınmış, bir çoxları qətlə yetirilmişdir. Bütün bu fədakarlıqlar təsdiq edir ki, Əhli-beytin (ə) hətta uşaq yaşlarında imamətə çatmasına etiqad şiələr tərəfindən qəbul olunmuşdur və onlar bu .yolda canlarından, mallarından keçmişlər

?Sual: ١٧٢. Şiə alimləri azyaşlı imama etiqadı xalqa necə qəbul etdirmişdir

Cavab: Bəziləri iddia edirlər ki, belə bir etiqad xalqa məcburən qəbul etdirilmişdir. Bu iddia batildir. Belə bir münasibət imamiyyə alimlərinin ləyaqətinə uyğun gəlmir. Alimlərin xalqı məcbur etməsi inandırıcı deyil. İmamiyyə böyükləri tarix boyu ən çətin .şəraitlərdə Əhli-beytin (ə) imamətini sübuta yetirməyə çalışmışlar

Əhli-beytə (ə) itaətə dəvət və bu dəvətin qəbul olunmasının heç bir maddi mənfəəti olmamışdır. Öz dəvətlərinə görə böyük məhrumiyyətlərə düçar olan alimlər xalqı nahaq bir şeyə məcbur etməzdilər. Demək, bütün şiə alimləri məsumların körpə .yaşında imamətə çatmasına qəlbən inanmışlar

?Sual: ١٧٣. Xəlifələr məsumların körpə yaşında imamətinə inanmışdırmı

Cavab: İmamların müasiri olmuş xəlifələr onların uşaq yaşında vilayət məqamına çatmasını etiraf etmişlər. Bu səbəbdən də onların varlığını öz hakimiyyətləri üçün .təhlükə bilərək imamlar və onların fəzilətlərinə qarşı mübarizə aparmışlar

Deyilənlərdən aydın olur ki, uşaq yaşında imamət məqamının verilməsi təsdiqlənmiş bir həqiqətdir. Xəlifələr məsum imamları fəzl və kamillik baxımından dəfələrlə .imtahana çəkmiş və onların məqamına əmin olmuşlar

?Sual: ١٧٤. Əvvəlki imamlar körpə yaşında imaməti mümkün saymışdırmı

Cavab: Uşaq yaşında imamətə çatmış hər bir məsum haqqında özündən öncəki .imamın buyuruqları var

a) İmam Cavad (ə) haqqında – Məhəmməd ibn Əbu-Nəsr deyir: Nəccaşinin övladı ”?mənə dedi: “Sahibindən sonra imam kimdir

İmam Rizanın (ə) yanına gedib Nəccaşinin sualını ona ərz etdim. Həzrət buyurdu: (“İmam mənim övladımdır.”(١

b) Həzrət Mehdinin (ə) imamlığı – Məhəmməd ibn Əli ibn Bilal deyir: Vəfatından iki il öncə imam Əsgəri (ə) tərəfindən məktub aldım. Bu məktubda imam öz canişini haqqında xəbər verirdi. Vəfatından üç gün öncə də başqa bir məktub gəldi. Bu (məktubda imam özündən sonrakı canişinini tanıtdırırdı.”(٢

Əmr Əhvazi deyir: İmam Əsgəri (ə) övladını mənə göstərib buyurdu: “O, məndən sonra (sizin sahibiniz və imamınızdır.”(٣

Həmidan Qalansi deyir: “Əmriyə ərz etdim: İmam Əsgəri (ə) dünyasını dəyişibmi?” (Buyurdu: “Bəli, amma özündən sonra canişin təyin edib.”(٤

Sual: ١٧٥. Şəriət uşağa mülkünü sərf etmək icazəsi verməyibsə, onun imamlığı necə ?mümkün olar

Cavab: Bəziləri iddia edirlər ki, insan körpə yaşında imamət məqamına çata bilməz. Onlar dəlil olaraq “Nisa” surəsinin ۶-cı ayəsini göstərirlər. Bu ayədə göstəriş verilir ki, yetimlər yalnız yetkinlik həddinə çatdıqda mülklərini sərf edə bilərlər. İddia olunur ki, .mülkündən istifadə etmək haqqı olmayan uşaq imamət məqamına çata bilməz

Bu sayaq sualları doğuran dindən yetərincə məlumatlı olmamaqdır. Sübut göstərilən ayə xüsusi ünvanlıdır və məsum imamlara aid deyil. Allah əqli və nəqli dəlillərə əsasən, məsumların imamətini sübut etmişdir. Bu səbəbdən də yetimlər haqqındakı hökm azyaşlı imama tətbiq olunmamalıdır. Şübhə yox ki, bu ayə ağıl baxımından yetkinləşməmiş insanlara aiddir. Əhli-beyt (ə) imamları uşaq yaşından kamala (çatdıqlarından onların hər hansı mülkün sərfində problemləri yoxdur.(٥

Qeyd etməliyik ki, yetimlərə münasibətdə müəyyənləşdirilmiş bu qadağanın əsl səbəbi onların ağıl baxımından qeyri-yetkin olmasıdır. Aydın olur ki, bir insan yetkinlik yaşına baxmayaraq ağıl baxımından yetkinləşməsə, mülkünü özbaşına sərf edə bilməz. Demək, ayədə yaş

١- [٢٨٧] “Kafi”, c. ١, s. ٣٢٠.

٢- [٢٨٨] “Kafi”, c. ١, s. ٣٢٨.

٣- [٢٨٩] Həmin mənbə.

٤- [٢٩٠] Həmin mənbə.

٥- [٢٩١] “Əl-Füsulul-Muxtarə”, s. ١٤٩, ١٥٠.

yox, ağıl səviyyəsi nəzərdə tutulur. Məsum imamlarda isə belə düşüncə uşaq .yaşlarından mövcuddur

?Sual: ۱۷۶. Beş yaşlı uşaq imam üçün cənazə namazı qıla bilərmi

Cavab: Belə bir sualı yalnız imamı adi insanlardan üstün saymayanlar ünvanlaya bilər. Əgər qəbul etsək ki, körpənin imaməti möcüzə və etibarlı məlumatlarla təsdiqlənmişdir və düşüncəsi kamildir, onu adi xalqla müqayisə etmərik. Soruşurlar ki, hər birinin öz ağırlığı olan təkvini (təbii), təşrii (şəriətlə bağlı) və batini rəhbərlik hansı əsasla azyaşlı uşağa həvalə olunur? Öncə işarə etdik ki, Allah bir şəxsə hidayət və imamət məqamı verdikdə onun ağlını kamala çatdırır. Bu kamilləşmə Allahın lütf və .inayətidir

?Sual: ۱۷۷. Heç bir dini vəzifə daşımayan körpə hansı əsasla imam ola bilər

Cavab: Yetkinlik yaşına çatmamış, heç bir dini vəzifəsi olmayan bir uşağın imamət kimi bir məsuliyyəti qəbul etməsi bəzilərinə şübhəli görünür. Əslində büluğ, yetkinlik həddi dedikdə ağıl baxımından yetkinlik nəzərdə tutulur. Oğlanlar üçün on beş yaşın büluğ həddi təyin olunmasının səbəbi onların, adətən, bu yaşda düşüncə yetkinliyinə çatmasıdır. Əgər bir şəxs on beş yaşından qabaq şübhə doğurmayacaq şəkildə yetkinlik həddinə çatmışdırsa, onun imaməti də mümkündür. Ağıl baxımından kamil, .məqam baxımından məsum insanda imamət üçün heç bir nöqsan yoxdur

Bəzi sünni alimləri həzrət Əlinin (ə) doqquz yaşında ikən iman gətirməsinə şübhə ilə yanaşırlar. Onlar bildirirlər ki, Əli (ə) həmin vaxt yetkinlik yaşına çatmadığından onun İslamı qəbul etməsi dəyərsizdir. Onların nəzərincə Əbu-Bəkrin yuxarı yaşda iman .gətirməsi daha qiymətlidir

Doqquz yaşında İslamı qəbul etmiş həzrət Əli (ə) uşaq yaşlarından kamal həddinə çatmışdı. O öz uşaqlıq dövrünü həzrət Peyğəmbərin (s) yanında keçirmişdi. İslamı tam .bəsirətlə, agahlıqla qəbul edən Əli (ə) həqiqətən ilk mömin və müsəlmandır

Axı kim iddia edə bilər ki, yaşlı olmaq ağıllı olmaqdır? Bəs nə üçün bir çox yaşlıların !?uşaqca ağlı yoxdur

Bu səbəbdən də həzrət Peyğəmbər (s) həzrət Zəhraya (ə) xitabən buyurur: “Əli səhabələrimdən mənə ilkin iman gətirmiş kəsdir.”(1)

səh:116

---

1- [292] “Müsnəde-Əhməd”, c.5, s.662.

(Ənəs ibn Malik deyir: “Peyğəmbərə ilkin iman gətirən kəs Əli ibn Əbu-Talib idi.”(١

İbn Kəsir deyir: “Peyğəmbər (düşənbə günü) məbus oldu, Əli (ə) (seşənbə günü) bir (gün sonra ona iman gətirdi.”(٢

(Şeyx Məhəmməd Xızri deyir: “İslam dəvətini ilkin qəbul edən Əlidir.”(٣

İbn Əbil-Hədid deyir: “Doğru yola çıxmaqda başqalarından önə keçən kəs haqqında nə deyim?! O bütün yer üzü daşa ibadət edib, Allaha arxa çevirdiyi vaxt Allaha iman (gətirib, Ona ibadət etdi.”(٤

Bu səbəbdən də həzrət Peyğəmbər (s) besətin üçüncü ili “Ənzir əşirətəkə...” ayəsi nazil olduqdan sonra həzrət Əlini (ə) özünə canişin seçib, qövmünə göstəriş verdi ki, onu (dinləyib itaət etsinlər.(٥

?Sual: ١٧٨. Allah nə üçün uşağı imam təyin etdi

Cavab: Bəziləri sual verirlər ki, Allah şəkk-şübhə yaranacağını bildiyi halda nə üçün :uşağı imam təyin etdi? Belə bir seçimin bir neçə amili ola bilər

Xalqın imtahanı – Çünki möcüzə və başqa yollarla uşağın imaməti sübuta yetdikdə .١ xalq imtahana çəkilir. Müəyyənləşdirilir ki, kim haqqa təslim olur? Necə ki, həzrət .Əbdül-Əzim Həsəni imtahana çəkildi

Körpənin imam təyin olunması bu işin Allah tərəfindən müəyyənləşdirilməsinin . ٢ sübutu ola bilər – Əgər imamlar yalnız yaşlı vaxtlarında imamət məqamına çatsaydılar, bəziləri onların çalışaraq kamilliyə çatdığını düşünərdi. Körpə uşağa münasibətdə belə ehtimallar olmur. Əgər uşaqda imamət fəziləti varsa, şübhəsiz ki, .bu fəzilət Allah tərəfindəndir

Sübuta yetirilir ki, insanın məqamı onun yaşından yox, ləyaqətindən asılıdır – Usamə .٣ ibn Zeydin komandan təyin olunması da bu həqiqəti göstərir. Bir çox səhabələr bu təyinatı bəyənmirdi. Amma həzrət Peyğəmbər (s) məhz ləyaqətinə görə Üsaməni .komandan təyin etdi

İmam Riza (ə) İmamlar ardıcıl şəkildə şəhadətə yetirildiyindən, Allah imamları uşaq .٤

yaşında bu məqama təyin etməklə zalım

səh:۱۱۷

---

۱- [۲۹۳] "Səvaiqul-Muhriqə", s. ۱۱۸.

۲- [۲۹۴] "Üsdul-ğabə", c. ۴, s. ۱۷».

۳- [۲۹۵] "Tarixul-Əməmul-islamiyyə", c. ۱, s. ۴۰۰».

۴- [۲۹۶] Şərhe-Əbil-Hədid, c. ۳, s. ۲۶۰».

۵- [۲۹۷] "Kamile-İbn-Əsir", c. ۲, s. ۴۰, ۴۱; "Tarixe Təbəri", c. ۲, s. ۶۲, ۶۳.

hakimlərin diqqətini yayındırırdı. Digər imamlar imtahandan başıuca çıxdığı üçün düşmənlər anladılar ki, azyaşlı imam da onlar üçün təhlükəlidir. Bu səbəbdən də həzrət Mehdini (ə) tapıb qətlə yetirmək istədilər. Allah-təala həzrət Mehdini (ə) uşaq yaşından .qeybə çəkdi

?Sual: ١٧٩. Uşağın imaməti lütf prinsipinə uyğundurmu

Cavab: Bəziləri nöqsan tuta bilər ki, uşağın imamət məqamına təyin olunması bir çoxlarında şəkk-şübhə yaratdığı üçün lütf prinsipinə uyğun deyil. Amma bəzən Allahın lütfü tələb edir ki, məsum şəxs uşaq yaşında imamətə təyin olunsun. Qeyd olunduğu kimi bu yolla həm xalq imtahana çəkilir, həm də çoxları uşaq yaşında bu məqama təyin olunmuş şəxsin imamətinə əmin olur. Bir daha təsdiqlənir ki, imamət yaşa yox, ləyaqətə əsaslanır. Bu imtiyazları və hər bir şəxsin araşdırma aparmalı olduğunu .nəzərə alsaq, heç bir şəkk-şübhə qalmır

?Sual: ١٨٠. Nə üçün həzrət Mehdi (ə) uşaq yaşında qeybə çəkildi

Cavab: Sual oluna bilər ki, imam xalq arasında olmalı ikən nə üçün həzrət Mehdi (ə) uşaq yaşında qeybə çəkildi? Başqa sözlə, nə üçün imam Əsgəri (ə) uşaq yaşında ikən ?övladını xalqdan gizlətdi

Şübhəsiz ki, imam Əsgəriyə (ə) qarşı siyasi təzyiqlər çox güclü idi. Həzrət Mehdini (ə) ciddi təhlükə gözlədiyindən imam öz şiələri və səhabələrinə tapşırdı ki, ona aşkar (salam da verməsinlər.(١

Vəziyyət o qədər mürəkkəb idi ki, imam Əsgəri (ə) səhabələri ilə görüşmək üçün onların arxasınca adam göndərib buyurardı: "Gecə vaxtı, filan saatda, filan evdə (toplanın, məni orada görərsiniz."(٢

Bütün siyasi sıxıntılara rəğmən həzrət vəkalət qurumu müəyyənləşdirmişdi. O bu yolla .həm xalqın problemlərini həll edir, həm də görüşlə bağlı çətinlikləri aradan qaldırırdı

Belə bir həssas vaxtda həzrət Mehdi (ə) dünyaya gəldi. O, imam Əsgəridən sonra Allahın yer üzündə höccəti idi. Həzrət Peyğəmbər (s) onun gəlişini və yer üzündə ədaləti bərpa edəcəyini vəd etmişdi. Həzrət Mehdi (ə), böyük qiyamın rəhbəri

dövrünün xəlifələrindən kimsəyə beyət etməmişdi. Belə bir imamın xalqın və zalım hakimlərin gözündən qeybə çəkilməsi təbii deyilmi?! Bununla belə, o xalq arasındadır, .onlarla yanaşı yaşayır



---

.Bihar”, c.۵۰, s.۳۶۹“ [۲۹۸]-۱

.Bihar”, c.۵۰, s.۳۰۴“ [۲۹۹]-۲

?Sual: ١٨١. İmamların fəzilət və kəramət səbəbi onların kamil düşüncəsi idimi

Cavab: Materialist düşüncəli insanlar hər hansı möcüzə ilə rastlaşdıqda onu maddi baxımdan yozmağa çalışırlar. Onlar insanın bütün keyfiyyətlərini onun üçün təbii sayır və bütün qeybi əlaqələri inkar edirlər. Amma bu sayaq dünya görüşünə malik :insanların bir sıra nöqsanları var

.Materialist düşüncəli insanlar istənilən bir qeybi məlumatı inkar edirlər.١

İmamların uşaq yaşındakı kəramət və möcüzələrindən biri onların qeybi xəbərlər .٢ verməsidir. Kiminsə imamlıq iddiası ilə uşaq yaşında sırf düşüncəsinə əsaslanaraq qeybi xəbər verməsi müşahidə olunmamışdır. İnsanın düşüncəsi nə qədər kamilləşsə .də o qeybdən xəbər verə bilməz

Əgər qeybi xəbərlər düşüncədən qaynaqlanırdısa, nə üçün peyğəmbərlər və . ٣ !?imamlar bu xəbərlərin vəhy olduğunu bildirirdi

Əgər imamların uşaq yaşındakı kəramətləri onların kamil düşüncəsindən . ٤ !?qaynaqlanırdısa, nə üçün başqaları bu sahədə öz acizliklərini etiraf edirdi

?Sual: ١٨٢. Əhli-beyt (ə) azyaşlı məsumların imaməti üçün zəmin hazırlamışdırmı

Cavab: Rəvayətlərə müraciət etdikdə görürük ki, bu sahədə Əhli-beyt (ə) əlindən gələni etmişdir. Onların əsas fəaliyyət istiqamətlərindən biri uşaq yaşında imamətin .mümkünlüyünü sübuta yetirmək olmuşdur

Müqəddəsi Şafei “Əqdud-durər” kitabında imam Baqirdən (ə) belə nəql edir: “Aramızda (ən az yaşı olanlar imamət və xilafət məqamına seçilər.”(١

Sual: ١٨٣. İmam Əsgəri (ə) öz övladının imamətini sübut etmək üçün hansı tədbirləri ?gördü

:Cavab: Həzrət bu istiqamətdə bir sıra işləri həyata keçirdi

Təlimat və bəyanat – Musa ibn Cəfər ibn Vəhəb Bağdadi deyir: “İmam Əsgəridən (ə) .١ belə eşitdim: “Sanki canişinimlə bağlı ixtilaf edəcəyinizi görürəm. Agah olun! Hər kəs

imamları qəbul edib mənim övladımı inkar etsə, bütün peyğəmbərləri qəbul edib (həzrət Məhəmmədi (s) inkar etmiş kimidir…”(١

Əhməd ibn İshaq deyir: “İmam Həsən Əsgəridən (ə) belə eşitdim: “Həmd olsun mən (dünyadan köçməmiş canişinimi tanıtdıran Allaha!”(٢

Mövludundan üç gün sonra atası imam Əsgəri (ə) həzrət Mehdini (ə) səhabələrinə təqdim edib buyurdu: “Bu övladım məndən sonra sizin imamınız və mənim xəlifəmdir. (Xalq bu qaimin intizarını çəkəcək…”(٣

Yaxın adamlara həzrət Mehdinin (ə) göstərilməsi – Əhməd ibn İshaq ibn Səd Əşəri .٢ deyir: “Canişini haqqında soruşmaq üçün imam Əsgərinin (ə) yanına getdim. Həzrət öncə belə buyurdu: “Ey Əhməd ibn İshaq! Allah Adəmdən başlamış qiyamət gününədək yer üzünü heç vaxt höccətsiz qoymaz. Höccət vasitəsi ilə yer üzündən bəla götürülər, onun vasitəsi ilə yağış yağar, yer bərəkətə çatar.” Ərz etdim: “Ey peyğəmbər övladı! Sizdən sonra imam və xəlifə kimdir?” Həzrət dərhal qalxdı və o biri otağa daxil oldu. Çox keçməmiş çiynində ay parçası tək işıq saçan, təqribən üç yaşlı bir körpə bayıra çıxdı və buyurdu: Ey Əhməd ibn İshaq! Əgər Allah və Onun höccəti (yanında kəramətin olmasaydı, bu övladı sənə göstərməzdim…”(٤

Şeyx Səduq Əbu-Ğanim-Xadimdən belə nəql edir: Allah imam Əsgəriyə (ə) bir övlad əta etdi və buyurdu ki, onun adı Məhəmməd qoyulsun. İmam mövluddan üç gün sonra onu səhabələrinə göstərib buyurdu: “Bu, sizin sahibiniz və imamınız, məndən sonra (xəlifənizdir…”(٥

Müaviyə ibn Həkim, Məhəmməd ibn Əyyub ibn Nuh, Məhəmməd ibn Osman Əmri deyirlər: “Biz qırx nəfərlə birlikdə imam Əsgərinin (ə) mənzilində idik. Həzrət öz övladını bizə göstərib buyurdu: “Bu, məndən sonra sizin imamınız və xəlifənizdir. Ona itaət edin və məndən sonra parçalanmayın, yoxsa həlak olacaqsınız. Bilin ki, bundan sonra onu (görməyəcəksiniz…”(٦

Yəqub ibn Mənquş deyir: İmam Əsgərinin (ə) yanında olduğum vaxt qapısından pərdə asılmış otağı görüb soruşdum: “Ey mənim ağam! Sizdən sonra imam kimdir?” Buyurdu: “Pərdəni kənara çək.” səh:١٢٠

۱- [۳۰۱] “Bihar”, h. ۵۱, s. ۱۶۰.

۲- [۳۰۲] “Kəmalud-din”, s. ۴۰۸; “Bihar”, c. ۵۱, s. ۱۶۱.

۳- [۳۰۳] “Kəmalud-din”,s.۴۳۱.

۴- [۳۰۴] “Kəmalud-din”,s.۴۳۱.

۵- [۳۰۵] “Kəmalud-din”,s.۴۳۱.

۶- [۳۰۶] “Kəmalud-din”,s.۴۳۵.

Pərdəni kənara çəkdim və xüsusi səciyyələrə malik bir körpə gördüm. O yaxınlaşıb imam Əsgərinin (ə) qucağında oturdu. Həzrət buyurdu: "Bu, məndən sonra sizin (sahibiniz, imamınızdır..."(١

?Sual: ١٨۴. Həzrət Mehdi (ə) körpə ikən öz imamətinin sübutu üçün nə etdi

Cavab: Həzrət Mehdi (ə) öz imamətinin şiə cəmiyyətinə sübutu üçün bir sıra işlər :gördü

Möcüzələr və kəramətlər – öncə Əbül-Ədyandan nəql etdiyimiz əhvalatda deyilirdi: .١ "İmam Əsgəri (ə) vəfat edən vaxt bir uşaq qabağa çıxıb imamın cənazəsinə namaz qıldı. Sonra imam atası ilə yanaşı dəfn olundu. Bu körpə (həzrət Mehdi (ə)) mənə buyurdu: "Ey Bəsri! Yanındakı məktubu mənə ver. Məktubları həzrətə təqdim etdim. "...Gördüyüm bu iki nişanə uşaqdakı imamət nişanələridir

Əbül-Ədyan deyir: Xadim bayıra çıxdı və dedi: "Filan məktublar var, xurcunlarınızda ١٠١٠ dirhəm var." Oradakılar məktubları və dinarları ona verib dedilər: "Səni bu işçün (göndərən həqiqətən imamdır..."(٢

Məsələlərin cavablandırılması – həzrət Mehdi (ə) öz nümayəndələri vasitəsi ilə xalqın .٢ suallarına cavab verirdi. Onun verdiyi cavablar imamətinin digər bir sübutu idi. Mənbələrdə Həzrət Əhməd ibn İshaq Əşəriyə, İshaq ibn Yəquba, Həmiriyə, Məhəmməd ibn İbrahim Məhzyara, Əbul-Hüseyn ibn Məhəmməd Əsədiyə verdiyi .cavablar nəql olunur

### İmam Mehdinin (ə) vilayəti

?Sual: ١٨۵. Vilayət nə deməkdir

Cavab: "Vilayət" sözünün lüğət mənası yaxınlıqdır. Fəyyumi deyir: "Vəliyy" "fələs" sözü (kimi yaxınlıq mənasını bildirir.(٣

Əqrəbul-Məvariddə" deyilir: "Vəliyy" dedikdə bir fərd və ya şeyi ikinci fərd və ya şeyin" (yanında yerləşdirmək nəzərdə tutulur.(۴

Rağib İsfəhani deyir: "Və la" və "təvaliy" dedikdə iki şeyin arasında məsafə qoymadan

onları yanaşı yerləşdirmək nəzərdə tutulur.”(۵)



---

۱- [۳۰۷] Həmin mənbə, s. ۴۳۶, ۴۳۷.

۲- [۳۰۸] “Kəmalud-din”, c. ۲, s. ۵۰۲, ۵۰۳.

۳- [۳۰۹] “Misbahul-Munir”.

۴- [۳۱۰] “Əqrəbul-Məvarid”.

۵- [۳۱۱] “Mufrədate-Rağib”, s. ۵۲۳.

İnsanların ilkin olaraq sözləri hisslərlə bağlı mənada bəyan etməsini nəzərə alaraq :belə demək olar

Vilayət” sözü əvvəllər hissi yaxınlıq mənasında işlədilmişdir. Həmin vaxt bu sözə“ “mənəvi yaxınlıq” mənası verilmişdir. “Vilayət” sözü mənəvi yöndə işlədildikdə elə bir yaxınlığı bildirir ki, bu yaxınlıq müstəsna ixtiyar haqqı verir. Məsələn, meyyitin vəlisi onun mülkünü sərf edə bilər. Bu vilayət varislik haqqından doğur. Sağır üzərində vilayəti olan kəs onun işlərini idarə edə bilər. Allah-təala öz bəndələrinin işinin vəlisidir. Yəni onların dünyəvi və axirət işlərini idarə edir. Allah möminlərin vəlisidir. Yəni onların .üzərində xüsusi vilayəti var

(Demək, bütün variantlarda “vilayət” sözü yaxınlıq bildirir.(١

(Başqa sözlə, vilayət elə bir yaxınlıqdır ki, aradakı pərdələr götürülür.(٢

Beləcə, insan nəfsini ram etməklə, əldə etdiyi qabiliyyətlərlə, digər bir tərəfdən, Allahın lütfünə və ona yaxın məqama çatmaqla xalq üzərində vilayət məqamına yüksəlir. Vilayət məqamına yüksəlmiş şəxs ixtiyar qazanır və kimsə onun icazəsi olmadan .nəzərdə tutulmuş işlərə qatıla bilmir. Bütün bunlar Allahın izn və iradəsi ilə baş tutur

?Sual: ١٨۶. İmamın təkvini vilayəti dedikdə nə nəzərdə tutulur

Cavab: “Təkvini vilayət” dedikdə fərdin elə bir yaxınlıq və kamillik məqamına çatması nəzərdə tutulur ki, o Allahın izni ilə dünyanın, təbiətin işlərinə müdaxilə edə bilir. Təkvini vilayət ruhi və mənəvi bir kamillikdir. İnsan ilahi vəzifələrinə və şəri qanunlara əməl etməklə bu səviyyəyə qalxıb qeyri-adi işlər görə bilər. Təşrii vilayətdən fərqli olaraq təkvini vilayət insanın zəhmətləri sayəsində əldə olunur və onun bəzi .mərtəbələrinə hamı çata bilər. İmam isə təkvini vilayətin ən uca mərtəbələrinə qalxır

Təşrii vilayət isə sırf Allah tərəfindən əta olunan məqamdır. Bu məqam yalnız Allahın .istəyi ilə verilə bilər



---

.Əl-Mizan”, c. ۶, s. ١٢“ [٣١٢] -١

?Sual: ١٨٧. Təkvini vilayətin hansı nəticələri var

Cavab: “Misbahul-Şəriət” kitabında deyilir: “Bəndəlik və Allaha yaxınlıq məqamı bir (gövhərdir. Bunun nəticəsində insan böyük qüdrət və bacarıq əldə edir.”(١

:İlahi yaxınlıq məqamının bir sıra təsirləri var. Onlardan bəzilərini nəzərdən keçirək

Nəfsə hakimlik – Allah-təala buyurur: “Namaz insanı çirkin və pis işlərdən . ١ (uzaqlaşdırır.”(٢

Xüsusi baxış – İlahi yaxınlıq məqamının səciyyələrindən biri budur ki, insan qəlb . ٢ səfası sayəsində xüsusi baxış əldə edir. O bu baxışla haqqı batildən seçir və heç vaxt .azmır

Quran buyurur: “Ey iman gətirənlər, əgər pəhrizkar olsanız, Allah sizə bir güc verər ki, (bu güclə haqqı batildən seçərsiniz.”(٣

Xülyalardan uzaqlıq – Bəndəlik yolunu gedənlər qazandıqları təkamül və qüdrət . ٣ vasitəsi ilə bütün yayındırıcı fikirlərə, xülyalara qalib gəlir, ibadət vaxtı Allahdan qeyrisi .haqqında düşünmürlər

Əbu-Əli Sina deyir: “İbadət düşüncə qüvvələrinin tərbiyə növüdür. Allah qarşısında təkrarlanan ibadət insanın fikrini maddi aləmdən çəkib ərş aləminə yönəldir. İbadət (nəticəsində düşüncə qüvvəsi ilahi fitrətə təslim olur və mütiləşir.”(٤

Nəfsə qələbə - Təbiət aləmində ruh və bədən arasında qarşılıqlı ehtiyac mövcuddur. .۴ Amma bəzən ruh kamillik sayəsində ilahi yaxınlıqdan faydalanaraq bədəndən .ehtiyacsız olur

Təbiət aləminə müdaxilə - İbadət və ilahi yaxınlıq sayəsində nəinki insan bədənin . ۵ hakimiyyətindən çıxır, hətta təbiət aləmi onun qarşısında mütiləşir. Allahın izni ilə belə .bir insan təbiətin işlərinə qarışır, ondan bir sıra möcüzələr və kəramətlər görünür

?Sual: ١٨٨. İmamın təkvini vilayəti ola bilərmi

Cavab: Məsum imamların, o cümlədən, həzrət Mehdinin (ə) təkvini vilayətini bir neçə

.müqəddimə ilə sübut etmək olar

a) Quran Asəf ibn Bərxiya haqqında deyir: “Kitabdan biliyi olan kəs dedi: “Bir göz qırpımında onu sənin yanına gətirəcəyəm.



---

۱- [۳۱۴] “Misbahul-şəriət”.

۲- [۳۱۵] “Ənkəbut”, ۴۵»

۳- [۳۱۶] “Ənkəbut”, ۲۹.

۴- [۳۱۷] “İşarat”, c. ۳, s. ۳۷۰.

(Süleyman) Onu (taxtı) öz yanında dayanmış görüb dedi: “Bu Rəbbimin fəzlindəndir.”(1)

b) Digər ayələrdən məlum olur ki, Allah və kitabdan tam xəbərdar bir qrup peyğəmbərlə xalq arasında şahiddir. Allah-təala buyurur: “Allahın və kitabdan elmi olanın Mənimlə sizin aranızda şahid olması kifayətdir.”(2)

v) Quranda bu da bildirilir ki, Quran maarifinin mahiyyətini bilən yalnız pak insanlardır: “Paklardan qeyriləri onu əldə edə bilməzlər.”(3)

q) Quran “mutəhhərun” (“paklar”) təbirini özü açıqlayıb peyğəmbərlə birlikdə onun əhli-beytini nümunə göstərir. Buyurulur: “Həqiqətən, Allah siz peyğəmbər ailəsindən bütün çirkinliyi uzaqlaşdırmaq istəyir...”(4)

d) Ayədəki “əhli-beyt” ünvanını tanımaq üçün rəvayətlərə müraciət etmək lazımdır. Quranda buyurulur: “Sənə Quran göndərdik ki, göndəriləni ümmətə bəyan edəsən.”(5)

j) Şiə və sünni rəvayətlərinə müraciət etdikdə görürük ki, “Təthir” ayəsində “əhli-beyt” dedikdə həzrət Peyğəmbər (s), Əli (ə), Fatimə (ə), Həsən (ə) və Hüseyn (ə) nəzərdə tutulmuşdur.(6)

Belə bir nəticə əldə edirik ki, təkvini vilayət paklara əta edildiyindən və peyğəmbər əhli-beyti ən üstün paklıq nümunəsi olduğundan təkvini vilayətdən bəhrələnmişdir.

Bürəydə ibn Müaviyə deyir: “İmam Baqirdən (ə) “Rəd” surəsinin ۴۳-cü ayəsi haqqında soruşdum. İmam buyurdu: “Ayədə yalnız biz nəzərdə tutulmuşuq. Peyğəmbərdən sonra ən fəzilətlimiz və üstünümüz Əlidir (ə).”(7)

Sual: ۱۸۹. “Təkvini vilayət” “təfviz” (işin tapşırılması) deyilmi?

Cavab: Bəziləri elə güman edir ki, imamın təkvini vilayəti dünya işlərinin bütövlükdə imama tapşırılmasıdır. Belə bir əqidə tövhid əqidəsinə uyğun deyil. Quran yəhudiləri məhz bu sayaq əqidələrinə görə məzəmmət edir.(8)



---

۱- [۳۱۸] “Nəml”, ۴۰.

۲- “Rəd”, ۴۳.

۳- [۳۲۰] “Vaqe”, ۷۹.

۴- [۳۲۱] “Əhzab”, ۳۳«

۵- [۳۲۲] “Nəhl”, ۴۴«

۶- [۳۲۳] “Səhihe-Müslim”, c. ۷, s. ۱۳۰; “Səhihe-Tirmizi”, c. ۵, s. ۶۵۶.

۷- [۳۲۴] “Kafi”, c. ۱, s. ۲۹۹.

۸- [۳۲۵] “Maidə”, ۶۴.

Tövhid əqidəsini və Allahın iradəsi olmadan işlərin mümkünsüzlüyünü nəzərə alaraq :təkvini vilayət haqqında belə demək olar

.Əvvəla, imam yalnız müəyyən işlərə qatışa bilər

.İkincisi, imamın qatıldığı təkvini işlər də digər işlər kimi Allahın iradəsindən asılıdır

?Sual: ١٩٠. Təkvini vilayət yalnız Allaha aiddirmi

Cavab: Bəziləri iddia edirlər ki, Quran ayələri təkvini vilayətin yalnız Allaha aid .olduğunu bildirir

Qurani-Kərimdə buyurulur: "Onlar özlərinə Allahdan qeyrisini "vəliyy" seçdilər?! Hansı (ki, "vəliyy" yalnız Allahdır. Odur ölüləri diriltdən və Odur hər işə qadir."(١

Digər bir Quran ayəsində buyurulur: "Sizin üçün Allahdan başqa "vəliyy" və yardımçı (yoxdur."(٢

Bu və digər ayələrdən məlum olur ki, vilayət (vəlilik) əslində yalnız Allaha aiddir. .Başqaları yalnız Allaha yaxınlıq və Onun izni ilə bu məqamdan bəhrələnə bilər

Maidə" surəsində oxuyuruq: "Sizin vəliniz yalnız Allah, Onun peyğəmbəri və iman" (gətirənlərdir. Onlar ki, namazı bərpa edir, rüku halında zəkat verirlər."(٣

Təhrim" surəsində oxuyuruq: "Onun ziddinə əl-ələ versəniz (bacarmazsınız). Çünki" Allah onun vəlisidir, həmçinin Cəbrail, saleh möminlər və mələklər ona arxa (dururlar."(۴

Sual: ١٩١. Əgər imamın təkvini vilayəti varsa, nə üçün zəruri məqamlarda bu imkandan ?istifadə etmir

Cavab: Bəziləri deyirlər ki, əgər imamların təkvini vilayəti, möcüzə göstərmək imkanı varsa, nə üçün zəruri məqamlarda bəlanı özlərindən uzaqlaşdırmaq, düşməni ?zərərsizləşdirmək üçün bu imkanlardan istifadə etmirlər

Əvvəla, zərərli olduğunu düşündüyümüz bir çox işlər əslində bizə xeyirdir. Əksinə, bir

çox işləri xeyirli bildiyimiz halda bu işlər bizə zərər yetirir. Allah təkvini vilayəti məsləhət bildiyi kəsə verir. İmamın çətinlik zamanı həmin məqamdan istifadə etməməsində, „şübhəsiz ki



---

۱- [۳۲۶] “Şura”, ۹.

۲- [۳۲۷] “Şura”, ۳۱.

۳- [۳۲۸] “Maidə”, ۵۵.

۴- [۳۲۹] “Təhrim”, ۴.

.hikmət var. Bizim zahirinə baxıb xeyir saydığımız bir iş zərərli də ola bilər

Quran buyurur: “Sizin üçün Allah yolunda cihad müəyyənləşdi – bir halda ki, sizə xoş gəlməz. Nə çox xoşlamadığınız, amma xeyrinizə olan şeylər. Bəzən də zərərinizə olan (şeyi dost tutursunuz.”(١

Digər bir ayədə buyurulur: “Xoşlamadığınız bir çox işlər ola bilər ki, Allah həmin işdə (böyük xeyir müəyyənləşdirib.”(٢

İkincisi, imam ilahi müqəddərata təslim olduğundan Allahın iradəsinə qarşı heç bir .vasitədən istifadə etmir

Üçüncüsü, Allahın övliyaları bu sınaq dünyasında imkan həddində möcüzədən istifadə .etməməyə çalışırlar

Dördüncüsü, məsum şəxs heç vaxt şəxsi mənafeyi naminə təkvini vilayətdən istifadə edib, ilahi müqəddərata qatışmır. Məsumlar yalnız bəşəriyyətin xeyiri istiqamətində və .Allahın iradəsinə uyğun şəkildə səy göstərirlər

## Ağıl baxımından imam Mehdinin (ə) varlığı

?Sual: ١٩٢. İmam Mehdinin (ə) varlığı ilahi lütf əsasında necə sübut olunur

Cavab: İlahi lütfün həzrət Mehdinin (ə) varlığına dəlil olmasını araşdırmazdan öncə bir :neçə nöqtəyə işarə edək

:Bir baxımdan lütf iki qismə bölünür .١

.a) Lütfi-müfəssəl: Bu lütf sayəsində insan ixtiyari olaraq itaət yolunu seçir

b) Lütfü-müqərrəb: bu lütf sayəsində insan vacib göstərişlərin yerinə yetirilməsinə .yaxınlaşır, haramlardan uzaqlaşır

İmamiyyə və mötəzilə alimləri lütfü Allah üçün vacib sifət saymışlar. Çünki Allah Öz .٢ bəndələrini boş yerə yaratmamışdır. Buna görə də onları nəzərdə tutulmuş məqsədə .çatdırmaq üçün şərait yaradır, o cümlədən, lütf göstərir

Müqərrəb lütfə əsasən cəmiyyətdə haqqa mehvər olası, cəmiyyəti xətadan uzaqlaşdırası imama ehtiyac var. Bu səbəbdən də deyirik: icma höccətdir. Lütf qaydası tələb edir ki, xalq arasında rəis olsun. Rəis cəmiyyətə biganə qalmamalıdır. Cəmiyyət .yolunu azdıqda rəis onu doğru yola sövq etməli, batilin qarşısını almalıdır

səh:۱۲۶

---

.Bəqərə", ۲۱۶" [۳۳۰] -۱

.Nisa", ۱۹" [۳۳۱] -۲

Səffar imam Sadiqdən (ə) belə nəql edir: “Həqiqətən, Allah-təala yer üzünü imamsız (qoymaqdan daha ucadır.”(١)

?Məhz varlığını lütf saydığımız qeybdə olan imamın hansı təsirləri var

Bütün yer üzündə Allah dinin hifzi – Mərhum Şəriful-Üləma buyurur: “Heç şübhəsiz, .١ qeyb dövründə imamın varlığı lütfdür. Digər bir lütf şəriətin qorunması, xalqın batil (ətrafında toplanmasının qarşısının alınmasıdır.”(٢)

Hazırlıqlı nəfslərin tərbiyəsi – Qeyb dövründə imamın xalqla rabitələrinin tamamilə .٢ kəsilməsi yanlış fikirdir. Bəzi rəvayətlərə əsasən, ləyaqətli insanlar həzrətin nurundan .bəhrələnəcəklər

İmamın varlığı ilə məzhəb qorunar – Sosioloqlar və psixoloqlar bu fikirdədilər ki, .٣ hətta qeybdə olan rəhbərin varlığına inam dini cəmiyyətə böyük təsir göstərir. Ühüd savaşında düşmən xalqın ruhiyyəsini zəiflətmək üçün peyğəmbərin qətlə yetirilməsi ilə .bağlı şayiə yaydı

İdeal şəxsiyyətin bəşəriyyətin tərəqqisinə təsiri – İlahi dinlərin imtiyazlarından biri .٤ budur ki, göstəriş verməzdən öncə nümunələr, ideal şəxslər təqdim olunur. Xalq bu ideallarla tanış olub kamillik yolunda daha asanlıqla qədəm götürür. Bildiyimiz kimi, ən .üstün nümunə kamil və sağ imamdır

?Sual: ١٩٣. Əgər imamın varlığı lütfdürsə, nə üçün hər məntəqədə imam yoxdur

Cavab: Əvvəla, kəlam elmində sübuta yetirilib ki, hər dövrdə birdən artıq imam ola bilməz. Çoxluq fəsad yaratdığından imam da çox ola bilməz. Əgər imam hakimiyyətə .malikdirsə, bir neçə hakimiyyət, şübhəsiz ki, fəsadla nəticələnər

İkincisi, həzrət Mehdinin (ə) varlığı ilə bağlı sadaladığımız lütflər bir nəfər vasitəsi ilə həyata keçə bilər. Bu səbəbdən də hər məntəqədə imama ehtiyac qalmır. Bəli, hər bir .məntəqədə həqiqi din aliminin olması zəruridir



---

?Sual: ۱۹۴. İlahi inayət imam Mehdinin (ə) varlığına dəlil sayılırmı

.Cavab: Həzrət Mehdinin (ə) vücudunu təsdiqləyən dəlillərdən biri ilahi inayətdir

İnayət” sözünün lüğət mənası iradə və məqsəddir. Danışıq dilində isə bu söz müxtəlif“ .mənalarda işlədilir

Şeyx İşraq deyir: “İnayət dedikdə Haqq-taalanın külli nizamın necəliyini əhatəsi (nəzərdə tutulur...”(۱)

Fəxr-Razi deyir: “İnayət” dedikdə əşyanın ən kamil şəkilə düşməsi üçün hansı halda (olmasından Allahın xəbərdarlığı nəzərdə tutulur.”(۲)

Sədrul-Mutəllihin deyir: “Hikmət sahiblərinin “inayət” adlandırdığı həqiqət mövcud (nizamın qaynağıdır. Demək, mövcud aləm nəhayətdə mümkün bir fəzilətdir.(۳)

:İnayət dəlili vasitəsi ilə imamın mövcudluğunu iki bəyanla sübuta yetirmək olar

Varlıq nizamı mümkün olan ən üstün nizamdır. Şübhəsiz ki, Məsum imam olmadan .۱ .bu nizam yetkinliyə çata bilməz. Bu səbəbdən də imamın mövcudluğu zərurətdir

Allah-təala hər bir mövcudun kamala çatması üçün bu dünyada zəruri olan vasitələr .۲ qoymuşdur. Şübhəsiz ki, insan istisna deyil. Necə ola bilər ki, insanın mənəvi yönümü !?nəzərdə tutulmasın

?Sual: ۱۹۵. Həzrət Mehdinin (ə) mövcudluğu fitrət yolu ilə sübuta yetirilirmi

:Cavab: Bəzi müqəddimələrə ehtiyac var

Psixoloqlar insanın fitri meyllərini üç qismə bölür: dostluq kimi şəxsi meyllər; insanın .۱ insana məhəbbəti kimi ictimai meyllər; həqiqətpərəstlik, dindarlıq, pərəstiş, kamala .yüksəliş kimi ali meyllər

Mütləq kamala və həqiqi məbuda çatmaq üçün vasitəyə ehtiyac var. İnsan öz .۲ .daxilində bələdçiyə ehtiyac duyur

Əgər fitrətdə bir şeyə ehtiyac duyulursa, bu şey hökmən xarici aləmdə mövcuddur. .۳

Xarici aləmdə olmayan bir şey fitrət tərəfindən tələb oluna bilməz. Başqa sözlə, insanın məsum və kamil bir bələdçiyə



---

.Əl-ləmhat", Sührəvərdi, s. ۱۶۶" [۳۳۴] -۱

.Əl-məbahisul-məşriqiyyə", c. ۲, s. ۵۱۶" [۳۳۵] -۲

.Əl-hikmətul-mutəaliyyə", c. ۷, s. ۱۱۱" [۳۳۶] -۳

ehtiyacı onun içindən gəlir. Bu ehtiyac məsum imam olmadan ödənə bilməz. Biz sözlə, .insanın mütləq kamala çatması üçün yetərli vasitənin olması zəruridir

Əgər soruşulsa ki, bu meyl insanda necə yaranır, cavab verə bilərik ki, ağıl və düşüncə varlıq aləmində feyz vasitəsinin olmasını qəbul edirsə, insanda bu vasitəyə meyl .təbiidir. Bu səbəbdən də kamil insan daim xarici vücuda malik olmalıdır

?Sual: ١٩۶. Hansı əsasla feyzin vasitəli olması imamın varlığına dəlil sayıla bilər

Cavab: Filosoflar aləm üçün dörd mərhələ zikr etmişlər: rübubi aləm, əql aləmi, misal aləmi, təbiət aləmi. Filosoflar həm də ağıl üçün on hal müəyyən etmişlər. Birinci əql üçün Allah, ikinci əql üçün birinci əql, üçüncü əql üçün ikinci əql səbəbdir. Nəhayətdə onuncu əql misal aləmi üçün, misal aləmi təbiət və maddə aləmi üçün illət olur. Beləcə, .aləm səbəblər prinsipi üzərində hərəkətdədir

Soruşula bilər ki, Allah-təala təbiət aləmini nə üçün vasitəsiz yaratmayıb? Rübubi (ilahi) aləmlə maddə aləmi yekcins olmadığından onlar arasında vasitələrlə əlaqə yaradılmışdır. Maddi aləmdə yalnız insanın misal aləmi ilə yekcinsliyi var. Tam yekcinslik üçün kamil insana ehtiyac duyulur. Belə bir insan bəşəriyyətin feyzi üçün vasitə olur. Bu halda təkvini feyzlə təşrii feyz arasında fərq qalmır

Başqa sözlə, ilahi aləmlə təbiət aləmi arasında feyzin ötürülməsi baxımından vasitəyə ehtiyac olduğu kimi, Allahın mənəvi feyzinin də insan qəlbinə ötürülməsi üçün vasitəyə .ehtiyac var. Bu vasitə məsum imamdır. Əlbəttə ki, şəri feyz də bu yolla insana çatdırılır

Allah-təala buyurur: "(Ey Məhəmməd) Əgər sən olmasaydın, fələkləri xəlq etməzdim, əgər Əli olmasaydı, səni xəlq etməzdim." Bu hədisin mahiyyəti yuxarıda deyilənlərdən aydın olur. Çünki adı sadalanan məsumlar ilahi feyzin maddi aləmə ötürülməsi üçün .vasitədirlər. Fatimə (s) əql aləmi ilə imamət aləmi arasında bir pərdədir

?Sual: ١٩٧. Məqsədlilik səbəbi imamın mövcudluğuna dəlil ola bilərmi

Cavab: Kəlam elmində ilahi fellərlə bağlı danışılarkən qeyd olunur ki, Allahın bütün felləri məqsədlidir. Amma ilahi məqsəd bəşəri məqsəd kimi deyil. Allah mütləq kamil olduğundan onun 

məqsədi kamala çatmaq deyil. Əslində Allahın felləri məxluqunu kamala çatdırmaq .məqsədi daşıyır

Məqsədlilik ("ğayi") dedikdə əməlin məqsədsiz olmaması nəzərdə tutulur: Allah heç vaxt məqsədsiz iş görmür. Qurani-Kərimdə də bu həqiqət təsdiqlənir: "Göyləri və yeri, ".onların arasında olanları oyun-oyuncaq yaratmadıq

Hikmət sahibləri və filosoflar deyir: "Varlığın formalaşması prosesində hər bir ali mərtəbə özündən aşağı mərtəbə üçün məqsəddir. Beləcə, sübut olunur ki, nəticə failin (fəaliyyət göstərənin) fəaliyyətinin illətidir. Əgər varlıq aləmində insan olmasaydı, "...heyvanat aləmi də ləğv olardı

Digər bir tərəfdən bilirik ki, hər bir fərd digər fərdlərə oxşardır. Bütün insanlar eyni bir növdən sayılır. Amma arada fərq də var. Həzrət Peyğəmbər (s) buyurur: "İnsanların (cövhəri qızıl və gümüş mədəni kimi bir-birindən fərqlənir."(١

Bəli, insan, meyvəsi kamil insan olan ağac kimidir. Bu meyvə Allahın məsum höccətindən başqası ola bilməz. Bu səbəbdən də rəvayətdə deyilir: "Əgər yer üzü (imamsız olsa, dağılar."(٢

Bir sözlə, Allahın höccəti adlandırılan kamil insan bəşəriyyətin varlıq səbəbi .olduğundan onun vücudu zəruridir

Sual: ١٩٨. Ən şərəfli olmaq (əşrəf) prinsipi imam Mehdinin (ə) vücuduna dəlil ola ?bilərmi

Cavab: Hikmət sahibləri deyir: Varlıq, həyat, elm, qüdrət, rəhmət və digər kamilliklər feyz mənbəsindən aşağı mərtəbə varlıqlara birbaşa çatdırılmır. Kamilliklər öncə "əşrəf" (ən şərəfli) varlıqlara yetirilir. Necə ki, çıraq öncə ətrafını, sonra uzağı .işıqlandırır

.Elm və qüdrət kimi qeyri-hissi işlərdə öncə daha üstün rütbəli, əşrəf pillələr bəhrələnir

Əllamə Təbatəbai deyir: "Ən şərəfli olmaq qaydası budur ki, "əşrəf mümkün" vücud mərtəbəsində "xüsusi mümkündən" qədim olmalıdır. Çünki ondan şərəflisi ondan öncə

"...mövcud ola bilər

Molla Sədra bu qaydanın sübutu üçün deyir: "Əgər "xüsusi mümkün" Allah tərəfindən vücuda gəlmişsə, ondan öncə "əşrəf mümkün" olmalıdır. "Əşrəf" və "əxəssin" eyni zamanda mümkün olması mümkünsüzdür. Bu halda şübhə doğurmur ki, əşrəf əxəsdən



---

۱- [۳۳۷] "Bihar", c. ۶۱, s. ۶۵.

۲- [۳۳۸] "Kafi", c. ۱, s. ۱۷۹.

sonra vücuda gələ bilməz. Əlbəttə ki, nəticə səbəbdən öncə gələ bilmədiyi kimi...(١)

Bilirik ki, insan yaranmışların əşrəfidir. O, heyvandan, heyvan bitkidən, bitki cansız cisimlərdən şərəflidir. Şərəflilik qaydasına əsasən hər hansı feyz bitkiyə çatmamış torpağa, heyvana çatmamış heyvana çata bilməz. Bu da bir həqiqətdir ki, elm və qüdrət kimi feyzlər kamil insana çatmamış adi insana verilə bilməz.

Demək, bu qaydaya əsasən, kamil bir insan mövcuddur və o, Allahın höccətidir.

Kuleyni imam Sadiqdən (ə) belə nəql edir: “Höccət xalqdan öncə vardı, xalqladır, xalqdan sonra olacaq.”(٢)

İmam Sadiq (ə) başqa bir məqamda buyurur: “Əgər yer üzündə yalnız iki nəfər qalsa, hökmən onlardan biri imamdır.”(٣)

Sual: ١٩٩. “Məzhəre-came” dəlili ilə imamın vücudu necə sübuta yetirilir?

Cavab: İbn Tirk “Təmhidul-qəvaid” kitabında “Məzhəre-came” adlı bir dəlillə imamın varlığını sübuta yetirir. Biz bu dəlili xülasə şəkildə bir müqəddimə ilə təqdim edirik:

١. Kamil insan başqa bir mövcudda görünməyən məqama malikdir.

٢. Vacib zat heç bir vəsflə məhdudlaşmır. Bu səbəbdən də, ifadə olunan, zatın yox, onun ünvanının vəsfidir. İlkin zühur vahidiyyət və əhədiyyət kimi iki çöhrənin gerçək vəhdətidir.

٣. Zühur məqamında vəhdət hökmləri qalib gəldiyindən çoxluq (kəsrət) aradan götürülür.

Nəticə: Zati vəhdətdə təfsili adlar üçün macal qalmır. Çünki təfsil çoxluq növündəndir. Xarici aləmdə zahir olan təfsili məzahir böyük aləmin əczasından sayılır. Çoxluq hökmü bu məqamda qalibdir, yəni burada zati vəhdətin zühuru yoxdur. Demək, ilahi fərman vəhdətlə çoxluğun fərqlənə bilməyəcəyi orta həddi əsas götürür. Bu yolla haqq üçün təfsili adların və həqiqi vəhdətin məzhəri olur. Böyük ədalətdən qidalanan bu orta hədd həmin kamil insandır. Bu insan bir tərəfdən vəhdətin hakim olduğu ilahi dairəyə, digər bir tərəfdən təbiət aləminə bağlıdır.(٤)

---

۱- [۳۳۹] "Nəhayətul-hikmət", s. ۳۱۹, ۳۲۰.

۲- [۳۴۰] "Kafi", c. ۱, s. ۱۷۷.

۳- [۳۴۱] "Həmin mənbə", s. ۱۷۹.

۴- [۳۴۲] "Təmhidul-qəvaid", s. ۱۷۲.

?Sual: ٢٠٠. Böyük təcəlla dəlili əsasında imamın mövcudluğu necə sübut olunur

Cavab: Həzrət Mehdinin (ə) mövcudluğunu sübuta yetirən əqli dəlillərdən biri .“təcəllayi-əzəm”, yəni böyük təcəlla dəlilidir. Bu dəlillə tanış olaq

a) Təcəlliyyat dedikdə Quran və rəvayətlərdə işarə olunmuş zühura çıxma nəzərdə .tutulur. Allah-təala buyurur: “Allah hər gün bir işdədir

.b) Bu təcəlla və zühur vacibul-vücudun zatından bu mövcudların ayrılmasıdır

v) Allahın adları onun müqəddəs zatının cəmal və cəlal sifətlərini tanıtdırır. Bu adların .əhatəlilik baxımından bir-birindən üstünlüyü var

q) Allahın hər bir adı bir əhatə ilə zühur edirsə, Onun “ismi-əzəm” sifəti böyük bir .təcəllaya malik olmalıdır. Bu böyük təcəlla kamil insandır

Sual: ٢٠١. “Təqabüli-qütbeyn”, yəni qütblərin qarşılaşması dəlili imamın (ə) ?mövcudluğunu necə sübuta yetirir

:Cavab: Bu dəlili iki müqəddimə ilə bəyan edirik

.a) Allah-təalanın camal və cəlal təcəllaları var

b) İlahilik və tam təcəlla qütbləri arasında yaxınlıq üçün yer üzündə bəndəlik və ilahi xüsusiyyətlər baxımından kamil insan olmalıdır. Fəlsəfi terminologiyada işraqilər onu “pak ilahi kəlmə”, məşşaiyun “onuncu əql” adlandırırlar. Allahın şəninə layiq ibadəti .yalnız o bilir və yerinə yetirir. Belə bir şəxs yalnız həzrət Mehdi (ə) ola bilər

?Sual: ٢٠٢. Feyzdə ziddiyyətin olmaması qanunu imamın varlığını necə sübuta yetirir

Cavab: Peyğəmbərlik və imamət mənəvi bir feyzdir. Kəlimilərin baxışına əsasən həzrət Musanın ölümü ilə bəşəriyyətin ərş aləmi ilə rabitəsi qırıldı. Protestant məsihilər bu əqidədədirlər ki, həzrət Məsihin dara çəkilməsi ilə bəşəriyyətin ilahi dərgahla əlaqəsi üzüldü. İslamın sünni firqəsi də özünü bu feyzdən məhrum etmişdir. Onlar bu əqidədədir ki, İslam peyğəmbərinin (s) ölümü ilə bu feyz kəsilmişdir. Belə bir sual verilə bilər ki, nə üçün İslam ümməti peyğəmbərdən

sonra feyzdən məhrum olsun? Nə üçün Allah-təala imam vasitəsi ilə bəşəriyyəti bu ?feyzdən bəhrələndirməsin

İmamiyyə şiələr bu sualı cavablandırır. Onlar deyir: Bu feyz vəhy yolu ilə kəsilsə də, kamil insan vasitəsi ilə təmin olunur. Bu feyz bəşəriyyətə həzrət Mehdinin (ə) kamil .vücudu ilə çatdırılır

Parisin Sarbonna universitetinin professoru Hanri Korbən deyir: "Mənim əqidəmcə, şiəlik yeganə məzhəbdir ki, bəşəriyyətlə Allah arasındakı hidayət rabitəsinin davamlığını qəbul edir. Onlar ilahi vilayəti qiyamət gününədək sabit saxlamışlar..."(١)

?Sual: ٢٠٣. "Əql-bil-fel" dəlili imam Mehdinin (ə) vücudunu necə sübuta yetirir

Cavab: Farabi imam Mehdinin (ə) vücudunu sübuta yetirəcək bir dəlil göstərir. O deyir: "Fəzilət cəmiyyətinin hər üzvündə rəislik səlahiyyəti yoxdur. Bu cəmiyyətin rəisi həm xarakter baxımından bu məqama layiq olmalı, həm də uyğun məqsədlə yaşamalıdır. Belə bir insan yalnız kamil insan ola bilər. O həm rəisdir, həm müəllimdir, həm mürşiddir, həm də tərbiyəçi..."(٢) Farabi yetkin cəmiyyətin formalaşması üçün müəllimin varlığını zəruri sayır. Bu müəllim imam Mehdidir (ə). Şiələr inanır ki, .cəmiyyətin qurulması üçün kamil insan rəis olmalıdır

Bu böyük filosof imamı "əqli-bil-fel" kimi tanıyır. O elə bir insan nəzərdə tutur ki, tam əqli, təbii, kəsbi imkanlara malikdir, nəhayət, kamala çatmışdır, bir növ özü fəal ağıldır. Farabi belə bir şəxsi cəmiyyətə rəhbərliyə layiq bilir. Onun nəzərincə, belə rəis .cəmiyyət üçün ürək kimidir

?Sual: ٢٠٤. Ehtimalları hesablamaq yolu ilə imamın varlığını sübuta yetirmək olarmı

Cavab: Mərhum Şəhid Sədr bu barədə buyurur: "Məhdəviyyət İslam ümmətinin əsrlər boyu etiqad etdiyi bir həqiqətdir. Xüsusilə həzrət Mehdinin (ə) səfir və naiblərinin ٧٠ illik fəaliyyəti dövründə xalq bu həqiqətlə tanış edilmişdir. Bu müddət ərzində kimsə uyğun inancın ziddinə çıxmamışdır. Necə ola bilər ki, bir yalan nəinki yetmiş il, əsrlər boyu yaşasın və bir-biri ilə heç bir əlaqəsi olmayan dörd nümayəndə yekdil fikirdə olsun. Elə qədimdən yalanın ömrünün

qısalığı haqqında məsəllər çəkilib. Ehtimalların hesabı baxımından, hər hansı yalanın bir bu qədər davam edib bütün ümmət tərəfindən qəbul olunması mümkünsüzdür.”(۱)

?Sual: ۲۰۵. Əqli dəlillər müəyyən bir imamın mövcudluğunu sübut edirmi

Cavab: ۱. Əqli dəlillər kamil bir insanın mövcudluğunun zəruriliyini təsdiqləyir. Bu dəlillərin həmin şəxsin məhz imam Mehdi (ə) olması ilə əlaqəsi yoxdur. Amma uyğun dəlillər imamiyyə şiələrinin məsum bir imamın mövcudluğuna etiqadını təsdiqləyir. .Beləcə, uyğun dəlillər yalnız şiələrin baxışına uyğundur

Ustad Həsənzadə Amuli deyir: “Bu məqamda iki mövzuda danışmaq lazımdır: Külli və .۲ şəxsi mövzularda. Külli mövzu dedikdə daimi mövcud olan höccətin varlığını sübut edən dəlillər nəzərdə tutulur. Şəxsi mövzu dedikdə isə qaimin konkret kimliyi ilə bağlı dəlillərdən danışılır. Fərdin kamilliyini tanımaq üçün isə mütəvatir hədislərə və vəhyə müraciət etmək lazımdır.”(۲)

İslam irfanı məqsədə çatmaq üçün şeyx və ustadın varlığını şərt sayır. Bu şərt də iki .۳ qisimdir: “Ümumi ustad və xüsusi ustad. Ümumi ustad odur ki, sırf hidayət məsuliyyəti .daşımasın və ona məlumat almaq üçün müraciət olunsun

Xüsusi ustad isə sırf hidayət məsuliyyəti daşıyan şəxsdir və həqiqət yolunu gedən kəs heç bir halda bu ustaddan kənar düşməməlidir.(۳)

Bu məsələlər sünnə əhli arifləri tərəfindən də qəbul olunur. Çünki onlar da iki ustadın mövcudluğunu şərt sayır. Onlardan biri mürşid, digəri ilahi feyz daşıyıcısı olan ustaddır. Əgər bu ustad dünyada olmasa, dünya dağılar. Bu səbəbdən də aləmin sabitliyi bu şəxsin varlığından asılıdır. Sünnə əhli arifləri dünyanın belə bir ümumi ustada ehtiyacını qəbul edirlər. Uyğun həqiqəti qəbul edənlər arasında Əbdül-Vəhhab Şərani, Mühyiddin .ibn Ərəbi, Cami Hənəfi, Əttar Nişapuri, Cəlaləddin Rumi diqqəti cəlb edir

Başqa sözlə, qeyd olunan dəlillər məsum imamın varlığının zərurətini göstərir. Ariflər bu şəxsi imkan dairəsinin qütbü adlandırırlar. İrfanda hər zamanın yalnız bir qütbü ola bilər. Bir neçə səh:۱۳۴

۱- [۳۴۶] “Bəhsun-həvləl-Məhdi (ə)”, s. ۱۰۹-۱۱۰.

۲- [۳۴۷] “Nəhcül-vilayə”, c. ۷, ۸.

۳- [۳۴۸] “Risaleye lubbul-ləbab”, s. ۱۳۳, ۱۳۴.

qütbün olması mümkünsüzdür. Bu qütb bütün səhv və nöqsanlardan pakdır.(١) Bunu da qeyd etməliyik ki, ayə və rəvayətlərdən də bu sayaq anlayışlar əldə olunur. Qütb anlayışı həmin anlayışlardandır. Əmirəlmöminin (ə) Şiqşiqiyyə xütbəsində özünü qütb adlandırır: "And olsun Allaha! Əbu-Qəhafənin oğlu Əbu-Bəkr mənim xilafətdəki yerimin dəyirman daşı oxunun (qütbünün) dəyirmandakı yeri kimi olduğunu bildiyi halda xilafət əbasını geyindi."(٢)

Sual: ٢٠۶. Şəriət və millətin keşiyində dayanmayan və ilahi hökmləri icra etməyən imamın nə faydası var?

Cavab: Bəzən deyirlər ki, pərdə arxasında qalmış, kimsəyə görünməyən, hökmləri icra etməyən, xalqı cihada çağırmayan imamın nə faydası ola bilər?

Sualı xülasə şəkildə belə cavablandıra bilərik:

١. İmamın qeybə çəkilməsində təsirli olduğumuz kimi, onun zühuruna da əməllərimizin təsiri var.

٢. Qeyb dövründə heç bir ilahi hökm gücdən düşmür, cihad təxirə salınmır. Bu iş imamın vəkaləti ilə fəqihlər tərəfindən icra olunur.

٣. İmam qeybdə olsa da, onun nəzarəti var və şəriətin keşiyindədir. Həqiqətə qarşı icma təşkil olunduqda imam müdaxilə edib həqiqəti bildirir.

۴. İmamın vücudu ilahi feyz vasitəsidir. İmam olmasa, dünya dağılar.

۵. İmam xalqın nəzərlərindən gizli olsa da, batini bir nüfuz gücü var. Ləyaqəti olan hər bir kəs batini yolla haqqa yönəldilir.

### Quran baxımından həzrət Mehdinin (ə) varlığı

Sual: ٢٠٧. "Qədr" surəsinin ayələri imam Mehdinin (ə) vücudunu təsdiqləyirmi?

Cavab: "Qədr" surələrində bildirilir ki, mələklər hər ilin qədr gecəsi yerə enirlər.

"Biz onu (Quranı) qədr gecəsində nazil etdik. Sən nə bilirsən ki, qədr gecəsi nədir?! Qədr gecəsi min aydan üstündür. Mələklər və ruh həmin gecə Rəbbinin izni ilə hər

(işdən ötrü nazil olar. Bu gecə sübh ağartısınadək salamatlıqdır.”(۳



---

۱- [۳۴۹] “Müqəddiməye-qeysəri”.

۲- [۳۵۰] “Nəhcül-bəlağə”.

۳- [۳۵۱] “Qədr”, ۱-۵.

Duxan" surəsində də bu məsələyə işarə olunur: "Ha, mim. And olsun bu aydın kitaba" ki, biz onu bərəkətli bir gecədə nazil etdik. Biz daim qorxudan olmuşuq. Həmin gecə (hər bir iş hikmət əsasında tənzim (tədbir) olar."(۱)

Ramazan ayı qiyamət gününədək təkrarlanar. Qədr gecəsi də qiyamətə qədər davam edəsidir. Deməк, mələklərin və ruhun gəlişi də hər qədr gecəsi təkrarlanır. Belə bir sual yaranır: "Hər qədr gecəsi yerə enən mələklər və ruh həzrət Peyğəmbərdən (s) sonra kimə nazil olur? Diqqətlə araşdırdıqda görürük ki, hər bir dövrdə kamil və məsum imam olmalıdır ki, mələklər və ruh ona nazil olsun. İmam Baqir (ə) buyurur: "Ey şiələr! "İnna ənzəlnahu" surəsinə sarılsanız, qalib gələcəksiniz. And olsun Allaha ki, bu surə, peyğəmbərdən sonra Allahın höccəti üçündür. Bu surə, həqiqətən, sizin dininizin təsdiqi, bizim elmimizin nəhayətidir. Ey şiələr! "Ha, mim, vəl kitabil-mubin" ayəsi (haqqında danışın. Çünki bu ayələr peyğəmbərdən sonrakı əmr sahiblərinə aiddir..."(۲)

Başqa bir məqamda İmam (ə) buyurur: "And olsun Allaha, həqiqətən, qədr gecəsini (təsdiq edən şəxs bizə aid elmdən əldə edər..."(۳)

Həzrət Əli (ə) ibn Abbasa buyurur: "Həqiqətən, hər ilin qədr gecəsi var. Həmin gecə bir ilin işləri nazil olar. (Bir ildə baş verəcək işlər müəyyənləşər.) Onun üçün peyğəmbərdən sonra vəlilər var." İbn Abbas deyir: Ərz etdim ki, onlar kimlərdir? (Həzrət buyurdu: "Mən və məndən olan on bir övladım hamısı imam və mühəddisdir."(۴)

Həzrət Peyğəmbər (s) səhabələrinə buyurmuşdur: "Qədr gecəsinə iman gətirin. Çünki (o, Əli ibn Əbi-Talib və onun on bir övladı üçündür."(۵)

?Sual: ۲۰۸. "İmam" ("İsra" surəsinin ۷۱-ci) ayəsi imamın mövcudluğunu necə təsdiqləyir

Cavab: Allah-təala "İsra" surəsində buyurur: "Bir gün ki, hər bir güruhu imamı vasitəsi ilə çağırarıq. Əməl naməsi sağ əlinə verilənlər onu (şadlıqla) oxuyar. Xurma dənəsinin ".lifi qədər onlara sitəm qılınmaz



---

.Duxan", ۱-۴" [۳۵۲] -۱

.Kafi", c. ۱, s. ۲۴۹" -۲

.Həmin mənbə, s. ۲۵۲, ۲۵۳ [۳۵۴] -۳

.Həmin mənbə, c. ۱, s. ۲۴۷, ۲۴۸ [۳۵۵] -۴

.Kəmalud-din",c.۱, s.۲۸۰, ۲۸۱" [۳۵۶] -۵

Ayədən məlum olur ki, qiyamət günü hər bir kəsdən imam haqqında soruşular. Əgər etiraf etsə, nicat tapar və əməl naməsi sağ əlinə verilər. Deməк, hər bir dövrün imamı olmalıdır. Elə bir imam ki, onu tanımadan kimsə nicat tapmaz. Həzrət Peyğəmbər (s) buyurur: “İmamını tanımamış ölən kəs cahiliyyət dövründə ölmüş kimidir.”(١)

.Hər bir dövrdə imam olmalıdır ki, xalq öz istəyi ilə onu rəhbər seçib itaət edə bilsin

Lövhe-məhfuz” (müqəddəratın qeyd olunduğu lövhə) bir olduğundan və hər tayfanın“ öz lövhəsi olmadığından ayədəki “imamları” sözü hər qövmün kitabı kimi də təbir oluna bilməz. Çünki söhbət yaranışdan sonadək bütün insanlardan gedir. Hansı ki, göndərilmiş ilk şəriət kitabı Nuhun kitabıdır. Ondan öncə insanlara heç bir kitab nazil .olmamışdır

Süyuti uyğun ayə ilə bağlı həzrət Peyğəmbərdən (s) belə nəql edir. Hər bir qövm dövrünün imamı, Rəbbinin kitabı və peyğəmbərinin sünnəsi ilə məhşur olacaq.”(٢)

İbn Abbas ayədəki “imam” sözünün hidayət və ya zəlalət imamına (rəhbərinə) işarə olduğunu bildirir.(٣)

Kuleyni imam Baqirdən (ə) belə nəql edir: “İmam” ayəsi nazil olan vaxt müsəlmanlar ərz etdilər: “Ey Allahın rəsulu! Məgər sən bütün xalqın imamı deyilsən?” Həzrət buyurdu:“Mən bütün bəşəriyyət üçün göndərilmiş bir peyğəmbərəm. Amma tezliklə məndən sonra əhli-beytimdən imamlar gələr. Onlar xalq arasında qiyam qaldırar, amma təkzib olunarlar...”(۴) Bişr ibn Ğalib imam Sadiqdən (ə) uyğun ayə haqqında soruşduqda həzrət buyurur: “O, xalqı hidayətə çağıran və xalq tərəfindən qəbul olunan imamdır. O, xalqı zəlalətə çağıran rəhbər də ola bilər. Birincilər behiştdə, ikincilər cəhənnəmdədir.”(۵)

?Sual: ٢٠٩. “İnzar” (“Rəd”, ٧) ayəsi imamın varlığını necə sübut edir

Cavab: Allah-təala öz peyğəmbərinə xitabən buyurur: “Həqiqətən, sən bir qövm üçün ”.qorxudan, hidayət edən şəxssən

١- [٣٥٧] “Kafi”, c. ٢, s. ١٩.

٢- [٣٥٨] “Dürrül-mənsur”, c. ۴, s. ١٩۴.

٣- [٣٥٩] Həmin mənbə.

۴- [٣۶٠] “Kafi”, c. ١, s. ٢١٥.

٥- [٣۶١] “Bihar”, c. ٥١, s. ١۶١.

Ayədən məlum olur ki, hər bir dövrdə hər bir qövm üçün onu haqqa çağıran rəhbər var. Belə bir çağırış Allahın rübubiyyət (Rəblik) tələbidir. Bu da məlum olur ki, yer üzü heç vaxt həqiqi hidayətçidən, rəhbərdən məhrum olmamışdır. Ayədə yalnız peyğəmbərlər nəzərdə tutulmur. Zəməxşəri ayə ilə bağlı qeyd edir ki, yalnız peyğəmbərlər nəzərdə tutulsaydı, peyğəmbərlər olmadığı dövrdə yer üzü höccətsiz qalardı.

Təbəri uyğun ayənin təfsiri ilə bağlı İbn Abbasdan belə nəql edir: "Bu ayə nazil oldu. Həzrət Peyğəmbər (s) əlini sinəsinə qoyub buyurdu: "Mən qorxudanam və hər bir qövm üçün yol göstərənəm. Sonra əlini həzrət Əlinin (ə) çiyninə qoyub buyurdu: "Hidayət olanlar məndən sonra yalnız sənin vasitənlə olar."(١)

Hakim Nişapuri səhih sənədə əsasən həzrət Əlinin (ə) dilindən belə nəql edir: "Həzrət Peyğəmbər (s) qorxudandır, mən hadiyəm."(٢)

Kuleyni imam Baqirdən (ə) belə nəql edir: "Həzrət Peyğəmbər (s) qorxudandır. Hər bir dövrdə xalqı peyğəmbərin gətirdiyinə dəvət edən imam və hadi var..."(٣)

Uyğun ayə ilə bağlı imam Baqir (ə) buyurmuşdur: "Allahın rəsulu qorxudandır, Əli isə hadidir. Agah ol! And olsun Allaha ki, ayə bizdən kənar olmaz və qiyamət gününədək aramızdadır."(۴)

Sual: ٢١٠. Şəhadətdən danışan ayələr imamın mövcudluğunu necə sübut edir?

Cavab: Bir çox ayələrdə Allah-təala qiyamət günü ümmətin əməllərinə şahid olacaq insanlardan (şahidlərdən) danışır. Bu ayələrdən bəzilərini nəzərdən keçirək:

a) "Məhşər günü, hər bir tayfaya şahid gətirdiyimiz və səni (peyğəmbəri) şahid tutacağımız vaxt necə olacaq?!"(۵)

b) Hər bir ümmətdən şahid seçəcəyimiz gün kafirlərə danışmaq icazəsi verilməz və onların tövbələri qəbul olunmaz."(۶)

v) Hər ümmət üçün onların öz arasından şahid seçəciyimiz, səni (peyğəmbəri) ümmətə şahid gətirəcəyimiz gün..."(٧)

---

۱- [۳۶۲] "Cameul-bəyan", c. ۱۳, s. ۱۴۲.

۲- [۳۶۳] "Mustədrəke-hakim", c. ۳, s. ۱۲۹.

۳- [۳۶۴] "Kafi", c. ۱, s. ۱۹۱.

۴- [۳۶۵] Həmin mənbə, s. ۱۹۲.

۵- [۳۶۶] "Nisa", ۴۱.

۶- [۳۶۷] "Nəhl", ۸۴.

۷- [۳۶۸] "Nəhl", ۸۹.

Ayələrdən məlum olur ki, Allah-təala qiyamət günü hər bir ümmətin əməlinə şəhadət vermək üçün dünya həyatında məsum şəxslər müəyyənləşdirmişdir. Ümmətin əməllərinə şəhadət verəcək kəs öz şəhadətində yanılmamalıdır. O ümmətin .əməllərindən xəbərdar olmalıdır. Onlar bəşərin hidayətində Allahın höccətidirlər

Fəxr Razi "Qəsəs" surəsinin ٧٥-ci ayəsi haqqında deyir: "Onlar hər bir dövrdə xalqın əməllərinə şahid duranlardır. Peyğəmbərlər də bu qəbildəndir."(١) Müəllif "Nəhl" surəsinin ٨۴-cü ayəsi haqqında deyir: "Dünyada mövcud olan hər bir cəmiyyətin əməllərinə şahid durası şəxsə ehtiyac var." Peyğəmbər öz dövrünün şahidi idi. .Peyğəmbərdən sonra da hər bir dövrün şahidə ehtiyacı var

Aydın olur ki, heç bir dövr şahidsiz deyil. Bu şahid pak olmalıdır. Əks-təqdirdə onun özünün də şahidə ehtiyacı olar. Belə olsa, sonsuz şahidlər silsiləsi yaranar. Bu batil (fikirdir.(٢

Sual: ٢١١. Hər bir dövrdə xalqın əməllərinə şahid olan şəxsin hansı xüsusiyyətləri ?olmalıdır

Cavab: Quran ayələrinə əsasən, məsum höccətin bir sıra səciyyələri olmalıdır: Allahın höccəti insan növündən olmalıdır; hər dövrün bir höccəti ola bilər; höccətin elmi (əhatəsi olmalıdır; Allahın kitabından xəbərdar olmalıdır.(٣

Əbu-Səid Xidri deyir: Həzrət Peyğəmbərdən (s) bu ayə haqqında soruşdum. O (buyurdu: "O (höccət), qardaşım Əli ibn Əbi-Talibdir."(۴

?Sual: ٢١٢. "Nəzir" (qorxudan) ayəsi imamın vücudunu necə təsdiqləyir

(Cavab: Allah-təala buyurur: "Hər bir ümmətin keçmişdə qorxudanı olub."(۵

Ayədən məlum olur ki, hər bir dövrdə xalq arasında Allahın höccəti, hidayətçi .olmuşdur

İmam Baqir (ə) buyurur: "Ey şiələr! Allah-təala buyurur ki, hər bir ümmətin qorxudanı olmuşdur." Ərz olundu: "Ey Əba-Cəfər! Məgər bu ümmətin qorxudanı Məhəmməd deyilmi?" Həzrət səh:١٣٩

۱- [۳۶۹] "Təfsire-Fəxr-Razi", c. ۲۵, s. ۱۲, ۱۳.

۲- [۳۷۰] Həmin mənbə, c. ۲۰, s. ۹۸.

۳- [۳۷۱] Bax: "Rəd", ۴۳.

۴- [۳۷۲] "Əl-Mizan", c. ۱۱, s. ۳۸۸.

۵- [۳۷۳] "Fatir", ۲۴.

buyurdu:“Bəli, düz deyirsiniz. Peyğəmbər olduğu gündən həyatı boyu bütün yer üzü (üçün qorxudan olmayıbmı?!”(١

(Əli ibn İbrahimin təfsirində oxuyuruq: “Hər bir zaman üçün imam olmuşdur.”(٢

?Sual:٢١٣. “Hidayət” ayəsi imamın mövcudluğunu necə təsdiq edir

Cavab: Allah-təala buyurur: “Xəlq etdiyimiz kəslərdən bir firqəsi hidayət olub haqqa ”.dönər

Fəxr Razi ayənin təfsiri ilə bağlı deyir: “Ayədən məlum olur ki, heç bir zaman dönəmi (qiyam qaldırıb xalqı hidayət edən şəxssiz olmamışdır.”(٣

Mirzə Məhəmməd Məşhədi “Kənzul-dəqaiq” təfsirində deyir: “Ayə hər bir dövrdə məsum şəxsin varlığını təsdiqləyir. Ayədə bildirilir ki, hidayətçilər xalqın bir hissəsidir və (hər kəs məsum deyil.”(۴

Əbdullah ibn Sənan deyir: İmam Sadiqdən (ə) bu ayə haqqında soruşdum. Həzrət (buyurdu: “Ayədə imamlar nəzərdə tutulmuşdur.”(۵

?Sual: ٢١۴. “Sadiqin” təbiri imamın mövcudluğunu necə təsdiq edir

(Cavab: Allah-təala buyurur: “Ey möminlər! Təqva yolunu tutub daim sadiqlərlə olun.”(۶

Ayədə “sadiqlər” dedikdə bütün möminlər yox, onların bir qrupu nəzərdə tutulmuşdur. ?Bəs bu firqənin hansı xüsusiyyətləri olmalıdır

Ayənin özündən məlum olur ki, sadiqlər xalqı xoşbəxtlik yoluna hidayət edənlərdir. Vəhy gətirənlər, peyğəmbərin xəlifələri sadiqlər zümrəsindəndir. Allah bu zümrədən çirkinliyi uzaqlaşdırmışdır. Onlar hər bir nöqsandan pakdır. Onların birincisi Əmirəl-.(möminin Əli ibn Əbi-Talib (ə), sonuncusu həzrət Mehdidir (ə

Fəxr Razi yuxarıdakı ayədən istifadə edərək deyir: “Hər bir dövrdə məsum sadiqlər (olmalıdır...”(٧

۱- [۳۷۴] “Kafi”, c. ۱, s. ۲۴۹.

۲- [۳۷۵] “Təfsire Əli ibn İbrahim Qummi.

۳- [۳۷۶] “Təfsire-Fəxr-Razi”, c.۱۵, s. ۷۲.

۴- [۳۷۷] “Təfsire-Kənzul-dəqaiq”, c. ۳, s. ۶۳۷.

۵- [۳۷۸] “Kafi”, c. ۱, s. ۴۱۴.

۶- [۳۷۹] “Tövbə”, ۱۱۹.

۷- [۳۸۰] “Təfsire-Fəxr-Razi”, c.۱۶, s. ۲۲۰.

Kuleyni Bürəyd ibn Müaviyədən belə nəql edir: "İmam Baqirdən (ə) bu ayə haqqında (soruşdum. Həzrət buyurdu:"Nəzərdə tutulan bizik."(١

(Uyğun ayə ilə bağlı imam Sadiq (ə) buyurur: "Sadiqlər həmin imamlardır..."(٢

Hakim Həsəkani Hənəfi Əbdüllah ibn Ömərə istinadən bildirir ki, ayədə həzrət (Məhəmməd və onun Əhli-beyti (ə) nəzərdə tutulmuşdur.(٣

?Sual: ٢١٥. "Ulil-Əmr" ayəsi imamın mövcudluğunu necə təsdiqləyir

Cavab: Allah-təala buyurur: "Allaha, rəsula, özünüzdən olan əmr sahiblərinə itaət (edin."(٤

.Ulil-əmr" "əmr sahibləri" deməkdir"

Yuxarıdakı ayədən aydın olur ki, hər bir dövrdə məsum imam olmalıdır. İnsanlar Allaha .itaət etdikləri kimi bu imama itaət etməlidir

Ulul-əmr" dedikdə xalqın itaət etməli olduğu məsum əmr sahibləri nəzərdə tutulur." Ayədə qeyd-şərtsiz itaət qeyd olunduğundan bu təbirin məsum imamlara aid olduğu aydınlaşır. Əgər əmr sahibi məsum olmazsa, onun nöqsanları olar və belə bir şəxsə mütləq itaət əmr edilməz. Deməkk, "ulil-əmr" bütün dövrlərdə mövcudluğu labüd olan .məsumlardır. Hazırkı dövrdə həzrət Mehdidən (ə) savay belə bir şəxs yoxdur

.Bu həqiqəti rəvayətlər də təsdiqləyir

Səqələyn" adı ilə tanınmış hədis misal göstərilə bilər. Bu hədisdə həzrət Peyğəmbər" .(s) məsum Əhli-beytə (ə) itaəti göstəriş verir

Rəd" surəsinin ٧-ci ayəsi və "١٢ xəlifə" hədisi də yuxarıdakı ayədən uyğun nəticəni" çıxarmağa əsas verir. Sünnə əhlindən olan bəzi alimlər də yuxarıdakı ayənin əhli-beyti nəzərdə tutduğunu qəbul edir. İbn Həyyan Əndəlosi, Nişapuri, Məhəmməd Saleh Kəşfi .Termizi, Qunduzi Hənəfi, Həməvini Şafei, Hakim Həsəkani bu qəbil alimlərdəndir

Hakim Həsəkani Mücahidə istinadən ayənin təfsirində bildirir ki, ayədə Əmirəl-möminin nəzərdə tutulmuşdur. Həmin vaxt həzrət Peyğəmbər (s) Mədinədə Əlini

.özünə canişin təyin etmişdi



---

۱- [۳۸۱] "Kafi", c. ۱, s. ۲۰۸.

۲- [۳۸۲] Həmin mənbə.

۳- [۳۸۳] "Təzkirətul-xəvvas", s. ۱۶.

۴- [۳۸۴] "Nisa", ۵۹.

**İmam Mehdi (ə) haqqında şiə rəvayətləri**

?Sual: ۲۱۶. Şiə rəvayətləri imam Mehdinin (ə) varlığını necə sübuta yetirir

Cavab: həzrət Mehdinin (ə) varlığını, o cümlədən mövludunu müxtəlif yollarla sübuta yetirmək olar. Bu yollardan biri mütəvatir (yetərli həddə çatmış) hədislərdir. Qısa bir :müqəddimə ilə həmin yolu aydınlaşdıraq

ci müqəddimə: Ərəstun məntiqinə əsasən mütəvatir xəbər dedikdə yanlışlığı-۱ mümkünsüz olan çoxsaylı cəmiyyətin xəbəri nəzərdə tutulur. Tərifdən aydın olur ki, :mütəvatir xəbərin iki əsası var

Çoxsaylı cəmiyyətin xəbəri; cəmiyyət elə bir sayda olmalıdır ki, onların yalan danışmaq üçün bir-biri ilə razılaşması mümkünsüz olsun. İmam Mehdinin (ə) mövcudluğunu təsdiqləyən hədislərin birinci əsası hiss və vicdan prinsipləri üzərində qurulmuşdur. Nəql edən tərəfin eşitdiyi və gözü ilə gördüyü çoxsaylı xəbərlər həzrət Mehdinin (ə) .vücudunu təsdiqləyir

İkinci əsasın "bədahət" (aşkar) olduğu bildirilir. Ərəstun məntiqinə əsasən mütəvatir .xəbər altı "bədihi" (aşkar) mühakimədən biridir

Mərhum şəhid Sədr bu əqidədədir ki, yəqinliyi yaradan Ərəstunun dediyi kimi mütəvatirliyin bədahət olması yox, ehtimalların hesabıdır. Nəql olunan hər bir xəbər məsələnin həqiqət olması ehtimalını artırır. Nəhayət, bu xəbərlər elə bir həddə çatır ki, .insanda yəqinlik yaranır

İkinci müqəddimə: Mütəvatir xəbərdə hər bir xəbər verənin adil olması zəruri deyil. .Sadəcə, sübut olunmalıdır ki, həmin xəbərlər yalan deyil

:cü müqəddimə: Təvatir xəbər üç qisimdir-۳

Söz təvatiri: Bu təvatirdə müştərək mehvər bütün xəbərlərdə eyni ifadələrin . ۱ .işlədilməsidir

.Məna təvatiri: Burada müştərək mehvər xəbərlərdəki məna və məhdudiyyətdir .۲

İcmali təvatir: Burada müştərək mehvər hər hansı qəziyyədir. Məsələn, müxtəlif .۳ xəbərlərdə təkrarlandığından həzrət Əlinin (ə) şücaətinə əmin olduğumuz kimi, eyni yolla həzrət Mehdinin (ə) mövcudluğuna və mövluduna da əmin ola bilərik. Bu mövzuda rəvayətləri sənəd baxımından araşdırmağa ehtiyac yoxdur. Çünki mövzu ilə bağlı müxtəlif xəbərlərdən yəqinlik hasil olur. İmam səh:۱۴۲

.Mehdinin (ə) varlığı və mövludu hamı tərəfindən qəbul olunan bir həqiqətdir

?Sual: ٢١٧. Hansı hədislər imam Mehdinin (ə) varlığını təsdiqləyir

Cavab: Şiə hədisləri arasında imam Mehdinin (ə) mövludunu və vücudunu təsdiqləyən bir qurup hədislər var. Bunların böyük əksəriyyəti səhih sənədə əsaslanır. Qısa şəkildə :bu hədislərin əsas mövzularını nəzərdən keçirək

Yalnız qaim imam vasitəsi ilə xalqa höccət tamamlanır; imamlar yer üzünün sütunlarıdır; hər bir dövrün öz hidayətçisi var; imamlar Allah göstərişlərinin valisidir; imam xalq üçün həyat qaynağıdır. Qeyb hədisləri, onlarla rəvayət bu həqiqəti təsdiqləyir. Onların əksəriyyəti səhih sənədə malikdir. Bu hədisləri Kuleyni və başqaları .öz hədis kitablarında nəql etmişdir

İbn-Fars deyir: “Bir şeyin gözlərdən qeybdə olmasını təsdiqləyən əsil maddə (qeyb) ”.səhihdir

Qəyyumi deyir: “Qeyb maddəsi bir şeyin uzaqlaşması mənasındadır...”); həzrət Mehdi (ə) üçün iki qeybin olmasını təsdiqləyən hədislər; qeybin uzun müddət çəkəcəyini bildirən hədislər; qeybin səbəblərini göstərən hədislər; qeybin faydalarını bəyan edən hədislər; imamın ömrünün uzunluğunu bildirən hədislər; həzrətin daim cavan yaşda .olduğunu bildirən hədislər; qeyb əsrində həzrətə imanın fəzilətini bəyan edən hədislər

**(Firqələrin nəql etdiyi rəvayətlərdə imam Mehdi (ə**

?Sual: ٢١٨. “Səqəleyn” hədisi imamın varlığını necə sübut edir

Cavab: Həzrət Peyğəmbər (s) buyurur: “Həqiqətən, sizin aranızda iki canişin qoyuram: Allahın kitabı, göylə yer arasında uzanmış bir ip; itrətim, əhli-beytim. Həqiqətən bu iki (şey hovuz (behişt hovuzu) kənarında mənə yetişənədək bir-birindən ayrılmaz.”(١

Bu hədisdə həzrət Peyğəmbər (s) buyurur ki, kitab və itrətim (əhli-beytim) qiyamət gününədək bir-birindən ayrılmaz. Uyğun buyuruğa əsasən, qeyd olunan iki əmanətdən biri olmadıqda ikincisi də aradan götürülməlidir. Quran əlimizdədirsə, əhli-.beytin hüzuru da zəruridir

İbn Hucr Məkki deyir: “Əhli-beytin (ə) tapşırıldığı hədislərdə belə bir nöqtəyə diqqət etmək lazımdır ki, qiyamət gününədək yer üzü



---

.Müsnəde-Əhməd”, c. ۵, s. ۱۸۱“ [۳۸۵] -۱

Əhli-beytsiz ola bilməz. Əhli-beyt (ə) yer əhli üçün əmin-amanlıq kimi tanıtdırılır. Rəvayətdə deyilir: "Hər bir qövm və güruh arasında mənim əhli-beytimdən olan ədalətli şəxs var."(1)

Hafis Səmhuri deyir: "Səqəleyn" hədisindən məlum olur ki, hər bir dövrdə əhli-beytdən bir şəxs olmalıdır. Qiyamət gününədək belə bir şəxsə üz tutmaq lazımdır. Çünki Əhli-beyt yer əhli üçün aman sayılmışdır. Onlar yer üzündən getsə, yer məhv olar."(2)

Eyni məna Süyutinin "Cameus-səğir" kitabında Əllamə Minavidən nəql olunur.(3) Şiə və sünnilərin yekdil olaraq mütəvatir hədis kimi qəbul etdiyi "Səqəleyn" hədisi təsdiqləyir ki, hər bir dövrdə peyğəmbər Əhli-beytindən məsum bir imam olmalıdır. Bu məsum şəxslər mütləq hidayətə çatmış və zəlalətdən uzaq dayanmışlar. Bu səbəbdən də başqalarını hidayət edə bilir, azğınlıqdan çəkindirirlər. Dövrümüzdə bu şəxs yalnız Həzrət Mehdi (ə) ola bilər.

Sual: ٢١٩. İmamı tanımağın (mərifətin) zəruriliyini bildirən hədislər imamın mövcudluğunu necə sübuta yetirir?

Cavab: Şiə və sünni rəvayətlərinə əsasən, həzrət Peyğəmbər (s) buyurmuşdur: "Hər kəs öz dövrünün imamını tanımadan (mərifətsiz) ölsə, cahiliyyət dövründə dünyadan getmiş kimidir."(4)

Rəvayəti azca araşdırdıqdan sonra imamın həqiqi siması haqqında təsəvvür yaranır. İnsanın, dünyadan cahil getməsinə səbəb olan mərifətsizlik hansı mərifətsizlikdir? Hansı imamı tanımamaq insanı bədbəxtliyə aparır? İmamı tanımamaqla cahiliyyət ölümü arasında hansı asılılıq var?

Yoxsa söhbət dövrün zalım rəhbərlərindən gedir? Əlbəttə ki, belə deyil. Nəzərdə hər bir dövrün məsum imamı nəzərdə tutulmuşdur. Həqiqi imamı tanımadan ölən insan cahiliyyət dövründə ölmüş kimidir.

Sual: ٢٢٠. "Əman" hədisi imamın mövcudluğunu necə sübut edir?

Cavab: Müxtəlif firqələrdən nəql olunmuş rəvayətlərə əsasən peyğəmbər Əhli-beyti (ə) yer əhli üçün amandır. Əgər Əhli-beytim (ə) həlak olsa, yer əhli Allahın vəd etdiyi

(aqibətə düçar olar”.(۵



---

۱- [۳۸۶] “Səvaiqul-Muhriqə”, s. ۹۰.

۲- [۳۸۷] “Cəvahirul-əqdeyn”.

۳- [۳۸۸] “Feyzul-qədir”, c. ۳, s. ۱۵.

۴- [۳۸۹] “Şərhul-Məqasid”, c. ۵, s. ۲۳۹.

۵- [۳۹۰] “Səvaiqul-muhriqə”, s. ۱۵۰.

Səmhudi bu hədisi nəql etdikdən sonra deyir: “Ümmət üçün aman olan Əhli-beyt (ə) dedikdə xalqı hidayət edən alimlər nəzərdə tutula bilər. Necə ki, xalq ulduzlar vasitəsi ilə hidayət olur.”(١)

Bu hədis aydın şəkildə göstərir ki, hər bir dövrdə Əhli-beytdən (ə) məsum bir rəhbər olmalıdır. Hazırkı dövrdə həmin şəxs Mehdidir. İmam olmasa, bütün yer üzü məhv olar.

Sual: ٢٢١. “Səfinə” hədisi imamın mövcudluğunu necə təsdiq edir?

Cavab: Firqələr tərəfindən nəql olunmuş rəvayətlərə əsasən, həzrət Peyğəmbər (s) öz Əhli-beytini (ə) Nuhun gəmisinə (“Səfinə”) bənzətmişdir.

İbn Hucr Məkki həzrət Peyğəmbərin (s) dilindən belə nəql edir: “Həqiqətən, mənim Əhli-beytim (ə) Nuhun gəmisi kimidir. Hər kəs bu gəmiyə süvar olsa, nicat tapar.”(٢)

Bu hədis müxtəlif yollarla, müxtəlif şəkillərdə nəql olunmuşdur. Onun məzmunu haqqında dərindən düşündükdə aydın olur ki, qiyamət gününədək hər bir dövrdə məsum imam olmalıdır. Yalnız imamın varlığı ilə qurtuluş gəmisinə süvar olub fitnə dəryasından keçmək və behiştə yetişmək olar.

Sual: ٢٢٢. Qüreyşi imam haqqındakı hədis imamın varlığını necə sübuta yetirir?

Cavab: Buxari, Müslim və başqaları həzrət Peyğəmbərin (s) dilindən belə nəql edirlər: “Yer üzündə iki nəfər qalsa belə xilafət əmri Qüreyş üçün sabitdir.”(٣)

Bu hədisdə xarici bir olaydan xəbər verilir. Bu olayın gerçəkləşməsi vacibdir. Həzrət peyğəmbərin xilafətinin hər bir dövrdə layiqli bir qüreyşə tapşırmaq müsəlmanların vəzifəsidir. Fəxr Razi və başqalarının nəzərincə “ulil-əmr” məsumlara işarədir.(۴) Hər bir dövrdə qüreyşdən məsum bir imam mövcuddur. Nə qədər ki yer üzündə həyat davam edir, bu şəxs həzrət Mehdidir (ə).

Başqa sözlə, rəvayət və ayədəki “ulil-əmr” sözü zahir və batini rəhbərliyə işarədir. Tam mənada peyğəmbərin sifət və xüsusiyyətlərinə malik olan şəxs onun canişini olaraq hər vaxt

۱- [۳۹۱] “Rəşfətus-Sadi”, s. ۷۸.

۲- [۳۹۲] “Səvaiqul-Muhriqə”, s. ۲۳۴.

۳- [۳۹۳] “Səhihe-Buxari”, c. ۹, s. ۲۹.

۴- [۳۹۴] “Təfsire-Fəxr-Razi”, c.۱۰, s. ۱۴۴; “Təfsire-Əl-Mizan”, c. ۴, s. ۳۸۷-۴۰۱ (“Nisa”, ۵۹).

mövcuddur. Sadəcə, ona vəhy nazil olmur. Hazırki dövrdə bu canişin həzrət Mehdidir .((ə

İbn Hucr Əsqəlani: "Həzrət İsanın dünyanın sonunda bu ümmətdən olan şəxsin arxasında namaz qılması deyilənlərin möhkəm dəlilidir: Yer üzü heç vaxt "Qaim billah – (höccətsiz olmayacaq."(١)

**ci xəlifə" hədislərində imam Mehdi–١٢"**

?Sual: ٢٢٣. "١٢ xəlifə" hədisləri hansı hədislərdir

Cavab: Şiə və sünnilər tərəfindən mütəvatir hədis kimi qəbul olunmuş digər hədislər ١٢ xəlifə haqqındadır. Bu rəvayətlərdə bildirilir ki, həzrət Peyğəmbər (s) özündən sonra .üçün ١٢ imam, canişin təyin etmişdir

Cabir ibn Səmərə nəql edir ki, həzrət Peyğəmbər (s) buyurmuşdur: "Nə qədər ki ١٢ xəlifə hakimdir, İslam daim əzizdir." Cabir deyir: Həzrətin buyurduğu sonrakı sözü anlamadım. Bu barədə atamdan soruşdum. O dedi: "Buyurdu ki, onların hamısı (qüreyşdəndir."(٢)

Bu hədisi müxtəlif şəkillərdə ٣۶ səhabə nəql etmişdir. Bir çox sünni alimləri də öz .kitablarında bu hədisə yer vermişdir

?Sual: ٢٢۴. ١٢ xəlifə dedikdə kim nəzərdə tutulur

Cavab: Bu hədislər vida həccində ("həccətul-vida") peyğəmbər tərəfindən .buyurulmuşdur. Həmin həccdə "Səqəleyn" və "Ğədir" hədisləri də bəyan olunmuşdur

Quran ayələri kimi rəvayətlər də bir-birini təsdiq edir. Bu üç qrup rəvayətdən belə bir nəticə alınır ki, ١٢ imam həzrət Peyğəmbərin (s) əhli-beytindəndir. Onların birincisi Əli ibn Əbi-Talibdir. İslam peyğəmbəri "Səqəleyn" hədisində buyurur: "Mən sizin aranızda iki dəyərli şey qoyuram. Bu iki şeyə sarılmaqla heç vaxt yolunuzu azmayacaqsınız: Allahın kitabı və itrətim." Ğədire-Xum günündə İslam peyğəmbəri Əli ibn Əbi-Talibin .(ə) xilafət və imamət məqamını açıqladı

xəlifə rəvayətlərində həmin xəlifələrin bir sıra sifətləri açıqlanmışdır. Bu sifətlər ١٢

yalnız məsum imamda ola bilər: İslam onların varlığı ilə əzizdir; din onların varlığı ilə bərpadır; Onları xar etmək istəyənlər boş yerə çalışır və onlara heç bir zərər vura .bilməz



---

.Fəthul-Bari”, c. ۶, s. ۳۸۵“ [۳۹۵] -۱

.Səhihe-Müslim”, c. ۶, s. ۳“ [۳۹۶] -۲

Həməvinin və Qunduzunin nəql etdiyi bəzi rəvayətlərdə həzrət Peyğəmbər (s) öz .nəslindən olan ١٢ imamın adını birbəbir zikr edir

Sual: ٢٢٥. ١٢ xəlifə hədisləri məsum imamların hakimiyyətini təsdiq edirsə, nə üçün ?əslində onlar hakimiyyətdə olmamışlar

Cavab: Bəziləri deyirlər ki, ١٢ xəlifə hədisləri peyğəmbərdən sonra imamların hakimiyyətini təsdiqlədiyi halda həzrət Əli (ə) və imam Həsəndən (ə) savay şiə .imamları hakimiyyətə çatmamışlar

Əslində, bu hədislər zahiri hakimiyyəti yox, Allahın təyinatını bəyan edir. Allahın təyin .etdiyi imamı xilafətə çatdırmaq xalqın işidir

Seyyid Məhəmməd Təqi Həkim deyir: Nəzərdə tutulan budur ki, hakimiyyət məsum imamların haqqıdır. İlahi rəhbər Allah tərəfindən hakimiyyətə təyin olunur. İmamların (zahiri hakimiyyətə çatmaması uyğun hədislərin bəyanına zidd deyil...(١

?Sual: ٢٢٦. ١٢ xəlifə hədisləri hansı məkanda bəyan olunmuşdur

Cavab: Bu barədə müxtəlif məlumatlar verilir. Bəziləri bu hədislərin Ərəfə günü Ərəfatda bəyan olunduğunu bildirir.(٢) Bir başqaları uyğun hədisin məsciddə bəyan edildiyini iddia edir. Bəziləri isə hədisin harada bəyan olunmasına toxunmur. Görənsən ?Peyğəmbər (s) uyğun hədisi bir və ya bir neçə yerdə bəyan edibmi

Çox ehtimal ki, həzrət Peyğəmbər (s) bu hədisi müxtəlif yerlərdə bəyan etmişdir. Hədisin həccətul-vidada bəyan olunması isə aşkardır. Həmin yerdə həzrət Peyğəmbər (s) öz vəfatının yaxınlaşması barədə məlumat verdi. O məsum canişinləri haqqında .vəsiyyət etdi

?Sual: ٢٢٧. Nə üçün ١٢ xəlifə hədislərində imamların adı haqqında soruşulmur

Cavab: Hətta söhbətin gedişində peyğəmbərə sual ünvanlamaq müsəlmanlar arasında bir qayda idi. Rəvayətdə peyğəmbərdən sonrakı xəlifələrlə bağlı mühüm məlumat verilir. Xilafət məsələsi İslam cəmiyyətinin çox mühüm məsələlərindəndir. ?Maraqlıdır ki, nə üçün ١٢-xəlifənin adı soruşulmamışdır

Əgər səhabələr istənilən bir məsələnin xırdalığı ilə maraqlanırdılarsa, nə üçün ?canişinlərin adı ilə maraqlanmamışlar

Ehtimal olunur ki, imamların adının aşkar şəkildə bəyan olunmasına əhli-beyt (ə) ,"düşmənləri mane olmuşlar. "Ğədire-Xum



---

.Əl-üsusul-ammətu-lil fiqhil-müqarin", s. ١٧٣" [٣٩٧] -١

.Müsnəde-Əhməd", c. ۵, s. ٩٣" [٣٩٨] -٢

Səqəleyn” hədislərindən imamların sayı, onların Əhli-beytdən (ə) olması və birinci“ imamın Əli ibn Əbi-Talib olması məlum olur. Həməvinin və Qunduzinin nəql etdiyi (rəvayətlərdə Peyğəmbər (s) öz canişinlərinin adlarını da zikr edir.(١)

Sual: ٢٢٨. Sünnə əhlindən nəql olunmuş bəzi rəvayətlərdə Əbu-Bəkr və Ömər də ١٢ ?xəlifədən biri kimi tanıtdırılır. Bunu necə izah etmək olar

Cavab: Təbərani Əbdüllah ibn Əmrdən belə nəql edir: Peyğəmbərdən belə eşitdim: “Məndən sonra ١٢ xəlifə olacaq: Əbu-Bəkr Siddiq – o məndən sonra çox yubanmaz, (onun ev dəyirmanının sahibi Ömər ibn Xəttab...”(٢)

:Uyğun hədisə münasibətdə bir neçə iradımız var

Bu hədis sənəd baxımından mötəbər deyil. Bu hədisi nəql edən Əbdüllah ibn Salehin .١ hədisləri Zəhəbi tərəfindən inkar olunur. Əhməd ibn Hənbəl deyir: O, ömrünün axırlarında əqidəsindən döndü.” Saleh ibn Məhəmməd deyir: “Mənim zənnimcə, o ”.hədis nəqlində yalançıdır

Bu hədisdə ٣ xəlifə, xüsusi ilə Osman xüsusi bir tərzdə tərif olunur. Həqiqət isə .٢ .tamam başqadır

Digər rəvayətlərə müraciət etdikdə görürük ki, ١٢ xəlifə hədislərində peyğəmbər .٣ (Əhli-beyti nəzərdə tutulmuşdur.(٣)

?Sual: ٢٢٩. ١٢ xəlifə hədislərini şiələr mötəbər sayırmı

Cavab: Əhməd Katib deyir: “١٢ imamçı şiələrin nəql etdiyi hədislər əsassızdır və onları ”.təsdiqləyən dəlil yoxdur. Bu hədisləri nəql edənlər də mötəbər deyil

:Uyğun iddiaya cavab verək

Həzrət Peyğəmbərdən (s) sonra ١٢ imamın olacağını xəbər verən rəvayətlər təvatir .١ .həddindədir. Bildiyimiz kimi, mütəvatir hədis araşdırmasız qəbul olunur

١- [٣٩٩] “Fəraidus-Səmteyn”, c. ٢, s. ١٣٢; “Yənabiul-Məvəddət”, c. ٣, s. ٢٨١.

٢- [٤٠٠] “Əl-Məcməul-Kəbir”, c. ١, s. ٧.

٣- [٤٠١] “Fəraidus-Səmteyn”, c. ٢, s. ١٣٣.

Şiə səhabələri və hədisçiləri bu hədisləri yekdilliklə qəbul edirlər. Bu özü də uyğun .٢
.rəvayətlərin düzlüyünü təsdiq edən dəlildir

Şəhid Sədr buyurur: “Bu rəvayətlər imamlar tərəfindən çox ehtiyatla nəql olunsa da, onların düzlüyünü yalnız çoxluq yox, başqa əlamətlər də təsdiqləyir. İmam Cavad (ə), Hadi (ə) və Əsgərinin (ə) müasiri olmuş Buxari bu hədisi nəql etmişdir. Bu çox mühüm nöqtədir. Uyğun hədis gerçəkləşməmiş, ١٢ imam düşüncəsi formalaşmamış bu həqiqət (peyğəmbər tərəfindən təsbit olunmuşdur.”(١)

Uyğun mövzu ilə bağlı rəvayətləri araşdırdıqda səhih sənədə malik çoxsaylı . ٣ hədislərlə rastlaşırıq. Bu hədislər mütəvatir həddə olmasa belə, istifadə olunacaq səviyyədədir. Xüsusi ilə Kuleyni rəvayətlərə xüsusi bir üslubda yanaşmışdır. O yalnız məsumlar tərəfindən nəql olunması əminlik yaradan hədisləri seçmişdir. Kuleyni və digər qədim alimlər daxili və xarici dəlillərlə təsdiqlənmiş hədisləri səhih sayırdı. Əsas dəlillərdən biri də həmin hədisin imamların öz dövründə nəql olunmuş hədislər arasında olmasıdır. Digər bir dəlil hədisin böyük səhabələr tərəfindən təsdiqlənmiş .kitablarda nəql olunmasıdır

Xarici dəlillərdən biri həmin hədislərin imamlar tərəfindən təsdiqlənmiş kitablarda .nəqlidir. Məsələn, “Kitabi-səlim” imam Sadiq (ə) tərəfindən təsdiqlənmişdir

Düzgünlük dəlillərindən biri də araşdırılan hədisin qədim alimlər tərəfindən etibarlı sayılmasıdır. Şeyx Kuleyni yalnız hədisi nəql edənlərin düzlüyünə yox, yuxarıda qeyd .olunan meyara da müraciət etmişdir

Katib bəzi rəvayətləri İbn əl-Ğəzairinin mövqeyinə istinadən zəif saymışdır. Hansı ki, .۴
.onun kitabının düzlüyü sübuta yetməmişdir

?Sual: ٢٣٠. “١٢ xəlifə” hədisləri imamın mövcudluğunu necə sübuta yetirir

:Cavab: Bu hədislər vasitəsi ilə imamın mövcudluğunu sübut etmək olar

Əvvəla, əksər rəvayətlərdə işlədilmiş “bədi” sözü İslam peyğəmbərindən sonra ardıcıl .şəkildə ١٢ imamın canişinliyini bəyan edir

İkincisi, “Səhihi-Müslim” və digər mənbələrdəki hədislərə əsasən, dinin davamlılığı bu ۱۲ nəfərdən asılıdır. Bu səbəbdən də İslam



---

۱- [۴۰۲] “Üsule-Kafi”.

onların vücudu ilə əziz olur. Əgər din bərqərardırsa və əzizdirsə, ۱۲ imam silsiləsi də .mövcuddur. Onlardan biri qalıb din və şəriəti hifz edir

?Sual: ۲۳۱. Xilafətin ۳۰ il davam edəcəyini bildirən hədis ۱۲ xəlifə hədislərinə zidd deyilmi

Cavab: Əhməd ibn Hənbəl "Müsnəd" kitabında həzrət Peyğəmbərdən (s) belə bir (rəvayət nəql edir: "Xilafət ۳۰ il çəkəcək. Ondan sonra sultanlıq və padşahlıqdır."(۱)

Bəzi sünni alimləri bu hədisi ۱۲ xəlifə hədislərinə zidd sayırlar. Çünki ۱۲ xəlifənin xilafəti .۳۰ il çəkməmişdir

:Sualı cavablandıraq

Bu iki rəvayət arasında fərq var. ۱۲ xəlifə haqqında məlumat verən hədislərdə ۱۲ .۱ məsum imam haqqında danışılır. Nəzərdə tutulan hədisdə isə peyğəmbərdən sonrakı .xəlifələrdən söhbət açılır. Bu xəlifələr məsum olmaya da bilər

Qeyd olunan hədis mötəbər və məşhur deyil. İbn Teymiyyə bu hədisi zəif .۲ (saymışdır.(۲) Uyğun hədisi nəql edən Səid ibn Cəmhan rical elmində zəif sayılmışdır.(۳

?Sual: ۲۳۲. ۱۳ imam haqqında danışan hədislər necə izah oluna bilər

Cavab: Bəzi rəvayətlərdə həzrət Peyğəmbərdən (s) sonra ۱۳ xəlifənin olacağından :danışılır. Bu rəvayətləri araşdıraq

Həzrət Peyğəmbərdən (s) sonra imamların ۱۳ nəfər olacağını Hibtullah ibn Əhməd .۱ Müfid Əmridən savay heç bir şiə alimi təsdiqləməmişdir. Nəccaşi bu barədə deyir: "Bu şəxs Əbül-Hüseyn ibn Əbu-Şeybə Ələvi Zeydinin həmsöhbəti olmuş, onun üçün kitab tərtib etmişdir. O, imamların ۱۳ nəfər olacağını bildirir. Onun Zeyd ibn Əli ibn Hüseyni ۱۲ .imama əlavə etməsinin səbəbi Əbu-Şeybə Zeydiyə xoş gəlmək istəyi olmuşdur

Bəziləri rəvayətlərin mətnini düzgün anlamamışlar. Səlimin rəvayətində bildirilir ki, .۲ Peyğəmbər (s) Əliyə (ə) buyurdu: "Sən və övladlarından ۱۲-si imam olacaqsınız." Şübhəsiz ki, bu təbirdə həzrət

۱- [۴۰۳] "Müsnəde-Əhməd", c. ۵, s. ۲۲۰.

۲- [۴۰۴] "Minhacus-Sunnə", c. ۲, s. ۲۲۳.

۳- [۴۰۵] "Təhzibul-təhzib", c. ۴, s ۱۳.

Əli (ə) özü də ١٢ nəfərə daxildir. İmamların ١٢ nəfər olacağını xəbər verən hədislər .mütəvatirdirsə, başqa ehtimala yer yoxdur

Səlim ibn Qeysin kitabında peyğəmbərdən sonra ١٢ imamın gələcəyini ٢٠-dən çox .٣ .hədis xəbər verir

Kuleyni və Səlim ibn Qeys öz kitablarında bildirirlər ki, imamlar ١٢ nəfərdir. Yenə də .۴ .günah mütəvatir hədisi düzgün anlamayanların üzərinə düşür

.imamın gələcəyini xəbər verən bütün hədislərin sənədi, qaynağı zəifdir ١٣ .۵

**(Kiçik qeyb (Qeybəti suğra**

?Sual: ٢٣٣. Kiçik qeyb dövrü nə vaxtdan başlamışdır

:Cavab: Uyğun məsələ ilə bağlı iki baxış mövcuddur

Birinci baxışa əsasən, kiçik qeyb dövrü həzrət Mehdinin (ə) mövlud günündən başlamışdır. Çünki bu mövlud gizli şəkildə baş vermişdir. Amma bu baxış ziddiyyətlidir. Çünki qeyb imama aiddir, həzrət Mehdi (ə) dünyaya gələn zaman imam məqamına çatmamışdı. Bundan əlavə, bir çoxları imam Əsgərinin (ə) şəhadətindən öncə ۵ il .həzrəti müşahidə etmişdir

İkinci baxışa əsasən, imamın qeyb dövrü atası imam Əsgərinin (ə) şəhadət vaxtından başlayır. Daha dəqiq desək, həzrət atası üçün cənazə namazı qıldıqdan sonra, Əbül-(Ədyanın nəql etdiyi qəziyyəyə uyğun olaraq qeybə çəkilmişdir.(١)

?Sual: ٢٣۴. Böyük qeyb dövründən öncə kiçik qeyb dövrünün olması nə üçündür

Cavab: Kiçik qeyb həzrət Mehdinin (ə) imamətinin ilkin dövrünü əhatə edir. İmamın bir müddət xalqdan məxfi şəkildə yaşayıb öz səfirləri vasitəsi ilə onların işlərini idarə .etməsi Allahın təqdiridir

Kiçik qeyb dövrünün böyük qeyb dövründən öndə gəlməsinin də səbəbləri var. Şiələr imamət cərəyanı boyu adət etmişdilər ki, imamın xidmətində olub onun hüzurundan istifadə etsinlər. Onlar qeyb adlı bir məfhumla tanış deyildilər. İnsanları qeybə

alışdırmaq üçün öncə kiçik qeyb dövrü müəyyənləşdi. Beləcə, ilk əvvəllər məsələyə şübhə ilə yanaşanlar zaman ötdükcə həzrət Mehdinin (ə) varlığına əmin oldular. Çox .keçməmiş böyük qeyb dövrü başladı



---

.Kəmalud-din”, s. ۴۷۴-۴۷۶; “Biharul-Ənvar”, c. ۳۰, s. ۳۳۲“ [۴۰۶] -۱

?Sual: ۲۳۵. Kiçik qeyb dövrünün böyük qeyb dövründən hansı üstünlüyü var

Cavab: Bir xəbərə görə kiçik qeyb dövrü imam Əsgərinin (ə) şəhadəti zamanından başlamışdır və həzrət Mehdi (ə) həmin vaxtdan imamət məqamına təyin olunmuşdur. Həzrət xilafətə Qum əhli ilə qarşılaşma zamanı ilkin vəkilini təyin etməklə başlamışdır. :Kiçik qeyb dövrünün bir sıra imtiyazları var. Onlardan bəzilərini yada salaq

.Kiçik qeyb dövründə həzrət Mehdi (ə) imamət və xilafət məqamına çatdı .۱

Bu dövrdə imam tam məxfi həyat keçirməmiş, ümumi fayda baxımından öz xüsusi .۲ .yardımçıları ilə görüşmüşdür

Həmin dövrdə ۴ səfir olmuşdur. Bu dörd səfir həzrətin xüsusi göstərişlərini yerinə .۳ .yetirmiş, onunla xalq arasında rabitə yaratmışdır

?Sual: ۲۳۶. Allah-təala həzrət Mehdinin (ə) imaməti üçün zəmin yaratmışdırmı

Cavab: Bəli, imam Mehdinin (ə) mövludundan öncə baş vermiş hadisələri onun gəlişi üçün zəmin saymaq olar. İmam Cavad (ə) və imam Hadinin (ə) dünyaya gəlişi bu zəminlərdəndir. Çünki imam Cavad (ə) ۸ ya ۷, imam Hadi (ə) isə ۶ yaşında imamətə çatmışdı. Bu iki məsumun imamətinə etiqad həzrət Mehdinin (ə) imamətinə etiqad üçün zəmin yaradırdı və ۵ yaşlı məsumun imamət məqamına çatması ilə bağlı .şübhələri aradan qaldırırdı

?Sual: ۲۳۷. Digər imamlar həzrət Mehdinin (ə) qeybi üçün hansı şəraiti hazırlamışdı

Cavab: Qeyb mövzusu ümmət üçün yeni bir hadisə idi. Bu sayaq uzunmüddətli qeyblə heç bir ümmət rastlaşmamışdı. Bu səbəbdən də şiə cəmiyyətinin hansısa hazırlığa ehtiyacı vardı. Əhli-beyt (ə), hətta həzrət Peyğəmbər (s) ardıcıl şəkildə ۱۲-ci imamın qeybinə işarə etmişdir. Böyük qeyb dövründən öncə kiçik qeyb dövrünün gəlməsi də .cəmiyyəti böyük qeyb dövrünə hazırlayan zəmin idi

?Sual: ۲۳۸. Həzrət Peyğəmbər (s) həzrət Mehdinin (ə) qeybini xəbər vermişdirmi

Cavab: Bəli, bir çox rəvayətlərdə bu mövzuya işarə olunmuşdur. İbn-Abbas həzrət Peyğəmbərin (s) dilindən belə nəql edir: “Hüseyndən (ə), mənim məqsədim yolunda

qiyam qaldırıb vəsiyyətimi hifz edəcək imamlar qərar verilmişdir. Onların Hüseyndən

sonra ۹-cusu Əhli-beytimin (ə) qaimi, ümmətimin Mehdisidir (ə). İnsanlar arasında görünüş, hərəkət və danışıq baxımından mənə ən çox oxşayan da odur. O uzun qeyb və azdırıcı heyrətdən sonra zühur edəcək. O, Allahın əmrini elan edib, onun dinini (aşkarlayacaq..."(۱)

Həzrət Əli (ə) həzrət Peyğəmbərdən (s) belə rəvayət edir: "Bir vaxt onların imamı Allah istəyi ilə qeybə çəkiləcək. Onun üçün iki qeyb dövrü müəyyənləşmişdir. Qeybin biri o (birindən uzundur..."(۲)

Cabir ibn Əbdüllah Ənsari Peyğəmbərdən (s) soruşmuşdur: "Övladlarınızdan qaim olan üçün qeyb varmı?" Həzrət buyurmuşdur: "Bəli, and olsun Allaha!" Sonra "Ali-İmran" .surəsinin ۱۴۱-ci ayəsini oxumuşdur

?Sual: ۲۳۹. Həzrət Əli (ə) imam Mehdinin (ə) qeyb dövrünə işarə etmişdirmi

Cavab: Bəli, bir çox rəvayətlərdə belə bir xəbərlə rastlaşırıq. Məsələn, Şeyx Səduq Əmirəl-mömininin (ə) özünə istinadən nəql edir: "Bizdən olan qaim üçün qeyb dövrü var. Onun (qeybin) müddəti uzun olacaq. Şiəni otlaq gəzən, amma tapa bilməyən çaşqın qoyunlar kimi görürəm. Agah olun! Həmin vaxt hər kəs öz dinində sabitqədəm olsa, qeybin uzunluğu onun qəlbini bərkitməsə, o, qiyamət günü mənimlədir və mənim (mərtəbəmdədir."(۳)

?Sual: ۲۴۰. İmam Həsən (ə) imam Mehdinin (ə) qeybi haqqında xəbər vermişdirmi

Cavab: Şeyx Səduq nəql edir ki, imam Həsən (ə) Müaviyə ilə sülhdən və bəzilərinin ona qarşı etirazından sonra buyurdu: "Vay olsun sizə! Bilirsinizmi mən nə etdim? And olsun Allaha, mənim gördüyüm bu iş şiələr üçün günəşin tülu və qürubundan üstündür. Məgər bilmirsiniz ki, mən sizin imamınızam və mənə itaət etməyiniz vacibdir? Məgər mən peyğəmbərin buyurduğu kimi behişt əhli cavanlarının iki ağasından biri deyiləmmi? Bilmirsinizmi ki, Xızır gəmini deşdiyi, divarı uçurduğu vaxt həzrət Musa bu işlərin hikmətini bilmədiyindən qəzəbləndi? Əslində isə bu işlərin Allah yanında savabı vardı. Bilmirsinizmi ki, hər birimiz dövrümüzün zalım hakiminə beyət etmişik? Yalnız .arxasında İsanın namaz qılacağı qaim belə deyil

---

۱- [۴۰۷] "Kəmalud-din",s.۲۳۶; "Biharül-Ənvar", c. ۳۶, s. ۲۲۷.

۲- [۴۰۸] "Bihar", c. ۵۲, s. ۳۸۰.

۳- [۴۰۹] "Kəmalud-din",s.۳۰۳; Elamul-Vəri", s. ۴۲۶; "Bihar", c. ۵۱, s.۱۰۹.

Allah-təala onun dünyaya gəlişini gizlədəcək, qiyamınadək kimsəyə beyət etməsin deyə, onu qeybdə saxlayacaq. O, qardaşımın ٩-cu övladı, ən üstün qadınlardan birinin oğludur. Allah qeyb dövründə onun ömrünü uzadacaq. Öz qüdrəti ilə onu ٤٠ yaşından aşağı gənc surətində zahir edəcək. Qoy bilsinlər ki, Allah hər şeyə qadirdir."(١)

?Sual: ٢٤١. İmam Hüseyn (ə) övladı Mehdinin (ə) qeybi haqqında xəbər vermişdirmi

Cavab: Səduq imam Hüseynin (ə) dilindən belə nəql edir: "Övladlarımdan ٩-cusunda Yusifin və Musanın sünnəsi var. O, biz Əhli-beytin (ə) qaimidir. Allah onun qiyamını bir gecədə gerçəkləşdirəcək."(٢)

Başqa bir rəvayətdə imam Hüseyn (ə) buyurur: "Bu ümmətin qaimi mənim ٩-cu övladımdır. O, qeybə çəkilər..."(٣)

Başqa bir məqamda imam buyurur: "Onun üçün bir qövmün mürtəd olacağı, digər bir qövmün öz dinində sabit dayanacağı qeyb dövrü var..."(٤)

?Sual: ٢٤٢. İmam Səccad (ə) imam Mehdinin (ə) qeybi haqqında xəbər vermişdirmi

Cavab: Şeyx Səduq imam Zeynəl-Abidinin (ə) (imam Səccadın) belə buyurduğunu nəql edir: "Həmin vaxt Allah-təalanın vəlisinin, peyğəmbərin ١٢-ci vəsisinin qeybi başlayar. Ey Əba-Xalid! Həqiqətən, onun imamətinə iman gətirilən və intizarı çəkilən qeyb dövrü bütün dövrlərdən fəzilətlidir. Çünki, Allah-təala onlara elə bir ağıl və düşüncə verər ki, qeybi hüzur kimi dərk edərlər..."(٥)

?Sual: ٢٤٣. İmam Baqir (ə) imam Mehdinin (ə) qeybini xəbər vermişdirmi

Cavab: Şeyx Səduq nəql edir ki, imam Baqir (ə) buyurmuşdur: Xalq üçün elə bir dövr gələr ki, onların imamı qeybə çəkilər. Xoş o insanların halına ki, həmin vaxt əmrimizdə sabitqədəm qalarlar. Həqiqətən, onlar üçün nəzərdə tutulmuş ən kiçik savab budur ki, Allah-təala buyurar: "Ey mənim bəndələrim və kənizlərim! Mənim



---

١- [٤١٠] "Kəmalud-din",s.٣١٥; "Bihar", c. ٥١, s. ١٣٢".

.Kəmalud-din”, s.۳۱۶; “Bihar”, c. ۵۱, s. ۱۳۲“ [۴۱۱] -۲

.Həmin mənbə, s. ۳۱۷ [۴۱۲] -۳

.Həmin mənbə [۴۱۳] -۴

.Kəmalud-din”, s.۳۱۹; “Bihar”, c. ۳۶, s. ۳۸۶“ [۴۱۴] -۵

sirrimə iman gətirdiniz, Mənim qeybimi təsdiq etdiniz. Sizə Mənim tərəfimdən gözəl savabla müjdə olsun!"(۱)

Sual: ۲۴۴. İmam Sadiq (ə) imam Mehdinin (ə) qeybi haqqında xəbər vermişdirmi?

Cavab: İmam Sadiq (ə) bir hədisdə buyurur: "Yeddinci övladın beşinci övladı sizdən qeybdə olacaq bir şəxsdir."(۲)

Digər bir hədisdə həzrət buyurur: "Agah olun! And olsun Allaha, Mehdi (ə) sizin aranızdan qeybə çəkiləcək. Cahilləriniz deyəcək ki, Allahın Ali-Məhəmmədə ehtiyacı qalmadı..."(۳)

Həzrət başqa bir məqamda buyurur: "Həqiqətən, övladlarımdan altıncısı üçün qeyb baş verəcək. O, peyğəmbərdən sonra on ikinci, hidayət imamıdır. Onların birincisi Əli ibn Əbi-Talib (ə), sonuncusu yer üzündəki Bəqiyyətullahdır..."(۴)

Bir hədisdə isə həzrət belə buyurur: "Həqiqətən, qaim üçün qiyamdan öncə qeyb dövrü var."(۵)

Sual: ۲۴۵. İmam Kazim (ə) imam Mehdinin (ə) qeybini xəbər vermişdirmi?

Cavab: İmam Kazim (ə) buyurmuşdur: "Yeddinci övladın beşinci övladı qeybə çəkilən vaxt kimsə sizi dininizdən ayırmasın. Ey övladım! Həqiqətən, qaim üçün qəti şəkildə qeyb dövrü var..."(۶)

Yunis ibn Əbdür-Rəhman deyir: "Musa ibn Cəfərə ərz etdim: "Ey peyğəmbər övladı! Siz həqiqətən qaimsiniz?" Həzrət buyurdu: "Mən haqq olaraq qaiməm. Amma yer üzünü Allah düşmənlərindən təmizləyəcək, ədaləti bərpa edəcək qaim mənim beşinci övladımdır. Həyatı üçün təhlükə yarandığından onun üçün böyük qeyb dövrü var..."(۷)

Həzrət "Loğman" surəsinin iyirminci ayəsi ilə bağlı buyurmuşdur: "Aşkar nemət aşkar imam, batini nemət qeybdə olan imamdır." Rəvayətçi soruşur ki, imamlar arasında qeybə çəkilən varmı? Həzrət buyurur: "Bəli, o, xalqın gözündən qeybə çəkilər,

۱- [۴۱۵] "Kəmalud-din", s.۳۳۰; "Bihar", c. ۵۲, s. ۱۴۵.

۲- [۴۱۶] "Kəmalud-din", s.۳۳۸; "Bihar", c. ۵۱, s. ۱۴۳.

۳- [۴۱۷] "Həmin mənbə", s. ۳۴۱; "Bihar", c. ۴۵.

۴- [۴۱۸] Həmin mənbə.

۵- [۴۱۹] Həmin mənbə, s. ۳۴۳.

۶- [۴۲۰] "Kəmalud-din", s.۳۵۹, ۳۶۰.

۷- [۴۲۱] Həmin mənbə, s. ۳۶۱; "Bihar", c. ۵۱, s. ۱۵۱.

(amma möminlərin qəlbindən qeyb olmaz. O, bizim on ikincimizdir..."(١)

?Sual: ٢۴۶. İmam Riza (ə) imam Mehdinin (ə) qeybini xəbər vermişdirmi

Cavab: Şeyx Səduq nəql edir ki, imam Riza (ə) buyurmuşdur: "Allah mənim dördüncü övladım, ən üstün qadınlardan olan xanımın övladı vasitəsi ilə yer üzünü zülm-sitəmdən təmizləyər. Xalq onun mövluduna şəkk edər. Qiyamdan öncə qeybə çəkilən (kəs odur..."(٢)

Həzrət Riza (ə) Dəbələ buyurmuşdur: "Ey Dəbəl! Məndən sonra övladım Məhəmməd (ə) imamdır. Məhəmməddən sonra onun övladı Əli, Əlidən sonra onun övladı Həsən, (Həsəndən sonra onun övladı Höccət qaimdir..."(٣)

?Sual: ٢۴٧. İmam Cavad (ə) imam Mehdinin (ə) qeybini xəbər vermişdirmi

Cavab: Əbdül-Əzim Həsəni deyir: Mən ağam Məhəmməd ibn Əli ibn Musa ibn Cəfər ibn Məhəmməd ibn Əli ibn Hüseyn ibn Əli ibn Əbi-Talibdən qaim haqqında soruşduqda o buyurdu: "Ey Əbül-Qasim! Həqiqətən, bizim qaimimiz Mehdidir (ə). Qeyb vaxtı onun intizarını çəkmək, zühur vaxtı ona itaət etmək vacibdir. O, məndən sonra üçüncü (övladdır..."(۴)

Səqər ibn Əbu Delf deyir: İmam Cavaddan (ə) soruşdum ki, nə üçün qaimi müntəzir adlandırırlar? Həzrət buyurdu: "Çünki onun uzun müddətli qeybi olacaq. Xalis möminlər (onun intizarını çəkəcək, şəkdə olanlar onu inkar edəcəklər..."(۵)

?Sual: ٢۴٨. İmam Hadi (ə) həzrət Mehdinin (ə) qeybini xəbər vermişdirmi

Cavab: Şeyx Səduq Əbu-Haşim Davud ibn Qasim Cəfəriyə istinadən imam Hadidən belə nəql edir: "Məndən sonra canişin övladım Həsəndir. Ondan sonrakı canişin gözə (görünməz, onun adını çəkmək halal deyil..."(۶)



---

.Kəmalud-din",s.٣۶٨; "Bihar", c. ۵١, s. ١۵١" [۴٢٢]-١

.Kəmalud-din",s.٣٧١; "Bihar", c. ۵٢, s. ٣٢١" [۴٢٣]-٢

.Həmin mənbə, s. ٣٧٢; “Bihar”, c. ٥١, s. ١٥۴ [۴٢۴] -٣

.Kəmalud-din”,s.٣٧٧; “Bihar”, c. ٥١, s. ١٥۶“ [۴٢٥] -۴

،Həmin mənbə, s.٣٧٨; “Bihar”, c. ٥١, s. ٣٠ [۴٢۶] -٥

.Kəmalud-din”,s.٣٧٩, ٣٨٠; “Elamul-vəri”, , s. ۴٣٧, ۴٣٨“ [۴٢٧] -۶

?Sual: ۲۴۹. İmam Əsgəri (ə) övladı Mehdinin (ə) qeybi üçün zəmin hazırlamışdırmı

:Cavab: İmam Əsgərinin (ə) uyğun sahədəki fəaliyyətlərini bir neçə qismə bölmək olar

Təlimat və bəyanat – İmam Əsgəri (ə) Əhməd ibn İshaqa buyurmuşdur: "Ey Əhməd .۱ ibn İshaq! O, bu ümmət arasında Xızır və Zül-Qərneyn kimidir. And olsun Allaha! Onun üçün qeyb dövrü var. Yalnız Allah tərəfindən onun imamətinə münasibətdə sabit qərar (verilənlər və dua ilə onun zühurunun tezləşməsini istəyənlər həlak olmayacaq..."(۱

İmam buyurur: "Agah olun! Həqiqətən, övladım üçün elə bir qeyb var ki, yalnız Allahın (hifz etdikləri bu qeybə şəkk etməz."(۲

Şiələrlə əlaqələrin azaldılması – Məsudi deyir: O imamət məqamına çatdığı vaxt həm .۲ yaxınları, həm də başqaları ilə pərdə dalından danışardı. Yalnız sultanın sarayına aparıldığı vaxt belə olmurdu."(۳) Bu səbəbdən də şiələr həzrətin yolu üstündə (otururdular ki, onu görə bilsinlər.(۴

Vəkalət qurumunun təşkili – Vəkalət qurumu öncədən mövcud olsa da, həzrət . ۳ Əsgərinin (ə) dövründə bu qurum Mehdinin (ə) gəlişinə hazırlıq üçün daha da genişləndirildi. Bu məqsədlə Osman ibn Səid və onun övladı vəkil olaraq tanıtdırıldı: Şahid olun ki, Osman ibn Səid Əmri mənim, onun övladı Məhəmməd isə övladım (Mehdinin (ə) vəkilidir."(۵

Məhəmməd ibn Əhməd ibn Cəfər ibn Seyqəl də imamın vəkillərindən idi. (həmin (mənbə, c. ۵۰, s. ۳۰۹, ۳۱۰

Övladı üçün qurbanlıq etməsi – Şeyx Səduq Əbu-Cəfər Əmriyə istinadən belə nəql .۴ edir: Ağa dünyaya gələn vaxt imam Əsgəri (ə) Əbu-Əmri yanına çağırıb buyurdu: "On min peymanə çörək və on min peymanə ət al və onu bəni-Haşim arasında böl. Onun (tərəfindən filan sayda qoyun əqiqə et." (Əqiqə - mövludla bağlı verilən ehsan).(۶

Həzrət Mehdinin (ə) xüsusi şiələrə təqdimi – İmam Əsgəri (ə) şiələri əmin etmək .۵ üçün həzrət Mehdini (ə) bəzi yaxın adamlarına

۱- [۴۲۸] "Kəmalud-din",s.۳۸۴; "Bihar", c. ۵۲, s. ۲۳,۲۴.

۲- [۴۲۹] Həmin mənbə,s.۴۰۹; "Bihar", c. ۵۱, s. ۱۶۰.

۳- [۴۳۰] "İsbatul-vəsiyyə", s. ۲۸۶.

۴- [۴۳۱] "Bihar", c. ۵, s. ۲۹۰.

۵- [۴۳۲] "Bihar", c. ۵۱, s. ۳۴۴.

۶- [۴۳۳] "Kəmalud-din",s.۴۳۰; "Bihar", c. ۵۱, s. ۵.

göstərdi. Onlar imamın övladında bir sıra möcüzələr müşahidə etdilər. Orada olanlardan biri də Əhməd ibn İshaq Əşəri idi.(١)

Sual: ٢٥٠. İmam Mehdi (ə) kiçik qeyb dövründə öz mövcudluğunu sübut etmək üçün hansı tədbirlər gördü?

Cavab: Həzrət Mehdi (ə) əvvəlki imamların Məhdəviyyət məsələsi ilə bağlı hazırlıq görməsinə baxmayaraq, özü də müxtəlif yollarla mövlud və imamətini sübuta yetirirdi.

Həzrətin bu sahədəki bəzi tədbirləri ilə tanış olaq:

١. Həzrət şiə böyüklərinin onunla görüşə bilməsi üçün müəyyən tədbirlər görürdü.

٢. Zəruri məqamlarda həzrət kəramət və möcüzə göstərirdi. Bəzən bu möcüzələr səfirlər, bəzən də onun öz vasitəsi ilə həyata keçirdi.(٢)

٣. Həzrət xalqın Məhdəviyyət məsələsinə inamını artırmaq üçün bəzi sualları özü cavablandırırdı.

٤. Həzrətin xüsusi xətti onun imamətini sübuta yetirən dəlillərdən sayıla bilər. Xalq imam Əsgərinin (ə) vaxtında bu məsələ ilə tanış olmağa başlamışdı. Müqəddəs nahiyə (nümayəndəlik) tərəfindən verilən bəyanatlar imamın varlığı ilə bağlı yəqinlik yaradırdı.

Sual: ٢٥١. Həzrət Mehdi (ə) düşmənlərdən məxfi qalmaq üçün hansı tədbirlər gördü?

Cavab: İmam Əsgərinin (ə) şəhadətindən sonra zalım hakimlər həzrəti öldürmək qəsdində olduqlarından, o, məxfi qalmaq üçün bir sıra tədbirlər gördü. Bu tədbirlərdən bəzilərini nəzərdən keçirək:

١. Həzrət özünü yalnız fədakar şiələrə göstərirdi.

٢. Həzrət onunla görüşmüş şəxsə tapşırırdı ki, bu görüş gizli qalsın.

٣. Həzrət Mehdinin (ə) adının ("Məhəmməd") çəkilməsi haram edilmişdi. Bu səbəbdən də həmin dövrdə imam "Qaim", "Qərim", "Höccət", ""Nahiyə", "Sahibəz-zaman" və başqa adlarla yada salınırdı.(٣)

.Həzrət xilafət və onun valilərindən məxfi yaşayırdı .۴



---

.Kəmalud-din",s.۳۸۴; "Bihar", c. ۵۲, s. ۲۳, ۲۴" [۴۳۴] -۱

.Bihar", c. ۵۱, s. ۳۲۵" [۴۳۵] -۲

.Əl-ğeybət", Tusi, s. ۳۶۴; "Bihar", c. ۵۱, s. ۳۵۱" [۴۳۶] -۳

Həzrət tez-tez yerini dəyişir, kimsənin diqqətini cəlb etmirdi. Həzrətin yeri ilə bağlı .۵ .verilən məlumatların ziddiyyətli olması bu səbəbdəndir

Vəkillər və ya səfirlər imamla elə bir şəraitdə görüşürdü ki, kimsə bundan xəbər .۶ .tutmurdu

Həzrət öz vəkillik və nümayəndəliyini ən xalis və fədakar insanlara tapşırırdı. Onlar .۷ həzrətin məkanı və xüsusiyyətləri ilə bağlı kimsəyə məlumat vermirdilər. Əbu-Səhl Növbəxtiyə belə bir sual verirlər: "Nə üçün imam nümayəndəliyə sizi yox, Hüseyn ibn Ruhu seçdi?" O belə cavab verir: "Hüseyn ibn Ruh elə bir şəxsdir ki, imam onun əbası (altında olsa, tikə-tikə doğransa da, səsini çıxarmaz."(۱

**Səfirlər**

?Sual: ۲۵۲. Həzrət Mehdinin (ə) ilk səfiri kim olub

Cavab: İmam Mehdinin (ə) ilk səfiri Əbu-Əmr Osman ibn Səid Əmri olmuşdur. Bu şəxs tanınmamaq üçün yağ satmaqla məşğul olurdu. Tarixi mənbələrdə onun doğum və ölüm tarixləri göstərilmir. Əbu-Əmr yalnız imam Hadinin (ə) xüsusi vəkili olaraq .tanıtdırılır

Bu şəxs imam Hadinin (ə) şəhadətindən sonra imam Əsgərinin (ə) vəkili olmuşdur. İmam Əsgəri (ə) Əbu-Əmri müxtəlif münasibətlərlə tərif etmişdir. Həzrət onun haqqında buyurur: "Əbu-Əmr etibarlı şəxsdir, həm keçmişdəkilərin, həm də mənim inamımı qazanmışdır. Məndən sonra da belədir. Nə desə, məndəndir, nə çatdırsa, (mənim tərəfimdəndir."(۲

Əbu-Əmr imam Əsgərinin (ə) digər ۴۰ şiəsi ilə birlikdə onun yanında olduqda həzrət oğlu Mehdini (ə) onlara göstərmiş, övladının imamət və qeybi haqqında məlumat vermişdir. Əbu-Əmrin vəkilliyi haqqında həzrət buyurur: "Osman nə desə, qəbul (edin..."(۳

Hicri ۲۶۰-cı ildə imam Əsgərinin (ə) şəhadəti zamanı Osman onun qüsl ayinində iştirak (etmiş, bütün işləri öz üzərinə götürmüşdür.(۴

İmam Əsgərinin (ə) qüsl mərasimini Osmanın icra etməsi zalım hakimlərin diqqətini yayındırmaq məqsədi daşıya bilər. Çünki imamın qüslü və kəfənlənməsi o biri imamın öhdəsinədir. Osman ibn Səid imam Əsgərinin (ə) şəhadətindən sonra onun öncədən təsdiqi və həzrət Mehdinin (ə) razılığı ilə Qumlular Samirraya daxil olarkən



---

۱- [۴۳۷] "Əl-ğeybət", Tusi, s. ۳۹۱; "Bihar", c. ۵۱, s. ۳۵۸.

۲- [۴۳۸] Tusi, Əl-Ğeybət", s. ۳۵۴; "Bihar", c. ۵۱, s. ۳۴۴.

۳- [۴۳۹] "Bihar", c. ۵۱, s. ۳۴۶.

۴- [۴۴۰] Tusi, Əl-Ğeybət", s. ۳۵۶.

həzrətin birinci səfiri təyin olundu. Həmin vaxtdan öz səfirlik vəzifəsini icra etdi. Dünyasını dəyişdiyi vaxt oğlu Əbu-Cəfər Məhəmməd ibn Osman onu dəfnə hazırlayıb (Bağdadın qərbində torpağa tapşırdı.(١

Osman ibn Səidin vəfatından sonra müqəddəs nahiyə tərəfindən yazılmış məktubda imam Mehdi (ə) Osmanın vəfatı ilə bağlı oğlu Məhəmmədə başsağlığı verdi və onu öz (səfiri təyin etdi.(٢

?Sual: ٢٥٣. Osman ibn Səidin səfirliyini təsdiqləyən rəvayətlərin sənədi zəifdirmi

Cavab: Əhməd Katib deyir: Osman ibn Səidin imam Mehdi (ə) üçün səfirliyinin imam Əsgəri (ə) tərəfindən elan olunmasını bildirən rəvayətin sənədi zəifdir. Çünki bu rəvayətlər Nəccaşi və İbn Əl-Ğəzairi tərəfindən rədd olunmuş Cəfər ibn Məhəmməd ?ibn Malik Fərazi tərəfindən nəql edilmişdir. Bəs həqiqətdə necədir

Cəfər ibn Məhəmməd ibn Malik Şeyx Tusi tərəfindən təsdiqlənmiş şəxsdir. Onu .١ etibarsız sayan ibn Əl-Ğəzairinin kitabı imamiyyə alimləri tərəfindən .təsdiqlənməmişdir

Şeyx Tusi "Əl-Ğeybət" kitabında Əhməd ibn İshaq Qummiyə istinadən ikinci naib və .٢ (onun atasının vəkilliyini nəql etmişdir.(٣

Şiə əqidəsində imamət və səfirlik məsələlərinə ciddi yanaşılır. Bir şəxsin özünü səfir .٣ .hesab etməsi yetərli sayılmır. Yalançı səfirlərlə çox ciddi mübarizə aparılmışdır

Sual: ٢٥٤. İmam Mehdinin (ə) qeyb mövzusunun Osman ibn Səid tərəfindən ?uydurulması düzdürmü

Cavab: Bəziləri deyirlər ki, qeyb mövzusu səhabələr, xüsusi ilə Osman ibn Səid .tərəfindən uydurulmuşdur

Hansı ki, imamın qeyb mövzusuna ilkin toxunan həzrət Peyğəmbər (s) olmuşdur. Sonra həzrət Əli (ə) və digər imamlar bu mövzunu təsdiqləmişlər. Onlar qeyb hadisəsi .haqqında öncədən xəbər vermiş, xalqa bu barədə xəbərdarlıq etmişlər

Həzrət Peyğəmbər (s) buyurur: "And olsun bizi müjdə üçün seçmiş Allaha! Mənim

övladlarımın qaimi bağlanmış əhdə görə qeybə çəkilər. İnsanların çoxu deyər ki, Allahın Ali-Məhəmmədə



---

۱- [۴۴۱] "Bihar", c. ۵۱, s. ۳۵۰.

۲- [۴۴۲] "Tusi, Əl-Ğeybət", s. ۳۶۱; "Kəmalud-din",s.۵۱۰; "Bihar", c. ۵۱, s. ۳۴۸.

۳- [۴۴۳] "Tusi, Əl-Ğeybət", s. ۳۵۹, ۳۶۰.

Məhəmməd ailəsinə) ehtiyacı qalmadı. Bəziləri də həzrətin dünyaya gəlişinə şəkk) (edər. Qeyb dövründə yaşayan insan dinini hifz etməlidir…”(١)

Əsbəğ ibn Nəbatə Əmirəl-mömünindən (ə) belə nəql edir: “Agah olun ki, o cənab qeybə çəkilən vaxt nadan şəxs deyər: “Allahın Ali –Məhəmmədə ehtiyacı yoxdur.” (٢) İmam Sadiq (ə) buyurmuşdur: “İmamınızın qeybə çəkilməsi xəbərini eşitdikdə bunu inkar (etməyin.”(٣)

Həzrət Mehdinin (ə) qeyb mövzusu şiələr arasında o qədər məşhurdur ki, şairlər bu mövzuda şerlər yazmış, müəlliflər öz kitablarında bu mövzuya yer vermişlər. İmam Mehdinin (ə) mövludundan öncə onun qeybi haqqında yazan müəlliflərlə tanış olaq: Əli ibn Həsən ibn Məhəmməd Tai Tatiri (Musa ibn Cəfərin (ə) səhabəsi); Əli ibn Ömər Ərəc Kufi (Musa ibn Cəfərin (ə) səhabəsi); İbrahim ibn Saleh (Musa ibn Cəfərin (ə) səhabəsi); Həsən ibn Əli ibn Əbu-Həmzə (İmam Rizanın (ə) müasiri); Abbas ibn Hişam naşiri Əsəd (imam Rizanın (ə) səhabəsi); Əli ibn Həsən ibn Füzal (imam Hadi (ə) və imam Əsgərinin (ə) səhabəsi); Fəzl ibn Şazan Nişapuri (imam Hadi (ə) və imam (Əsgərinin (ə) səhabəsi).(۴)

Sual: ٢۵۵. İmam Mehdinin (ə) ikinci səfiri kim idi və bu şəxs hansı mövqeyə malik ?olmuşdur

Cavab: Əbu-Cəfər Məhəmməd ibn Osman ibn Səid Əmri atasının vəfatından sonra imam Əsgərinin (ə) göstərişi ilə səfirlik məqamına çatmışdır. Həzrət Qumdan olanlara buyurmuşdur: “Şahid olun ki, Osman ibn Səid mənim vəkilimdir. Onun övladı (Məhəmməd isə övladım Mehdinin (ə) vəkilidir.”(۵)

(Bu şəxsin səfirliyi atasının imzası ilə də təsdiqlənmişdir.(۶)

İkinci səfir öz dövrünün şiələri arasında etibarı ilə seçilmiş, əmanətdar kimi tanınmışdır. İmamiyyə əqidəsindən olanların heç biri bu həqiqətə şəkk etmir. İmam Əsgərinin (ə) bu şəxs və onun atası haqqında buyuruğu bütün şübhələri aradan (qaldırır.(٧)

۱- “İsbatul-Hudat”, c. ۶, s. ۳۸۶.

۲- [۴۴۵] Həmin mənbə, s. ۳۹۳.

۳- [۴۴۶] Həmin mənbə, s. ۳۵۰.

۴- [۴۴۷] Həmin mənbə.

۵- [۴۴۸] Tusi, Əl-Ğeybət”, s. ۳۵۵.

۶- [۴۴۹] Həmin mənbə, s. ۳۵۹.

۷- [۴۵۰] Həmin mənbə, s. ۳۶۰; “Kafi”, c. ۱, s. ۳۲۹.

İmam Mehdi (ə) özü də bu şəxsin səfirliyini təsdiq edib buyurmuşdur: “Sən atanın (həyatı dövründə daim bizim tərəfimizdən etibarlı sayılmısan...”(۱)

İkinci səfir ۵۰ il müddətində öz vəzifəsini ən üstün şəkildə yerinə yetirdi. Nəhayət, hicri (۳۰۴ və ya ۳۰۵-ci ilin cəmadiul-əvvəl ayında dünyasını dəyişdi.(۲)

Məhəmməd ibn Osman uyğun vəzifənin icrasında başqa səfirlərdən daha çox xidmət göstərmişdir. O, fiqh kitabları tərtib etmiş, imam Əsgəri (ə), imam Mehdi (ə), atası Osman ibn Səid və imam Hadinin (ə) buyurduqlarını bu kitabda toplamışdır.(۳) İmam Mehdi (ə) onu öncədən öz ölümündən xəbərdar etmişdir. Bu səbəbdən də ikinci səfir (özü üçün qəbir hazırlamış və ölümündən sonra atası ilə yanaşı dəfn olunmuşdur.(۴)

?Sual: ۲۵۶. Həzrət Mehdinin (ə) üçüncü səfiri kim idi və o hansı mövqeyə malik idi

Cavab: Üçüncü səfir Şeyx Cəlil Əbül-Qasim Hüseyn ibn Ruh Növbəxti idi. O, öncə Əbu-Cəfər Məhəmməd ibn Osman Əmrinin vəkili olmuşdu və onun mülkünə nəzarət edirdi. (Nəhayət, səfir seçildi və onun səfirliyinə heç bir şübhə yoxdur.(۵)

Bir qrup şiə dörd yüz dinarlıq malı Əbu-Cəfər Əmriyə təqdim etdikdə o göstəriş verdi ki, Hüseyn ibn Ruha müraciət etsinlər. Qarşı tərəfin tərəddüddə olduğunu görən səfir növbəti dəfə həmin məbləğin Hüseyn ibn Ruha çatdırılmasını göstəriş verdi. Əslində .bu, həzrət Mehdinin (ə) göstərişi idi

Əbu-Cəfər Əmrinin vəziyyəti pisləşdiyi vaxt Əbu-Əli ibn Həmmam, Əbu-Abdüllah ibn Məhəmməd Katib, Əbu-Abdullah Baqətani, Əbu-Səhl İsmail ibn Əli Növbəxti, Əbu-Əbdüllah ibn Vəcna kimi şiə böyükləri ondan canişini haqqında soruşdular. Əbu-Cəfər Əmri buyurdu: “Bu, Əbül-Qasim Hüseyn ibn Ruhdur. O, mənim qaimim və sizin aranızdakı səfirimdir. Hüseyn ibn Ruh vəkildir və əmin şəxsdir. İşlərinizə görə ona müraciət edin, mühüm işlərdə ona etimad göstərin. Mənə tapşırılıb ki, bu göstərişi sizə (çatdırım.”(۶)



---

.Bihar”, c. ۵۱, s. ۳۴۹“ [۴۵۱] -۱

۲- [۴۵۲] Tusi, Əl-Ğeybət”, s. ۳۶۶.

۳- [۴۵۳] Həmin mənbə, s. ۳۶۳.

۴- [۴۵۴] Həmin mənbə, s. ۳۶۵.

۵- [۴۵۵] Həmin mənbə, s. ۳۷۲.

۶- [۴۵۶] Həmin mənbə, s. ۳۷۱.

Əbu-Cəfər ibn Əhməd Mutyəl deyir: “Məhəmməd ibn Osman Əmri vəfat etdiyi vaxt mən onun yastığı kənarında oturmuşdum. Hüseyn ibn Ruh isə onun ayaq tərəfində dayanmışdı. Mən sual verdim. Məhəmməd ibn Osman üzünü mənə tutub buyurdu: “Mənə əmr olunub ki, Əbül-Qasim ibn Ruha vəsiyyət edim.” Mən bu sözləri eşidib yerimdən qalxdım və Hüseyn ibn Əli Ruhu Məhəmməd ibn Osmanın yastığı kənarında, (öz yerimdə əyləşdirdim.(١)

Məhəmməd ibn Osmanın təkidlərinin və Hüseyn ibn Ruha vəsiyyətinin səbəbi bu idi ki, o, imamlarla yaxın rabitədə olan adam kimi tanınmırdı. Onun səfir təyin edilməsinin səbəbi ixlas və fədakarlığı idi. Hüseyn ibn Ruh Əbu-Cəfər Əmrinin vəfatından sonra ٢١ .il səfir oldu

Bu şəxs çox ciddi təqiyyə şəraitində fəaliyyət göstərirdi. O, sünnə əhlindən olmasını izhar etməklə diqqəti yayındırır və imamın səfirliyini yerinə yetirirdi. Öz fəaliyyəti dövründə bu şəxs müxtəlif azğınlıqlar və yalançı səfirlik iddiaları ilə ciddi mübarizə .apardı. Hicri ٣٢۶-cı ildə Hüseyn ibn Ruh dünyasını dəyişdi

?Sual: ٢۵٧. Həzrət Mehdinin (ə) dördüncü səfiri kim idi və onun hansı mövqeyi vardı

Cavab: Dördüncü səfir Şeyx Cəlil Əbül-Həsən Əli ibn Məhəmməd Səməri idi. Onun doğum tarixi məlum deyil. Amma bu şəxs ilkin olaraq imam Əsgərinin səhabəsi kimi tanınmışdır.(٢) Bu şəxs Bağdadda Hüseyn ibn Ruh vasitəsi ilə həzrət Mehdi (ə) tərəfindən səfirliyə təyin olunmuşdu. Onun səfirliyi haqqında konkret bir məlumat yoxdur. Yalnız bunu demək olar ki, şiələr yekdil olaraq onun səfirliyini təsdiqləmişlər. Belə bir əminlik həzrət Mehdinin (ə) Hüseyn ibn Ruha göstərişindən yaranır. Səməri Hüseyn ibn Ruhun vəfatından sonra üç il fəaliyyət göstərmişdir. Bu şəxsin səfirliyinə heç bir şübhə olmasa da, o digər üç səfir qədər geniş fəaliyyət göstərməmişdir. Onun fəaliyyətindəki məhdudluq yaşadığı dövrün sıxıntıları ilə izah oluna bilər. Həmin dövrdə mövcud olan ideoloji və ictimai sıxıntılar Səməridən sonra səfirlik fəaliyyətinin dayanmasının və böyük qeybin səbəbi ola bilər. Səməri vəfatından bir neçə gün öncə imamdan kiçik

۱- [۴۵۷] Həmin mənbə, s. ۳۷۰.

۲- [۴۵۸] “Ricale-Şeyx-Tusi”, s. ۴۰۰.

qeyb dövrünün başa çatması ilə bağlı məlumat alır. İmam Səməriyə özündən sonra (səfir təyin etməsini qadağan edir.(١

Rəvayətçi deyir: Bu namədən altı gün sonra Əli ibn Məhəmmədin yanında olduq. Həyatının son anlarını yaşayan səfirdən növbəti səfir haqqında soruşduq. O, növbəti .səfirin olmayacağını bildirib, dünya həyatı ilə vidalaşdı

?Sual: ٢٥٨. Həzrətin dörd səfirinin nümayəndəliyi necə sübut olunur

Cavab: ١. Osman ibn Səid haqqında deyirik: Onu imam Əsgəri etibarlı saymış və imam .Mehdi (ə) mənsəbini təsdiqləmişdir

Onun övladı Məhəmməd ibn Osman haqqında deyirik: O atası tərəfindən təyin olunmuş, bundan əlavə imam Əsgəri (ə) və imam Mehdi (ə) tərəfindən etibarlı .sayılmışdır

Hüseyn ibn Ruh da öz növbəsində Məhəmməd ibn Osman tərəfindən bu məqama təyin olunmuşdur. O isə özündən sonra üçün Əli ibn Məhəmməd Səməriyə uyğun .vəzifəni tapşırmışdır

Bu dörd şəxsin səfirliyini sübuta yetirmək üçün ikinci yol onların bütün xalqı imamət .٢ məsələsi ilə tanış etməsidir. Hələ imam Əsgərinin (ə) dövründə şiələr imam Mehdinin .(ə) xətti ilə tanış idilər

Bu böyük insanlardan görünən kəramətlər onların səfirliyinin sübutu üçün növbəti .٣ dəlil ola bilər. Bu kəramətlər bəzən səfirlərin özlərindən, bəzən isə həzrət Mehdidən (ə) görünürdü. Həzrətin kəramətlərini səfirlər şiələrə çatdırırdılar. Belə qəziyyələrdən (məşhuru Əbu-Əli Bağdadi tərəfindən nəql olunmuşdur.(٢

Seyyid Əbdüllah Şwbbər deyir: Şiələr imamın nümayəndələrindən imama aid kəramət görməmiş onların sözünü qəbul etməzdi. Bu kəramətlər onların verdiyi göstərişlərin və (nümayəndəliklərinin dəlili idi."(٣

?Sual: ٢٥٩. Dörd nümayəndə şiələrlə hansı yolla rabitə saxlayırdı

:Cavab: Şiələr nümayəndələrlə iki yolla əlaqə saxlayırdı

Vasitəli rabitə – Vasitəli rabitə səfirlik qurumunda prinsipial məsələlərdən idi. Çünki .۱ bu qurum Abbasilərin zülmü səbəbindən



---

.Kəmalud-din”, s. ۵۱۶; “Elamul-vəri”, s. ۴۴۵“ [۴۵۹] -۱

.Kəmalud-din”,s.۵۰۲-۵۱۸“ [۴۶۰] -۲

.Həccül-Yəqin”, s. ۲۴۲“ [۴۶۱] -۳

aşkar fəaliyyət göstərə bilmirdi. Onlar xalqla rabitə üçün gizli yollardan istifadə etməli .olurdular

Birbaşa rabitə – Dörd nümayəndənin fəaliyyəti dövründə ilk əvvəllər birbaşa rabitə .٢ yox idi. Kiçik qeyb dövründə nümayəndələrin xalqla birbaşa rabitə saxlaması çox çətin idi. Zalım hakimlərin təzyiqləri səbəbindən rabitələr gizli şəkildə qurulurdu. Şiələr zaman ötdükcə gizli şəkildə səfir və vəkilin adını və nişanələrini öyrənirdilər. Bu yolla müstəqil rabitə qurmaq mümkün olurdu. Bu iş əsasən ikinci səfirin dövründə həyata keçməyə başladı. Şeyx Tusi bu növ rabitə haqqında yazır: "Etibarlı şəxslərdən bir qrupu imam Mehdinin (ə) səfirinin yanına gedirdi. Onlar öz məktublarını və istəklərini (səfirlərə çatdırmaqla onlar vasitəsi ilə müqəddəs nahiyədən cavab alırdılar."(١)

?Sual: ٢۶٠. Dörd nümayəndə hansı vəzifələri yerinə yetirmişdir

:Cavab: Dörd nümayəndənin vəzifələri və fəaliyyətlərinin ümumi mehvəri bu şəkildədir

İmam Mehdinin (ə) varlığı ilə bağlı şəkk-şübhəni aradan qaldırmaq; . ١ nümayəndələrin, xüsusi ilə ilk səfir Osman ibn Səid Əmrinin ən mühüm vəzifəsi imam Mehdinin (ə) varlığını sübuta yetirmək olmuşdur. Onlar isbat etməli idilər ki, imam .Əsgərinin (ə) övladı var, o hazırda imamdır və nümayəndəsi fəaliyyət göstərir

Həzrət Mehdinin (ə) adını və məkanını gizli saxlamaqla onun hifz olunması – İmam .٢ Mehdi (ə) bir bəyanatında Məhəmməd ibn Osman ibn Səid Əmriyə bildirirdi ki, həzrətin adı və nişanələri bilindirilməsin və bu sahədə fəaliyyət göstərilsin.(٢) Əbu-Səhl Növbəxti "nə üçün sən səfir olmadın" sualına belə cavab verir: "Mən Hüseyn ibn Ruh (kimi sirr saxlamağı bacarmıram."(٣

Vəkalət qurumunun nizama salınması və ona rəhbərlik – Şiələr öz suallarını məhz bu .٣ qurum vasitəsi ilə vəkillərə çatdırırdılar. Eləcə də, vəkalət qurumu həzrətin cavabını şiələrə ötürürdü. Şəri ödənclər vəkillərə çatdırılır və onlar vasitəsi ilə qurumun .məsullarına təhvil verilirdi

Fiqh və əqidə ilə bağlı sualların cavablandırılması – Nümayəndələr xalqın fiqhi . ۴ (suallarını imam Mehdi (ə) çatdırır və cavab alıb xalqa bəyan edirdilər.(۴

---

۱- [۴۶۲] “Əl-Ğeybət”, s. ۲۵۷.

۲- [۴۶۳] Həmin mənbə, s. ۲۲۲.

۳- [۴۶۴] Həmin mənbə, s. ۲۴۰.

۴- [۴۶۵] “Elamul-vəri”, s. ۴۵۲.

İmam Mehdiyə (ə) aid mülkün alınması və paylanması – İmam Mehdi (ə) atasının .۵ dəfnindən sonra Qumdan gəlmiş heyətə göstəriş verdi ki, bundan sonra ona aid olan (mülkü Bağdaddakı vəkilə təhvil versinlər.(۱

Yalan səfirlik iddiası ilə mübarizə - Səfirlik dönəmində Həllac, Şələmğani və bir çox .۶ başqaları nəfsə uyaraq özünü səfir elan etmişdi. İmamın nümayəndələrinin mühüm vəzifələrindən biri bu sayaq yalan iddialarla bağlı müqəddəs nahiyə tərəfindən bəyanatlar verilirdi. Həqiqətin bu sayaq aşkarlanması imamiyyə şiələrini bir çox .azğınlıqlardan qoruyur, dörd nümayəndəyə etibarı artırırdı

Xain vəkillərlə mübarizə - Bəzən vəkil təyin olunanlar arasında yolunu azanlar .۷ tapılırdı. Belələri qurumun məxfi fəaliyyəti üçün bir sıra problemlər yaradırdı. Onlar bəzən şəri ödəncləri quruma təhvil vermir, özbaşınalıq göstərirdi. Bu sayaq mənfi fəaliyyətlərə qarşı dörd nümayəndə mübarizə aparır, xain vəkillər işdən .uzaqlaşdırılırdı

Xalqın böyük qeyb dövrünə hazırlanması – Bu istiqamətdə daha çox Əbül-Həsən Əli .۸ ibn Məhəmməd Səməri fəaliyyət göstərmişdir. Bu şəxs həzrət Mehdinin (ə) son səfiridir. Həzrət möcüzə vasitəsi ilə ona kömək etmiş, ölümündən altı gün əvvəl bu barədə ona məlumat vermişdir. Bununla da, höccət tamamlanmış, xalq qeyb dövrünə .hazırlanmışdır

?Sual: ۲۶۱. Dörd nümayəndə hansı meyarlar əsasında seçilmişdir

Cavab: Məsum imamlar daim hikmət əsasında hərəkət etmiş, öz nümayəndələrini :konkret meyarlar əsasında seçmişlər

Ən üstün səviyyədə təqiyyə və sirr saxlama – Həzrət Mehdinin (ə) birinci səfiri .۱ Osman ibn Səid özünü Abbasi rejimindən qorumaq üçün maksimum səviyyədə təqiyyə edirdi. O, bu məqsədlə heç bir məzhəbi və siyasi söhbətdə aşkar mübahisəyə (girişmirdi.(۲

Hüseyn ibn Ruh da öz növbəsində təqiyyəyə əməl edir, əsl mövqeyini məxfi saxlayırdı. Hətta xidmətçilərindən biri Müaviyəni aşkar lənətlədiyi üçün onu işdən

(uzaqlaşdırmışdı.(٣

٢. Böyük səbr və sabitqədəmlik – Bir qrup şəxs Əbu-Səhl Növbəxtidən soruşdu: “Nə üçün sən imamın xüsusi naibi olmadın?” O belə cavab verdi: “Onlar (imamlar) daha yaxşı bilirlər ki, kim bu səh:١۶۶

---

١- [۴۶۶] “Kəmalud-din”, s.۴٧٨.

٢- [۴۶٧] “Tarixe-Siyasiye-Ğeybəte-imame dəvazdəhum”, Doktor Casim Hüseyn, s. ١۴٩.

٣- [۴۶٨] “Əl-Ğeybət”, s. ٢٣٧.

məqama layiqdir. Mən düşmənlərlə get-gəli olan adamam. Onlarla mübahisə edirəm. Əgər Əbül-Qasim Hüseyn ibn Ruhun Mehdi (ə) haqqında bildiyini mən bilsəm, olsun ki, mübahisələrdə mövqeyimi sübuta yetirmək üçün hansısa bir məsələni açam və nəticədə imamın yeri məlum olsun. Əbül-Qasim Hüseyn ibn Ruh isə, imam əbasının altında olsa belə, bədəni tikə-tikə doğransa, imam Mehdini (ə) göstərməz."(١)

Başqaları ilə müqayisədə daha düşüncəli olmaq – Şeyx Tusi "Əl-Ğeybət" kitabında .٣ imamın naiblərinin düşüncə baxımından üstünlüyünü qeyd etmişdir.(٢)

Hökumətin həmin şəxslərə münasibətdə həssas olmaması – İmam Mehdi (ə) öz .۴ nümayəndəsini elə şəxslər arasından seçirdi ki, onlar Abbasi hökumətinin diqqətini cəlb etməmiş olsun. Çünki nümayəndəlik xeyli məxfi bir iş idi. Nümayəndələrin hər biri .hansısa peşə sahibi idi və nümayəndəlik fəaliyyəti ilə tanınmırdı

Sual: ٢۶٢. Bəzilərinin özünü əsassız olaraq imamın səfiri kimi tanıtdırmasının səbəbi nə ?idi

Cavab: Səfirlik fəaliyyətinin başlamasından çox keçməmiş yalançı səfirlər məsələsi ortaya çıxdı. Onlar haqsız olaraq səfir olduqlarını iddia edir və əlbəttə ki, hansısa :məqsəd izləyirdilər. Bu məqsədlərlə tanış olaq

.Bu şəxslərin imanı zəif olduğundan uyğun iddia ilə xalq və cəmiyyəti çaşdırırdılar .١

Onlar öz səfirlik iddiaları ilə imamın qeybdə olmasından istifadə edib var-dövlət ələ .٢ .keçirmək istəyirdilər

Onlar ictimai mövqe qazanmaq istəyirdilər. İmamın səfiri kimi tanınmaq onlara .٣ .şöhrət gətirirdi

?Sual: ٢۶٣. Kimlər haqsız olaraq səfirlik iddiası etmişdir

Cavab: Yalançı səfir iddiası ikinci səfir Məhəmməd ibn Osman Əmrinin dövrünə təsadüf edir. Çünki onun atası Osman ibn Səid çox tanınmışdı və kimsə onun dövründə .yalan iddiaya cürət etmirdi

Yalandan səfirlik iddiası edən ilk şəxs Əbu-Məhəmməd Şərii olmuşdur.(٣) Məhəmməd

,ibn Nəsir Nəmiri, Əhməd ibn Hilal Kərxi



---

.Əl–Ğeybət”, s. ۲۴۰“ [۴۶۹] -۱

.Həmin mənbə, s. ۲۳۶ [۴۷۰] -۲

.Bihar”, c. ۵۱, s. ۳۶۷“ [۴۷۱] -۳

Əbu-Tahir Məhəmməd ibn Əli ibn Bilal Bilali, Əbu-Bəkr Məhəmməd ibn Əhməd ibn .Osman Bağdadi, İshaq Əhmər haqsız yerə özünü səfir kimi tanıtdırmaq istəyənlərdir

.Onlardan bəziləri əvvəllər saleh insan olmuşdur

İkinci səfir uyğun cəhdlərlə ciddi mübarizə aparmışdır. O cümlədən, müqəddəs nahiyə .tərəfindən yalan iddiaçılığa qarşı bəyanatlar verilmiş, yolunu azanlar lənətlənmişdir

Üçüncü səfir Hüseyn ibn Ruhun səfirliyi dövründə bu sahədə vəziyyət daha da gərginləşmişdir. Həmin dövrdə Məhəmməd ibn Əli Şələmğani Qəzafəri adlı bir şəxsin səfirlik iddiasına düşməsi cəmiyyətdə böyük çaşqınlıq yaratmışdır.(۱) Şələmğani öncə mömin bir şəxs kimi Hüseyn ibn Ruhun vəkili olsa da, sonra yolunu azmışdır. Haqsız olaraq səfirlik iddiasına düşmüş son şəxs Əbu-Delf Katibdir. O, dördüncü səfir Səməri .dünyasını dəyişənədək öz iddiasından əl çəkməmişdir

?Sual: ۲۶۴. İmam Mehdinin (ə) səfirlərdən başqa vəkili olmuşdurmu

Cavab: Tarixi mənbələri araşdırdıqda görürük ki, həzrət Mehdinin (ə) dörd tanınmış səfirindən əlavə, vəkilləri olmuşdur. Onlar müxtəlif şəhərlərdə və əyalətlərdə öz vəzifələrini yerinə yetirmişlər. Amma səfirlər və vəkillər arasında iki mühüm fərq :olmuşdur

Səfirlər həzrət Mehdi (ə) ilə bilavasitə görüşmüş, şəxsən tanımışlar. Hansı ki, vəkillər .۱ .həzrət Mehdi (ə) ilə səfirlər vasitəsi ilə əlaqə saxlamışlar

Səfirlər bütün şiələrə münasibətdə məsuliyyət daşıyırsa, vəkillər məhdud bir .۲ .məntəqədə öz vəzifəsini yerinə yetirirdi

?Sual: ۲۶۵. Müqəddəs nahiyə vəkillərinin təyinatının hansı səbəbləri var

:Cavab: Vəkillik məsuliyyətinin bir sıra faydalarını saymaq olar

Vəkil səfirin öhdəsinə düşən geniş məsuliyyətləri onunla bölüşür. Xüsusi ilə şiələrin .۱ .həzrət Mehdi (ə) ilə bağlı fəaliyyətlərinin gizli saxlanılması istiqamətində səy göstərilir

.Vəkillər səfirin ad və şəxsiyyətinin gizli saxlanılmasında mühüm rol oynayır .۲

?Sual: ۲۶۶. Vəkalət qurumunun hansı məsuliyyətləri var

Cavab: Tarixi mənbələri araşdırdıqda görürük ki, vəkalət qurumu bütün fəaliyyəti dövründə aşağıdakı işləri həyata keçirmişdir: şəri ödənclərin toplanması və paylanması; şiələrin tərbiyəsi və müxaliflərlə mübarizə; vəkalət qurumunda siyasi fəaliyyət; vəkalət qurumunda rabitələrin təmini; ehtiyaclılara yardım və şiələrin .problemlərinin həlli

**(Toqiat (qeydlər, məktublar, fərmanlar**

?Sual:۲۶۷. "Toqi" dedikdə nə nəzərdə tutulur

Cavab: Rəvayət dilində "toqi" bu sözün gündəlikdə işlənən mənasını bildirir. Toqi böyük şəxsiyyətlərin öz məktublarında qeyd etdiyi və suallara cavab olan buyuruqlarıdır. Həzrət Mehdinin (ə) toqiatı onun məktublarda öz xətti ilə qeyd etdiyi cavablardır. Bu .cavablar səfirlər vasitəsi ilə məktub sahiblərinə çatdırılırdı

Toqi" dedikdə, adətən, ünvanlanan suallara cavab nəzərdə tutulsa da, bəzən sualsız" .bəyan olunmuş həqiqətlər də toqi sayılmışdır

?Sual: ۲۶۸. Həzrətin göstərişlərində səfirlər hansı rol oynamışdır

Cavab: Uyğun göstərişlər (toqiat) həzrətin qeydlərindən ibarət olsa da, bu işdə səfirlərin mühüm rolu var. Hər hansı sualla ünvanlanmış məktubu imama çatdıran, qısa bir müddətdə həzrətdən cavab alıb məktub sahibinə yetirən şəxs səfirdir. Səfiri bir növ bu işdə vasitə saymaq olar. İmamın bu sayaq səfiri olmasaydı, heç vaxt uyğun .məktublar məqsədə çatmazdı

?Sual: ۲۶۹. Uyğun göstərişlər hansı müddətdə həzrət tərəfindən həyata keçirilirdi

Cavab: Bəzi rəvayətlərdən məlum olur ki, ünvanlanmış suallara ۲-۳ gün ərzində cavab verilirdi. Bəzi rəvayətlərdə deyilir: "Bir neçə gündən sonra ağam dedi ki, Əbu-Cəfərin yanına gedib cavabı soruşum."(۱) Digər rəvayətdə isə belə qeyd olunur: "Səfir ۳ gün (sonra həzrətin cavabını çatdırdı."(۲

Bəzən səfirin həzrətdən gətirdiyi cavab şifahi olurdu. Hüseyn ibn Ruh Növbəxtinin gətirdiyi bəzi cavablar bu qəbildəndir.(١)

Bəzən isə müəyyən səbəblərdən cavab verilmirdi. Məsələn, övladı olmayan bir şəxs bununla bağlı imamdan dua istədikdə, müəyyən səbəblərdən cavab almamışdı.(٢)

Bəzən məktuba bir neçə saatda cavab verilir, bəzən isə məktubun mürəkkəbi qurumamış cavab gəlirdi. Nadir hallarda xəyalından hansısa sual ötüşən şəxs imamdan cavab almışdır.(٣)

Sual: ٢٧٠. Həzrət Mehdi (ə) fərmanları öz əli iləmi yazırdı?

Cavab: Bir sıra rəvayətlərdən məlum olur ki, bəzi göstərişlər həzrətin öz əli ilə yazılmışdır.

İshaq ibn Yəqub deyir: "Məhəmməd ibn Osman Əmri vasitəsi ilə müqəddəs nahiyəyə ünvanladığım çətin bir suala imamın mübarək xətti ilə yazılmış cavab aldım."(٤)

Məhəmməd ibn Osman Əmri deyir: "Müqəddəs nahiyədən yaxşı tanıdığım bir xətlə yazılmış cavab gəldi."(٥)

Şeyx Səduq buyurur: "İmam Mehdinin (ə) xətti ilə atam üçün yazılmış qeyd hazırda məndədir."(۶)

Şeyx Əbu-Əmr Amili deyir: "İbn Əbu-Hakim Qəzvini bir qrup şiə ilə mübahisə edirdi. Problemi aradan qaldırmaq üçün müqəddəs nahiyəyə məktub yazıb sual verdi. İmamın mübarək xətti ilə cavab alındı."(٧)

Bu rəvayətlərdən məlum olur ki, həzrətin səhabələri onun xəttini tanıyırmışlar. Amma bəzi rəvayətlərə əsasən, imamın müəyyən göstərişləri səfirlərin xətti ilə yazılmışdır.

Əbu-Nəsr Hibtullah deyir: "Həzrət Mehdinin (ə) göstərişləri imam Əsgərinin (ə) dövründəki xətt ilə, Osman ibn Səid və Məhəmməd ibn Osman vasitəsi ilə şiələrə çatdırılırdı.(٨)

۱- [۴۷۵] Həmin mənbə, s. ۳۰۹.

۲- [۴۷۶] Həmin mənbə, s. ۳۲۰.

۳- [۴۷۷] "Bihar", c. ۵۳, s. ۱۸۳.

۴- [۴۷۸] "Bihar", c. ۵۱, s. ۳۴۹.

۵- [۴۷۹] Həmin mənbə, c.۳۳.

۶- [۴۸۰] "Ənvarul-Nemaniyyə", c. ۳, s. ۲۴.

۷- [۴۸۱] "Bihar", c. ۵۳, s. ۱۷۸.

۸- [۴۸۲] "Bihar", c. ۵۱, s. ۳۴۶.

?Sual: ٢٧١. Müqəddəs nahiyə tərəfindən neçə “toqi” (göstəriş) verilmişdir

Cavab: Məhdəviyyətlə bağlı yetmişdən çox göstəriş mövcuddur. Onlar aşağıdakı şəxslərə ünvanlanmışdır: Əli ibn Məhəmməd Səməri, Əbu-Cəfər Əmri (atasının ölümü ilə bağlı), Səd ibn Əbdüllah Qummi, İshaq ibn Yəqub, Məhəmməd ibn Abdüllah ibn Cəfər Həmiri (məsələsi ilə bağlı), Həmiri (həzrətin ziyarəti ilə bağlı), Əhməd ibn Xızır ibn Əbu-Saleh Xocəndi, Həsən ibn Fəzl Yəmani, Əbu-Əmr və onun övladı Əbu-Cəfər Məhəmməd, Məhəmməd ibn İbrahim Məhzyari (Cəfəri Kəzzabın rəddi ilə bağlı), Əhməd ibn Həsən Madərayi (Əhməd ibn Əbu-Ruhun əhvalatı ilə bağlı), Haciz Vəşa, Məhəmməd ibn Cəfər, Məhəmməd ibn Saleh (Əbərətaninin ölümündən sonra), Səmərinin məktubuna cavab, Fanim əhlindən olan bir kişinin sualına cavab, Məhəmməd ibn Həsən Muruzi, Məhəmməd ibn Yusifin məktubuna cavab, Məhəmməd ibn Cəfər Əsədinin suallarına cavab, Məhəmməd ibn Əli ibn Hilal Kərxi, Məhəmməd ibn Şazan, Əhməd ibn Həsən Xazən, Əli ibn Məhəmməd ibn İshaq Əşəri, Übeydullah ibn Süleymanın gedişi ilə bağlı xəbər, ibn Əbu-Ğanim Qəzviniyə cavab, Məhəmməd ibn Yəzdaza cavab, Qasim ibn Əlaya cavab, Rəbəz əhlindən olan kişiyə cavab, Qumdan olan sailə cavab, Həsən ibn Əbdül-Həmid, Məhəmməd ibn Cəfər Ərəbi, Əbül-Həsən Xızır ibn Məhəmmədə cavab, Şeyx Müfid, Şeyx Müfidə ikinci göstəriş, Əli ibn Babəveyhə cavab, Məhəmməd ibn Kəşmirə cavab, Cəfər ibn Həmədana cavab, Əli ibn Ziyada cavab, Qasim ibn Əla, Əbül-Qasim ibn Əbu-Cüləys Rəqə Bərxi, Əhməd ibn Həsən, Məhəmməd ibn Həmmam və başqaları.

## (Böyük qeyb (Qeybəti kübra

?Sual: ٢٧٢. Böyük qeyb dövrünün hansı xüsusiyyətləri var

Cavab: Böyük qeyb dövrü kiçik qeyb dövründən sonra başlamışdır. Bu dövr imamın qeyd etdiyi hicri ٣٢٩-cu ilə təsadüf edir. Həmin ildə imam Məhəmməd Səməriyə məktub yazmaqla səfirlik dövrünün başa çatdığını və böyük qeyb dövrünün başladığını xəbər verdi.

:Böyük qeyb dövrünün bir sıra səciyyələri mövcuddur

١. Həmin dövrdə müsəlmanlar zahirən öz rəhbərlərindən ayrı düşdülər. Onlar rəhbəri

görmür, ya da görüb tanımırdılar. Bu hökm bütün şiələrə aid idi. Əlbəttə ki, bəzi .səbəblərdən kimlərsə həzrətlə görüşə bilərdi

Həmin dövrdə yer üzündə zülm-sitəm genişləndi. Bu səciyyə hazırkı dövrü İslam .٢ peyğəmbərinin həyatındakı İslam hökuməti dövründən fərqləndirir.

Bu dövrdə İslam ümmətinin sınağa çəkilməsi; Çünki bu dövrdə xalq bir sıra .٣ çətinliklərlə üzbəüz dayanmışdı: İslam cəmiyyətində və dünyada fitnə-fəsadın genişlənməsi; siyasi sıxıntılar və haqqın qəbulu ilə bağlı problemlər; imamın varlığı ilə bağlı bir sıra şübhələrin ortaya çıxması;

Nəticədə görürük ki, imamlar bu mövzuya xüsusi diqqət yetirmişlər. Həzrət Musa ibn Cəfər buyurur: "Yeddinci övladdan olan beşinci övlad qeybə çəkildikdə dininizdən ehtiyatlı olun etiqadınızı əldən verməyin. Ey övladım! Qəti olaraq, Qaim üçün qeyb dövrü var. Bu qeybə etiqad sınaq olar və Allah bu çətinliklə xalqı imtahana çəkər..."(١)

Sual: ٢٧٣. Həzrət Mehdinin (ə) qeybinin hansı səciyyəsi var?

Cavab: Bu qeyblə bağlı iki nəzəriyyə mövcuddur:

Bu nəzəriyyəyə əsasən, həzrətin vücudu xalqın gözündə məxfidir. Bu baxış müəyyən .١ rəvayətlərlə əsaslandırılır. İmam Riza (ə) buyurmuşdur: "Onun misli görünməz".(٢) İmam Sadiq (ə) buyurmuşdur: "Yeddinci övladdan olan beşinci övlad sizdən qeybə çəkiləcək".(٣)

İkinci baxışa əsasən, xalq onu görür, amma onun Mehdi (ə) olmasından xəbərsizdir. .٢ Bu baxışa Məhəmməd ibn Osman Əmridən nəql olunmuş rəvayət dəlil göstərilir. İmam buyurur: "And olsun Allaha! Həqiqətən, imam Qaim hər il həcc mövsümündə vardır və xalqı görür. Xalq da onu görür, amma tanımır."(٤)

Sual: ٢٧٤. Hazırda yer üzünü zülm-sitəm bürüdüyü halda nə üçün imam zühur etmir?

Cavab: Əksər hədislərdə bildirilir ki, həzrət zühur etdikdən sonra Allah onun vasitəsi ilə yer üzündə ədaləti bərqərar edəcək. Əslində bu o demək deyil ki, imamın zühuru üçün zülm-sitəmin yayılması şərtdir.

Başqa sözlə, zülm-sitəm məqsəd deyil. Məqsəd hazırlıq və hədəfdir. Bəziləri elə düşünürlər ki, imamın zühuru üçün yer üzünü zülm-sitəmin bürüməsi kifayətdir.

insanların hazırlığı, zühura təşnəliyi mühümdür. Bu təşnəliyi və hazırlığı yaradan səbəblərdən biri kimi zülm-sitəm qeyd oluna bilər. Yalnız zülm-sitəm yayıldıqda bütün .insanlar ədalətsizliyin acılığını hiss edib ədalət sorağında olur

Nəticədə, deməliyik ki, zühur üçün əsas şərt insanların hazırlığı və nizamsızlığın .aqibətindən xəbərdarlığıdır. Bir sözlə, zülm-sitəm əsas şərt deyil

?Sual: ٢٧٥. Nə üçün həzrət Mehdi (ə) etibarlı möminlərə zahir olmur

Cavab: Əvvəla, həzrət bir şəxsə zahir olmaq üçün inandırıcı möcüzələr göstərməlidir. Bu halda hoqqabaz sehrbazlar xalqı öz sehrləri ilə aldadıb özünü əsrin imamı kimi .təqdim edə bilər

İkincii, yaramaz insanlar bu məsələdən istifadə edib yalan iddialar irəli sürə bilər. Bütün bu azğınlıqların və çaşqınlıqların qarşısını almaq üçün uyğun görüşlərdə məhdudiyyət var. Əlbəttə ki, ali məqam sahibi olan nadir insanlar müəyyən .məsələlərlə bağlı həzrətlə görüşə bilər

?Sual: ٢٧٦. Böyük qeyb dövründə ümumi naiblik məsələsi necə izah olunur

Cavab: Ümumi naiblik dedikdə hər bir dövrdə etibarlı bir şəxsin cəmiyyətdə imamın nümayəndəsi kimi tanınması nəzərdə tutulur. Kiçik qeyb dövründə təqdim olunan .naiblər xüsusi naiblər idi

Rəvayətlərə əsasən, ümumi naiblik məqamı imamların, xüsusi ilə həzrət Mehdinin (ə) vasitəsi ilə ləyaqətli fəqihə verilir. Uyğun baxışın sübutu üçün iki rəvayət misal .göstərilə bilər

Əmr ibn Hənzələ imam Sadiqdən (ə) soruşur ki, iki şiə arasında mübahisə baş .١ verdikdə dövrün hakimi tərəfindən təyin olunmuş qaziyə müraciət etmək olarmı? Həzrət buyurur: “Onlara müraciət haramdır. Onlara müraciət zalım hakimə müraciətdir. Allah zalım hakimə müraciəti qadağan etmişdir.” Əmr növbəti dəfə sual verir: “Bəs nə edilməlidir? Müraciət edilməyəcəyi halda həmin şəxsin haqqı tapdanır?” Həzrət zəruri şərtlərə malik alimləri meyar göstərərək buyurur: “Özünüz şiə fəqihlərindən hədislərimizi rəvayət etmiş, halal-haramı tanımış, hökmlərimizi bilən

şəxsi seçib çətinliklərinizi onun vasitəsi ilə həll edin. Çünki onlar mənim tərəfimdən seçilmişdir və mən də onları sizə hakim etmişəm. Əgər onlara müraciətdən sonra mübahisə edən tərəflər sağlam hökmü qəbul

etməsə, bizi rədd etmişdir. Bizi rədd edən əslində Allahı rədd edir. Belə bir şəxs müşrik (yerindədir."(١)

İshaq ibn Yəqub həzrət Mehdidən (ə) müəyyən sualların cavabını istəyir. İmam .٢ suallara cavab olaraq naib Məhəmməd ibn Osman Əmri vasitəsi ilə qeydlərini göndərir. Həmin məktubda əks olunan məsələlərdən biri budur: "Qarşıya çıxan hadisələrdə hədislərimizi rəvayət edənlərə müraciət edin. Onlar bizim üçün (höccətdir."(٢)

?Sual: ٢٧٧. Xalqın həzrət Mehdiyə (ə) yönəlmələri üçün nə etməliyik

Cavab: Xalqın həzrət Mehdiyə (ə) meyli onun şəxsiyyətini tanımalarından asılıdır. Kimsədə bilmədiyi məchul bir şeyə meyl olmur. Bu səbəbdən də vəzifəmiz həzrət Mehdini (ə) bütün bəşəriyyətə tanıtdırmaqdır. Xalq bilməlidir ki, qeyb dövrünün xüsusiyyətləri nədir, insan zühur dövründə hansı bərəkətlərə çatır, bütün yer üzünü ?zülm-sitəm necə bürüyür, həzrətin zühuru ilə bəşəriyyət zülmətlərdən nura necə çıxır

Bulud arxasındakı günəşdən bəhrələndiyimiz kimi, qeybdəki imamdan bəhrələnmiş olsaq da, zühur dövrünün bəhrəsi başqadır! Zühurla bağlı incə nöqtələr aydınlaşdıqda .bu məsələ insanların diqqətini cəlb edir, onlarda həzrətə meyl yaranır

?Sual: ٢٧٨. Hansı yolla həzrət Mehdini (ə) görmək olar

:Cavab: İnsan iki yolla həzrəti görə bilər

Ruhi kamilliklərə çatmaq yolu ilə: İnsan bu yolla özünü əxlaqi çirkinliklərdən .١ təmizləyir, şəri göstərişlərə əməl etməklə elə bir dərəcəyə çatır ki, həzrətlə görüş .ləyaqətini əldə edir

Bəzi rəvayətlərdə uyğun məsələ ilə bağlı nəql olunmuş bəzi göstərişlərə əməl etmək .٢ yolu ilə: Məsələn, hər kəs ۴٠ həftə ərzində ۴٠ gecə Səhlə məscidinə gedib qəlb iştirakı .(hüzuri-qəlb) ilə həzrəti düşünsə, Allahdan belə bir görüş diləsə, məqsədinə çatar

۱- [۴۸۷] “Üsule-Kafi”, c. ۱, s. ۶۷.

۲- [۴۸۸] “Kəmalud-din”, s.۴۸۴; “Əl-Ğeybət”, s. ۱۷۷.

?Sual: ۲۷۹. Nə üçün “Qaim” (Mehdi) adı çəkildikdə ayağa qalxırıq

Cavab: Hacı Nuri yazır: “İmam Sadiqdən (ə) belə nəql olunmuşdur: “Bir gün imam Sadiqin (ə) məclisində həzrət Mehdinin (ə) mübarək adı çəkildi. İmam Sadiq (ə) təzim (və ehtiram əlaməti olaraq yerindən qalxdı.”(۱

Digər bir rəvayətdə deyilir ki, Dəbəl Xəzai imam Rizanın (ə) yanında həzrət Mehdi (ə) (ilə bağlı bir neçə beyt oxuduqdan sonra həzrət ayağa qalxdı...”(۲

Mirzayi Nuri deyir: İmam Rizanın (ə) məclisində həzrət Höccətin adı çəkildikdə həzrət (qalxdı və iki mübarək əlini başına qaldırıb zühurun tezləşməsi üçün dua etdi.(۳

İmam Sadiqdən (ə) soruşuldu: “Həzrət Mehdinin (ə) adı çəkildiyi vaxt nə üçün yerimizdən qalxaq?” Həzrət buyurdu: “Həzrət Mehdinin (ə) qeybi uzun çəkər. O öz dostlarını çox sevdiyindən, yada salındığı zaman dostuna nəzər salar. Həzrəti yada salan şəxs ehtiram əlaməti olaraq yerindən qalxsa yaxşıdır. Həzrət Mehdinin (ə) ona baxdığı bir anda onun ayağa qalxması, Allahın zühurun tezləşməsini istəməsi (yaxşıdır.(۴

Sual: ۲۸۰. Qeyri-müəyyən və müəyyən (növi və şəxsi) Məhdəviyyət dedikdə nəzərdə ?nə tutulur

Cavab: Bəzən Məhdəviyyəti iki qismə bölürlər. Məsələn, deyirlər ki, sünnə əhli onu bir növi Məhdəviyyət olaraq qeyri-müəyyən şəkildə qəbul edir. Şiələr isə konkret bir .şəxsin Mehdi (ə) olduğuna inanır

Bəli, şiələr Məhdəviyyət (ə) məsələsinə konkret yanaşır. Yəni onlar inanırlar ki, həzrət Mehdi (ə) real şəxsdir, o dünyaya gəlmişdir və hazırda diridir. Şiələr həzrət Mehdinin .(ə) zühuruna inanır, onun imam Əsgərinin (ə) övladı olduğunu iddia edirlər

Sünnə əhli isə Məhdəviyyət (ə) məsələsinə başqa cür yanaşır. Onlar inanırlar ki, dünyanın sonunda peyğəmbər nəslindən olan bir şəxs dünyaya gələcək və yer üzü .zülm-sitəmlə dolduqdan sonra, onda ədaləti bərqərar edəcək

۱- [۴۸۹] “Nəcmus-Saqib”, s. ۴۴۴.

۲- [۴۹۰] “Muntəxəbul-Əsər”, s. ۵۰۵.

۳- [۴۹۱] Həmin mənbə.

۴- [۴۹۲] Həmin mənbə.

Məhdəviyyət (ə) məsələsinə ikili yanaşmaya irfanda da diqqət yetirilmişdir. Sünni ariflərindən bəziləri, eləcə də, Mövləvi bu əqidədədir ki, hər bir dövrdə istər Əli, istər Ömər nəslindən, bir Mehdi (ə) olmalıdır. Ariflər Mehdi (ə) dedikdə imkan aləminin qütbünü (zirvəsini) nəzərdə tuturlar. Şiələr isə inanır ki, hər bir dövrdə məsum imam .olmalıdır və yer üzü imamsız yaşamaq gücündə deyil

?Sual: ۲۸۱. Böyük qeyb dövründə müqəddəs nahiyə tərəfindən bəyanat verilmişdirmi

Cavab: Şeyx Təbərsi "Əl-ehticac" kitabında həzrət Mehdinin (ə) müqəddəs nahiyəsi tərəfindən Şeyx Müfid üçün göndərilmiş iki məktubdan danışır. Bu iki məktubda bəzi (aşkar və bəzi rəmzi bildirişlər var.(۱

Bu məktublardan birincisi hicri ۴۱۰-cu il, səfər ayının axırlarında, Şeyx Müfidin vəfatından ۳ il öncə ona çatmışdır. İkinci məktub isə hicri ۴۱۲-ci ildə, yəni Şeyx Müfidin vəfatından bir il öncə göndərilmişdir. Bu isə ۴-cü səfir Əli ibn Məhəmməd Səmərinin vəfatından ۸۰ il sonraya təsadüf edir. Xatırlayaq ki, hicri ۳۲۹-cu ildə kiçik qeyb dövrü .başa çatmışdır

Birinci məktubu gətirən deyir: Bu məktub Hicaza bitişik bir məntəqədən gətirilmişdir." Deyilənlərdən məlum olur ki, imam həmin vaxt Hicaz məntəqəsində sakin olmuş və bu .məktubu yaxınlarından biri vasitəsi ilə Şeyx Müfidə göndərmişdir

İkinci məktub hicri ۴۱۲-ci ilin şəvval ayının əvvəlində Şeyx Müfidə göndərilmişdir. Həmin ilin zil-həccə ayının ۲۳-də cümə axşamı günü şeyx həmin məktubu almışdır. Yəni qasid üç aydan yeddi gün əskik müddətdə yolda olmuşdur. Hər iki məktub həzrət Mehdinin (ə) imzası, ona yaxın adamların xətti ilə yazılmışdır. Hər iki məktubun sonunda imam öz xətti ilə məktubun həqiqiliyini təsdiqləmişdir. Məktublarda şeyx Müfidə əmr olunur ki, bu məktubu gizli saxlasın, yalnız ən etibarlı səhabələri xəbərdar (etmək üçün nüsxə çıxarılsın.(۲



---

.Ehticac", c. ۲, s. ۵۹۷-۶۰۲" [۴۹۳] -۱

Tarixul-Ğeybətul-Kubra", s. ۱۴۰, ۱۴۱" [۴۹۴] -۲

Sual: ۲۸۲. Şeyx Müfidə yazılmış məktubların imam Mehdi (ə) tərəfindən göndərilməsi ?necə sübut oluna bilər

Cavab: Bu iki məktubun həqiqiliyinə müxtəlif baxımlardan əmin olmaq mümkündür. Onları nəql etmiş Şeyx Təbərsi sənəd göstərməsə də, müəyyən nöqtələrə istinad :etmək olar

Təbərsi bu iki rəvayəti şübhə doğurmayan aşkar rəvayətlərdən sayır. Məlum olur ki, .۱ o mötəbər sənədlərə əsaslanmışdır. Bir çox rəvayətlər kimi bu iki rəvayət də çox .məşhur olduğu üçün sənədsiz nəql oluna bilər

Bu iki rəvayətdəki ali məzmun və sadiq xəbərlər onların məhz həzrət Mehdi (ə) .۲ .tərəfindən göndərilməsinə əminlik yaradır

Uyğun iki məktubun həqiqiliyini göstərən digər məlumatlar da var. Mühəddis Bəhrani imam Mehdinin (ə) Şeyx Müfidə həsr olunmuş və qəbri üzərində yazılmış şerini nəql etdikdən sonra buyurur: "Həzrət Mehdinin (ə) nahiyəsindən Şeyx Müfidə ünvanlanmış məktubları nəzərə aldıqda onun Şeyx haqqında şer söyləməsi təəccüb doğurmur. Bu məktublarda tərif dolu xoş sözlər çoxdur..." Müəllif sonra yazır: "Suali-əhli-Hələb" adı :ilə tanınmış risalədə Şeyx Müfidin ehtiramı ilə bağlı deyilir

;a) Məsum imamlardan nəql olunanların həqiqiliyi

b) Bütün şiələrin şeyx Müfidə həzrət tərəfindən iki məktub yazılması xəbərini qəbul etməsi – İldə bir məktubun yazılması şeyx Müfidin etibarlılığını göstərir. İbn Bətriq bildirir ki, bu xəbər icma dəlili ilə qəbul olunur. Təbərsi "Ehticac" kitabında qeyd edir ki, bu iki məktub alimlər icması tərəfindən qəbul olunduğundan sənədləri göstərməyə .ehtiyac yoxdur

İbn Şəhr Aşub "Məalimul-üləma" kitabında qeyd edir ki, onu (şeyxi) həzrət Mehdi (ə) ("Şeyx Müfid" adlandırdı..."(۱

Təbərsi "Ehticac" kitabının müqəddiməsində deyir: "Nəql etdiyimiz bir çox .۳ rəvayətlərin sənədini ona görə göstərmirik kki, onlar ya icma tərəfindən qəbul (olunmuşdur, ya da əql və şöhrət dəlili ilə sübuta yetir..."(۲

Böyük qeyb dövründə bu iki məktubun yazılmasına ehtiyac və zərurət olmuşdur. .۴ Əvvəla, həzrət bu məktublar vasitəsi ilə şiələrə zəruri göstərişlər vermişdir. İkincisi, Şeyx Müfid kimi saleh alimlərə



---

.Məalimul-üləma", s. ۱۱۳" [۴۹۵] -۱

.Müqəddimeye-Ehticac", s. ۱۴" [۴۹۶] -۲

bu sayaq məktubların göndərilməsi onların rəyasətini təsdiqləyir, böyük qeyb dövründə xalqı belə alimlərə itaətə çağırır. Necə ki, bir məktubda ibn Babəveyhə "ya .Şeyx, ya Əbəl-Həsən" deyə xitab olunur

?Sual: ٢٨٣. Peyğəmbərlər arasında qeyb hadisəsi baş vermişdirmi

Cavab: Qeyb və Allah höccətinin xalqdan kənara çəkilməsi təzə bir iş deyil. Bu, peyğəmbərlər arasında da müşahidə olunan bir həqiqətdir. Qeyb həyatı yaşamış bəzi :peyğəmbərləri yada salaq

Həzrət İdris (ə). Rəvayətlərə əsasən, İdris peyğəmbər dövrün zalım hakimləri ilə .١ üzbəüz gəldiyi üçün ümmət arasından iyirmi il qeybə çəkildi. O dağlarda, mağaralarda (yaşayırdı. Allah hər qürub vaxtı ona qida gətirən mələk təyin etmişdi...(١

Həzrət Saleh (ə). Şeyx Səduq imam Sadiqin (ə) belə buyurduğunu nəql edir: . ٢ ."Həqiqətən, Saleh bir müddət öz qövmündən qeybə çəkildi

O qeyb zamanı qoca bir kişi idi. Qövmünün yanına qayıtdığı vaxt onu üzdən tanıyan (olmadı..."(٢

Həzrət İbrahim (ə). Rəvayətlərə əsasən həzrət İbrahim də anadan olduqdan sonra .٣ (bir müddət məxfi qalmış, Allahın əmri nazil olanadək öz risalətini gizlətmişdir.(٣

Həzrət Musa (ə). Səduq belə nəql edir: "Həzrət Musa Misirdən Mədyənə qaçıb bir .۴ (müddət həzrət Şüeybin yanında qaldı..."(۴

Həzrət Şüeyb (ə). Məclisi həzrət Əlinin (ə) belə buyurduğunu nəql edir: "Şüeyb . ۵ peyğəmbər qocalanadək öz qövmünü Allaha doğru dəvət etdi. Həmin vaxt Allahın (istədiyi dövrədək xalqdan qeybə çəkildi. Sonra cavan halda onların yanına qayıtdı..."(۵

Həzrət İlyas (ə). Qütb Ravəndi nəql edir ki, həzrət İlyas öz qövmü arasında ٧ il qeybə .۶ (çəkildi. Həmin müddət ərzində səhra və çöllərdə yaşadı.(۶

Həzrət Danyal (ə) nəbi: Şeyx Səduq deyir: Danyal nəbi ٩٠ il müddətində qövmü . ٧ arasından qeybə çəkildi. O, Bəxtun-Nəsrin əlində əsir oldu. Ardıcılları bu müddət (ərzində onun intizarında qaldılar." ("Kəmalud-din", c. ١, s.٣٨۵

---

۱- [۴۹۷] “Kəmalud-din”, c. ۱, s.۱۳۰».

۲- [۴۹۸] “Kəmalud-din”, c. ۱, s.۱۳۶, ۱۳۷.

۳- [۴۹۹] “Kəmalud-din”, c. ۱, s.۱۳۸.

۴- [۵۰۰] “Kəmalud-din”, c. ۱, s.۱۴۵.

۵- [۵۰۱] “Bihar”, c. ۱۲, s. ۳۸۵.

۶- [۵۰۲] “Qəsəse-Ravəndi”, s. ۲۴۸.

Həzrət İsa (ə):Həzrət İsanın iki növ qeybi olmuşdur: Birinci qeyb Şam və Misirdə ١٢ il .٨ çəkdi, ikinci qeyb dar tək təhlükəsi olan gündən bu günədək davam edir. Həzrət İsa (ə) .həzrət Mehdinin (ə) zühuru zamanı ədalət hökumətinin təşkilində iştirak edəcək

?Sual: ٢٨۴. Əgər həzrət Mehdi (ə) xalq arasında görünsəydi, bunun nə eybi vardı

Cavab: Bəziləri irad tuta bilər ki, həzrət Mehdi (ə) xalq arasında görünsəydi, bunun heç bir eybi olmazdı. Unutmamalıyıq ki, həzrət Peyğəmbər (s) və məsum imamların buyurduğu kimi, zülm-sitəm quruluşu həzrət Mehdinin (ə) əli ilə devriləsidir. Bu :səbəbdən də onun varlığı iki zümrənin diqqət mərkəzindədir

a) Əgər imam xalq arasında görünsəydi, dünyanın çoxsaylı məzlumları onun ətrafında toplanar və ondan qiyam tələb edərdilər. Hansı ki, hələ ümumdünya ədalət hökuməti .üçün şərait yaranmamışdır

b) Məzlum millətlərə hakim kəsilmiş qaniçən rejimlər öz mənafelərinə çatmaq yolunda heç nədən çəkinmirlər. Onlar azğın məqsədlərini həyata keçirmək naminə bütün bəşəriyyəti qurban verməyə hazırdılar. Onlar həzrət Mehdini (ə) hər an aradan götürə .bilərdilər

?Sual: ٢٨۵. Allah həzrət Mehdini (ə) qeybə çəkmədən qoruya bilməzdimi

Cavab: Əvvəla, möcüzə prinsipcə təbiət qanunlarına ziddir. Yalnız zəruri hallar .istisnadır. Allah həzrət Mehdini (ə) qeybi yolla qorumaq istəmişdir

İkincisi, ilahi təqdirlər reallıqlar şəklində dəyişir. Allah-təala İslam ümmətinin hidayəti üçün ١٢ məsum imam qərar vermişdir. Amma onların biri o birinin ardınca şəhadətə yetirildi. Bütün bunlar həzrət Mehdinin (ə) bir müddət qeyb pərdəsi arxasında qorunması ilə müşayiət olunan təqdirlə nəticələndi. Məqsəd imamın qeybini hiss .etdirmək, zühur ilə onun qədr-qiymətə çatdırmaq idi

Üçüncüsü, ayə və rəvayətlərə əsasən, Allah-təalanın qəti sünnələrindən biri ümmətlərin imtahanıdır. İslam ümməti üçün də bu qanun istisna deyil. Hər bir ümmət bir yolla imtahana çəkilir. İslam ümmətinin imtahanı hazırkı dövrdə imamın qeybi ilə bağlıdır. Müəyyənləşdirilir ki, insanlar məhz qeyb halında din və məzhəblərində

?Sual: ۲۸۶. İmamın xalq arasında olması ilə sitəmkarları təslim etmək olmazdımı

Cavab: Məlum məsələdir ki, bir çoxları haqq-ədalət qarşısında təslim olmur. Yaranışın ilk günlərindən bu günədək bəşəriyyət arasında haqq-ədalətə düşmən kəsilənlər olmuşdur. Onlar haqqı aradan götürmək üçün var qüvvələri ilə çalışmış, öz çirkin məqsədlərinə çatmaq yolunda heç nədən çəkinməmişlər. Əgər həzrət Mehdi (ə) qeybə çəkilməsəydi, heç şübhəsiz, onu aradan götürmək istəyəcəkdilər. Amma şərait .yaranmadığından haqqın batilə qələbəsi mümkün olası deyildi

Sual: ۲۸۷. Əgər imam aşkar olub öz dövrünün zalımları ilə sülh müqaviləsi bağlasaydı ?nə olardı

Cavab: Məhdəviyyət (ə) məsələsi ilə tanış olanlar yaxşı bilirlər ki, həzrət Mehdinin (ə) proqramı digər imamların proqramlarından fərqlənir. Digər imamlara dinin yayılmasında var gücü ilə çalışmaq əmr olunmuşdu. Onlara savaş göstərişi verilmədiyindən bəzən öz dövrlərinin hakimi ilə müqavilələr bağlayırdılar. Amma həzrət Mehdinin (ə) missiyası başqa imamlardan fərqlidir. Qərara alınmışdır ki, həzrət yalnız zühur etməklə zülmə qarşı çıxıb ədaləti bərpa etsin. Bu səbəbdən də onun .boynunda kimsəyə beyət olmamalıdır. Çünki hər an zühur baş verə bilər

İmam Sadiq (ə) buyurmuşdur: "Həzrət Mehdinin (ə) mövludu ona görə məxfidir ki, zühur etdiyi vaxt kimsə qarşısında öhdəçiliyi olmasın. Allah Öz əmrini bir gecədə (gerçəkləşdirər."(۱

Bundan əlavə, zalım hakimlər hər an bu qiyamı gözlədiklərindən və həzrətlə heç bir .müqavilələri olmadığından çıxış yolunu yalnız onu öldürməkdə görürlər

?Sual: ۲۸۸. Əsrin imamının qeyb fəlsəfəsi nədir

Cavab: Qeyb dövrünün tarix boyu ən aktual suallarından biri imamın hansı məqsədlə .qeybə çəkilməsi olmuşdur

:Araşdırmaya bizə həqiqəti aydınlaşdıracaq bir müqəddimənin bəyanı ilə başlayırıq

Allah-təala Quran-Kərimdə və İslam peyğəmbəri öz buyuruqlarında İslam dininin .۱

.bütün dinlərə qələbəsini vəd etmişlər



---

.Bihar”, c. ۵۲, s. ۹۶“ [۵۰۳] -۱

Allah-təala buyurur: “Öz rəsulunu müşriklər ikrah duysa belə, bütün dinlərə qalib gəlmək üçün xalqın hidayətinə haqq dinlə göndərən Odur (Allahdır).”(١)

٢. Bəndələrin halında ixtilaf göründükcə onların məsləhət və tədbiri dəyişir. Allah-təala bəndələri ilə bağlı tədbiri öz öhdəsinə götürmüşdür. Onların ağlını kamilləşdirmiş, onları saleh əmələ yönəltmişdir. Yalnız bu yolla insan səadətə çata bilər. Əgər insanlar Allahın göstərişlərinə əməl etsələr, onlara yardım göstərmək Allahın öhdəsinədir. Vəzifəsini yerinə yetirən insana Allah öz yardımını artırır, getdiyi yolu onun üçün asanlaşdırır. Amma insan ilahi göstərişlərə qarşı çıxdıqda, günaha yol verdikdə məsləhət dəyişir və nəticədə mövqelər də əvəz olur. Bu halda Allah öz tövfiqini, yardımını insandan kəsir və o məzəmmət olunur. Allah ardıcıl olaraq öz imamlarını xalqa doğru göndərmişdir. Amma insanlar Allah övliyalarını qətlə yetirdiklərindən Allah son imamını qeybə çəkmişdir.

٣. İstər kiçik, istər böyük ictimai iş münasib şərait tələb edir. Bu səbəbdən də ümumdünyəvi qiyam üçün xüsusi hazırlıq olmalıdır.

٤. Heç şübhəsiz, zühur əsrində dinin qələbəsi fövqəladə qüdrətə, əhatəli elm və paklığa malik olan rəhbər və imama ehtiyaclıdır.

٥. Şiə və sünnilər arasındakı mütəvatir rəvayətlərə əsasən, həzrət Peyğəmbər (s) özündən sonra ardıcıl şəkildə gələcək ١٢ imamı sadalamışdır.(٢)

٦. Rəvayətlərdən və əqli dəlillərdən məlum olur ki, qiyamət gününədək yer üzündə məsum imamın, ilahi höccətin olması zəruridir.

Mərhum Kuleyni səhih bir sənəd əsasında Əbu-Həmzədən belə nəql edir: İmam Sadiqdən soruşdum ki, yer üzü imamsız qalarmı? Həzrət buyurdu: “Əgər yer üzü imamsız qalsa, məhv olacaq.”(٣)

٧. Peyğəmbərin və rəsulların kənara çəkilmə səbəblərindən biri İslam şəriətini yaymaq məqsədi ilə qətldən qorunmaq olmuşdur. İmam Mehdi (ə) də qorunmaq üçün təbii vasitələr gücdən düşdüyündən Allahın əmri ilə qeybə çəkilmişdir.

İmam Sadiq (ə) Zürarəyə buyurur: “Qaim (Mehdi) üçün qiyamından öncə bir qeyb var.”

Zürarə deyir: “Həzrətə ərz etdim ki, hansı səbəbdən? Həzrət buyurur: “Qətlindən çəkindiyi üçün.”(۴)



---

۱- [۵۰۴] “Tövbə”, ۳۳; “Səff”, ۹.

۲- [۵۰۵] “Səhihe-Buxari”, c. ۸, s. ۱۲۷.

۳- [۵۰۶] “Kafi”, c. ۱, s.۱۷۹.

۴- [۵۰۷] “Kəmalud-din”, c. ۲, s.۴۴۱.

۸. İmamın qeybə çəkilmə amillərindən biri onun əsrin zalım hakimlərinə beyətə məcbur edilməməsidir.

Şeyx Səduq imam Sadiqin (ə) dilindən nəql edir: "Qaim (Mehdi) öhdəsində kimsə ilə beyət olmayan bir halda qiyam edəcək."(۱)

۹. Hidayət bir neçə qisimdir:

a) Fitri hidayət: Bu, fitrət yolu ilə hidayətdir. Qurani-Kərimdə oxuyuruq: Üzünü Rəbbinin xalis ayininə doğru tut. O, Allahın insanları yaratdığı vaxt onlara verdiyi fitrətdir. İlahi yaranışda nizamsızlıq yoxdur. Budur möhkəm ayin. Amma xalqın əksəri bilməz."(۲)

b) Təşrii (şəriət yolu ilə) hidayət: Bu, xalqın onlar arasındakı imam vasitəsi ilə doğru yola yönəldilməsidir. Qurani-Kərimdə oxuyuruq: "(Öncə) Xalq bir dəstə idi. (Onlar arasında ziddiyyət yarandı, tədricən təbəqələr əmələ gəldi.) Allah xalqa müjdə vermək və onu qorxutmaq üçün peyğəmbərlər seçdi. Xalq arasında ixtilaflı məsələlərdə mühakimə üçün haqqa dəvət edən səmavi kitab nazil oldu..."(۳)

v) Təkvini (təbiət qanunları vasitəsi ilə) hidayət: Bu, varlıq nizamında tədbir tökməklə hidayətdir. Qurani-Kərimdə oxuyuruq: "Kitabdan elmi olan kəs dedi: "Gözünü qırpmamışdan qabaq onu sənin yanına gətirəcəyəm." (Süleyman) Onu (taxtı) yanında dayanmış gördü və dedi: "Bu mənim Rəbbimin fəzlindəndir. Məni imtahana çəkir ki, görən şükür, yoxsa küfr edəcəyəm?!"(۴)

q) Batini hidayət: O, təkvini vilayətin bir şöbəsidir və istəyə çatdırma mənasını bildirir. Qurani-Kərimdə oxuyuruq: Onları insanlara rəhbər etdik ki, xalqı bizə doğru hidayət etsinlər. Hər yaxşı işi, xüsusilə namazın bərpası və zəkat ödənməsini onlara vəhy etdik, onlar da bizə ibadətə qatıldılar."(۵)

Yuxarıdakı müqəddiməni nəzərdən keçirdikdə belə bir nəticə əldə edirik ki, həzrət Mehdinin (ə) nazənin varlığı haqlı olaraq vəd olunmuş günədək pərdə arxasında qalmalı, yalnız zəmin yarandıqdan sonra Allah-təalanın izni ilə zühur etməlidir.

۱- [۵۰۸] ”Kəmalud-din“ ».

۲- [۵۰۹] ”Rum”, ۳۰“.

۳- [۵۱۰] ”Bəqərə”, ۲۱۳“ «.

۴- [۵۱۱] ”Nəml”, ۴۰“.

۵- [۵۱۲] ”Ənbiya”, ۷۳“.

?Sual: ٢٨٩. Həzrət Mehdi (ə) ilə bağlı şeyxiyyə firqəsi hansı əqidədədir

Cavab: Şeyx Əhməd Ehsainin rəyasəti ilə formalaşmış şeyxiyyə əqidəsinə əsasən, xüsusi bir şəhərdə yerləşmiş xüsusi bir bədən forması mövcuddur. O öz baxışına əsasən bu nəzəriyyə ilə üç mühüm və dərin fəlsəfi məsələni təhlil etmişdir: Peyğəmbərin cismani merac səfəri, cismani məad və imam Mehdinin (ə) ١٠ əsrdən çox çəkmiş həyatı. Onun əqidəsincə, əsrin imamı qeyd olunmuş şəhərdə qeyri-maddi, .xüsusi bir bədənlə yaşayır

(Şeyx Əhməd Ehsai imam Mehdini (ə) diri və xüsusi bir aləmdə mövcud bilir.(١

O deyir: "O xüsusi varlıq iki xüsusi şəhərdən ibarət son mülkdür. Həzrət Qaim (Mehdi) dünyada misal aləmində deyil." O sözünə belə davam edir: "Əsrin imamı qeyb dövründə həmin xüsusi aləmdədir və istədiyi vaxt bizim aləmin surətində buraya gəlir ".və kimsə onu tanımır

?Sual: ٢٩٠. "Cabulqa" və "Cabursa" dedikdə hansı şəhərlər nəzərdə tutulur

Cavab: ٢٨٩-cu sualda Şeyx Əhməd Ehsainin nəzərdə tutduğu şəhərlər «Cabulqa» və «Cabursa» adlanırdı. Bu şəhərlər haqqında Əbdül-Kərim Səfipur deyir: «Cabursa qərbdə bir şəhərdir və ondan sonra insan yoxdur. Cabulqa isə şərqin Cabulsaya qardaş «.şəhəridir

Xələf Təbrizi deyir: "Misal aləmi haqqında deyirlər ki, Cabulqa və Cabursa müsul aləmində iki şəhərdir. Bu məsələni araşdıran alimlər bildirirlər ki, bu mənzil salikin ((haqq yolçusunun) son mənzilidir. Sonra bildirilir ki, Cabulqa salikin ilk mənzilidir.(٢

Qütbüddin Şirazi Cabulqa və Cabursa şəhərləri haqqında deyir: "Bu iki şəhər müsul (ünsürləri aləminin şəhərlərindəndir."(٣

Şeyx Əhməd Ehsainin tanınmış şagirdlərindən olan Seyid Kazim Rüşti deyir: "Cabulqa və Cabursa xalqdan haqqa doğru ilk səfərdə qərar tutur. Bu səfərin müxtəlif məhəlləri var. Onun ١٩-cu məhəlli "xəzirətul-qüds" adlanır və bu məhəldə misali quşlar qərar tutur. Cabursa və Cabulqa bu şəhərin iki məhəllidir. Bu məhəllərdən hər

---

.İrşadul-əvam", c. ۲, s. ۱۵۱" [۵۱۳] -۱

.Burhani-qate", c. ۴, s. ۵۵۲" [۵۱۴] -۲

«Şərhe-hikmətul-işraq", s. ۵۱۷-۵۵۶" [۵۱۵] -۳

birinin ٧٠٠٠٠ qapısı var. Hər bir qapının ağzında ٧٠٠٠٠ ümmət dayanır. Onlar bir-birləri ilə ٧٠٠٠٠ dildə danışır və heç bir dilin o biri dilə oxşarlığı yoxdur."(١)

?Sual: ٢٩١. "Hurqəlya bədən" dedikdə hansı bədən nəzərdə tutulur

(Cavab: Şeyxiyyə əqidəsinə əsasən, imam Mehdi (ə) "hurqəlya bədəndə" yaşayır.(٢)

Şeyx Əhməd Ehsayi bildirir ki, "hurqəlyə" sabiin dilindən götürülmüşdür və Suryani .(Suriya) kökündəndir

Qütbüddin Şirazi deyir: Cabulqa və Cabursa müsul ünsürlü dəyərlərdəndir. Hürqəlya (müsul əflakındandır. Deməк, hurqəlya daha üstündür.(٣)

Dediklərimizdən məlum olur ki, "hurqəlya aləm" dedikdə həmin misal aləmi nəzərdə tutulur. Çünki misal aləmi iki qisimdir: Başlanğıc və son aləmlər. Deyilir ki, bu aləmin iki şəhəri var: Cabulqa və Cabursa. Misal aləmi maddi aləmlə ilahi aləm arasında qərar .tuta bilər. Bu fikir işraqilər tərəfindən qəbul edilir, məşşailər tərəfindən rədd olunur

İşraqilər misal aləmini iki mərhələyə malik bilirlər: Dünyadan əvvəlki bərzəx və .dünyadan sonrakı bərzəx

?Sual: ٢٩٢. İmam Mehdinin (ə) varlığı ilə bağlı şeyxiyyə etiqadına hansı iradlar tutulur

:Cavab: Bu əqidəyə qarşı bir çox iradlar var. Onlardan bəzilərini nəzərdən keçirək

İmamın hurqəlya bədəndə olmasını iddia etmək əslində onun yer üzündə olduğunu .١ inkar etməkdir. Həzrət Mehdi (ə) bərzəx aləmində yaşayırsa, deməк, yer üzü .höccətsizdir. Bu isə mümkün deyil

İmam Mehdinin (ə) hurqəlya bədəndə olması onun yer üzündə mövcudluğunu .٢ .sübuta yetirən əqli dəlillərə ziddir

Şeyx Əhməd Ehsayi Hurqəlya aləmi dünya aləmi ilə axirət aləmi arasında təsəvvür .٣ .edir. Hansı ki, misal aləmi də ilahi aləmdəndir

Həzrət Mehdinin (ə) Hurqəlya bədəndə yaşamasının heç bir dəlili yoxdur. Bu iddia .٤

.heç bir əqli və nəqli dəlillə sübut olunmur

səh:۱۸۴

---

.Şərhe-hikmətul-işraq”, s. ۵“ [۵۱۶] -۱

.Burhani-qate”, c. ۴, s. ۲۳۹۱“ [۵۱۷] -۲

.Şərhe-Hikmətul-işraq”, s. ۵۱۷-۵۵۶“ [۵۱۸] -۳

XIII əsrdə yersiz sözlər danışmaq geniş rəvac tapmışdı və avam xalq bunu alimlik .۵ kimi qəbul edirdi. Çox ola bilər ki, Şeyx Əhməd Ehsayi və Seyyid Kazim Rüşti avam .xalqa xoş gəlmək üçün bu sayaq sözlərdən istifadə etmişlər

Şeyx Əhmədin sözləri nəticəsində azğın Babilik və Bəhailik kimi təriqətlər meydana .çıxmış, pak ayin adı altında dinsizlik rəvac tapmışdır

Sual: ۲۹۳. Həzrət Zəhranın (ə) (Fatimənin) həzrət Mehdinin (ə) nümunəsi, idealı olması ?nə deməkdir

Bəs həzrət Mehdi (ə) həzrət Fatimənin (ə) hansı söz və rəftarını nümunə saymışdır? :Bəyan olunmuş ehtimallardan üçünü nəzərdən keçirək

Həzrət Fatimə (s) ömrünün sonunadək heç bir zalım hakimə beyət etməmişdir. .۱ .Həzrət Mehdi (ə) də heç bir zalım hakimin qarşısında öhdəçilik götürməmişdir

Şiələrdən bəziləri həzrətin imamətini qəbul etmirdilər. Həzrət onlara cavab olaraq .۲ buyurur: "Əgər icazəm olsaydı, elə edərdim ki, haqq söz aşkarlanardı və heç bir şübhə qalmazdı. Amma mən həzrət Zəhranın yolunu gedirəm. O xanım hakimiyyət haqsız yerə Əlidən alınsa da, heç vaxt qeyri-adi vasitələrdən istifadə etmədi. Mən də onun ".yolunu gedirəm. Öz haqqımı almaq üçün qeyri-adi yollardan faydalanmıram

Həzrət buyurur: "Əgər sizin hidayətiniz şövqündə olmasaydıq, gördüyümüz zülmlər .۳ səbəbindən sizdən üz döndərərdik." Həzrət xanım Zəhraya (s) işarə ilə buyurur ki, düşmənlər həzrət Zəhraya (s) nə qədər əziyyət versələr də, müsəlmanlar bu zülm qarşısında sussalar da, xanım heç vaxt müsəlmanlara duadan əl çəkmədi, hətta başqalarını özündən üstün tutdu. Mən də bu zülmlərə dözürəm və sizə canıyananlığı, .duanı, göstərişi əsirgəmirəm

səh:۱۸۵

?Sual: ۲۹۴. Zühurun (fərəcin) tezləşməsi üçün edilən duaların hansı təsirləri var

Cavab: Sahibəzzaman (Mehdi) İshaq ibn Yəquba cavabında yazır: "Həqiqi və kamil qurtuluşun tezləşməsi üçün çox dua edin. Həqiqətən, sizin qurtuluşunuz bundadır."(۱)

Bilirik ki, şiələrin qurtuluşu həzrət Mehdinin (ə) zühuru sayəsində mümkün olasıdır. Nə qədər ki, həzrət qeybdədir, şiələr sıxıntı və təzyiqə məruz qalasıdır.

Hədisdən məlum olur ki, həzrət Mehdinin (ə) zühuru dövrü həm tezləşə, həm də yubana bilər. ("Bəda.") Həzrətin zühurunun tezləşmə amillərindən biri duadır. Bilirik ki, qəlb istəyi və zəmin olmadan edilən dua təsirsizdir. İnsan həm dili və qəlbi ilə istəməli, həm də əməli olaraq öz istəyinə zəmin yaratmalıdır.

?Sual: ۲۹۵. İmamın mövcudluğunun bəlalara hansı təsiri var

Cavab: Sahibəzzaman Şeyx Müfidə ilk məktubunda buyurur: "Biz sizə yardım və himayədə yubanmırıq və sizi yaddan çıxarmırıq. Əgər belə olsaydı (yaddan çıxarsaydıq) bəlalar üstünüzə yağar, düşmənlər sizi məhv edərdi."(۲) Şiələr haqq-ədalətə üz tutduqlarından daim zalım hakimlərin təzyiqlərinə məruz qalmışdır. Bu səbəbdən də onların qurtuluş üçün yardımçıya ehtiyacı var. Həzrət bu məktubunda şiələrə müjdə verir ki, qeybdə olsam da, sizi himayə edirəm və imkan vermirəm ki, düşmənlərin sizə qarşı yönəlmiş planları gerçəkləşsin, şiə məzhəbi aradan getsin.

Digər bir hədisdə həzrət buyurur: "Mən vəsilərin (canişinlərin) sonuncusuyam. Allah mənim vasitəmlə şiələrin üzərindən bəlanı götürər."(۳)

?Sual: ۲۹۶. Dövrün imamını inkar edənlərin hökmü nədir

Cavab: Sahibəzzaman İshaq ibn Yaquba cavablarından birində buyurur: Allah-təala ilə kimsə arasında heç bir qohumluq yoxdur. Məni inkar edən məndən deyil. Bu şəxs Nuhun övladının yolunu tutmuşdur."(۴)



---

۱- [۵۲۰] "Kəmalud-din", s.۴۸۵.

۲- [۵۲۱] "Ehticac", c. ۲, s. ۳۲۳.

۳- [۵۲۲] "Kəmalud-din", c. ۲, s.۴۴۱.

۴- [۵۲۳] "Kəmalud-din", s.۴۸۴.

Bu hədisi şiə və sünnilərin nəql etdiyi rəvayətlər təsdiqləyir. Həzrət Peyğəmbər (s) buyurmuşdur: “Mənim Əhli-beytim (ə) Nuhun gəmisi kimidir. Ona süvar olan nicat (tapar, ondan üz çevirən qərq olar.”(١)

?Sual: ٢٩٧. İmam Mehdinin (ə) qeyb dövründə ümumi vəzifəmiz nədir

Cavab: Sahibəzzaman Şeyx Müfidə məktubunda yazır: “Hər biriniz sizi məhəbbət və dostluqda bizə yaxınlaşdıracaq işlər görməli, bizi razı salmayacaq və qəzəbləndirəcək (işlərdən çəkinməlisiniz.”(٢)

Aydın məsələdir ki, Əhli-beytə (ə) məhəbbət şəxsi, fərdi bir məsələ deyil. Bu, ilahi bir meyardır. Buna görə də Əhli-beyt məsumları şiələrin pis işdən çəkinib, yaxşı iş .gördüklərini müşahidə etdikdə xoşhal olurlar

Əgər Sahibəzzamanın məhəbbətini qazanmaq istəyiriksə, onu narazı salacaq işlərdən çəkinməliyik. Digər bir tərəfdən, çalışmalıyıq ki, bizi həzrətə yaxınlaşdıracaq işlər .görək

?Sual: ٢٩٨. Bulud arxasındakı günəşlə qeybdə olan imamın hansı oxşarlığı var

Cavab: Sahibəzzamanın İshaq ibn Yaquba cavabında buyurulur: “Qeyb dövründə mənim vasitəmlə fayda əldə etmək bulud arxasında günəşdən faydalanmaq (kimidir.”(٣)

Bulud arxasındakı günəşlə qeybdəki imam arasında müqayisə aparılması bəzi :nöqtələri üzə çıxarır

İnsanlar daim günəşin bulud arxasından çıxmasını gözlədiyi kimi, qeyb dövründə .١ .imamın zühuru intizarında olurlar

Qeyb dövründə imamın varlığını inkar etmək bulud arxasındakı günəşi inkar etmək .٢ .kimidir

Bulud günəşi tam örtmədiyi kimi, qeyb də imama tam mane ola bilmir. Xalq qeyb .٣ dövründə həzrəti görməsə də, onun vücudundan bəhrələnir. İmamdan faydalanma .yollarından biri təvəssüldür

۴ . Günəş buludlar arasından bəzən göründüyü kimi, imam da arabir bəzi ləyaqətli insanlarla görüşür və bu yolla onun mövcudluğu xalqa sübut olunur.

səh:۱۸۷

---

۱- [۵۲۴] "Mustədrəke-Hakim", c. ۳, s. ۱۵۱.

۲- [۵۲۵] "Ehticac", c. ۲.

۳- [۵۲۶] "Bihar", c. ۵۳, s. ۱۸۰.

Buludlar günəşi aradan götürə bilmir, sadəcə, onun üzərinə pərdə çəkir. Qeyb də .٥ .belədir. İmam görünməsə də mövcuddur

?Sual: ٢٩٩. Biz "fətrət", yəni imamət cərəyanının qırıldığı dövrdəyikmi

Cavab: Əhməd Katib deyir: "Bəzi şiələr elə düşünürlər ki, peyğəmbərlik cərəyanı qırıldığı kimi imamət cərəyanı da qırıla bilər. Onlar öz iddialarını müəyyən rəvayətlərlə sübuta yetirirlər. Onlar düşünürlər ki, Allahın qəzəbi bu cərəyanı qıra bilər. Onlar ".deyirlər: "Hazırda həmin dövrdür

Əvvəla, Şeyx Müfid "Əl-füsulul-muxtarə" kitabında imam Həsən Əsgəridən (ə) sonrakı müxtəlif quruplar haqqında danışdıqdan sonra buyurur: "Amma yaşadığımız hazırkı (dövrdə ١٢ imamçı şiədən başqa firqə qalmayıb."(١

İkincisi, Əhməd Katibin üz tutduğu rəvayətləri araşdırdıqda görürük ki, bu rəvayətlər nəinki həzrətin mövcudluğunu inkar etmir, hətta bu mövludu təsdiqləyir. Bəzi rəvayətləri nəzərdən keçirək: Məhəmməd ibn Fərəc deyir: İmam Əbu-Cəfər mənə yazdığı məktubunda bildirirdi: "Əgər Allah-təala öz xalqına qəzəblənsə bizi onlardan (uzaqlaşdıracaq."(٢

Bu rəvayət aşkar şəkildə həzrət Mehdinin (ə) mövludunu təsdiqləyir. Rəvayətdən .məlum olur ki, o mövcuddur, amma nəzərlərdən qeybdədir

Üçüncüsü, bu rəvayətlər sənəd baxımından zəifdir. Mərhum Məclisi də bu məsələni .qeyd etmişdir

Dördüncüsü, bu rəvayətlər qrupu mütəvatir rəvayətlərə ziddir. Mütəvatir rəvayətlərdə .bildirilir ki, yer üzü heç vaxt höccətsiz ola bilməz

?Sual: ٣٠٠. Həzrət Mehdi (ə) qeyb dövründə hansı işləri görür

Cavab: Böyük qeyb dövründə həzrətin çox mühüm işləri var. O zahiri hakimiyyətə .malik olmasa da, bütün işlərə nəzarət edir və müəyyən işlərə qatılır

İmamət və rəhbərlik şəni onu öz vəzifəsini ən üstün şəkildə yerinə yetirməyə sövq edir. Həzrətin ömrü Allaha itaət yolunda keçir. İmam öz ictimai vəzifələrini insanların

yerinə yetirir. İnsanların hidayəti, müxaliflərə qarşı möminlərə yardım, müşkül məsələlərin həlli, fərdlərin moizə-nəsihəti, xəstələrə şəfa, yolda qalmışlara bələdçilik, elm və maarif təlimi, ehtiyaclılara iqtisadi yardım, çətinliyə düşənlərin fəryadına .çatmaq həzrətin işlərindəndir

Həzrətin mühüm işlərindən biri də şiə cəmiyyətini nizama salmaq, elmi hövzələri tarix .boyu nəzarətdə saxlamaqdır

?Sual: ٣٠١. İmamın hadilik, tərbiyəçilik vəzifəsi onun qeybdə olması ilə bir araya sığırmı

Cavab: Kəlam, fəlsəfə və irfan kitablarına müraciət etdikdə imamətin iki təfsiri ilə :rastlaşırıq

Kəlam əsasında tərif: İmamət dini və dünyəvi işlərə bir nəfər vasitəsi ilə .١ (rəyasətdir.(١

Fəlsəfi-irfani tərif: İmamət peyğəmbərlik kimi bir mənsəbdir, bu iki məqam arasında .٢ vəhydən savay fərq yoxdur. Peyğəmbərliyə aid olan bütün vəzifələr (vəhydən savay) imamətə də aiddir. İmamət eyni zamanda insanları zəruri kamala çatdırmaq üçün .batini yardımdır

Uyğun tərifə əsasən, din və dünya işlərinə rəyasət bu mənada imamət şənindəndir. ١٢ imamçı şiə əqidəsinə əsasən bu məna mötəbərdir. Bu səbəbdən də imamət dinin üsulu .sayılmışdır

Əllamə Təbatəbai buyurur: “İmamət itaət məqamıdan üstün bir həqiqət, din və dünya (rəyasəti, yer üzündə xilafət və canişinlikdir.”(٢

İmamətin məna dərinliyi budur ki, o batini bir hidayət olub, xalq üzərində vilayətdir. Bu .hidayət istəyə doğru səydən başqa bir şey deyil

Mütəkəllimlər (kəlam alimləri) imamətə verdikləri tərifdə bir neçə dəlilə əsaslanır: Lütf qaydası, şəriətin hifzi zərurəti, Allah dininin aydınlaşdırılması. Bütün bunlar imamın .xalq arasında hüzuru ilə təmin edilir

?Soruşula bilər ki, bu lütf imamın qeybi ilə necə uyğun gəlir

.Əvvəla, Sahibəzzəman şəriətin ümumi hifz edənidir. O batil ittifaqa qarşıdır

İkincisi, ilahi lütfün müxtəlif dərəcələri var. Əziyyət zamanı daha çox lütf gətirən iş öndə gəlir. İmamın hüzurunda xalq ilahi lütfə çatsa da, onun qeybi zamanı gerçəkləşən lütf daha mühümdür. Qeyb fəlsəfəsi haqqında danışarkən bu məsələyə işarə olundu. İmamətin ikinci tərifi irfani tərifdir. Bu tərifə əsasən imamət insanların batininə



---

.Nəhcul-Mustərşədin", s. ۶۲" [۵۲۹] -۱

.Əl-Mizan", c. ۱, s. ۲۷۱" [۵۳۰] -۲

.nüfuz edə bilən bir həqiqətdir. Bu hidayət sayəsində insanlar məqsədə çatır

İmamətə verilən bu tərif qeyblə uyğun gəlir. İmam qeyb dövründə də nəzərdə tutulan (işləri görə bilir. Qeyb dövrü boyu həzrətə bu sayaq yardımlar göstərilmişdir.(١

?Sual: ٣٠٢. İmam qeybdə ikən onu necə tanımaq olar

Cavab: Müxtəlif firqələrə aid mənbələrdəki rəvayətlərə əsasən Peyğəmbər (s) buyurmuşdur: "Dövrünün imamını tanımadan ölən kəs cahiliyyət dövründə ölmüş ?kimidir."(٢) Bəs qeybdə olan imamı necə tanımaq olar

İmamı tanımaq dedikdə onu zahiri baxımdan tanımaq nəzərdə tutulmur. Məqsəd imamın məqamını, Allahın yanındakı yerini tanımaqdır. İmam şəriəti qoruyan kəsdir. O, təkvini və təşrii feyz vasitəsidir. O, Allahın izn və iradəsi ilə insanların batininə təsir .göstərir, onları haqqa yönəldir. O bütün əvvəl və axır elmlərin toplumudur

.Bütün bu məlumatları imamı görmədən də əldə etmək olar

?Sual: ٣٠٣. Hansı dəlilə əsasən bu zaman "axirüz-zəman", "son dövr" adlanır

Cavab: İslami rəvayətlərdə axirüz-zəmanın, yəni dünyanın sonunun əlamətləri zikr olunmuşdur. Bu nişanələr həyata keçdikcə anlayırıq ki, hazırda həmin dövrdə :yaşayırıq. Bu əlamətlərdən bəzilərini yada salaq

Qorxu və ümidsizliyin artması – İmam Baqir (ə) buyurur: "Qorxu və ümidsizlik hakim .١ (olmayınca həzrət Qaim qiyam etməz."(٣

Başqa bir hədisdə həzrət buyurur: "İmam cəmiyyətin işləri zalımların əlində olan vaxt (qiyam edər."(۴

Məscidlərin hidayətdən uzaqlığı – Həzrət Peyğəmbər (s) axirüz-zamanda . ٢ məscidlərin vəziyyəti haqqında buyurur: "Həmin dövrün məscidləri zahirən abad və (gözəldir. Amma bu məscidlərdə hidayət və tərbiyədən xəbər yoxdur."(۵

۱- [۵۳۱] “Əl-Mizan”, c. ۱۴, s. ۳۰۴.

۲- [۵۳۲] “Şərhe-Məqasid”, c. ۲, s. ۳۷۵.

۳- [۵۳۳] “Nemani”; “Əl-Ğeybət”, s. ۲۳۵.

۴- [۵۳۴] İbn-Tavus, “Məlahim”, s. ۷۷.

۵- [۵۳۵] “Bihar”, c. ۲, s. ۱۹۰.

۳. İnsanlar arasında soyuqluq – Həzrət Peyğəmbər (s) bu barədə buyurur: “Həmin dövrdə böyüklər tabeçiliklərində olanlara və kiçiklərə rəhm etməz. Güclü zəifə rəhm göstərməz. Allah həmin vaxt ona (Mehdiyə) qiyam izni verər.”(۱)

۴. Əxlaqi pozğunluqların çoxalması – Həzrət Peyğəmbər (s) buyurur: “Nə qədər ki, qadın günün günorta çağı aşkar şəkildə yolun ortasında təcavüzə məruz qalmır və həmin işə görə məzəmmət edən var, qiyamət qopmaz.”

Məhəmməd ibn Müslim deyir: “İmam Baqirə (ə) ərz etdim: “Ey Allah rəsulunun övladı! Sizin qaim nə vaxt zühur edəcək?” İmam buyurdu: “Kişilər özünü qadına, qadınlar özünü kişiyə oxşatdığı vaxt. O vaxt ki, kişilər kişilərlə, qadınlar qadınlarla kifayətlənər.”(۲)

۵. Az övlad istəyi – İslam peyğəmbəri buyurur: “Beş övladı olan dörd övlad arzusuna düşməyincə qiyamət qopmaz. Həmin vaxt dörd övladı olan “kaş üç övladım olaydı”, üç övladı olan “kaş iki övladım olaydı”, iki övladı olan “kaş bir övladım olaydı”, bir övladı olan, “kaş övladım olmayaydı” deyər.(۳)

۶. Qəfil ölümlər –Həzrət Peyğəmbər (s) buyurur: “Ağ ölüm, yəni qəfil ölüm zahir olmayınca qiyamət bərpa olmaz.”(۴)

۷. Müharibə və qırğınlar – İmam Riza (ə) buyurur: “Həzrət Mehdinin (ə) zühurundan öncə ardıcıl və aramsız qırğınlar baş verəcək.”(۵)

Sual: ۳۰۴. Necə ola bilər ki, imam aramızda olsun, amma biz onu tanımayaq?

Cavab: Həzrət Mehdinin (ə) böyük qeyb dövründəki məxfiliyi barədə iki nəzəriyyə var:

Nəzəriyyələrdən birinə əsasən həzrət Mehdi (ə) şəxsən məxfidir. Yəni o bizdən uzaqdadır, kimsənin əli çatmayan yerdə yaşayır.

İkinci nəzəriyyəyə əsasən, həzrət Mehdi (ə) şəxs olaraq məxfi deyil. O bizim aramızdadır, amma biz onu tanımırıq. İkinci nəzəriyyə bir növ ünvanın məxfiliyindən ibarətdir.

۱- [۵۳۶] Həmin mənbə, c. ۵۲, s. ۳۸۰.

۲- [۵۳۷] “Kəmalud-din”, c. ۱, s.۳۳۱.

۳- [۵۳۸] “Firdovsul-əxbar”, c. ۵, s. ۲۲۷.

۴- [۵۳۹] “Əl-faiq”, c.۱, s. ۱۴۱.

۵- [۵۴۰] Nemani, “Əl-Ğeybət”, s. ۲۷۱.

?Sual: ۳۰۵. Həzrət Mehdinin (ə) varlığına imanı necə gücləndirmək olar

:Cavab: Bu istiqamətdə imanı gücləndirmək üçün bir neçə yol var

Əqli dəlilləri araşdırmaqla həzrət Mehdinin (ə) mövcudluğuna imanı gücləndirmək .۱ .olar

Quran ayələrini və rəvayətləri araşdırmaqla həzrət Mehdinin (ə) mövcudluğuna .۲ .dərin iman əldə etmək olar

Həzrət Mehdinin (ə) hüzurunda olmuş, onunla görüşmüş insanların haqqında .۳ .mütaliə etməklə insan uyğun istiqamətdə imanını gücləndirə bilər

Həzrətə xitabən tərtib olunmuş bu duaları oxumaqla onun mövcudluğuna iman .۴ .güclənə bilər

?Sual: ۳۰۶. Sahibəzzaman qeyb dövründə xalqı necə hidayət edir

Cavab: ۱. Təşrii hidayət (şəriət yolu ilə tərbiyə): Xalq üçün şəri hökmlərin və ilahi .maarifin bəyanı. Bu növ hidayət adətən imamın iştirakı ilə təmin olunur

Batini hidayət: Belə bir hidayət insana daxili yardımlarla müşayiət olunur. Bu hidayət .۲ təkvini hidayət növüdür və onun gerçəkləşməsi üçün imamın hüzuruna, xalqla görüşünə ehtiyac yoxdur. İmam qeybdə ola-ola batini hidayət gerçəkləşə bilər. Daxilində təlatüm qopmuş insanlar Allahın iradəsi ilə Sahibəzzaman nahiyəsindən .qəlbən hidayət olur

Şiələr həzrət Mehdinin (ə) bir çox başqa hidayətlərindən də bəhrələnir. Yol azanlara .۳ .bələdçilik, xəstələrə şəfa bu qəbildəndir

?Sual: ۳۰۷. Milad bayramlarının hansı təsirləri var

Cavab: Həzrət Mehdinin (ə) mövlud mərasimlərinin bir sıra müsbət təsirləri var. :Onlardan bəzilərini nəzərdən keçirək

Şiələr hər il xüsusi bir gündə həzrət Mehdini (ə) yad edərək bir yerə toplaşır. Həzrətə .۱

.məhəbbətlərini bildirməklə qəlblərində onun xatirəsini canlandırırlar

Bu sayaq bayramlar insanın ruhuna müsbət təsir göstərir, zühura olan etiqadı .٢ .möhkəmləndirir

Bu bayramlarda həzrətin kamillik və fəzilətləri yada salınır, nəticədə xalq həzrətə .٣ .təvəssül edərək Allaha yaxınlaşır

Bu mərasimlərdə ehsanlarla, şirni paylamaqla xalqın könlü açılır, zəiflər təbəqəsi .۴ .maddi baxımdan bəhrələnir

səh:١٩٢

.Belə bir mərasim xalqı Allaha doğru dəvət üçün münasib fürsətdir .۵

?Sual: ۳۰۸. Saleh insanların imamla görüşünü necə sübut etmək olar

:Cavab: Yuxarıdakı sual əslində iki hissədən təşkil olunmuşdur

?Bəzilərinin həzrətlə görüş iddiasını necə sübut etmək olar .۱

?Necə bilmək olar ki, bu görüşdə onlar şəxsən həzrəti görmüşlər .۲

İlkin olaraq deyə bilərik ki, biz hər görüş iddiasında olanın sözünü qəbul etmirik. Belə .bir görüşün həqiqiliyi yalnız dəlillər əsasında qəbul edilir

Bu şəxs doğru danışan olmalı, kimsə ondan yalan, xilaf əməl, ədalətsizlik görüb-.eşitməməlidir

Digər bir nöqtə budur ki, həzrətlə görüş iddiasında olan şəxsin dedikləri həqiqətə .uyğun olmalı, qeybi xəbərlərlə münasib gəlməlidir

İkinci sualın cavabında deyə bilərik ki, həzrətlə görüş iddiasında olanlar özləri müəyyən dəlillər gətirmiş, hər biri həzrətin varlığını sübut edən möcüzələr və qeybi .xəbərlərə şahid olmuşlar

Onlar bu yolla məhz həzrətlə görüşdüklərinə əmin olmuş və bu xəbəri bizə nəql .etmişlər

?Sual: ۳۰۹. Sahibəzzaman məhəbbətini qəlblərdə necə diriltmək olar

Cavab: İnsanların, xüsusi ilə gənclərin qəlbində Sahibəzzaman məhəbbətini diriltməyin :müəyyən yolları var. Onlardan bəzilərini nəzərdən keçirək

Qəlbini Allah vəlisinin eşqi ilə doldurmaq istəyənlər öncə bu qəlbi paka çıxarmalıdır. .۱ .Həm də nəfs çirkin sifətlərdən təmizlənməlidir

Bu səbəbdən də əxlaq ustadları haqq yol yolçusu (salik) üçün ilkin mərhələdə nəfsin təmizlənməsini zəruri saymışlar. Deməк, öncə nəfs çirkinlikdən təmizlənməli, sonra .əxlaqi gözəlliklərlə zinətlənməlidir

Gücümüz çatan və qarşı tərəfin qəbul edəcəyi həddə imamın məqam və . ۲ kamilliklərini bəyan edək. Həzrətin xalqın halından xəbərdarlığını, ilahi rəhmaniyyət .məzhəri olduğu, daim şiələr haqqında düşündüyü nəql edilməlidir

İnsan zatən və fitrətən kamillik aşiqidir. Digər bir tərəfdən, insanda kiməsə qarşı belə .bir eşq yarandıqda ona müti olur

Sahibəzzaman xalqı Allaha doğru dəvət etdiyindən ona qarşı eşq yarandıqda insan .Allaha doğru meyl edir

Qeyd etməliyik ki, xalqın imam Mehdiyə (ə) məhəbbətə dəvəti əslində Allaha doğru .çağırış, qəlblərdə Allah eşqinin ərsəyə gəlməsi üçün cəhddir

?Sual: ٣١٠. Sahibəzzaman dünyanın bütün nöqtələrində olurmu

Cavab: Prinsipcə, həzrət Mehdi (ə) Allahın qeyb elminin məzhəri olduğundan hər yerdə olur və hər şeydən xəbərdardır. Başqa sözlə, imamın istədiyi onun üçün hazırdır. Həzrət bəzən Allah tərəfindən çarəsizlərə yardımla bağlı əmr alır. Beləcə, həzrət .Allahın məsləhət bildiyi yerdə hazır olur

?Sual: ٣١١. Həzrətin "Bəqiyyətullah" ləqəbinin mənası nədir

Cavab: "Bəqiyə" fəna və yoxluğun ziddidir. Bu sözün lüğət mənası davamlılıq və .sabitlikdir. "Bəqiyyətullah", yəni Allahın yer üzündə sabit qalmışı

"?Nüdbə" duasında oxuyuruq: "Allahın yalnız pak itrətdən olan sabit qalmışı haradadır"

:Burada iki ehtimal var

Bəqiyyətullah" dedikdə Allahın yer üzündəki höccətinə işarə olunur. Yez üzü heç" .١ .vaxt onsuz deyil və olmayacaq

.Bəqiyyətullah" yer üzündə davamlı vücudu olan Sahibəzzamanın ləqəbidir" .٢

İbn Sikkit deyir: "Bu cümlə o zaman işlədilir ki, insan bir kəsi gözləyir, onun intizarı ilə ".əyləşmişdir

?Sual: ٣١٢. Nə üçün həzrət Mehdini (ə) görənlərin bir çoxu öncədən onu tanımırlar

Cavab: Əvvəla hər adam imamla görüşə nail ola bilmir. Öncədən həzrəti tanımış və onunla görüşmüş şəxslər azdır. Seyyid Bəhrül-ülumu, Müqəddəs Ərdəbilini misal .göstərmək olar

İkincisi, həzrətin insanlarla görüşməkdə məqsədi problemləri aradan qaldırmaqdır.

.Belə bir məqsəd həzrəti tanımadan da ödənə bilər

Üçüncüsü, həzrət ünsiyyət olmadığı üçün tanınmır. Adətən, birinci görüşdə insanlar .onu tanıya bilmir

Dördüncüsü, insan bəzən eşqinin çoxluğundan qarşısında dayanan adamdan qəflətdə .qalır. Yalnız istəyi qəbul olduqdan sonra anlayır ki, qarşısındakı kim imiş

Beşincisi, böyük qeyb dövründə həzrətin tanınmaması prinsipial bir məsələdir. Bu qeyb .dövründə onun məxfi halda qalması ilahi bir məsləhətdir

?Sual: ٣١٣. Nə üçün başqa imamlar qeybə çəkilməmişdir

.Cavab: İmam Mehdinin (ə) şəraiti digər imamların şəraitindən fərqlənmişdir

.a) Həzrət Mehdi (ə) ١٢ imamın sonuncusudur

.b) Hər an qiyamı gözlənilən həzrət zahir olub hansısa zalım hakimə beyət edə bilməz

v) Qeyb olmasaydı, Allahın yer üzündəki yeganə höccəti düşmənlər tərəfindən qətlə .yetirilərdi

.Bütün bu səbəblərdən həzrətin qeyb pərdəsi arxasında qalması məsləhət olmuşdur

?Sual: ٣١٤. Nə üçün biz öz imamımızla görüşə bilməyək

Cavab: Əvvəla, hazırkı dövrdə vəzifəmizi bilməli, kamilliyə çatmaq üçün nə etməyimizi .dərk etməliyik

Bizim yeganə vəzifəmiz məsum imamlar tərəfindən bəyan olunmuş ilahi göstərişlərə .əməl etməkdir. Həzrətlə görüşmək şərəf olsa da, belə bir ilahi əmr yoxdur

İkincisi, həzrətin qeybə çəkilməsinin səbəbi özümüz olmuşuq. Əgər yaratdığımız .maneələri aradan götürə bilsək, onunla görüşə bilərik

Üçüncüsü, hər bir ümmət hər bir dövrdə hansısa imtahana çəkilir. İmamın qeybə .çəkilməsi şiə cəmiyyəti üçün böyük imtahan sayılır

Dördüncüsü, kimsə deməyib ki, biz imamın xidmətinə çata bilmərik. Belə bir arzuya çatmaqdan ötrü göz və qəlbdən çirkabı təmizləyib ləyaqəti əldə etsək, həzrət özü .görüşümüzə gələcək

?Sual: ٣١٥. Hansı yolla həqiqi Mehdi (ə) aşiqi olmaq mümkündür

Cavab: Aşiq insan üçün cəhət var. Həzrət Mehdiyə aşiq olmaq istəyiriksə, şübhəsiz, cəhət götürməliyik. Biz onu sevirik. Çünki o bütün yaxşılıqların, ədalətin, bəndəliyin ...məzhəridir

Biz həzrət Mehdini (ə) yaxşılıqlara əməl baxımından ən kamil fərd saydığımız üçün onu sevirik. Əslində həqiqi imam aşiqi

.yaxşılıqların aşiqi olmalıdır. Həqiqi imam aşiqi əslində yaxşı əməl aşiqidir

Əgər yaxşılıqlara aşiqiksə və bu məqsədlə əməl ediriksə, demək, əslində .Sahibəzzaman (ə) aşiqiyik

?Sual: ۳۱۶. Zühurun təxirə düşməsinin səbəbi nədir

Cavab: Zühurun təxirə düşməsinin səbəbkarı insanlar özüdür. Ümumdünya ədalət :hökumətinin qurulması üçün insanlar özü şərait yaratmalıdır. O cümlədən

;Xalq ədalət məfhumunu anlamalıdır .۱

;Can-qəlbdən ədalət istəyəcək həddə çatmalıdır .۲

Şəriət göstərişlərinə əməl etməklə yüksək düşüncə və mədəniyyət səviyyəsinə . ۳ ;çatmalıdır

.Bəşəriyyət elm və texnika sahəsində inkişafa nail olmalıdır .۴

Sual: ۳۱۷. İmam Sadiqin (ə) "Əgər onun dövründə olsaydım, ömrü boyu ona xidmət ?edərdim" buyuruğu həzrət Mehdinin (ə) digər imamlardan üstünlüyünü göstərmirmi

Cavab: Zühur dövründə rəhbər həzrət Mehdi (ə) olduğundan hamı ona yardım .göstərməyə borcludur. Uyğun təbir bu məqsədlə işlədilmişdir

?Sual: ۳۱۸. Dövrünün imamını tanımayan nə üçün cahil kimi ölür

Cavab: Əvvəla, insanın mərifəti onun əməllərinə təsirlidir. Həzrət Mehdi (ə) Allahın yer üzündəki höccətidir. Ona itaət vacibdir. Bu səbəbdən də hər bir insan onu tanımağa .çalışmalıdır. Əks-təqdirdə cahil bir ölümlə dünyadan gedəsiyik

İkincisi, imamı tanımasaq, ləyaqətsiz bir adama itaət edəsiyik. İnsan kimi ideal seçməli və dini kimdən öyrənməlidir? Rəhbərlik iddiasına düşmüş hər kəsə itaət göstərmək, !?onu imam seçmək olarmı

?Sual: ۳۱۹. Zühurun tezləşməsi üçün vəzifəmiz nədir

:Cavab: İmamın zühuru şəraitdən asılıdır. Şiələrə aid olan isə aşağıdakılardır

.Əvvəla, özümüzü islah edib, zühur dövrünün şərtləri ilə uyğunlaşdıraq

İkincisi, cəmiyyətdə həzrətin zühuru üçün zəmin yaradaq, gücümüz həddində xalqın islahı üçün çalışaq. Belə etsək, həzrətin qüdrət əli ilə maneələr aradan qalxar, ümumdünya ədalət hökuməti səh:۱۹۶

üçün şərait yaranar. Bu səbəbdən də buyurulmuşdur: “Xilaskarın intizarında olanlar ”.özləri saleh fərdlərdir

Üçüncüsü, Allah dərgahına dua və ah-nalədən əl çəkməyək. Rəvayətlərə əsasən, dua .və ah-nalənin zühur üçün böyük təsiri var

?Sual: ٣٢٠. Şiələrin günahı zühuru təxirə salırmı

Cavab: Zühur vaxtı həzrətin pak və xalis insanlara ehtiyacı var. Ümumdünya ədalət hökumətini qurmaq üçün layiqli şəxslərin varlığı zərurətdir. Günahlar zühuru təxirə .salıb, onun mühüm şərtlərindən birinin ödənməsinin qarşısını ala bilər

Digər bir tərəfdən, həzrət Mehdi (ə) elə bir dövrdə zühur edəcək ki, bütün yer əhli ali bir mədəniyyətdən bəhrələnmiş olsun. Zühur ilə ağıllar kamilləşməli, şəri göstərişlərə .əməl sayəsində hədəf gerçəkləşməlidir

?Sual: ٣٢١. Sədəqə verməyin həzrət Mehdinin (ə) salamatlığına hansı təsirləri var

Cavab: Sədəqə vermək dəyərli və böyük savaba malik bir işdir. Sədəqə bəlanı insandan uzaqlaşdıra bilər. Əgər insan Sahibəzzaman (ə) tərəfindən, həzrətin vəkaləti .ilə sədəqə versə, həm özü, həm də həzrət üçün faydalıdır

Sədəqənin insan üçün böyük təsirləri var. Möminə hədiyyə, ən əsası yer üzünün ən .mömin şəxsinə hədiyyə böyük savaba malikdir

Sədəqənin həzrətə də təsiri var. Sədəqə səbəbindən Allah ona daha böyük bərəkət əta edir və inayətini artırır. Çünki Allahın inayətinin həddi yoxdur. Sədəqə həm də həzrətin vücudundan bəlanı uzaqlaşdırır. Çünki Allah-təala həzrəti müxtəlif yollarla, o .cümlədən sədəqə yolu ilə hifz edir

.Həzrətin salamatlığı haqqında edilən dualar da bu sayaq müsbət təsirə malikdir

?Sual: ٣٢٢. Yer üzünü fəsad bürüdüyü halda nə üçün həzrət zühur etmir

Cavab: Fəsadın yer üzünü bürüməsi zühur üçün şərt olsa da, kafi şərt deyil. Həzrətin məqsədlərindən biri yer üzündə haqq-ədalətin genişlənməsidir. Əlbəttə ki, bunun

:üçün müəyyən şərtlər ödənməlidir. Bəzi şərtləri nəzərdən keçirək

;a) Cəmiyyətin düşüncə səviyyəsinin yüksəlməsi

;b) Rabitə və informasiya şəbəkəsinin inkişafı və genişlənməsi

səh:۱۹۷

v) Ədl və tövhid prinsiplərinin cəmiyyətdə genişlənməsi üçün həzrətlə həmkarlıq edəsi xüsusi və kamil insanların ərsəyə gəlməsi;

Sual: ۳۲۳. Zühur vaxtı haqqında danışmaq düzgündürmü?

Cavab: Bir neçə səbəbdən zühur vaxtı haqqında danışmaq olmaz:

۱. Heç bir rəvayətdə dəqiq və ya qeyri-dəqiq, zühur vaxtı göstərilməmişdir.

۲. Zühur vaxtı müəyyən səbəblərdən dəyişə biləcəyi üçün ("Bəda") bu barədə danışmaq olmaz. İnsan qeyri-adi yollarla məlumat əldə etsə belə bu barədə danışmamalıdır.

۳. Bəzən zühur haqqında xəbərlər eşidirik. Amma deyilən vaxtda zühur baş verмədiyindən xalq ümidini itirir.

۴. Bəzi rəvayətlərdə zühur vaxtının müəyyənləşdirilməsi qadağan edilmişdir.

Sual: ۳۲۴. Həzrət Mehdiyə (ə) ərizə ilə müraciət etmək mötəbərdirmi?

Cavab: Həzrət Mehdiyə (ə) ərizə yazmağın mümkünlüyünü sübuta yetirən müəyyən dəlillər vardır:

۱. Ərizə yazılması həzrət Mehdiyə (ə) təvəssül növlərindən biridir. Bu iş dini mənbələrdə müstəhəb işlərdən sayılmışdır.

۲. Böyük dini şəxsiyyətlər bu işi görmüş və onun bərəkətindən faydalanmışlar.. Mühəddis Nuri "Nəcmus-Saqib" kitabında bu mövzuda maraqlı bir əhvalat nəql edir.(۱)

۳. Kəfəmi "Əl-Misbah" və "Əl Bələdul-əmin" kitablarında ərizənin hansı qaydada yazılmasını açıqlayır. Məlum olur ki, imama ərizə yazılması qanuni bir işdir.(۲)

Mərhum Məclisi buyurur: "Ərizəni atarkən belə xəyal etsin ki, bu məktubu xüsusi naibə təhvil verir."(۳)

Şeyxul-Taifə Əbu-Cəfər Tusi "Misbahul-Mutəhəccid" kitabında deyir: "Allaha ünvanlanmış məktub yazılır, bükülür və sonra həzrət Bəqiyyətullaha digər bir məktub

.yazılır..."(۴) Sonra alim hər bir ərizənin yazılma qaydasını göstərir



---

۱- [۵۴۱] "Nəcmus-Saqib", s. ۴۲۱.

۲- [۵۴۲] "Misbah", s. ۵۳۱; "Əl-Bələdul-Əmin", s. ۲۲۷.

۳- [۵۴۳] "Bihar", c. ۹۴, s. ۳۰.

۴- [۵۴۴] Həmin mənbə, s. ۲۷.

?Sual: ٣٢٥. Həzrətin zühurundan öncəki qiyamların hökmü nədir

Cavab: Bəziləri bu əqidədədirlər ki, imam Mehdinin (ə) zühurundan öncə zalım hakimlərə qarşı qiyam qaldırmaq haramdır. Onlar imam Sadiqdən (ə) nəql olunmuş bir rəvayətə istinad edirlər. Həmin rəvayətdə buyurulur: "Qaimin qiyamından öncə ucalan hər bir bayraq sahibi zalım hakimdir və Allahdan qeyrisinə ibadət edir."(١) Bu barədə ?nə demək olar

Bu rəvayət ümumi şəriət üsulu, o cümlədən əmr be məruf və nəhy əz münkər .١ (yaxşılığa əmr və pisliyin qadağası) və cihad hökmlərinə ziddir. Çünki bu üç hökmün .mərtəbələri var və bu mərtəbələrdən biri qiyamdır

.Bir çox rəvayətlərin mənbəsi ilə bağlı problemlər var .٢

Bəzi rəvayətlərdən məlum olur ki, imam külli olaraq inqilabların mümkünlüyünü .٣ inkar etmir, sadəcə, onların son hədəfə çatmayacağını bildirir. Necə ki, Zeydin və .Muxtarın qiyamları son hədəfə çatmadı

İnqilaba çağırış iki qisimdir: Kimi Əhli-beyt hakimiyyətinin bərpasına çağırır və belə .۴ .bir çağırış batil deyil

Bir digəri şəxsi məqsədlərini həyata keçirmək üçün batilə dəvət edir. Beləcə, şəriət və Əhli-beyt imamətini müdafiə üçün qaldırılmış qiyamlar uyğun rəvayətlərdə nəzərdə tutulmur. Həzrət Zeynəl-Abidindən (ə) Muxtarın qiyamı haqqında soruşulduqda buyurdu: "Qara bir qul bizə yardım üçün ayağa qalxsa, ona yardım göstərmək (vacibdir."(٢

İmam Sadiq (ə) buyurmuşdur: "Bəni-Haşimdən on iki nəfər qiyam qaldırıb xalqı dəvət (etməyincə Qaim zühur etməyəcək."(٣

**Müqəddəs sərdabə**

?Sual: ٣٢۶. Sahibəzzaman (ə) qeyb dövründə evindəki sərdabədəmi qeybə çəkilmişdir

Cavab: Sünnə əhli şiələrin əqidəsinə istehza ilə deyir: "Şiələr inanır ki, Mehdi (ə) dünyaya gəldikdən sonra sərdabədə qeybə çəkilmişdir, indi də oradadır və

sərdabədən zühur edəcək. Guya, şiələr

səh:۱۹۹

---

۱- [۵۴۵] “Kafi”, c. ۸, s. ۲۹۵.

۲- [۵۴۶] “Bihar”, c. ۴۵, s. ۳۶۵.

۳- [۵۴۷] “Əl-Ğeybət”, Tusi, s. ۴۳۷.

hər gün sübhdən qüruba qədər sərdabənin qarşısında göz yaşı axıdıb onun zühurunu gözləyirlər."(1)

Əvvəla, "sərdabə" dedikdə hər bir tikilinin alt təbəqəsində yerləşən sərin yer nəzərdə tutulur. Bu sayaq sərdabələr, adətən, İraqda müşahidə olunur. Samirra da belə yerlərdəndir. İmam Hadi (ə) öz əhli-beytinin asayişi üçün belə bir sərdabə tikmişdi. Bu sərdabə onun şəhadətindən sonra irs olaraq imam Əsgəriyə çatdı.

Tarixi məlumatlara əsasən, həzrət Mehdi (ə) mövludundan başlayaraq xalqın, xüsusi ilə zalım hakimlərin gözündən gizli qalmışdır. Atasının şəhadətindən sonra ona cənazə namazı qılıb, rəsmən qeybə çəkilmişdir. Həzrət və ailənin digər üzvləri bu sərdabədən istifadə etdiyi üçün qeybin də bu yerdə baş verdiyi bildirilir. Şiələr bu sərdabəni ona görə müqəddəs sayırlar ki, Sahibəzzaman, onun atası və babası bu sərdabədə yaşamış, ibadət etmişlər. Həzrət Mehdi (ə) də məhz həmin yerdə qeybə çəkilmişdir. İmamın qeybi imamın yaşadığı yer olaraq sərdabəyə aid edilmişdir. Cahil fikirdir ki, şiələr imamın hələ də sərdabədə olduğuna inanır! Çoxsaylı rəvayətlərə əsasən, həzrət Mehdi (ə) yer üzünün müxtəlif nöqtələrində olur.

Həzrət müxtəlif dini mərasimlərdə, o cümlədən, həcdə iştirak edir, dirilərə və ölülərə şahid olur. Bu səbəbdən də müqəddəs sərdabə haqqında və onun ziyarəti ilə bağlı deyilən sözlər cəfəngiyatdan başqa bir şey deyil. Şiələr imamın Səhlə, Cəmkəran məscidlərində ola biləcəyinə inandıqları üçün bu məscidlərdə toplaşır, "Nüdbə" duası oxuyurlar. Şiələr yalnız sərdabəni müqəddəs saydıqları üçün orada toplanıb Allaha dua oxuyurlar.

Əllamə Əmini deyir: Şiələr bu əqidədə deyil ki, imamın qeybi sərdabədə məhdudlaşır. Mötəbər rəvayətlərə əsasən, şiələr inanır ki, imam Məkkədə Allah evinin önündə zühur edəcək. Kimsə bu əqidədə deyil ki, müqəddəs sərdabə bu ilahi nuru özündə gizləmişdir. Sadəcə, bu sərdabə imamların Samirradakı evi olmuşdur. İraqda hamı istidən qorunmaq üçün bu sayaq sərdabədə yaşayır. Haqqında danışılan sərdabəni müqəddəs edən isə üç məsum imamın orada yaşamasıdır. Allah-təala özü bu müqəddəs məkanda zikr və duaya icazə vermişdir."(2)

İkincisi, hər bir məzhəbin əqidəsini onun aparıcı alimlərinin kitablarından öyrənmək olar. Şiə alimlərinin kitablarına müraciət etdikdə anlaşılır ki, imam Mehdinin (ə) mövludundan çox-çox əvvəllərdən başlamış hazırkı dövrədək hətta avamlar arasında belə bir etiqad olmamışdır. İmamın hələ də sərdabədə olması düşmənlər tərəfindən .uydurulmuş bir böhtandır

?Sual: ٣٢٧. Böyük qeyb dövründə həzrət Mehdinin (ə) məkanı haradadır

Cavab: Bir çox rəvayətlərdən məlum olur ki, Sahibəzzaman nəinki müqəddəs .sərdabədə deyil, hətta onun heç bir daimi məkanı yoxdur

İmam Mehdi (ə) İbrahim ibn Məhzyara xitabən buyurur: "Atam mənə vəsiyyət edib ki, məxfi və uzaq yerlərdə məskən salıb azğın insanların pisliklərindən amanda qalım. Bu (vəsiyyət məni uca dağlara çəkib apardı."(١

Bəli, bəzi rəvayətlərə əsasən, həzrət Mehdinin (ə) yalnız xüsusi şiələrə məlum olan .müəyyən məkanı vardır

İshaq ibn Əmmar imam Sadiqdən (ə) belə nəql edir: "Qaim üçün iki qeyb var: biri qısa, o biri uzun. Qısa qeyb dövründə xüsusi şiələrdən savay kimsə onun yerini bilməz. (Böyük qeyb dövründə yalnız ən yaxın dostlar onun yerindən xəbər tutar."(٢

?Sual: ٣٢٨. Həzrət Mehdi (ə) müqəddəs sərdabədən zühur edəcəkmi

Cavab: Şiələrə atılan növbəti böhtanlardan biri budur ki, guya onlar imamın sərdabədən zühur edəcəyinə inanır. Amma şiələrin hədis və kəlamlarına müraciət etdikdə görürük ki, deyilənlər iftiradan başqa bir şey deyil. Şiələr inanır ki, həzrət .Mehdi (ə) öz babası peyğəmbər kimi Məkkədən zühur edəsidir

Fəzl ibn Şazan uzun bir hədisdə imam Sadiq (ə) və həzrət Əlidən (ə) belə nəql edir: "Ey Hüseyn, o sənin doqquzuncu övladındır! O rükn və məqam arasında (Məkkədə) zühur (edəcək..."(٣

Şeyx Səduq imam Sadiqdən (ə) belə nəql edir: "Bizdən olan Qaim qorxudan hifz olunmuş, qələbə ilə təmin edilmiş kəsdir... O

---

۱- [۵۵۰] “Bihar”, c. ۹۹, s. ۱۰۸.

۲- [۵۵۱] “Kafi”, c. ۱, s. ۳۴۰.

۳- [۵۵۲] “Möcəmi-əhadisul-imamul-Mehdi (ə)”, c. ۳, s. ۲۳.

(zühur etdiyi vaxt Kəbəyə sığınar, həmin vaxt onun ətrafında ۳۱۳ nəfər cəm olar."(۱

**Qeyb dövrünün vəzifələri**

?Sual: ۳۲۹. Qeyb dövrünün möminlərinin əsrin imamı (ə) ilə bağlı hansı vəzifələri var

Cavab: Həzrət Mehdi (ə) ilə bağlı şiələrin hər birinin ağır vəzifələri vardır. Bu :vəzifələrdən bəzilərini xatırlayaq

Mehdinin (ə) zühurunun qətiliyinə iman – Sünnə əhli rəvayətlərində oxuyuruq ki, . ۱ Peyğəmbər (s) buyurmuşdur: "Hər kəs Mehdinin (ə) zühurunu inkar etsə, Məhəmmədə (nazil olanı inkar etmişdir."(۲

Fitnələr zamanı səbir və dinə bağlılıq –İmam Sadiq (ə) buyurmuşdur: "Bizim Qaimin .۲ qeybi dövründə əmrimizə bağlanan və qəlbi hidayətdən sonra çaşmayan kəsin xoş (halına!"(۳

İmam Mehdinin (ə) vilayətinə bağlılıq - İmam Baqir (ə) həzrət peyğəmbərin dilindən .۳ belə nəql edir: "Bizim əhli-beytin Qaimini görənin xoş halına! Qiyamından öncə ona (iqtida edənin xoş halına!"(۴

Allah-təaladan imam Mehdi (ə) (onu tanımaq) mərifəti diləmək – Kuleyni Əbu- . ۴ Bəsirdən nəql edir ki, imam Baqir (ə) buyurmuşdur: "İmaməti tanıdınmı?" Ərz etdim ki, bəli, and olsun Allaha, Kufədən xaric olmamışdan tanıdım." Buyurdu: "Bu vaxt üçün (sənə yetər."(۵

Beyətin təzələnməsi və itaətdə sabitlik – Əhd duasında oxuyuruq: "Pərvərdigara! . ۵ Həqiqətən, mən onun (həzrət Mehdi) üçün bu günümdə əhd-peymanı, beyətimi təzələyirəm. Elə bir beyət ki, ondan ayrılmamışam və heç vaxt onu zay etməmişəm. (Pərvərdigara! Məni o həzrətin köməkçilərindən, müdafiəçilərindən qərar ver..."(۶

Şübhə və iradlara cavab – İmam Sadiq (ə) buyurur: "Özünüzü şəkk-şübhədən . ۶ uzaqlaşdırın, şəklərdən pəhriz edin, bundan həzər qılın. Mən Allahdan sizin tövfiq və (öyüd istəyirəm."(۷

۱- [۵۵۳] "Kəmalud-din", s.۳۳۱.

۲- [۵۵۴] "Fəraidus-səmteyn", c. ۲, s. ۳۲۴.

۳- [۵۵۵] "Kəmalud-din", s.۳۵۸.

۴- [۵۵۶] "Kəmalud-din", s.۲۸۶; "Bihar", c. ۵۱, s. ۷۲.

۵- [۵۵۷] "Kafi", c. ۱, s. ۱۸۵.

۶- [۵۵۸] "Bihar", c. ۱۰۲»

۷- [۵۵۹] "Bihar", c. ۵۱, s. ۱۴۶.

Mömin qardaşlara yardım – İmam Sadiq (ə) “Əsr” surəsindəki “əmilus-salihati” . ٧ (təbirini din qardaşları arasında bərabərlik və qarşılıqlı yardım kimi izah etmişdir.(١

İmam Əsgərinin (ə) təfsirində deyilir: “Hər kəs bizə xatir, əlimiz çatmadığından möhnətə düşmüş bir yetimi öhdəsinə götürsə, bizim elmimizdən bacardığını ona öyrətsə, Allah-təala onun haqqında buyurmuşdur: “Ey yardım göstərən kərim bəndə! Mən kərəmdə ondan yuxarıyam. Ey mənim mələklərim, ona öyrətdiyi hər bir hərf üçün (behiştdə milyon qəsr verin...”(٢

Məhdəviyyət iddiasında olan yalançılara inanmamaq – İmam Sadiq (ə) buyurur: “Heç .٨ (şübhəsiz, bir-birinə oxşar on iki bayraq qalxar və onlar bir-birindən seçilməz...”(٣

Zühurun tezləşməsi üçün çoxlu dua etmək – Həzrət Mehdi (ə) bir məktubunda İshaq .٩ ibn Yaquba buyurur: “Zühurun tezləşməsi üçün çox dua edin. Çünki sizin qurtuluşunuz (ondadır.”(۴

Tələsməmək – Kuleyni imam Sadiqin (ə) belə buyurduğunu nəql edir: “Həqiqətən, .١٠ xalq bu işdə tələsdiyi üçün həlak oldu. Bəndələri tələsdiyi üçün Allah tələsməyəcək. (Çünki bu iş üçün bir nəhayət var...”(۵

Zühurun vaxtını müəyyənləşdirməmək – İmam Sadiq (ə) buyurur: “Həqiqətən, biz .١١ (əhli-beyt vaxt müəyyənləşdirmirik...”(۶

Həzrət Mehdini (ə) sevmək – Bir çox rəvayətlərdə əhli-beyt məhəbbəti tövsiyə .١٢ olunmuşdur. Belə bir tövsiyə xalqın diqqətinin Mehdiyə (ə) cəlb olunmasında və onun .göstərişlərinə itaət edilməsində mühüm təsirə malikdir

**İmam Mehdinin (ə) əsil-nəsli**

?Sual: ٣٣٠. Həzrətin zahiri görünüşü necədir? Kimsə özünü ona oxşada bilərmi

Cavab: Atasına cənazə namazı qıldığı vaxt xalq həzrət Mehdini (ə) gördü. O (buğdayıbəniz bir uşaq idi, saçları gözəl, ön dişlərinin arası açıq idi.(٧

١- [٥٦٠] “Kəmalud-din”, s.٦٥٦; “Bihar”, c. ٢۴.

٢- [٥٦١] “Bihar”, c. ٢, s. ۴.

٣- [٥٦٢] “Kəmalud-din”, s.٣۴٨.

۴- [٥٦٣] “Kəmalud-din”.

٥- [٥٦۴] “Kafi”, c. ١, s. ٣٦٩.

٦- [٥٦٥] “Bihar”, c. ٥٢, s. ١١٩.

٧- [٥٦٦] “Tarixul-ğeybətul-suğra”, s. ٥۴٠.

Şeyx Tusi həzrəti kiçik qeyb dövründə görənlərin dilindən nəql edir ki, həzrət gözəl simalı, xoşətirli, böyük heybətli bir gənc idi. Rəvayətçi deyir: "Mən ondan gözəl danışanını görmədim."(١)

Digər bir rəvayətdə deyilir: "O, ortaboyludur. Başı girdə, alnı genişdir... Çöhrəsi safdır, sağ yanağında xalı var."(٢)

İkinci suala gəldikdə, bir şəxs özünü zahirən imama oxşada bilsə də, zühur əlamətləri və imamdan müşahidə olunan möcüzələr belə bir yanlışlığa yol verməz. Bunu Allahın lütfü tələb edir. Allah lütfü özünə vacib etmişdir. Bu səbəbdən də elə bir iş görəsidir ki, zühur dövründə həzrətin vücudu kimsəyə oxşamasın.

Sual: ٣٣١. Həzrətin adını (Məhəmməd) çəkmək olarmı?

Cavab: Yüzdən çox rəvayətdə həzrətin adının çəkilməsinə münasibət bildirilir. Bu rəvayətləri dörd qismə bölmək olar:

١. Qeyd-şərtsiz həzrətin adının çəkilməsini qadağan edən rəvayətlər;

٢. Zühur dövrünədək onun adının çəkilməsini qadağan edən rəvayətlər;

٣. Uyğun qadağanı qorxu, təqiyyə və başqa amillərlə izah edən rəvayətlər;

۴. Həzrətin şərif adının bildirildiyi rəvayətlər.

Birinci və ikinci qisim rəvayətlər eyni bir mənanı bəyan edir. Bəziləri bu sayaq rəvayətlərə istinadən həzrətin adının çəkilməsini qadağan etmişlər. Onların nəzərincə, onun adını çəkmək zühur dövrünədək haramdır. Əllamə Məclisi, Şeyx Səduq, Şeyx Müfid, Təbərsi, Mirdamad, Mühəddis Cəzairi, Mühəddis Nuri, Mirza Şirazi, Mirza Məhəmməd Təqi İsfəhani belə alimlərdəndir.

Bəziləri də bu adın çəkilməməsinin səbəbi kimi qorxu və təqiyyəni göstərirlər. Ərbili, Hürr Amili bu qəbil alimlərdəndir.

Bəziləri isə qadağa hökmünün yalnız kiçik qeyb dövrünə aid olduğunu bildirir.

Belə görünür ki, ikinci baxış həqiqətə daha çox uyğun gəlir. Yəni bu qadağa qorxu və :təqiyyə səbəbindəndir. Dəlilləri göstərək

Can verən insana (möhtəzir) təlqin haqqında danışılarkən deyilir: “Can verən insana .١ fərəc, şəhadəteyn kəlmələrini və hər bir



---

.Əl-Ğeybət”, Tusi, s. ١۵٢“ [۵۶٧] -١

.Həmin mənbə, s. ١۵۶ [۵۶٨] -٢

.imamın adını təlqin et."(١) Belə görünür ki, təlqin zamanı həzrətin adı da qeyd olunur

Meyyitə təlqin zamanı da bütün imamların, o cümlədən, həzrət Mehdinin (ə) adı da .٢ (təlqin edilir.(٢

Məhəmməd ibn İbrahim Kufi deyir: İmam Əsgəri (ə) adını çəkdiyi kəs üçün qurbanlıq .٣ etmək məqsədi ilə mənə pul verib buyurdu: "Bu, övladım Məhəmməd üçün (əqiqədir."(٣

İmam Əsgərinin (ə) ən məşhur künyəsi "Əbu-Muhəmməddir". Bu künyədə həzrət .۴ .Mehdinin (ə) adı çəkilmişdir

İmam Rizadan (ə) imam Hüseynin (ə) qəbrini ziyarəti haqqında soruşulduqda . ۵ buyurur: "Məhəmməd və onun əhli-beytinə çoxlu salam göndər, onlardan hər birinin (adını çək və onların düşmənlərindən Allaha pənah apar."(۴

Tədqiqatçı alim Ərbili deyir: "Elə düşünürəm ki, həzrətin şərif adının çəkilməsinin qadağa səbəbi qorxu və təqib dövründə təqiyyə və onun ad və ünvanının axtarılması olmuşdur. Amma qorxu və təqiyyə olmayan dövrümüzdə bu adı çəkməyin eybi (yoxdur."(۵

Cabir ibn Abdullah Ənsari imam Baqirə (ə) deyir: "Həzrət Fatimənin (s) görüşünə .۶ getdim ki, övladı Həsənin dünyaya gəlişinə görə ona təbrik edəm. Onun əlində bəyaz dürdən bir səhifə gördüm. Soruşdum ki, ey aləmin ən üstün qadını, əlinizdəki səhifə nədir? Həzrət buyurdu: "Burada imam övladlarımın adı var..." Cabir deyir: "Səhifəyə (baxıb imamların hər birinin adını orada gördüm..."(۶

Həzrət peyğəmbərdən (s) nəql olunmuş bir çox hədislərdə bildirilir ki, həzrətin adı .٧ .Allah rəsulunun adı ilə eynidir. Bu da həzrət Mehdinin (ə) adını göstərir

?Sual: ٣٣٢. Həzrət Mehdi (ə) Abbasın övladlarındandırmı

Cavab: Abbasilər öz siyasi mövqelərini möhkəmləndirmək üçün yalan hədislər uydurmuşdular. Onlar mütəvatir Məhdəviyyət hədislərindən istifadə edərək öz :xeyirlərinə hədislər qoşurdular. Onlardan bəzilərini nəzərdən keçirək

---

۱- [۵۶۹] “Kafi”, c. ۳, s. ۱۳۴.

۲- [۵۷۰] “Vəsailuş-şiə”, c. ۳, s.۱۷۴.

۳- [۵۷۱] Həmin mənbə, c. ۲۱, s. ۴۴۸.

۴- [۵۷۲] Həmin mənbə, c. ۱۴, s. ۵۴۹.

۵- [۵۷۳] “Kəşful-ğəmmə”, c. ۳, s. ۳۱۰.

۶- [۵۷۴] “Kəmalud-din”, s.۳۰۷.

١. Əhməd ibn Hənbəl nəql edir ki, həzrət Peyğəmbər (s) buyurmuşdur: "Əgər Xorasan tərəfdən qara bayraqların qalxdığını görsəniz, onlara qoşulun. Çünki Allahın xəlifəsi Mehdi (ə) onların arasındadır."(١)

Bu hədisi ibn Qəyyim Cəvziyyə "Əl-Minarul-munif" kitabında zəif saymışdır. Çünki bu rəvayətin sənədi Əli ibn Zeydə aiddir. Təkcə bu şəxs tərəfindən nəql olunmuş hədislər isə höccət deyil.(٢)

٢. İbn Macə də eyni məzmunu qeyd etmişdir.(٣) Amma İbn Qəyyim məhz Yəzid ibn Əbu-Ziyad xəbəri nəql edənlərdən olduğu üçün zəif olmuşdur. O deyir: "Bu və bundan öncəki hədis səhihlik baxımından dəlil ola bilməz ki, ümumdünyəvi hökumətin rəhbəri Abbas övladındandır və o, dünyanın sonunda zühur edəcək..." ("Əl-Minarul-munif", s.١٣٧, ١٣٨)

Mehdi (ə) Abbasinin dünyanın sonunda olmaması, rüku və məqam arasında ona beyət edilməməsi, Dəccalı öldürməməsi və İsanın ona yardım üçün səmadan enməməsi rəvayətlərdə həzrət Mehdiyə (ə) aid sadalanmış xüsusiyyətlərin onda olmadığını göstərir.

Başqa sözlə, xilaskarın vəd olunmuş heç bir xüsusiyyəti bu şəxsdə yoxdur.

٣. Osman ibn Əfvan Allahın rəsulundan (s) belə nəql edir: "Mehdi (ə) mənim əmim Abbasın övladlarındandır."(٤)

Əvvəla, ibn Əl-Covzi bu hədisi uydurma hədislər toplanmış "Əl-movzuat" kitabında nəql etmişdir.

İkincisi, bu hədis Kəbul Əhbar, Osman ibn Əfvan və Abdullah ibn Ömər tərəfindən nəql olunmuşdur. Kəbin nəql etdiyi hədislər şiə və sünni tərəfindən etibarlı sayılmır. Osman ibn Əfvanın nəql etdiyi hədisdə Məhəmməd ibn Vəlidin nəqli var və rical alimləri onu zəif sayır. Abdullah ibn Ömərin nəql etdiyi hədisin də sənədi zəifdir.

Sual: ٣٣٣. Vəd olunmuş xilaskar İsa ibn Məryəmdirmi?

Cavab: Belə bir iddianı irəli sürənlər ibn Macənin həzrət Peyğəmbərdən (s) nəql etdiyi

(belə bir hədisə əsaslanırlar: "Mehdi (ə) İsa Məryəmdən başqa bir kəs deyil."(۵

:Qeyd etməliyik ki

səh:۲۰۶

---

.Müsnəde-Əhməd", c. ۵, s. ۲۷۷" [۵۷۵] -۱

.Əl-Minarul-munif", s. ۱۵۷" [۵۷۶] -۲

.Sünəne-ibn Mace", c. ۲" [۵۷۷] -۳

.Kənzul-Ummal", c. ۱۴, s. ۲۶۴" [۵۷۸] -۴

.Sunəne ibn Maccə", c. ۲, s. ۱۳۴۰" [۵۷۹] -۵

.١ Həzrət Peyğəmbərdən (s) Məhdəviyyət (ə) hədislərini nəql edən səhabələrin əksəriyyəti bu şəxsin həzrət peyğəmbər nəslindən olduğunu bildirir.

.٢ İbn Macənin bu hədisi hədis və kəlam alimlərinin etirazı ilə üzləşmişdir və kimsə ona istinad etməmişdir.

.٣ İbn-Macə özü "Mehdi Fatimə övladlarındandır" hədisini nəql etmişdir.(١)

.۴ İbn-Qəyyim Covziyyə bu hədisi "Əl-Minarul-munif" kitabında nəql etmiş və onu zəif saymışdır. Hakim Nişapuri də öz növbəsində bu hədisə təəccübünü gizlətməmişdir.(٢)

Zəhəbi deyir: "Bu hədis inkar olunası xəbərdir."(٣)

Qurtubi deyir: "Uyğun hədis bu mövzuda olan digər hədislərə ziddir. Mehdinin (ə) Peyğəmbər (s) və Fatimə (s) övladı olduğu sabit bir məsələdir."(۴)

.۵ Bu hədisi Təbərani nəql etsə də, "Mehdi İsa ibn Məryəmdən savay başqa kəs deyil" cümləsini zikr etməmişdir.(۵)

.۶ Fatimə (s) övladlarından olan Mehdinin (ə) zühuru ilə bağlı rəvayətlər mütəvatirdir. Xilaskarın İsa olduğunu bildirən hədis isə heç bir cəhətdən mötəbər sayıla bilməz. Peyğəmbər Əhli-beytindən olan xilaskarın zühuru İslam tarixi boyu müsəlmanlar arasında məşhur inanclardandır.

Əbül-Feyz Ğəmari də uyğun hədisə qarşı səkkiz irad bildirmişdir.(۶)

Sual: ٣٣۴. Həzrət Peyğəmbərin (s) "Mehdinin (ə) adı mənim adımdan, onun atasının adı atamın adındandır" buyruğunu nəql edən hədisi necə dəyərləndirirsiniz?

Cavab: Əksər sünni alimləri bu fikirdədir ki, həzrət Mehdinin (ə) atasının adı Abdullahdır. Belə bir rəvayəti Əbu-Davud nəql etmişdir.(٧) Bu rəvayət imamiyyə etiqadı ilə uyğun deyil. Çünki imamiyyə şiələri həzrət Mehdinin (ə) imam Həsən Əsgərinin (ə) övladı sayırlar.

Buna dəlil nədir?

---

.Həmin mənbə, s. ۱۳۶۸ [۵۸۰] -۱

.Mustədrəke-hakim”, c. ۴, s. ۴۴۱“ [۵۸۱] -۲

.Təhzibul-təhzib”, c. ۹, s. ۱۲۵“ [۵۸۲] -۳

.Əl-Təzkirə”, Qurtubi, c. ۲, s. ۷۰۱“ [۵۸۳] -۴

.Əl-məcəmul-Kəbir», c. ۸, s. ۲۱۴» [۵۸۴] -۵

.İbrazul-Vəhmul-məknun”, s. ۵۳۸“ [۵۸۵] -۶

.Sünəne Əbu-Davud”, c. ۲, s. ۳۰۹“ [۵۸۶] -۷

Həzrət Mehdi (ə) ilə bağlı tərtib olunmuş kitablarda o cümlədən "Səhihe-Termizidə", .١ "Sünəne-ibn Macədə", Əbu-Nəimin kitablarında, "Müsnəde-Əhməd ibn Hənbəldə" .belə bir hədis nəql olunmamışdır

Çox ehtimal ki, uyğun rəvayət Abbasilərin uydurmalarındandır. Çünki Abbasilər öz .٢ hakimiyyətlərini möhkəmləndirmək üçün, üçüncü Abbasi xəlifəsi Məhəmməd ibn .Abbasa xalqdan beyət almaq məqsədi ilə belə bir işə əl ata bilər

Adı Abdullah olan Mənsur Abbasi oğlu Məhəmmədi özünə canişin təyin etmişdi. O, xalqı Məhəmmədə beyətə məcbur edirdi. Bu məqsədlə oğlunun adını Mehdi qoymuşdu. O öz oğlunu xalqa xilaskar kimi tanıtdırıb beyət almaq istəyirdi. Xəlifə öz adı Abdullah olduğundan belə bir hədis uydurmağı göstəriş vermiş və həmin hədisdə (xilaskarın atasının adını Abdullah kimi qeyd etmişdi.(١

?Sual: ٣٣٥. Mehdi (ə) Həsənin (ə) övladlarındandır" hədisini necə qiymətləndirmək olar

Cavab: Əbu-Davud Əbu-İshaqdan nəql edir ki, həzrət Əli (ə) öz övladı Həsənə (ə) baxıb buyurdu: "Həqiqətən, bu övladım ağadır. Necə ki, Peyğəmbər (s) onu ağa (adlandırıb. Tezliklə ondan peyğəmbərlə bir adda olan kəs dünyaya gələr."(٢

:Uyğun hədisə münasibətimizi bildirək

Mehdinin (ə) Hüseynin (ə) övladı və onun nəslindən olması ilə bağlı onlarla hədis .١ .mövcuddur

Mehdi (ə) həm də Həsən (ə) nəslindəndir. Çünki imam Baqirin (ə) anası Fatimə (s) .٢ imam Həsənin qızı olmuşdur. Deməki, həzrət Mehdi (ə) həm Həsən (ə), həm də Hüseyn (ə) övladıdır. Həzrət Peyğəmbər (s) buyurur: "Ümmətin Mehdisi (ə) Həsən (ə) və (Hüseyn (ə)."(٣

Əqdud-durər" kitabının müəllifi uyğun hədisi nəql etmiş, amma Həsənin (ə) yox," .٣ Hüseynin (ə) adını çəkmişdir. "Səhihi-Termizi", "Sünəne-nəsai", "Sünəne-beyhəqi"də .də hədis bu formada nəql olunmuşdur

Belə bir nöqtə də maraqlıdır ki, uyğun hədislərin meydana çıxmasında Əbva . ۴

məntəqəsində xalqdan beyət almış Məhəmməd ibn



---

۱- [۵۸۷] "Şəhid Mütəhəri, əsərlər külliyyatı, c. ۱۸, s. ۱۷۳, ۱۷۴.

۲- [۵۸۸] "Sünəne ibn Davud", c. ۲, s. ۳۱۱.

۳- [۵۸۹] "Məcməul-Zəvaid", c. ۹, s. ۱۶۵.

Abdullah Həsəninin və Həsəni seyyidlərinin rolu olmamış deyil. Həsəni seyyidləri bəni-Üməyyəyə qarşı qiyam fikrində olduğundan mənəvi dayağa ehtiyac duyurdu. Bu səbəbdən də həzrət Mehdi (ə) ilə bağlı nəql olunmuş rəvayətlərdən faydalanıb, uyğun hədisi Abdullah ibn Həsənə tətbiq etdilər. Onlar rəvayət uydurub dinin imam Həsən nəslindən olduğunu bildirdilər.

**Böyük qeyb dövründə imam Mehdi (ə) ilə görüş**

Sual: ٣٣۶. Böyük qeyb dövründə imamla görüşmək mümkündürmü?

Cavab: Bəli, cavab olaraq iki nöqtəni qeyd etmək olar:

a) Böyük qeyb dövründə faydalı sayılmışdır ki, həzrət arabir özünü sözü keçərli böyüklərə göstərsin. Belə bir görüş insanlarda əminlik yaradır, qeybin uzun çəkməsi ilə bağlı ortaya çıxan şübhələri aradan qaldırır. Avam xalq üçün hər hansı dəlil yetərli olmur. Ona görə də din böyükləri göstəriş verirlər ki, imamla baş tutmuş görüşlər xalqa danışılsın. Bu sayaq söhbətlər xalqın qəlbini isidir, onlara ümid verir. Çünki bir şeyin mümkünlüyünün ən böyük dəlili, onun baş verməsidir.

b) Həzrətlə görüşün mümkünlüyünü istisna edən heç bir şəri və əqli dəlil yoxdur.

Sual: ٣٣٧. Hansı alimlər belə bir görüşün mümkünlüyünə inanır?

Cavab: Uzaq keçmişdən bu günədək şiə alimləri həzrətlə görüşü mümkün saymışdır. Bəzi alimlərin uyğun məsələ ilə bağlı fikirləri ilə tanış olaq:

١. Seyyid Mürtəza: "Biz imamla görüşün mümkünlüyünü istisna etmirik...

Əgər imamın qeybə çəkilməsinin səbəbi zalımlardan təqiyyə etməkdirsə, bu məqsədi həqiqi övliya və şiələrə aid etmək olmaz. Demək, imamın onlara görünməsi zəruridir..."(١)

٢. Şeyx Tusi: "Biz təsdiqləyirik ki, bir çox övliyalar və imamətə inananlar həzrətlə görüşmüş və ondan faydalanmışlar."(٢)

٣. Seyyid ibn-Tavus: "(Ey övladlarım) Allahın inayət və ehsan etdiyi kəs üçün imamətə

(doğru yol açıqdır."(٣

səh:٢٠٩

---

١- [٥٩٠] "Tənzihul-Ənbiya", s. ١٨٢-١٨٤.

٢- [٥٩١] "Kəramatul-Muhəqqiqin", s. ٥٣٣.

٣- [٥٩٢] "Kəşful-Muhəccə", s. ١٤٣-١٥٤.

Alim digər bir məqamda deyir: “İmam ümumi şəkildə şiələrdən qeybdə olsa da, kimlərinsə onunla görüşə bilməsi istisna olunmur. Kimlərsə imamın söz və rəftarından (bəhrələnib, bunu başqalarından gizlədə bilər...”(١

(Axund Xorasani: “Bəzi saleh insanların imamla görüşə bilməsi mümkündür...”(٢ .۴

Tədqiqatçı (mühəqqiq) Naini: “Qeyb dövründə, adətən, həzrəti görmək .۵ mümkünsüzdür. Bəli, bəzən saleh fərdlər onunla görüşüb göstərişlərini əldə edə (bilər.”(٣

?Sual: ٣٣٨. Həzrətlə görüş qeyb məsələsi ilə zidd deyilmi

Cavab: Bəziləri iddia edirlər ki, qeyb dövründə həzrətlə görüşmək qeybin hikməti ilə .ziddir

Sual: ٣٣٩. Əgər böyük qeyb dövründə də imamla görüşmək mümkündürsə, böyük qeyb ?dövrünün kiçik qeyb dövründən hansı fərqi var

Cavab: Kiçik qeyb dövründə həzrət Mehdi (ə) tamamilə gözlərdən gizlidir. O yalnız vəkilləri və səfirləri vasitəsi ilə əlaqə saxlayır. Bəzən səfirlər müəyyən adamların (həzrətlə görüşünü təşkil etmişlər.(۴

Amma böyük qeyb dövründə məsələ başqa cürdür. Bu dövrdə zərurət olduqda həzrət .özü bəzilərin görüşünə gəlir və onlar həzrətin varlığından bəhrələnirlər

Sual: ٣۴٠. Məgər həzrətin Əli ibn Məhəmməd Səməriyə yazdığı məktubda böyük qeyb ?dövründə həzrətlə görüşün mümkünlüyü istisna edilmirmi

Cavab: Bəziləri belə bir görüşün mümkünlüyünü inkar edərkən həzrət Mehdinin (ə) Əli ibn Səməriyə yazdığı məktubu əsas göstərirlər. Çünki bu məktubda yazılmışdır: “Agah ol! Əgər Süfyaninin



---

.Əl-təraif”, s. ١٨۵“ [۵٩٣] -١

.Kifayətul-üsul”, c. ٢, s. ٢٩١“ [۵٩۴] -٢

zühurundan və böyük səsdən öncə kimsə məni gördüyünü iddia etsə, yalançı və ?böhtançıdır…”(١) Bəs həqiqət necədir

Kimsə bu rəvayətin düzgünlüyünü qəbul etməmişdir. Ona görə də alimlərdən və .١ .salehlərdən bir dəstəsi həzrətlə görüş haqqında danışır

İnkar olunan müşahidə tanımaqla müşahidədir. Hansı ki, bir çox görüşlərdə ilkin .٢ .mərhələdə tanışlıq olmamışdır

Olsun ki, bəziləri əsassız olaraq imamı naib və səfir kimi gördüklərini iddia etmişlər. .٣ Amma həzrət böyük qeyb dövründə naiblərin olmadığını bildirir. Məktublardan birində ”…həzrət bildirir ki, tezliklə şiələrin arasında məni gördüyünü iddia edənlər tapılacaq

Şeyx Tusi bu məktubu nəql etsə də, saleh insanların imamla görüşə bilməsini .٤ .mümkün sayır

Olsun ki, müşahidə dedikdə xüsusi bir görüş nəzərdə tutulmuşdur. Rəvayətdə .٥ oxuyuruq: “Əgər sənin yanında ٥٠ nəfər bir nəfərin ziddinə and içsə, amma həmin şəxs onların dediyinin ziddini söyləsə, onu təsdiqlə, həmin ٥٠ nəfəri inkar et.” Bu rəvayətdə .٥٠ nəfərin andının təsiri açıqlanılır

Rəvayəti onun sənədinin mötəbərliyi təsdiqləyir. Hansı ki, görüşlər o qədər çox .٦ .olmuşdur ki, insanda yəqinlik yaradır

Olsun ki, uyğun məktubda ixtiyari bir görüş nəzərdə tutulmuşdur. Əslində böyük .٧ .qeyb dövründə yalnız Allahın məsləhət bildiyi şəxs həzrətlə görüşə bilər

.Uyğun məktub sənəd baxımından zəifdir .٨

?Sual: ٣٤١. İmamla görüşün mümkünlüyü yalançılara meydan açmırmı

Cavab: Əgər bir işin mümkünlüyü ilə bağlı qəti dəlillər varsa, ikinci dərəcəli problemlərə görə onu inkar etmək olmaz. Xalqı yalançıların hiyləsindən qorumaq alimlərin işidir. .Bəziləri peyğəmbərlik iddiasına düşüb deyə, peyğəmbərliyi inkar etmək olmaz

Sual: ٣٤٢. “Haram müqəddimə” qaydasına əsasən imamla görüş iddiasını yalan saymaq

?olarmı

Cavab: Sünnə əhli bu əqidədədir ki, haramla sonuclanan yollar qəti şəkildə .bağlanmalıdır. Başqa sözlə, “haram müqəddimə” külli şəkildə haramdır



---

.Bihar”, c. ۵۲, s. ۱۵۱“ [۵۹۷] -۱

Əslində isə haram müqəddimə həmişə haram deyil. Bu hal bəziləri üçün bəzi hallarda haramdır. Əgər imamla görüş iddiası azğınlığa səbəb olarsa, onu nəql etmək haramdır. Amma görüşlərin ümumi şəkildə bəyanı haram deyil, belə xəbərlər insanların imanını gücləndirir. Əlbəttə ki, bəziləri bu iddiadan sui-istifadə edə bilər. Amma bu sayaq .yalanların qarşısını almaq alimlərin vəzifəsidir

Sual: ٣٤٣. Tanınması mümkün sayılmayan həzrət Mehdi (ə) ilə görüş necə mümkün ola ?bilər

Cavab: Bəziləri böyük qeyb dövründə imamla görüşü istisna edərək müəyyən rəvayətlərə əsaslanırlar. Məsələn: “Həzrət Höccət xalqı tanıyır, xalq isə onu tanımır”; ”.Digər bir rəvayətdə deyilir: “O xalqı görür, amma xalq onu görmür

:Uyğun sualı belə cavablandırmaq olar

Bu rəvayətlərdə ümumi xalq nəzərdə tutulmuşdur. Ayrı-ayrı ləyaqətli şəxslərin . ١ .imamla görüşə bilməsi rəvayətə zidd deyil

.İkinci rəvayət Həcc haqqındadır və bütün hallara aid edilə bilməz .٢

İkinci rəvayətdə imamla görüş yox, onun tanınması inkar olunur. Xüsusi ilə də . ٣ rəvayətdə həzrət Mehdi (ə) həzrət Yusifə oxşadılmışdır. Xalq onu görürdü, amma onu .tanımırdı

Sual: ٣٤٤. Qeyb dövründə insanların imtahana çəkilməsi həzrətlə görüş xəbərinə zidd ?deyilmi

Cavab: Bəziləri deyirlər ki, şiələr qeyb dövründə imamı görməməklə imtahana çəkilir. Guya, bu həqiqət imamla görüş xəbərinə ziddir. Əslində isə, şiələrin imtahanı dedikdə .ümumi şiə toplumu nəzərdə tutulur. Bəzi ləyaqətli insanların görüşü isə istisnadır

?Sual: ٣٤٥. Böyük qeyb dövründə kimlər həzrət Mehdi (ə) ilə görüşə bilmişdir

Cavab: Həzrətlə görüşə nail olan bütün şəxslərin adını sadalamaq olmaz. Çünki onlardan bəziləri tanınmır, tanınanlar isə olduqca çoxdur. Amma nümunə olaraq bu şəxslərdən bəzilərinin adını çəkə bilərik: Seyyid ibn Tavus, Əllamə Hilli, Şeyx Qətifi,

Müqəddəs Ərdəbili, Məhəmməd Təqi Məclisi, Seyyid Mehdi Bəhrul-Ülum, Şeyx Müfid, Şeyx Ənsari, Mirzayi Şirazi, Şeyxpur Amili, İsmail Herqəli və başqaları.

?Sual: ۳۴۶. Həzrət Mehdi (ə) ilə görüş hansı şəkildə baş verir

Cavab: Həzrət Mehdinin (ə) zəruri hallarda insanlarla görüşünün necəliyi haqqında :ehtimallar var

Həzrətlə görüşən şəxs ondan uzaq olmamış, imamın yaşadığı cəmiyyətdə .۱ .yaşamışdır

Görüşlər təsadüfi baş verir. Həzrət bir məhəldən ötərkən çətinliyə düşmüş insanla .۲ .görüşür

Həzrət bir şəxsin çətinliyə düşdüyünü gördükdə və ona yardım əli uzatmağı zəruri .۳ .bildikdə təbii yolla hərəkət edib özünü həmin şəxsə çatdırır

Ehtimal olunur ki, istəklərin həyata keçirilməsi üçün görüşlər möcüzə yolu ilə baş .۴ verir. Həzrət “Teyyül-əzr” (Qeyri-adi yerdəyişmə) edərək özünü məqsədə çatdırır. Bütün deyilənlər təsəvvürdür. Əslində həzrət istəkləri yerinə yetirmək üçün bütün .yollardan istifadə edir

?Sual: ۳۴۷. Həzrət insanlarla görüşərkən hansı məqsədləri izləyir

:Cavab: Həzrət bir neçə məqsədlə görüşə gələ bilər

Müsəlmanları zalım hakimlərin zülmündən qurtarmaq məqsədi ilə; Bəhreyn xalqının .۱ (qurtuluşu buna misal ola bilər.(۱

(Müsəlmanların oğrulardan və cinayətkarlardan qorunması.(۲ .۲

Hələ ki, zühur şərtlərinin ödənməməsi ilə bağlı xalqa xəbərdarlıq; bu görüşlərdə .۳ çatdırılır ki, insanlar ümumdünya ədalət hökumətini öhdəyə götürəcək düşüncə və (qabiliyyətə yetişməmişlər.(۳

?Sual: ۳۴۸. İmamın xalqla görüşməkdə hansı xüsusi məqsədi olur

Cavab: Əvvəlki sualda ümumi məqsədlər açıqlandı. Qeyd edək ki, həzrətin insanlarla :görüşdə xüsusi məqsədləri də olur. Onlardan bəzisinə işarə edək

;Yolda qalmış insana bələdçilik və onu məqsədə çatdırmaq .١

;Mübahisə edən iki tərəfdən haqlı olanına yardım .٢

Alimlər üçün çətinlik yaradan bəzi məsələlərin həlli; Məsələn, Müqəddəs Ərdəbili bu .٣ məqsədlə həzrətin xidmətində olmuşdur.

Şiələri hifz etməyə xatir dövrün bəzi siyasi məsələləri haqqında öncədən . ۴ ;xəbərdarlıq

;Şiələrin elm və məişət səviyyəsini qaldırmaq .۵



---

١- [۵٩٨] "Nəcmus-saqib", s. ٣۶٧.

٢- [۵٩٩] Həmin mənbə, s. ٣٧٠.

٣- [۶٠٠] "Tarixul-qeybətul-kubra", s. ١٣۵,١٣۶.«

;İqtisadi çətinlik çəkən şiələrə yardım .۶

;Çarəsiz xəstələrə şəfa .۷

;Fərəc duası" kimi duaların təlimi" .۸

...Çətinliklərdən çıxmaq üçün dua oxunuşuna həvəsləndirmə .۹

?Sual: ۳۴۹. Görüş zamanı kimsə həzrət Mehdini (ə) tanıya bilərmi

Cavab: Qeybin məqsədlərindən biri budur ki, həzrət düşmənlərdən qorunsun, onu qətlə yetirə bilməsinlər. Bu məqsədlə həzrətin tanınmaması labüddür. Amma yalnız ləyaqətli insanlar, həzrətin yaxın dostları onu tanıya bilər. Bəzi rəvayətlərə əsasən, .otuz etibarlı şəxs daim həzrətin yanındadır, onunla birlikdə yaşayır

Başqa bir qrup rəvayətlərdən məlum olur ki, həzrət ya görünmür, ya da göründükdə (tanınmır. Bir rəvayətdə imam Riza (ə) buyurur: "Onun cismi müşahidə olunmur."(۱

İmam Sadiq (ə) isə belə buyurmuşdur: "Yeddinci övladımdan olan beşinci övlad sizdən (qeybə çəkilər."(۲

Həzrət başqa bir məqamda belə buyurur: "Xalq öz imamını itirər. Həzrət Həcc (mövsümündə iştirak edər, xalqı görər, amma onlar həzrəti görməzlər."(۳

Məhəmməd ibn Osman Əmri deyir: "And olsun Allaha! Həqiqətən əmr sahibi hər (Həcc) mövsümü Həccdə hazır olar. Xalqı görər və onları tanıyar. Xalq isə həzrəti görsə də (onu tanımaz."(۴

?Sual: ۳۵۰. İmamı gördüyünü bildirənlərə necə münasibət göstərməliyik

Cavab: Əvvəla, imamla görüş insanın ixtiyarında olan iş deyil. Belə bir görüşün bir sıra .şərtləri var. Əgər şərtlər ödənsə, həzrət görüşə gələr

İkincisi, əgər bir şəxs imamla daimi əlaqədə olduğunu bildirərsə, imam Mehdinin (ə) Əli .ibn Məhəmməd Səməriyə yazdığı məktuba əsasən, həmin şəxs yalançıdır

Üçüncüsü, görüş iddiasında olan insan imtahana çəkilməlidir. Həmin şəxs doğrudan da

İslam meyarlarına əməl edirmi? Onun məqsədi xalqın diqqətini özünə cəlb etmək və .cəmiyyəti azdırmaq deyil ki? Bəli, məsumlarla görüş üçün insanda ləyaqət olmalıdır



---

.Kəmalud-din", s.۳۷۰" [۶۰۱] -۱

.Bihar", c. ۵۱, s. ۳۲" [۶۰۲] -۲

.Bihar", c. ۵۲, s. ۱۵۱" [۶۰۳] -۳

.Kəmalud-din", s.۴۴۰" [۶۰۴] -۴

?Sual: ۳۵۱. Həzrətlə görüş üçün israr etmək düzgündürmü

Cavab: Qeyb dövründə insanların vəzifəsi həzrətin zühuruna mane olan halları aradan qaldırmaqdır. Həzrətə mənəvi cəhətdən yaxın olmaq üçün öz vəzifələrimizə əməl .etməliyik

Əgər həzrətlə görüş istəyinin səbəbi onun vücudundan bəhrələnmək, onun lütfünü əldə etmək, qəlbən əminliyə çatmaqdırsa bu görüşə can atmaq faydalıdır. Əks-təqdirdə, hazırkı dövr qeyb dövrüdür və bu dövrdə xalq nəzərlərdən gizli qalmalıdır. Buna görə də səbr etmək, bu həssas məqamda imtahandan üzüağ çıxmaq üçün .vəzifələrə əməl etmək lazımdır

Bəli, bəzi iddialardan həzrətlə görüş istəyi sezilsə də, bu istəyi zühur dövrünə aid .etmək olar

## Müqəddəs Cəmkəran məscidi

?Sual: ۳۵۲. Cəmkəran məscidinin tikilməsi ilə bağlı hansı məlumatlar var

Cavab: Cəmkəran məscidinin tikilməsi ilə bağlı mərhum hacı Nuri "Nəcmus-Saqib", "Cənnətul-məva", "Əl-kəlimətut-təyyibə" kitablarında, Mirza Məhəmməd Təqi Ərbabe Qummi "Tarixi darul-iman" kitabında məlumat verir. Bundan əlavə Həsən ibn Məhəmməd ibn Həsən Qumminin "Tarixe-Qum" ("Munisul-həzin" kitabı əsasında) .məlumatlar var

Bu məlumat Həsən ibn Məslə Cəmkəraninin əhvalatına əsaslanır. Bildirilir ki, bu şəxs ۲۹۳-cü ildə həzrət Mehdi (ə) ilə görüşmüşdür. Bu görüşdə həzrət ona göstəriş vermişdir ki, dəyərli Qum alimlərindən olan Seyyid Əbül-Həsən Ər-riza ilə əlaqə (yaradıb, onun köməyi ilə bu yerdə (Cəmkəranda) məscid tiksin...(۱

Bundan əlavə, "Munisul-həzin" kitabına əsaslanaraq bildirirlər ki, Əmirəl-möminin .həzrət Mehdi (ə) bayrağının Cəmkəran məscidində qalxacağını bildirmişdir

?Sual: ۳۵۳. Cəmkəran məscidində namazın müstəhəb olmasının dəlili nədir

Cavab: Həsən ibn Məslə Cəmkəraninin nəql etdiyi əhvalatlarda nəql olunur ki, həzrət

buyurmuşdur: “Bu məkanda ۷ gün qal və orada ۴ rəkət namaz qıl. İki rəkət məscid üçün təhiyyət namazı qıl, hər



---

.Bihar”, c. ۵۳, s. ۲۳۰“ [۶۰۵] -۱

rəkətdə bir dəfə Həmd, ٧ dəfə “İxlas” surəsini oxu, rüku və səcdənin təsbihini də ٧ dəfə təkrarla. İki rəkət də Sahibəzzaman namazı niyyəti ilə namaz qıl. Birinci rəkətdə “Həmd” surəsini oxu və “iyyakə nəbudu və iyyakə nəstəin” cümləsinə çatdıqda bu cümləni ١٠٠ dəfə təkrarla. “Həmd” surəsini tamamlayıb, bir dəfə “İxlas” surəsi oxu. Sonra rüku və səcdənin zikrlərini ٧ dəfə de. İkinci rəkətdə də eyni əməlləri təkrarla. Namazı başa çatdırdıqdan sonra bir dəfə “la ilahə illəllah” söylə, həzrət Zəhranın (s) təsbihatından sonra səcdədə ١٠٠ salavat çək. Bu namazdan qəflətdə qalma! Bu məsciddə olub həmin namazı qılan kəs Beytul-ətiqdə (Allahın evində) namaz qılmış ”.kimidir

?Sual: ٣٥۴. Cəmkəran məscidinin tikintisi haqqında məlumat verən sənəd mötəbərdirmi

Cavab: Müqəddəs Cəmkəran məscidi və orada qılınan namaz haqqında sənəd araşdırması aparmağa ehtiyac yoxdur. Çünki mötəbər sənədli hədislərə əsasən, savaba çatmaq ümidi ilə müstəhəb iş görən kəs əməlin müstəhəbliyindən xəbər verən .hədis mötəbər olmasa belə, savaba çatır

Kuleyni səhih sənədə əsasən nəql edir ki, imam Sadiq (ə) buyurmuşdur: “Hər kəs bir işin savab olduğunu eşidib onu yerinə yetirsə, eşitdiyi xəbər düzgün olmasa belə, ”.həmin şəxsə savab veriləcək

Bərqi nəql edir ki, imam Sadiq (ə) buyurmuşdur: “Bir şəxs peyğəmbərin savab saydığı bir işi yerinə yetirsə, əslində peyğəmbər o işi savab saymamışsa da, bu şəxsə savab ”.verilər

?Sual: ٣٥٥. Nə üçün “Qumun tarixi” kitabında Cəmkəran əhvalatına yer verilməyib

Cavab: Hazırda araşdırmaçıların əlində olan “Tarixe-Qum” kitabı orijinal mənbənin yalnız dörddə bir hissəsidir. Əslində ٢٠ fəsildən ibarət olan bu kitabın yalnız ۵ fəsli əlimizdədir. Çox ehtimal ki, kitabın əlimizə çatmayan hissələrində Cəmkəran haqqında məlumat vardır. Mərhum Mühəddis Nuri və başqaları kitabın ilkin mənbəsini əldə edə bilməmişdilər. Ona görə də alim həmin əhvalatı “Tarixe-Qum” kitabının əsli nüsxəsi .əlində olan Nemətullah Cəzairidən nəql etmişdir

Sual: ۳۵۶. “Munisul-həzin” kitabının Şeyx Səduqa aid olduğu dəqiq deyilsə, ona istinad ?etmək olarmı

səh:۲۱۶

Cavab: Biz də bu kitabın Şeyx Səduqa aid olduğunu iddia etmirik. Amma bu münasibət həmin kitabın etibarsız olduğunu göstərmir. İbn-Şəhr Aşub "Əl-mənaqib" kitabında uyğun kitabı Həmmal Nişapuriyə aid edir. O bu kitaba istinadən imam Həsən (Müctəbadan bir möcüzə nəql edir.(١

Əllamə Məclisi də bu kəraməti "Əl-Mənaqib" kitabından nəql etmişdir. O bu kitabın (Həmmal Nişapuriyə aid olduğunu inkar etmir.(٢

Mərhum Məclisidən öncə Seyyid Məhəmməd ibn Əbu-Talib Həsəni "Təsliyətul-Məcalis" kitabında Fəttal Nişapurinin "Munisul-həzin" kitabında hədis nəql edir və bu .kitabın ona aid olmasını şübhə altına almırdı

?Sual: ٣٥٧. Nə üçün "Munisul-həzin" kitabını Şeyx Səduqa aid etmişlər

Cavab: Çox ehtimal ki, bu əhvalat Qum tarixi ilə bağlı olduğu üçün həmin kitabın haşiyəsində yazılmış və sonradan haşiyədən mətnə keçmişdir. Fəttal Nişapuri hicri ٥٠٨-ci ildə şəhadətə çatmış, "Tarixe-Qum" kitabının müəllifindən iki əsr sonra yaşamışdır. O, Şeyx Səduqun müasiridir. Buna görə də kitab Şeyx Səduqa aid .edilmişdir

.Çox olub ki, "Qamusur-rical" sahibi həmin kitabdan nümunələr nəql etmişdir

Beləcə, məlum olur ki, qədim dövrlərdə çap olmamış və kitablar əlyazma yolu ilə yayılmışdır. Üz köçürmədə peşəkar olan bir çox adamlar kitabın mövzularından .yetərincə məlumatlı olmamışlar

?Sual: ٣٥٨. Cəmkəran məscidinin xüsusi əhəmiyyəti nədir

:Cavab: Bu məscidin bir sıra əhəmiyyətləri var

Cəmkəran məscidi Həsən ibn Məslə Cəmkəraninin imam Mehdidən (ə) nəql etdiyi .١ .rəvayətə əsasən Allah-təalanın xüsusi diqqətində olan məkanlarındandır

Məscid həzrət Mehdinin (ə) göstərişi ilə tikildiyindən şərafət və müqəddəsliyə .٢ .malikdir

۳. Bu məsciddə qılınan namazın xüsusi savabları var. Həzrət buyurdu: “Orada həmin iki namazı qılan şəxs beytül-Ətiqdə namaz qılmış kimidir.”

səh:۲۱۷

---

۱- [۶۰۶] “Əl-mənaqib”, c. ۴, s. ۸.

۲- [۶۰۷] “Bihar”, c. ۳۳, s. ۳۲۷.

Müqəddəs Cəmkəran məscidi Əhli-beyt (ə), xüsusi ilə İmam-zaman aşiqlərinin .۴ ictima yeridir. Bu səbəbdən də onun xüsusi cazibəsi var. Çox insanlar həzrət Mehdi (ə) eşqi ilə uzun yol gəlib bu məsciddən bəhrələnirlər. Bildirilir ki, bəzi gecələr bu .müqəddəs yerdə bir milyona yaxın Mehdi aşiqi toplanır

.Bu müqəddəs məkanda hətta çarəsiz xəstələr şəfa tapmışdır .۵

.Bu məsciddə həzrətin bir çox aşiqləri onunla görüşə bilmişdir .۶

Bu yer o qədər müqəddəsdir ki, tarix boyu böyük alimlər piyada və ya süvari həzrətə .۷ .təvəssül və namaz qılmaq üçün oraya gəlmişlər

Sual: ۳۵۹. Bir istəyin qəbul olunması üçün ۴۰ dəfə Cəmkəran məscidinə getmək ?doğrudanmı təsirlidir

...Cavab: Bu mövzu ilə bağlı xüsusi dəlil olmasa da, üç yolla onu sübuta yetirmək olar

Alimlər Cəmkəran məscidinə ardıcıl olaraq ۴۰ dəfə getməyi faydalı saymışlar. Belə bir .۱ .təsir Səhlə məscidi haqqında da bəyan olunur

Rəvayətlərdə bildirilir ki, hər kəs ۴۰ gün özünü Allaha xatir xalis, səmimi etsə hikmət .۲ (çeşmələri onun qəlbindən dilinə cari olar.(۱)

Çoxsaylı rəvayətlərdən aydın olur ki, maddi və mənəvi fəaliyyətlərin .۳ çiçəklənməsində ۴۰ rəqəminin mühüm təsiri var. O cümlədən: ۴۰ rəqəmi övladın bətndə inkişafına təsirlidir; Şərab namazın ۴۰ gün qəbulunun qarşısını alır; Bəhlul Nəbbaşın tövbəsinin ۴۰ gündən sonra qəbul olunması; Həzrət Zəhranın bətndə möhkəmlənməsi üçün həzrət Peyğəmbərin (s) Xədicədən ۴۰ gün kənarlaşması; ۴۰ gün əhd duası oxumaq insanın həzrət Mehdiyə yaxınlaşmasına səbəb olur; həzrət Mehdi (ə) ۴۰ gün mələklərin tərbiyəsi altında olmuşdur; həzrət Adəmin ۴۰ gün xəmir halında olması; həzrət Musanın Tur dağında Allahla ۴۰ gün ünsiyyəti; İslam peyğəmbərinin ۴۰ yaşdan sonra nübüvvətə çatması; insan təfəkkürünün ۴۰ il inkişaf edə bilməsi; ۴۰ möminin şəhadətinin möminin bağışlanmasına səbəb olması; ۴۰ hədis öyrənən insanın qiyamətdə fəqih kimi məhşur olması; qonşuluq həddinin ۴۰ ev olması; məscidin ...qonşuluğunun ۴۰ evə çatması

Bu hədislərdən məlum olur ki, insanın kamala çatmasında ۴۰ rəqəminin xüsusi təsiri .var

Seyyid Bəhrul-ülum deyir: “ Biz gözlərimizlə müşahidə etmiş və öyrənmişik ki, ۴۰ rəqəminin istedadların çiçəklənməsində xüsusi təsiri var.”(۲)



---

.Kafi”, c. ۲, s. ۱۶“ [۶۰۸] -۱

.Risaleyi-Seyri-Suluk”, s. ۲۳“ [۶۰۹] -۲

?Sual: ۳۶۰. Çərşənbə axşamı Cəmkəran məscidinə getməyin savabı ilə bağlı dəlil varmı

Cavab: Həsən ibn Məslə Cəmkəraninin rəvayətinə əsasən, o, həzrətlə çərşənbə axşamı görüşmüşdür. Həzrət ona göstəriş verir ki, Cəfər Kaşaninin sürüsündəki keçini alıb həmin yerə aparsın və növbəti gecə (yəni çərşənbə gecəsi) kəsib çərşənbə günü (ətini paylasın...(۱

Bu səbəbdən də həzrətin aşiqləri həmin mübarək gecə Cəmkəran məscidinə toplaşır, .Allah-təaladan yardım diləməklə həzrətə təvəssül edib istəklərini ondan diləyirlər

Sual: ۳۶۱. ۴۰ çərşənbə gecəsi Cəmkəranda olan insan həzrət Mehdini (ə) ziyarət edə ?bilərmi

Cavab: Bu barədə xüsusi bir dəlil yoxdur. Amma bəzi rəvayətlərə əsasən ۴۰ rəqəminin təkvini təsirləri var. Əgər bir şəxs bu niyyətlə Cəmkəran məscidinə gedib ciddi şəkildə arzusunu Allahdan diləsə, digər bir tərəfdən bu görüş üçün ləyaqət əldə etsə, ümid var .ki, həzrətlə görüşə bilsin. Bir çoxları bu yolla istəyinə çatmışdır

?Sual: ۳۶۲. Əgər həzrət Mehdi (ə) hər yerdə olursa, nə üçün Cəmkərana gedək

Cavab: Bəli, biz inanırıq ki, həzrət Mehdi (ə) hər yerdə olur. Amma Cəmkəran :məscidinin xüsusi imtiyazları var

Əvvəla, Həsən ibn Məslə Cəmkəraninin rəvayətinə əsasən bu məscid həzrət Mehdinin (ə) göstərişi ilə tikilmişdir. Həzrət xalqın burada toplanmasını və dörd rəkət namaz .qılmasını istəmişdir

İkincisi, bu müqəddəs yer əsrlər boyu aşiqlərin ictima məhəlli olmuşdur. Biz də bu .müqəddəs məkanın bərəkətindən faydalana bilərik

Üçüncüsü, məhbuba doğru hərəkətin özü təsirlərə malikdir. Belə bir hərəkət insanın .həzrətə olan rəğbətini artırır



---

.Bihar", c. ۵۳, s. ۲۳۲" [۶۱۰] -۱

?Sual: ۳۶۳. Səhlə məscidinin həzrət Mehdi (ə) ilə hansı əlaqəsi var

Cavab: Bəzi rəvayətlərə əsasən zühur dövründə bu məscid həzrətin şəxsi iqamətgahı .olacaq

Bir gün imam Sadiqin (ə) yanında Səhlə məscidindən söz düşdü. Həzrət buyurdu: Agah (olun! Həqiqətən, bu yer qiyam edəcəyi vaxt əmr sahibinin iqamətgahıdır."(۱

Nəql olunur ki, həzrət Əbu-Bəsirə xitabən buyurmuşdur: "Ey Əba-Məhəmməd! Səhlə (məscidində Qaimin gəlişini sanki gözlərimlə görürəm."(۲

?Sual: ۳۶۴. Səhlə məscidində olmaqla bağlı hansı tövsiyələr var

Cavab: Bəzi rəvayətlərə əsasən bu məsciddə olmaq və orada namaz qılmaq çox :tövsiyə olunmuşdur

İmam Sadiq (ə) Əla ibn Rəzinə xitabən buyurur: "Sizin yaxınlığınızda Səhlə məscidi .۱ adlanan bir məscid var. Biz o məscidi Şurə məscidi adlandırırıq. Həmin məsciddə namaz qılırsanmı? (Əla bildirir ki, orada namaz qılır) Oraya get. Çünki orada qəm (yoxdur. Qəmi olanın qəmini Allah götürür. (İstəyini qəbul edir)."(۳

Həzrət Sadiqdən (ə) belə buyurduğu nəql olunur: "Elə bir insan yoxdur ki, Səhlə .۲ məscidinə gedib məğrib və işa arasında iki rəkət namaz qıla və Allah onun qəm- (qüssəsini aradan götürməyə."(۴

Başqa bir məqamda həzrət buyurur: "Kufəyə daxil olduqda Səhlə məscidinə get və .۳ (orada namaz qıl. Maddi və mənəvi istəklərini Allahdan dilə."(۵

?Sual: ۳۶۵. Çərşənbə gecəsi Səhlə məscidində olmaqla bağlı dəlil varmı

Cavab: Bu barədə Əhli-beyt (ə) tərəfindən göstəriş yoxdur. Yalnız Seyyid ibn Tavus buyurmuşdur: "Əgər Səhlə məscidinə getmək istəsən bunu çərşənbə gecəsi məğrib və (işa namazı arasına sal. Bu vaxt başqa vaxtlardan üstündür."(۶

۱- [۶۱۱] "Kafi", c. ۳, s. ۴۹۵.

۲- [۶۱۲] "Bihar", c. ۱۰۰, s. ۴۳۶.

۳- [۶۱۳] "Bihar", c. ۱۰۰, s. ۴۳۷.

۴- [۶۱۴] "Vəsailuş-şiə", c. ۵, s. ۲۶۶.

۵- [۶۱۵] "Bihar", c. ۱۰۰, s. ۴۳۴.

۶- [۶۱۶] "Misbahul-Zair", s. ۱۰۵.

Mühəddis Nuri bildirir ki, ۴۰ gecə məsələsi ümumi şəkildə rəvayətlərdə (təsdiqlənmişdir.(۱

**(İmam Mehdinin (ə) izdivacı (evlənməsi**

?Sual: ۳۶۶. İmam Mehdi (ə) izdivac etmişdirmi

Cavab: "Şəxsin qeybi" nəzəriyyəsinə əsasən həzrət izdivac etməmişdir. Çünki o bütün insanlardan məxfidir. İzdivac üçün xalqla rabitədə olmaq lazım gəlir. Bu isə qeyb fəlsəfəsinə uyğun deyil. "Ünvan gizliliyi" nəzəriyyəsinə əsasən isə həzrət izdivac edə :bilər və bu islami sünnədir. Amma əldə olan sənədlər birinci baxışı təsdiqləyir

.Əksər rəvayətlərdə "şəxsi qeyb" nəzəriyyəsinə üstünlük verilir .۱

Əmrinin rəvayətində həzrətin həcc mövsümündə olması bildirilsə də, bu rəvayəti .۲ .imam nəql etməmişdir. Eyni zamanda, bu xəbər həcc mövsümünə aiddir

.Həzrət üçün tam qeyb müəyyənləşdirilmişdir .۳

.Əgər izdivac olsaydı, səfirlər və vəkillər bu məsələyə toxunardılar .۴

:Məsudi Əli ibn Əbu-Həmzədən nəql edir .۵

Biz imam Rizaya (ə) ərz etdik ki, rəvayətlərə əsasən imam öz nəslini görməmiş dünyadan getməz? İmam Riza (ə) buyurdu: "Məgər sizə çatmayıbmı ki, Qaimdən (savay?!"(۲

?Sual: ۳۶۷. Həzrətin izdivac etməməsi İslam sünnəsinə zidd deyilmi

Cavab: İzdivac peyğəmbər sünnəsi olsa da, bəzən daha mühüm məsələ önə gəlir. .Rəvayətlərdən bu da anlaşılır ki, dünyanın sonunda evlənməmək yayılmış iş olacaq

?Sual: ۳۶۸. Əgər izdivac olmayıbsa, Müfəzzəl ibn Ömərin rəvayətinə necə cavab verək

Cavab: Həzrətin izdivac etməsinə inananlar Müfəzzəl ibn Ömərin rəvayətinə istinad edirlər. O, imam Sadiqdən (ə) nəql edir ki, onun məkanından heç bir övladı xəbər (tutmaz..."(۳

:Cavab olaraq belə deyə bilərik



---

.Nəcmus-Saqib", s. ۸۴۵" [۶۱۷] -۱

.İsbatul-vəsiyyə", s. ۲۰۱" [۶۱۸] -۲

.Əl-Ğeybət", s. ۱۰۲" [۶۱۹] -۳

Bu rəvayət eyni məzmunda Nemaninin “Əl-ğeybət” kitabında nəql olunmuşdur. .١ Amma övlad sözü əvəzinə “vəli” sözü işlədilmişdir. Onun yerindən heç bir vəli xəbər (tutmaz.”(١

Rəvayətlərdə qeyd olunmur ki, hazırda həzrətin zövcəsi və övladları var. Zühurdan .٢ .sonrakı övladlar da nəzərdə tutula bilər

Belə bir təbir obrazlıq xatirinə işlədilə bilər. Yəni hətta həzrətin övladı olsaydı da, .٣ .onun yerindən xəbər tutmazdı

Sual: ٣۶٩. Əhməd ibn Məhəmməd ibn Yəhya Ənbarinin rəvayəti həzrətin izdivacı üçün ?dəlil deyilmi

Cavab: Bəziləri həzrətin izdivacını sübuta yetirmək üçün Əhməd ibn Məhəmməd ibn Yəhya Ənbarinin rəvayətinə istinad edirlər. Bu rəvayət genişdir. Rəvayətin mətnində (imam Mehdinin (ə) övladlarının yaşadığı beş şəhər göstərilir.(٢

Ənbarinin rəvayətini bir çox alimlər zəif saymışdır. Ağabozrog Tehrani, Seyyid .Nemətullah Cəzairi, Şeyx Məhəmməd Təqi Şüştəri bu qəbil alimlərdəndir

Ağabozrog Tehrani deyir: “Biz əlimizə düşmüş bu hekayəni nəql edəni tanımırıq. Yalnız bunu bilirik ki o, həmin məclisdə möhtərəm olmuşdur. Onun sənəd və mətnində .ziddiyyətlər var... Bu hekayəni nəql etməkdə alimlərin məqsədi həbibin zikridir

Sual: ٣٧٠. “Cəzireye-Xəzra” (Bermud adaları) əhvalatı imamın izdivacına dəlil ola ?bilərmi

Cavab: Mərhum Məclisi “Biharda” Əli ibn Fazildən geniş bir rəvayət nəql etmişdir. Bu .rəvayətdə həzrətin nəslinin yaşadığı adalardan danışılır

:Əslində isə

Məclisinin sözlərindən belə anlaşılır ki, o, rəvayəti bir o qədər də etibarlı .١ saymamışdır. Alim deyir: “Mötəbər kitablarda bu hədislə rastlaşmadığımdan onu (ayrıca bir fəsildə qeyd etdim.”(٣

.Ağabozrog Tehrani də bu əhvalatı ciddi saymır .۲

.Hədisin mətnində ziddiyyətlər var .۳

.Hədisdə əsassız məsələlər müşahidə olunur .۴

.Onu nəql edənlər arasında tanınmamış fərdlər var .۵



---

.Əl-Ğeybət", s. ۱۷" [۶۲۰] -۱

.Bihar", c. ۵۳, s. ۲۱۳-۲۲۱" [۶۲۱] -۲

.Bihar", c. ۵۲, s. ۱۵۹" [۶۲۲] -۳

Sual: ٣٧١. Bəzi rəvayətlərdə həzrətin ailəsindən danışılır. Bu məlumatlar onun izdivac ?etməsinə dəlil ola bilməzmi

?Hədis barədə nə demək olar

Həzrətin övladları ilə bağlı məlumatlar zühur və ya ondan sonrakı dövrə aiddir. . ١ Seyyid Cəfər Mürtəza Amili deyir: "Çox olsun ki, həzrətin zühurundan sonra övladı (olacaq..."(١)

Bəzi rəvayətlərdə rastlaşdığımız "həzrətin ailəsi" təbiri onun ata-babasına da işarə .٢ .ola bilər

?Sual: ٣٧٢. "Əba-Saleh" ("Saleh atası") künyəsi(٢) həzrətin izdivac etməsini göstərmirmi

Cavab: Bəziləri həzrət Mehdinin (ə) izdivacını sübuta yetirmək üçün onun "Əba-Saleh" .künyəsini dəlil göstərir

Əvvəla, həzrət Mehdi (ə) cəmiyyətin islahında bir ata, rəhbər olduğu üçün "Əba-Saleh" adlandırıla bilər. O, Allahın iradəsi ilə bütün yer üzünü islah edəcək yeganə şəxsdir. Necə ki, bir rəvayətdə həzrət Peyğəmbər (s) Əli ibn Əbi-Talib haqqında buyurur: "Mən ".və Əli bu ümmətin iki atasıyıq

İkincisi, ərəb dilində "əb" sözü təkcə ata mənasını bildirmir. Bu sözdə "sahib" mənası da . .var. "Əba-Saleh" dedikdə ixtiyarında salehlər olan kəs nəzərdə tutula bilər

Üçüncüsü, bu ad "Ənbiya" surəsinin ١٠٥-ci ayəsindəki "ibadiyəs-salihun" təbirindən də .götürülə bilər

**Nüdbə" duası"**

?Sual: ٣٧٣. Alimlər "Nüdbə" duasını mötəbər sayırlarmı

Cavab: Adətən, mötəbər və məşhur tarixi kitablardan nəql olunmuş xəbərlər qəbul edilir. İslam alimləri isə şəri hökmlərin və dini maarifin əldə olunmasında həmin üsulla kifayətlənmir, hədislərin sənədini, rəvayətçinin ədalət və doğruçuluğunu araşdırırlar. .Əgər bu istiqamətdə əminlik yaranmasa, xəbər etibarlı sayılmır

---

.Dirasətun fi əlaimul-zuhur”, s. ۲۳۲“ [۶۲۴] -۱

Ərəblər atanı böyük oğulun adı ilə çağırırlar. Məsələn, Əbülqasim-yəni Qasimin [۶۲۵] -۲ .atası; Əbusaleh-yəni Salehin atası. Bu kimi adlandırmaya «künyə» deyilir

Vacib və haram hökmlərə münasibətdə bu yanaşma daha da ciddiləşir. Amma müstəhəb işlərdə bu sayaq dərin araşdırmaya ehtiyac yoxdur. “Nüdbə” duası da bu sayaq məsələlərdəndir. Bu duanın mötəbər bir sənəddə nəql olunması bir o qədər də mühüm deyil. Həmin duanı qorxu və ümid hissləri ilə qiraət etmək kifayətdir. Duanın mətnindən, sözlərindən onun etibarlılığı görünür. Çünki eyni məsələlər ayə və .rəvayətlərdə də qeyd olunur

?Sual: ۳۷۴. Səhih rəvayəti qeyri-səhih rəvayətdən necə fərqləndirmək olar

Cavab: Bəzi uydurmaçılar həzrət Peyğəmbərin (s) dövründən başlayaraq hədis qondardıqları üçün səhih hədisi qeyri-səhih hədisdən seçmək üçün meyara ehtiyac :duyulur. Bir neçə meyar göstərmək olar

Qurana uyğunluq – İmam Sadiq (ə) həzrət Peyğəmbərdən (s) belə nəql edir: . ۱ “Həqiqətən, hər bir haqq üçün bir həqiqət və hər bir savab üçün bir nur var. Allahın (kitabına uyğun gələni əxz edib, ona zidd olanı boşlayın.”(۱

Digər məsumların buyuruqlarına uyğunluq – Həsən ibn Cəhm deyir: İmam Rizaya (ə) .۲ ərz etdim ki, sizin tərəfinizdən bizə fərqli hədislər çatır. Həzrət buyurdu: “Bizim tərəfdən sizə çatanı Allahın kitabı və bizim hədislərlə müqayisə edin. Əgər uyğun (gəlsə, bizdəndir, uyğun gəlməsə, bizdən deyil.”(۲

Ağıla uyğunluq – Həzrət Peyğəmbər (s) buyurur: “Əgər sizə məndən bir hədis yetişsə .۳ Allahın kitabı ilə müqayisə edib, onu ağlınızın hökmünə verin. Əgər kitab və ağıla (uyğundursa, qəbul edin, uyğun deyilsə, divara vurun.”(۳

?Sual: ۳۷۵. “Nüdbə” duası haqqında böyük alimlərin nəzəri nədir

Cavab: Şeyx Mürtəza Ənsari “Əl-məkasib” kitabında “Nüdbə” duası haqqında .danışarkən ona heç bir etiraz bildirmir və sənədini araşdırmır

.Şeyx Abdullah Maməğani və İrəvani də uyğun duaya oxşar münasibət göstərmişlər

?Sual: ۳۷۶. “Nüdbə” duasını kimlər nəql etmişdir

Cavab: “Nüdbə” duası bir çox alim və hədisçilər tərəfindən nəql olunmuşdur. Onlardan bəziləri ilə tanış olaq: Şeyx Məşhədi, “Əl-Məzar”; Seyyid ibn Tavus, “Misbahul-Zair”; “İqbalul-Əmal”; Əllamə Məclisi, “Zadul-Məad”; Şeyx Cəmil Əbül-Fərəc Məhəmmədi ibn Əli ibn Yaqub ibn İshaq ibn Əbu-Qürrə Bənani; Şeyx Əbu-Cəfər Məhəmməd ibn .Hüseyn ibn Süfyan

Mərhum Ayətullah Bürucirdi buyurur: “Ricalşünaslığın (hədisçiləri tanımağın) yollarından biri onların şagirdlərinin şəxsiyyətini tanımaqdır. Əgər Şeyx Müfid kimi bir şəxsin daim müəyyən bir şəxsə istinad etdiyini və ona irad tutmadığını görürüksə, bu ”.özü həmin şəxsin etibarlılığını göstərir

Sual: ٣٧٧. “Nüdbə” duasının rəvayətçisi imamın müasiri olmadığı halda bu duanı necə ?nəql edir

Cavab: Kimsə iddia etmir ki, Əbu-Cəfər Məhəmməd ibn Hüseyn ibn Süfyan Bəzuferi “Nüdbə” duasını vasitəçisiz nəql etmişdir. İmamdan rəvayət nəql etmək üçün onun .müasiri olmaq zəruri deyil

Biz əminik ki, bu duanı Bəzuferiyə istinadən nəql edənlər onun sənədini göstərməyi zəruri saymamışlar. Ya da Bəzuferi özü “Nüdbə” duası çox məşhur olduğundan onun .sənədini göstərməyə ehtiyac duymamışdır

?Sual: ٣٧٨. “Nüdbə” duasını vasitə ilə nəql etmiş Məhəmməd ibn Məşhədi kimdir

Cavab: Ayətullah Xoyinin Şeyx Hürr Amilidən nəql etdiyinə görə, Məhəmməd ibn (Məşhədi Məhəmməd ibn Əli ibn Cəfərdir.(١

Mərhum Hacı Nuri isə “Xatəmeye-Mustədrək” kitabında bu barədə deyir: “Məhəmməd ibn Məşhədi Hairi kimi tanınmış Məhəmməd ibn Cəfər ibn Əli ibn Cəfər Məşhədidir. O Əbül-Fəzl Şazan ibn Cəbrail Qumminin rəvayətçilərindəndir. O, Şeyx Müfiddən iki (vasitə ilə rəvayət edir.”(٢

Sual: ٣٧٩. “Nüdbə” duasının digər bir rəvayətçisi olan Məhəmməd ibn Əli ibn Əbu-Qürrə ?kimdir

Cavab: Bu şəxs mötəbər rəvayətçilərdəndir. Nəccaşi onun haqqında deyir: “O etibarlıdır, xeyli rəvayət eşitmiş və bir çox kitablar



---

۱- [۶۲۹] “Məcəme-ricalul-hədis”, c. ۱۷, s. ۲۶۹.

۲- [۶۳۰] “Mustədrəkul-Vəsail”, c. ۳, s. ۳۶۸.

tərtib etmişdir. O, imamiyyə səhabələri üçün kitabları vərəq-vərəq oxumuşdur və (bizimlə məclislərdə olmuşdur."(١)

Sual: ٣٨٠. İbn Məşədi "Nüdbə" duasını Məhəmməd ibn Əbu-Qürrədən necə nəql ?etmişdir

Cavab: Məhəmməd ibn Cəfər Məşhədi Məhəmməd ibn Əbu-Qürrənin müasiri olmamışdır. Sadəcə, Əbu-Qürrənin "Məzar" adında kitabı var və İbn-Məşhədi öz .nəqlində bu kitaba əsaslana bilərdi

?Sual: ٣٨١. İbn-Məşhədi mötəbər sayılmışdırmı

Cavab: O, Əhməd ibn İdrisin şagirdlərindən sayılır. Və ustadından rəvayət nəql etmişdir. Şeyx Müfid həmin şəxsdən rəvayət nəql etdiyi üçün onu Şeyx Müfid .tərəfindən etibarlı saymaq olar

Bəzufəri haqqında rical kitablarında xüsusi bir qeyd yoxdursa da, o Şeyx Müfidin .istinadgahı olduğundan və Şeyx ona dua etdiyindən onu etibarlı saymaq olar

?Sual: ٣٨٢. "Nüdbə" duası hansı imamdandır

Cavab: Zahirən, bu dua imam Sadiq (ə) tərəfindəndir. Bu həqiqəti mərhum Məclisi də təsdiqləyir. Amma bəzi mənbələrdən belə görünür ki, bu dua Sahibəzzamana aiddir. Belə bir qənaətə gələ bilərik ki, "Nüdbə" duası Sahibəzzaman tərəfindən yox, onun .üçün yazılmışdır

Belə bir ehtimal da var ki, Bəzufəri bu duanı əsrin məşhur rəvayətçilərindən olmuş atası Hüseyn ibn Əli ibn Süfyandan nəql etmişdir. Həmin şəxs dörd naib vasitəsi ilə .Sahibəzzamanla rabitə saxlaya bilərdi

?Sual: ٣٨٣. "Nüdbə" duasını şiə alimləri tərtib etməmişdirmi

Cavab: Bəziləri bu duanı şiə alimlərinə aid edirlər. Amma bu iddia bir sıra səbəblərdən :batildir

Bəzufəri rəvayətin davamında qeyd edir: "Belə görünür ki, bu dua məsum imam .١

tərəfindən bəyan olunmuşdur. Çünki beş hökm (vaciblik, haramlıq, müstəhəblik, .məkruhluq, mübahlıq) yalnız Allahın məsum övliyalarının səlahiyyətində olan işdir

Dua üçün konkret bir vaxtın göstərilməsi onun məsumlar tərəfindən nəql . ٢ .olunduğunu bildirir



---

.Ricale-Nəccaşi", s. ٢٨٣" [۶٣١] -١

:Alimlər özlərindən bir dua və ya ziyarət yazdıqda bunu qeyd edirlər .٣

a) Şeyx Səduq “Mən la yəhzuruhul-fəqih” kitabında həzrət Fatimə (s) üçün ziyarət nəql edir və bu barədə deyir: “Mən bu duanı həcc səfərində Mədinədə həzrət Fatimənin (s) ”...qəbri kənarında oxudum. Amma həmin duaya xəbərlərdə rast gəlmədim

b) Seyyid ibn Tavus “Əl-İqbal” kitabında deyir: “İnşa etdiyimiz bu duanı süfrə başında ”.oxuyuruq

v) Seyyid ibn Tavus başqa bir məqamda yazır: “Şəvvalda ayın görünməsi ilə bağlı ”...deyilənləri “Əməluş-şer” kitabında inşa etdiyimiz duada bildirmişik

İbn-Məşədi “Əl-Məzar” kitabında deyir: “Mən bu kitabımda etibarlı rəvayətçilərin .٤ ”.inşası olan ziyarətləri toplamışam

Nüdbə” duasının Sahibəzzaman tərəfindən inşa olunub öz məktublarında“ .٥ .Bəzufəriyə çatdırılması mümkündür

?Sual: ٣٨٤. Sahibəzzamanla Rəzva və Zil-tuva dağları arasında hansı əlaqə var

Cavab: Böyük qeyb dövründə həzrətin xüsusi bir məkanı yoxdur. Onun bu iki dağda və ya müqəddəs sərdabədə sakin olması düzgün deyil. Bəli, kisaniyyə kimi bəzi firqələr Məhəmməd ibn Hənəfiyyənin Rəzva dağında qeybə çəkildiyinə inanırdılar. Bəs ?Sahibəzzamanla bu iki dağ arasında hansı əlaqə var

Sualı cavablandırmazdan öncə bu iki dağ haqqında qısaca məlumat verək. Ziltuva (Məkkənin bir fərsəxliyində yerləşən məkanın adıdır. Oradan Məkkə evləri görünür.(١

Rəzva Mədinənin dağlarındandır. Bu dağla Mədinə arasında ٤٠ mil yol var. Bu dağın fəziləti haqqında rəvayətlər nəql olunmuşdur. Yuxarıdakı sualla bağlı deyə bilərik ki, qeyb dövründə həzrətin müəyyən bir məkanı yoxdur. Rəvayətdən belə bir nəticə çıxmır ki, həzrət Rəzva və ya Tuva dağında gizlənmişdir. Əslində dağların adının .çəkilməsi həzrətin müəyyən məkanda olmamasına bir işarədir

Məhz bu dağların adının çəkilməsində məqsəd həzrətin həmin yerlərdə daha çox .olmasıdır

Bu məntəqələrin adının çəkilməsində başqa məqsədlər də ola bilər. Məsələn, Zil-Tuva dedikdə Məkkə, Rəzva dedikdə Mədinə nəzərdə tutula bilər.



---

۱- [۶۳۲] Məcməul-Bəhreyn.

?Sual: ۳۸۵. Nə üçün bu duada bütün imamların adı çəkilməmişdir

Cavab: Bu duada ۱۲ imamın hər birinin adının çəkilməməsi onu gücdən salmır. İmamların adı birbəbir çəkilməsə də, onların üzləşdiyi çətinliklərə işarə olunmuşdur. Əslində duada zikr olunmuş müsibətlər hər bir imamın xalqın hidayəti yolunda çəkdiyi .əziyyəti göstərir

Sual: ۳۸۶. Duada ruhların meracından danışılır. Bu xəbər cismani merac prinsipinə zidd ?deyilmi

Cavab: Bəzən bildirilir ki, bu duada merac ruha aid edildiyindən əslində onu mötəbər .saymaq olmaz

Əslində duada ruhların meracı yox, səmaya doğru meracdan danışılır. Bu müddəanın :dəlilləri var

۱. Mühəddis Nuri "Təhiyyətul-Zair" kitabında deyir: "Mənim "Məzar" kitabından əldə etdiyim nüsxədə səmaya yüksəlişdən danışılır.(۱)

۲. Şeyx Abbas Qummi də öz kitabında ustadı Hacı Nurinin sözlərini nəql edir.

۳. Hazırda da duanın nəql olunduğu "Məzar" kitabında səmaya yüksəlişdən danışılır.

۴. Duadakı digər cümlələr də meracın cismani olduğunu təsdiqləyir.

۵. .Yüksəlişin ruha aid edildiyi nüsxələrdə zahiri mənanı əsas götürmək düzgün deyil. Mərhum hacı Mirza Əbül-Fəzl Tehrani deyir: "Bəzən ruh sözü ruhla birlikdə cisim "...mənasında işlədilir

?Sual: ۳۸۷. "Nüdbə" duası haqqında hansı əsərlər yazılıb

Cavab: "Nüdbə" duası haqqında yazılmış əsərlərdən bəzilərini yada salaq: Sədrəddin Məhəmməd Həsəni Müdərris Yəzdi, "Şərhe-duaye-Nudbə"; Mirza Əbdür-Rəhim Təbrizi, "Əqdul-Cəmani linudbətən Sahibəzzaman"; Şeyx Əli Xoyi, "Vəsilətul-qurbə fi şərh duaun-nudbə"; Molla Həsən Turbəti Səbzvari, "Şərhe-duaye-nudbə", Seyyid Məhmud Mərəşi, "Əl Nuxbəti fi şərhi-duaun-nudbə"; Sərdar Kabuli, "Şərhe duaye-

.nudbə” və s

Sual: ۳۸۸. Sahibəzzamanın (ə) qeybi dövründə həzrət haqqında edilən hansı dualar ?qəbuldur

səh:۲۲۸

---

Təhiyyətul-Zair”, s. ۲۶۰“ [۶۳۳] -۱

Cavab: Sahibəzzaman haqqında dua çoxdur. Onlardan bəzilərini yada salaq: İmam Sadiqdən (ə) dua;(۱) Ğəriq duası;(۲) Ramazan ayında hər fərizədən sonra dua; "Əhdi-səğir" duası;(۳) "Əhd" duası(۴) Zöhr namazından sonra dua;(۵) Əsr namazından sonra dua;(۶) "Nimeye Şəban gecəsi" duası.(۷)

?Sual: ۳۸۹. Sahibəzzaman üçün haralarda dua oxumaq tövsiyə olunur

Cavab: Rəvayətlərə əsasən, bəzi müqəddəs məkanlarda imam üçün dua oxumaq xüsusi tapşırılmışdır. O cümlədən: Məscidül-həram; Müqəddəs sərdabə; Kufə, Səhlə, Səə, Cəmkəran məscidləri kimi həzrətə aid yerlər; imam Hüseynin (ə) hərəmi; imam Rizanın (ə) hərəmi; imam Əsgərinin (ə) (və imam Hadinin (ə)) hərəmi; ümumi şəkildə imamlardan birinin hərəmi; Vüquf məhəllində (Ərəfatda)

?Sual: ۳۹۰. Sahibəzzamana təvəssülün fəlsəfəsi nədir

Cavab: Təvəssül insanın özü ilə məhbubu arasında vasitə qərar verməsidir. Vasitə iki növdür: Bu vasitə bəzən maddi olur, bəzən isə mənəvi. Məsələn, su susuzluğu aradan qaldırmaq üçün maddi vasitədir. Bəzən isə peyğəmbər və məsumlar günahın bağışlanması üçün bəndə ilə Allah arasında vasitə olur.

Dünya səbəblərin, nəticələrin, vasitələrin nəzmi əsasında bəşəriyyətin təkamülü üçün yaradılmışdır. İnsanın təbii ehtiyacları adi vasitələrlə ödənir. Amma hidayət, bağışlanma kimi mənəvi feyzlər yalnız xüsusi vasitələrlə insana çata bilər.

Yer üzünün günəş vasitəsi ilə işıqlanması təəccüb doğurmadığı kimi, günahların ilahi övliyalar vasitəsi ilə bağışlanması da təəccüblə qarşılanmamalıdır.

Şəhid Mütəhhəri buyurur: "Allahın feli, gördüyü işlər nizam əsasındadır. Varlıq nizamını saya salmayan insan yolunu azmışdır. Bu



---

۱- [۶۳۴] "Kəmalud-din", s.۳۴۲.

۲- [۶۳۵] "Bihar", c. ۵۲, s. ۱۴۸.

۳- [۶۳۶] Həmin mənbə.

۴- [۶۳۷] “Əl-bələdul-əmin”.

۵- [۶۳۸] Həmin mənbə.

۶- [۶۳۹] “Bihar”, c. ۵۳.

۷- [۶۴۰] “Məfatehul-Cinan”, s. ۱۶۶.

səbəbdən də Allah günahkarlara buyurur ki, peyğəmbərin qapısına gedib (bağışlanmaları üçün dua istəsinlər.(١)

Quran və rəvayətlərdə təvəssül haqqında çoxsaylı buyruqlarla rastlaşırıq. Allah-təala buyurur: "Ey möminlər! Təqva yolunu seçin, ona çatmaq üçün vasitə istəyin."(٢) Təvəssülün digər faydalarından biri budur ki, insanlar təvəssül yolu ilə öz problemlərini .həll etdikdə peyğəmbər və imamların uca məqamına əmin olurlar

Sual: ٣٩١. Zühurun tezləşməsi üçün edilən dua ilə zühura tələsməyin qadağası ?arasındakı ziddiyyət yoxdurmu

Cavab: Bir çox rəvayətlərdə zühurun tezləşməsi üçün dua tövsiyə olunmuşdur. Bir .qrup başqa rəvayətlərdə isə zühura tələsmək qadağan olunur

.Əvvəla, zühura tələsmək hazırlıqsız olursa, dua müqədimə və şərtlərlə müşayiət edilir

.İkincisi, dua özü həzrətin zühuru üçün şərtlərdən ola bilər

Sual: ٣٩٢. Əgər bir şəxs ٤٠ gün əhd duası oxusa imam Mehdinin (ə) yardımçılarından ?olarmı

Cavab: İmam Sadiqdən (ə) nəql olunmuş bir rəvayətə əsasən, hər kəs ٤٠ sübh "Əhd duası" oxusa həzrət Mehdinin (ə) yardımçılarından olar. Əgər bu şəxs həzrət Mehdinin ((ə) zühurundan öncə dünyasını dəyişsə, zühur vaxtı qəbirdən çıxarılar..."(٣

Əvvəla, belə bir təsir əldə etmək üçün, olsun ki, bu şərtlər də ödənməlidir. Dua edən .insan Allahla həqiqətən əhd bağlamaq üçün gerçək ünsiyyət yaratmalıdır

İkincisi, Allah əhd duasına xatir hətta pis insanı islah edə bilər. ٤٠ gün ardıcıl oxunan əhd duası insana böyük təsir göstərib onu dəyişə bilər və həmin şəxs həzrətin .səhabələrindən olar

### Həzrəttn ömrünün uzunluğu

?Sual: ٣٩٣. Həzrət Mehdinin (ə) ömrünün uzunluğuna sünnə əhli etiraz edirmi

Cavab: İmamiyyə şiələri qəti dəlillər əsasında inanırlar ki, həzrət Mehdinin (ə) imaməti

۲۵۵-ci ildən hazıradək davam edir. Bu etiqada



---

۱- [۶۴۱] ۶۴ ,"Bax: "Nisa.

۲- [۶۴۲] ۳۵ ,"Bax: "Maidə.

۳- [۶۴۳] "Məfatihul-Cinan".

əsasən insan ۱۰۰۰ ildən artıq yaşaya bilməlidir. Sünnə əhli isə buna şübhə ilə yanaşır və etiraz edir ki, insan bir bu qədər yaşaya bilməz. Onlar əslində şiələrin imamət və Məhdəviyyət etiqadını qəbul etmədiklərindən həzrət Mehdinin (ə) ömrünün uzunluğunu bəhanə gətirirlər. Onlar bu münasibətləri ilə əslində şiələrin Məhdəviyyət inancını sual altına alırlar. Saih Əli Hüseyn Məğribi deyir: "Sünnə əhli həzrət Mehdinin (ə) ۱۰۰۰ ildən çox yaşamasını tənqid edir və deyirlər: "Bəşəriyyətin bir bu qədər yaşaması görünməyib və buna heç bir dəlil yoxdur."(۱) Bu məsələni doktor Əhməd Mahmud Sülhi də etirazla qarşılamış və demişdir: "Mehdinin (ə) ۱۰۰۰ ildən artıq diri ".qalması Məhdəviyyət (ə) inancını zəifdədən səbəblərdəndir

?Sual: ۳۹۴. Allah insanın ömrünü bir bu qədər uzada bilərmi

Cavab: Kəlam elmində sübuta yetirilmişdir ki, Allah hər şeyə alim olduğu kimi, hər işə də qadirdir. Zatən mahal olmayan, baş verə biləsi bütün işlər ümumi qaydalara zidd olsa da, Allahın qüdrəti ilə gerçəkləşə bilər. Demək, Allah bir şəxsin ömrünü istədiyi qədər uzadıb, onu ölüm bəlasından qoruya bilər. Odun xasiyyəti yandırmaqdır. Amma Allah öz qüdrəti ilə odu İbrahimə soyutdu. Əllamə Təbatəbai buyurur: "Həzrət Peyğəmbərdən (s) və imamlardan qeybdə olan imamla bağlı nəql olunanları mütaliə edənlər belə bir nəticəyə gəlir ki, həzrətin həyatı möcüzəli və qeyri-adi bir həyatdır. Qeyri-adi işləri isə inkar etmək olmaz. Hadisələrin baş verməsi amilləri təkcə bizim hiss etdiyimiz amillərdən ibarət deyil. Biz təbiətdən kənardakı amilləri hansı əsasla inkar etməliyik?! Bəli, insanın ömrünü qeyri-adi həddə uzada biləcək amillər var. Bu ömür ۱۰۰۰ illərə çata bilər. Elə bu səbəbdən də, tibb elmi hələ ki insan ömrünün sirrini (tapa bilməmişdir."(۲

Şəhid Sədri deyir: "Tutaq ki, bu sayaq uzun ömür elmi baxımdan mümkünsüzdür. Nəticə nə olur? Bu sözləri deyərkən insan ömrünün qeyri-adi həddə uzunluğunun təbiət qanunlarına zidd olması nəzərdə tutulur. Amma unutmaq olmaz ki, söhbət ...möcüzədən gedir

Bu möcüzə Quran və sünnədən faydalanıb istifadə edənlər üçün yeni bir şey deyil. Təbiət qanunlarına əsasən istilik daha çox hərarəti

۱- [۶۴۴] “Tərasəna və məvazinul-nəqd”, s. ۲۰۳.

۲- [۶۴۵] “Şiə dər İslam”, s. ۱۹۸.

olan cisimdən hərarəti az olan cismə keçir. Hansı ki, bu qanun həzrət İbrahimə (münasibətdə ödənmədi.(١

Allah-təala həzrət Yunis haqqında buyurur: “Əgər o təsbih (həmd) deyənlərdən (olmasaydı, şübhəsiz, qiyamətədək balığın qarnında qalardı.”(٢

.Demək, bir insanın ömrü möcüzə yolu ilə qiyamətədək uzana bilər

?Sual: ٣٩٥. Elmi baxımdan insan bir bu qədər yaşaya bilərmi

Cavab: «Elmi baxımdan mümkünsüzdür» deyərkən nəzərdə tuturuq ki, bəzi işlər hətta .modern vasitələrlə həyata keçə bilməz. İnsan ömrünün uzunluğu da belədir

Bernard Şou deyir: “Bioloqların qəbul etdiyi elmi prinsiplərdən biri budur ki, insan ömrü ”.üçün sabit hədd yoxdur. Ömrün uzunluğu hədd qəbul etməyən bir məsələdir

Tanınmış alman alimi Vayzmen deyir: “Ölüm ilə təbiət qanunları arasında heç bir asılılıq ”...yoxdur

”.Tanınmış fizik Floker deyir: “İnsanın təbii ömür uzunluğu ٦٠٠ ildir

.İngilis alimi Rocer təbii insan ömrünün ١٠٠٠ il olduğunu göstərir

Amerika alimi doktor Kilverd Hauz deyir: “Tibb elmi insan ömrünü qısaldan amilləri qidalanma rejimi vasitəsi ilə aradan qaldıra bilər. Bu gün ümidvarıq ki, ata-babalarımızın ömründən fərqli olaraq uzun ömürlülüyə yol tapaq.” Professor Etinger deyir: “Yeni nəsil səmavi kitablara iman gətirdiyi kimi yaxın gələcəkdə inanacaq ki, insan üçün əbədi həyat mümkünsüz deyil. Bugünkü texnoloji tərəqqi gələn əsrdə insan (ömrünü ١٠٠٠ ilə çatdıra bilər.”(٣

Jons Hopkins universitetinin professoru Dimend deyir: “Sübuta yetirilib ki, insanın bütün əsas orqanları əbədi yaşaya bilər. Ən azı, onların uzun müddət yaşaması ”...mümkündür

?Sual: ٣٩٦. Real həyatda uzun ömürlülük müşahidə olunubmu

Cavab: Filosoflar və mütəkəllimlər bildirirlər ki, bir şeyin mümkünlüyü üçün ən güclü dəlil onun baş verməsidir. Tarixdə uzun



---

۱- [۶۴۶] .Bax: “Ənbiya”, ۶۹); (“Bəhsun həvləl-Məhdi”, s. ۷۷-۸۰

۲- [۶۴۷] .Saffat”, s. ۱۴۳,۱۴۴“

۳- [۶۴۸] .Məcəlleye-daneşmənd”, ۶-cı il, say ۶

ömürlülər çox olmuşdur və onlardan biri də bu günədək ömür sürən həzrət Mehdidir .((ə

Allah-təala həzrət Nuh haqqında buyurur: “Biz Nuhu qövmünə doğru göndərdik. Nuh (onların arasında ١٠٠٠ ildən ٥٠ il əskik yaşadı.”(١

Müsəlmanların və Məsihilərin əqidəsinə görə, həzrət Məsih hazırda sağdır. O, .dünyanın sonunda gəlib həzrət Mehdinin (ə) arxasında namaza dayanacaq

?Sual: ٣٩٧. Sünnə əhli rəvayətlərində uzun ömürlülüyə işarə olunmuşdurmu

Cavab: Maraqlıdır ki, sünnə əhli həzrət Mehdinin (ə) mövludunu və varlığını məhz uzun ömürlülük baxımından qəbul etmir. Hansı ki, onların səhih rəvayətlərində uzun ömürlük haqqında ətraflı məlumat var. “Səhihe-Muslim”də nəql olunmuş “Cəssasə hədisi” nümunə göstərilə bilər. Bu hədisdə Dəccal adlı bir şəxsin varlığından danışılır. Rəvayətdə bildirildiyinə görə bu şəxs insanların nəzərindən uzaq bir adada tənha (yaşayır və vaxtında batil inqilaba əl atasıdır.(٢

?Sual: ٣٩٨.Keçmiş ümmətlər arasında uzun ömürlülük olmuşdurmu

Cavab: Tarixi mənbələrə müraciət etdikdə bir çox insanların uzun ömür yaşadığına şahid oluruq. Məsələn, ١٠٠٠ il yaşayıb, hələ də sağ olan Xızır (ə); ٣٥٠٠ il yaşamış Loğman ibn Ad; ٤٠٠٠ il (bəzi mənbələrdə ١٠٠٠) həkim Loğman; ٢٥٠٠ il yaşamış Nuh peyğəmbər; ٩١٢ il yaşamış Şeys ibn Adəm; ٩٣٠ il yaşamış həzrət Adəm; ٤٦٢ il yaşamış İdris peyğəmbər; ٧١٢ il yaşamış Süleyman peyğəmbər; ٦٠٠ il yaşamış Sam ibn Nuh və .başqaları

?Sual: ٣٩٩. Uzun ömürlülük fəlsəfi və məntiqi baxımdan mümkündürmü

.Cavab: Fəlsəfi və əqli baxımdan uzun ömürlülüyə qarşı heç bir dəlil yoxdur

Fəxr Razi Nuhun ٩٥٠ il yaşadığını bildirən ayə ilə bağlı deyir: “Bəzi alimlər insanın ١٢٠ .ildən çox yaşamasını mümkünsüz sayır

Amma ayə başqa söz deyir və ağıl da bunu təsdiq edir. Çünki insanın tərkibində zati baxımdan əbədilik mümkündür...۶۵۱

Şeyx Müctəba Qəzvini Xorasani insanın uzun ömürlülüyünü təsdiqləyən əqli və fəlsəfi dəlillər göstərir: "Fəlsəfə və hikmət qaydalarına əsasən, hər bir nöqsanlı təbiət üçün kamal yolu var. Bəşəriyyət arasında peyğəmbər kimi kamil fərdin olması da bu qayda əsasında sübuta yetirilir. Eyni qanun insanın uzun ömürlülüyünü təsdiqləyir. ۱۰۰۰ və ya ۲۰۰۰ ili insan üçün son ömür müddəti saymaq olmaz. İnsan bundan da çox yaşaya (bilər..."(۱)

### Zühur əlamətləri

?Sual: ۴۰۰. Zühurun hansı əlamətləri nəql olunur

Cavab: Rəvayətlərdə zühur mövzusunu araşdırdıqda onun bəzi əlamətləri ilə :rastlaşırıq. Bəzi zühur əlamətlərini nəzərdən keçirək

;Ümmətin azğın bayraq və şüarlardan xəbərdarlığı .۱

;Xalqın haqqa dəvət olunacağı qiyamlar barədə müjdə .۲

Bu mövzuda qeybi xəbərlər və onların həyata keçməsi ilə insanlarda əminlik . ۳ ;yaranması

Kafirlər İslamı qəbul etməzdən öncə dəlil və möcüzə istəyirlər. Zühurla bağlı . ۴ ;xəbərlər isə gerçəkləşdikdə onlar üçün qəti dəlil olur

Zühur əlamətlərinin hər biri gerçəkləşdikdən sonra xalqın bu əqidəyə bağlılığı . ۵ ;güclənir

Zühur əlamətləri birbəbir gerçəkləşdikcə Allah-təalanın kafirlərə qarşı ciddi əzmi də .۶ ;üzə çıxır

Müsəlmanların zühura hazırlığı və bu qiyama zəmin yaratmaları üçün əlamətlərin .۷ müstəsna əhəmiyyəti var. Əlamətlər gerçəkləşdikcə müsəlmanların ruhi, siyasi və .iqtisadi hazırlığı artır

İnsanda qeybi xəbərlərə meyl olduğundan zühurla bağlı xəbərlər kahinlik kimi .٨ .xurafatın qarşısını alır

Zühur əlamətlərinin mühüm bir hissəsi İslamın siyasi gerçəkliklərindən sayılır. .٩ Məsullar öz strateji məsələlərinin araşdırılmasında bu əlamətlərə ciddi yanaşmış, .proqramlarının tərtibində uyğun xəbərləri nəzərə almışlar

Zühur əlamətləri mövzusu təkcə şiələrə və ya müsəlmanlara aid olan bir mövzu .١٠ .deyil. Bütün dinlərdə az və ya çox bu həqiqətə inam mövcuddur



---

.Bəyanul-Quran", c. ۵, s. ١١,١٢" [۶۵٢] -١

Alman yazıçısı Helsil “Xəbər və siyasət” kitabında yazır: “Biz məsihilər inanırıq ki, bəşər tarixi bir o qədər də uzaq olmayan gələcəkdə bir mərəkə ilə başa çatacaq. Həmin vaxt ”.Məsih geri qayıdıb bütün diri və ölülərə hakim olacaq

?Sual: ۴۰۱. Zühur əlamətləri ilə zühur şərtləri arasında hansı fərqlər var

:Cavab: Zühur əlamətləri ilə zühur şərtləri arasındakı bəzi fərqləri nəzərdən keçirək

Zühurun şərtlərdən asılılığı gerçəkdir. Yəni əgər şərtlər ödənməsə, zühur baş .۱ verməz. Amma zühurun əlamətlərdən asılılığı gerçək deyil. Əlamətlər zühur üçün bir .növ kəşf yönümünə malikdir

Əlamətlər bütün qeyb dövrü boyu gerçəkləşən pərakəndə hadisələrdir. Şəraitlər isə .۲ .zühur vaxtınadək əlaqəli və davamlı qalacaq

.İnsan zühur şərtlərinə münasibətdə vəzifəlidir .۳

Sual: ۴۰۲. Zühur əlamətlərinin bəyanı onun vaxtının bildirilməsinə qoyulan qadağa ilə ?zidd deyilmi

Cavab: Zühur vaxtının müəyyənləşdirilməsi onun əlamət və şərtlərindən fərqli bir mövzudur. Rəvayətlərdə zühur üçün konkret, dəqiq vaxt bildirmək qadağan .olunmuşdur

:Qadağanın səbəbləri var

;Bu iddia üçün heç bir dəlil yoxdur .۱

Əgər zühur vaxtı məlum olsa, düşmənlər müqavimət göstərmək üçün hazırlaşar. Bu .۲ .səbəbdən də rəvayətlərdə bildirilir ki, həzrətin zühuru qəfildən baş verəsidir

Vaxt müəyyənləşdikdə cəmiyyətin ümid ruhiyyəsi güclənir. Onlar hər an zühurun .۳ .baş verə biləcəyinə inanırlar

Cavab: Peyğəmbərlər və məsum imamlar heç vaxt səhvə yol vermədiyindən onların bildirdiyi qeybi xəbərlər düşmən üçün kömək ola bilməz. Allahın qəti iradəsi ilə

.gerçəkləşən əlamətlərin qarşısını almaq mümkünsüzdür

?Sual: ۴۰۴. Zühur əlamətləri dəyişə bilərmi

:Cavab: Bəzi rəvayətlərdə bildirilir ki, zühur əlamətləri iki qisimdir

səh:۲۳۵

Onlardan bəziləri qətidir və dəyişə bilməz ("bəda"), bəziləri isə şəraitdən asılı olaraq dəyişə bilər. Davud ibn Əbül-Qasim deyir: "Biz Əbu-Cəfər Məhəmməd ibn Əli Rizanın (ə) yanında olduğumuz vaxt söhbət Süfyaninin xürucundan düşdü. Rəvayətlərdə bildirilir ki, bu hadisə qətidir. Əbu-Cəfərdən bu hadisənin dəyişə biləcəyi haqqında ("bəda") soruşdum. Həzrət buyurdu: "Bəli". Ərz etdim ki, biz Qaimin zühurunda da dəyişiklik ("bəda") olacağından qorxuruq. Həzrət buyurdu: "Qaim hadisəsi Allahın (vədlərindəndir və Allah öz vədinə xilaf çıxmaz."(١)

Dəyişməz əlamətlərin bəzi nişanələri ilə tanış olaq: "Rəvayətlərdə bu əlamətlərin qəti bəyanı; andla təkid; "labüd" sözü ilə təkid; "Lam" hərfi ilə təkid; "innə" hissəsi ilə təkid; .təkrarla təkid

?Sual: ۴۰۵. Zühur əlamətlərini araşdırmaq üçün düzgün yol varmı

Cavab: Zühur əlamətləri ilə bağlı üç əsas problem var. Bu nöqtələrin hər biri dəqiq araşdırılmalıdır: Mötəbər dəlillə əlamətin sübutu; Əlaməti anlaşılmaz haldan çıxarmaq; .əlamətin gerçəkləşməsinin sübutu və ya inkarı üçün qaydalar

Zühurla bağlı mötəbər rəvayətləri uydurma rəvayətlərdən fərqləndirmək üçün onların .məsumlardan nəql olunması kifayətdir

:Zühur əlamətini iki yolla aydınlaşdırmaq olar

;a) Fiqhi rəvayətlərdə də istifadə olunan elmi üsul

b) Elmi müqəddimələr. Məsələn, tarix, coğrafiya, riyaziyyat, zühur əlamətlərinə aid .terminlər

Bir əlaməti sübuta yetirmək və ya inkar etmək üçün müəyyən qaydalardan istifadə :etmək olar

;Həmin əlaməti dəqiq şəkildə təsəvvürə gətirib onu xarici aləmə tətbiq etmək .١

.Dəlillərlə sübuta yetirilsin ki, həmin əlamət keçmiş dövrdə olub, yoxsa yox .٢

.Gələcək zamanda həmin əlamətin gerçəkləşməsi ehtimalı olmasın .٣

Sual: ۴۰۶. Zühur əlamətlərini bəyan edən rəvayətlərin sənədi və ya mətnində nöqsan ?varmı



---

.Nemani, "Əl-Ğeybət", s. ۳۰۳; "Bihar", c. ۵۲, s. ۲۵۰,۲۵۱ [۶۵۳] -۱

Cavab: Bəziləri iddia edirlər ki, zühur əlamətləri ilə bağlı rəvayətlərin sənədi zəifdir və .bu rəvayətlər mətn baxımından ağılabatan deyil

:Uyğun irada cavab verək

Zühur əlamətləri ilə bağlı xəbərlərin əksərinin səhih sənədi var. Hətta bəzi rəvayətlər .١ .mütəvatirdir. Onların əksərinin məzmunu aydındır

Bütün dini mövzularda zəif rəvayətlər mövcuddur. Bir neçə zəif rəvayətə görə .٢ .hansısa həqiqəti inkar etmək olmaz. Əksinə, düzgün yolla sənədi araşdırmaq lazımdır

Zühur əlamətlərinin tətbiqində yanlışlıq baş versə də, araşdırmadan əl çəkmək .٣ .olmaz. Elmi və mötəbər üsullarla araşdırmanı davam etdirmək lazımdır

?Sual: ۴٠٧. Zühurdan öncə qətlə yetiriləcək "Nəfsi-zəkiyyə" kimdir

Cavab: Şiə rəvayətlərində həzrət Mehdinin (ə) "Nəfsi-zəkiyyə"nin qətlindən sonra .zühur edəcəyi bildirilir

İmam Sadiq (ə) buyurur: "Qaimin qiyamı Nəfs-zəkiyyənin qətlə yetirilməsi arasında ".fasilə ١۵ gecədən çox deyil

Şeyx Müfid deyir: "Zühur əlamətlərindən biri də Nəfsi-zəkiyyənin ٧٠ salehlə birlikdə (Kufə yaxınlığında qətlə yetirilməsidir."(١

Bəzi rəvayətlərdə bildirilir ki, Nəfsi-zəkiyyə imam Mehdi (ə) tərəfindən təbliğ əmri alan (şəxsdir və bu şəxs rükn və məqam arasında şəhadətə çatacaq."(٢

Bəziləri güman edir ki, Nəfsi-zəkiyyə Mənsur Abbasinin dövründə qiyam qaldırmış Məhəmməd ibn Abdullah ibn Həsən ibn Əli ibn Əbi-Talibdir. Amma bu ehtimalın ziddinə :bir sıra dəlillər var

Rəvayətlərdə Nəfsi-zəkiyyənin rükn və məqam arasında öldürüləcəyi bildirilir. .١ .Məhəmməd ibn Abdullah ibn Hüseyn isə başqa yerdə şəhadətə çatmışdır

Bəzi rəvayətlərə əsasən, həzrət Mehdinin (ə) zühuru ilə Nəfs-Zəkiyyənin qətlə .٢

.yetirilməsi arasında ۱۵ gecə fasilə var

Məhəmməd ibn Abdullah ibn Həsən həzrət Mehdinin (ə) mövludundan öncə qətlə .۳ .yetirilmişdir



---

.İrşad", c. ۲, s. ۳۶۸" [۶۵۴] -۱

.Bihar", c. ۵۲, s. ۳۰۷" [۶۵۵] -۲

Məhəmməd ibn Abdullahın niyyəti xalis olmamış, “Məqatilut-Talibin” mənbəsində .۴ bildirildiyinə görə bu şəxs Məhdəviyyət iddiasında olmuşdur. Atası onu Bəni – Üməyyənin süqutundan və Bəni-Abbas dövləti təsis olunmamış Mehdi (ə) kimi (tanıtdırırdı.(۱

İmam Sadiq (ə) buyurur: “Nəfsi-Zəkiyyə” qətlə yetirildikdən sonra həzrət Mehdi .۵ (zühur edəcək.”(۲

?Sual: ۴۰۸. Məsih Dəccal kimdir

Cavab: Həzrət İsa kimi Dəccal da məsih adlandırılmışdır. Amma məsih sözü təklikdə işlədildikdə həzrət İsa nəzərdə tutulur. Məsih Dəccal elə tanınmış Dəccalın özüdür. :Onun haqqında bəzi ehtimallar var

Bu şəxs məsihiyyət bayrağı ilə zühur edəcək; onun qiyamı bütün yer üzünü .bürüyəcək; bu şəxs Məsihə qarşı çıxdığı üçün Məsih ləqəbi almışdır

?Sual: ۴۰۹. Süfyani kimdir

Cavab: Əhli-beyt rəvayətlərində Süfyaninin xürucu qəti zühur əlamətlərindən :sayılmışdır

Şeyx Tusi imam Sadiqdən (ə) belə nəql edir: “Süfyaninin xürucu zühurun qəti (əlamətlərindəndir.”(۳

Bir çox şiə və sünni rəvayətlərindən belə anlaşılır ki, Süfyani imam Mehdiyə (ə) qarşı çıxmaq qəsdində olan inadkarlardandır. O, Beyda adlanan məntəqədə öz qoşunu ilə .birlikdə yerə batacaq

Müslim həzrət Peyğəmbərdən (s) belə nəql edir: “Bir şəxs Allah evinə pənah gətirər. (Həmin vaxt ona doğru qoşun göndərilər. Bu qoşun Beydaya çatdığı vaxt yerə batar.”(۴

Nemani imam Sadiqdən (ə) belə nəql edir: “Qaimin beş əlaməti var...” Həzrət bu beş (əlamət arasında düşmənin Beydada yerə batmasını da nəql edir.(۵

Nemani digər bir yerdə zühur əlamətləri sırasında Süfyaninin xürucunu və qoşunu ilə

(Beydada yerə batmasını qeyd edir.(۶



---

.Məqatilut-Talibin", s. ۱۷۱" [۶۵۶] -۱

.Kafi", c. ۸, s. ۲۲۵" [۶۵۷] -۲

.Əl-Ğeybət", s. ۴۳۵" [۶۵۸] -۳

.Səhihe-Müslim", c. ۸, s. ۱۶۷" [۶۵۹] -۴

.Əl-Ğeybət", s. ۲۵۲" [۶۶۰] -۵

.Həmin mənbə, s. ۲۶۴ [۶۶۱] -۶

?Sual: ۴۱۰. Hərmucəddun mərəkəsi nədir

Cavab: Bəzi alimlər Hərmucəddun məntəqəsində baş verəcək mərəkəni imam Mehdinin (ə) zühuru üçün əlamət sayırlar. Bu əhvalat hətta digər səmavi kitablarda da (nəql olunmuşdur.(۱

Yəhudilər və məsihilər bu mərəkəni tarixin sonunda baş verəcək çox böyük müharibə .hesab edirlər

Hərmucəddun" sözü dağ mənasını bildirən "hər" və vadi və ya kiçik dağ adı olan" "mucəddu" sözündən düzəldilmişdir. Bu vadi Fələstinin şimalında yerləşir. Onların nəzərincə, bu savaşda ۴۰۰ milyon nəfər iştirak edəcək. Bu qoşun İraqdan, İrandan, .Livanda, Sudandan, cənubi Qafqaz və Rusiyadan toplanasıdır

Doktor Əbdül-Kərim Zübeydi deyir: "Bu hadisə imam Mehdinin (ə) zühurundan öncə baş verəcək həmin hadisədir. Rəvayətlərdə bu mərəkə "Tərqisya" adlandırılmışdır. Bu qoşun Amerikadan, Avropadan, Rusiyadan, Türkiyədən, Misirdən, Qərbi ərəb dövlətlərindən, Suriyadan, İordaniyadan, Livandan, Fələstindən və İsraildən olan çoxsaylı qüvvələrdən təşkil olunacaq. Şam sərhəddində bu qoşunlar rastlaşdığı vaxt "...Süfyani xüruc edəcək

Kuleyni nəql edir ki, imam Sadiq (ə) Muyəssərə buyurdu: "Agah ol ki, orada (Qərqisyada) göylər və yer yaranandan bu günədək oxşarı olmayan bir hadisə baş (verəcək."(۲

Bu mövzuda nəql olunmuş rəvayətlərdən məlum olur ki, bu müharibədə düşmən tərəfindən komandan Süfyani adlı bir şəxsdir. Bu şəxs İsrail və Amerika casusluq mərkəzlərinin köməyi ilə xalq arasında təfriqə salar və insanları insanlara qarşı təhrik edər. Həzrət Mehdi (ə) öz tərəfdarlarından bir hissəsi ilə Kəbəyə sığındığı vaxt bu .qoşun Beyda məntəqəsində yerə batar

Buxari həzrət Peyğəmbərdən (s) belə nəql edir: "Siz yəhudilərlə savaşanadək qiyamət qopmaz. Həmin vaxt o qədər yəhudi öldürülər ki, hətta yəhudinin pənah apardığı daş (deyər: "Ey müsəlman! Mənə sığınan şəxs yəhudidir, onu qətlə yetir."(۳

?Sual: ۴۱۱. “Sionist məsihiyyət” dedikdə nəzərdə nə tutulur

səh:۲۳۹

---

.Röyaye-Yuhanna”, ۱۶:۱۳-۱۶; Sefri-Zəkəriyya, ۱۴:۱-۵; Ketabe-müqəddəs, s. ۸۴۳“ [۶۶۲] -۱

.Kafi”, c. ۸, s. ۲۴۵“ [۶۶۳] -۲

.Səhihe-Buxari”, c. ۳, s. ۲۳۲“ [۶۶۴] -۳

Cavab: “Sionist məsihiyyət” dedikdə dünyanın sonu ilə bağlı öncəgörmələrə əsaslanan siyasi, iqtisadi, mədəni, hərbi bir cərəyan nəzərdə tutulur. Bu cərəyan yalnız gücə .istinad edir

Bu güruh kin-küdurət dolu ədəbiyyat və şiəliklə aşkar düşmənçilik əsasında Yerusəlimdə bütün qüvvələrini İslam ölkələrinə qarşı səfərbər etməyə səy göstərir. Onlar nəzərdə tutduqları zühur üçün zəmin hazırlamağa və bütün maneələri aradan .götürməyə çalışırlar

Bu cərəyanın aparıcıları Tövrata müraciət və yəhudi kitablarına etiqadla həzrət İsanın zühuru üçün bütün dünyanı əhatə edəcək müharibəni şərt sayırlar. Bu savaş üçün mərkəz kimi işğal olunmuş Fələstində yerləşən Armagedon məntəqəsini göstərirlər. Bu ideologiyanın arxasında yəhudilərin bütün Fələstin üzərində (hətta Suriya və .İraqda) hakimiyyətə çatıb böyük İsrail təşkil etmək planları dayanır

?Sual: ۴۱۲. Günəş və ay tutulmaları zühur əlamətidirmi

Cavab: Zühur əlamətlərini bəyan edən rəvayətlərdə bildirilir ki, ayın ortasında ay .tutulması və ayın əvvəlində günəş tutulması zühur nişanələrindəndir

İmam Baqir (ə) buyurmuşdur: “Həqiqətən, Bizim Mehdinin (ə) iki nişanəsi var. Göylər və yer yarandığı gündən belə bir hal olmamışdır. Əvvəla, ramazanın ilk gecəsində ay tutular, ikincisi, ramazanın ortasında günəş tutular.”(۱) Bu qeyri-adi hadisə ilə bağlı iki :ehtimal var

Bu hadisələri yaradan səbəb kimi fəzada qəfil peyda olan kütlə göstərilir. Bu kütlə .۱ .bəzən günəş və ay qarşısından keçib “xüsuf” və “küsuf” hadisələri yaradır

Bu kütlənin yerdən qopduğu ehtimal olunur. Mümkündür ki, gələcəkdə elmi-texniki .۲ tərəqqi nəticəsində yerdən bir parça qoparılsın və bu parça günəşlə ayın qarşısını .kəssin

.Bu iki hadisə təbiət qanunlarına uyğun deyil .۳

?Sual: ۴۱۳. Zühur əlaməti olan səma səsi nədir

Cavab: İmam Baqir (ə) buyurur: “Həqiqətən, Mehdinin (ə) xüruc əlamətlərindən biri ramazan ayında səmadan səs gəlməsidir.”(۲) İmam

səh:۲۴۰

---

۱- [۶۶۵] “Sünəne-darqutni”, c. ۲, s. ۵۱.

۲- [۶۶۶] “Kəmalud-din”, s.۳۲۸.

Sadiq (ə) buyurur: “Səma səsi ramazan ayında baş verəcək, gənc qadınlar pərdə arxasından baş götürüb qaçacaq, yuxudakılar oyanacaq və oyaqlar səsdə qərq :olacaq.”(١) Bu rəvayətdə iki ehtimal var

.Səma səsi dedikdə Cəbraildən eşidilən və hamını bürüyən səs nəzərdə tutula bilər .١

Səma səsi dedikdə məqsəd dünyəvi əzab, dünya müharibəsi ola bilər. Eyni vaxtda .٢ yer kürəsinin müxtəlif nöqtələrində partlayan atom bombaları dəhşətli səs yarada bilər. Bu sayaq partlayışların Avropa, Amerika, Rusiya və Çində baş verəcəyi gözlənilir. .Amma müsəlmanlar amandadırlar və yalnız həmin partlayışların səsini eşidərlər

?Sual: ۴۱۴. Zühur əlamətlərindən olan səma nidası nədir

:Cavab: Bu mövzu ilə bağlı üç qrup rəvayət var

;Nida haqqında ümumi məlumat verən rəvayətlər .١

;Haqq və batilin nidalarından ibarət iki nida .٢

.Qaimin adı ilə nida .٣

Səma səsi və səma nidası haqqında danışan hədislər məcmusundan anlaşılır ki, bütün :bunlar müştərək mənaya malikdir. Bu müddəanı sübuta da yetirmək olar

;a) Həm səs, həm də nida Cəbrailə aid edilmişdir

b) Hər iki hadisənin eyni bir vaxtda, yəni ramazan ayının ٢٣-ü, cümə gecəsi baş .verəcəyi bildirilir

.v) Hər iki hadisənin təsirləri eyni şəkildə bəyan olunur

?Sual: ۴۱۵. Dəccalın zühuru dedikdə nəzərdə nə tutulur

Cavab: Bir çox rəvayətlərdə, xüsusi ilə sünnə əhli hədislərində Dəccalın zühuru .haqqında danışılır. Bu hadisə imam Mehdinin (ə) hakimiyyətindən öncə baş verəsidir

Buxari nəql edir ki, həzrət Peyğəmbər (s) buyurmuşdur: “Dəccal Mədinə ətrafında

görünüb üç dəfə savaş hazırlığını bildirəcək və ətrafına kafirlər, münafiqlər toplanacaq.”(۲) Sünnə əhli mənbələrində Dəccalın bəzi sifətləri zikr olunmuşdur: Rəblik iddiası edər; ömrü uzundur; yanında su və od var; kora və dəri xəstəsinə şəfa verər; ölünü



---

۱- [۶۶۷] “Əl-Ğeybət”, s. ۲۵۲.

۲- [۶۶۸] “Səhihe-Buxari”, c. ۸, s.۱۰۲.

dirildər; biri öldürüldükdə onu ayağa qaldırar; onda behişt və atəş var; bəyaz su və (oddan çeşməsi var; istəkləri qəbul olar.(۱

:Dəccalda bəzi sifətlərin olduğu ehtimal edilir

.a) Dəccal qeyri-adi işlər görən, sehr-caduya malik real şəxsdir

;b) Dəccal dedikdə İblis nəzərdə tutulur

.v) Ehtimal olunur ki, Dəccal şiə rəvayətlərində adı çəkilən Süfyanidir

.q) Dəccal dedikdə İsrail nəzərdə tutulur

:Öncə belə görünür ki, Dəccal hadisələri elə İsraillə bağlı hadisələrdir. Çünki

;Əvvəla, Əhli-beyt (ə) rəvayətlərində bu hədislər yoxdur

İkincisi, əksər Dəccal hədisləri əslən yəhudi olan Kəbul-Əhbar tərəfindən nəql .olunmuşdur. Bu şəxsin bütün hərəkətləri şübhə doğurmuşdur

.Üçüncüsü, məsihin zühur edib Dəccalı öldürməsi yəhudilərə aid əqidədir

Seyyid Məhəmməd Sədr deyir: "Dəccal İslam və onun əsasları ilə düşmənçilik edən qərbin mədəni tərəqqisinin simvoludur. Bu mədəniyyət hər bir insanı qul etmək məqsədindədir. Aşkar görürük ki, əsrimizdə bütün dünyanı, hətta müsəlmanları hökm (altına almışdır..."(۲

## Quran və həzrət Mehdinin (ə) zühuru

?Sual: ۴۱۶. "Vəd" ayəsi həzrət Mehdinin (ə) zühurunu necə sübuta yetirir

Cavab: Allah-təala buyurur: "Allah sizlərdən iman gətirib saleh işlər görənlərə vəd edir ki, hökmən onları yer üzünün hökmranı edəcək. Necə ki, onların əvvəlkilərinə yer üzünün xilafətini bəxş etmişdi. Onlar üçün bəyəndiyi din və ayini möhkəmlədəcək, qorxularını aramlığa çevirəcək. Belə ki, yalnız Mənə pərəstiş etsinlər və bir şeyi Mənə (şərik qoşmasınlar. Bundan sonra kafir olanlar azğınlardır."(۳

Yuxarıdakı ayə həzrət Mehdinin (ə) zühur dövrünə və ümumdünya tövhid hökuməti :əsrinə aiddir. Bu müddəanın dəlilləri var

Bu ayə dünyanın sonunda İslamın digər dinlər üzərində qələbəsini bildirən digər .١ .ayələrə münasibdir



---

.Səhihe-Muslim", c.٨, s.١٩٧" [۶۶٩]-١

.Tarixi ma bəd əz zühur", s.١۴١, ١۴٢" [۶٧٠]-٢

.Nur", ۵۵" [۶٧١]-٣

(Əl-ərz" sözü bütün yer üzünə işarədir.(۱)" .۲

Bu vaxtadək qorxu tam şəkildə aramlığa çevrilməmişdir. Bu hal yalnız möminlərin .۳ .əhatəli hakimiyyəti zamanı yarana bilər

.Ayə ilə bağlı nəql olunmuş rəvayətlər nəzərdə tutulmuş mənanı təsdiqləyir .۴

Qurtubi hazırkı ayə ilə bağlı həzrət Peyğəmbərin (s) belə buyurduğunu nəql edir: "Həmin gün yer üzündə Allah tərəfindən İslam kəlməsi daxil edilməmiş ev yoxdur."(۲) Sudəyy İbn-Abbasdan nəql edir ki, ayə Ali-Məhəmməd haqqında nazil olmuşdur.(۳) (İmam Səccad (ə) buyurmuşdur: "Bu ayə həzrət Qaimin şəninə nazil olmuşdur."(۴

İmam Sadiq (ə) buyurmuşdur: "Bu ayə Qaim və onun səhabələri haqqında nazil (olmuşdur."(۵

Dörd xəlifənin dövründə də yer üzündə kamil əmin-amanlıq yaranmadı. Xüsusi ilə .۵ İran və Rum kimi qüdrətli düşmənlər İslam üçün təhlükə mənbəyi idi. Bu səbəbdən də .۳۰ il ərzində çoxsaylı savaşlar baş verdi

Fəzl deyir: "İmam Sadiqə (ə) ərz etdim ki, bəziləri bu ayənin Əbu-Bəkr, Ömər, Osman və Əli haqqında nazil olduğunu düşünür. Həzrət buyurdu: "Allah onların ("nasibə") qəlbini hidayət etməz. Axı nə vaxt Allah və onun rəsulunun dini yetərincə təsbit olub?! Axı nə vaxt həmin xəlifələrin dövründə qəlblərdən şəkk-şübhə çıxıb?! Onların (dövründə hansı fitnələr qopmadı, hansı savaşlar baş vermədi?!"(۶

?Sual: ۴۱۷. "Ərsələ rəsuləhu" ayəsi imam Mehdinin (ə) zühurunu necə sübuta yetirir

Cavab: Allah-təala buyurur: "O, müşriklər ikrah duysa belə, bütün ayinlərə qalib gəlmək üçün öz peyğəmbərini hidayət və haqq dinlə göndərən kəsdir."(۷) Ayədə hidayət dedikdə rəsulun göndərilməsi ilə gerçəkləşən ilahi hidayət, "haqq din" dedikdə .İslam dini nəzərdə tutulur



---

."Təfsire-ibn-Kəsir", c. ۲, s. ۶۱۴; "Cameul-bəyan" [۶۷۲] -۱

۲- [۶۷۳] “Təfsire-Qurtubi”, c. ۷, s. ۴۲۹.

۳- [۶۷۴] “Şəvahidut-tənzil”, c. ۱, s. ۴۱۳.

۴- [۶۷۵] “Təfsire-Safi”, c. ۳, s. ۴۴۴.

۵- [۶۷۶] Nemani, “Əl-Ğeybət”, s. ۱۲۶.

۶- [۶۷۷] “Təfsire-Kənzul-dəqaiq”, c. ۹, s. ۳۳۵.

۷- [۶۷۸] “Tövbə”, ۳۳.

Fəxr-Razi deyir: “Bu, gələcəkdə gerçəkləşəsi ilahi bir vəddir. Rəvayətlərə əsasən, bu vəd həzrət İsanın və həzrət Mehdinin (ə) dövründə həyata keçər.”(١)

Təbəri deyir: “Həzrət İsa nazil olan vaxt bütün dinlər batil olar və İslam dini bütün dinlərə qalib gələr.”(٢)

Səid ibn Cübeyrdən rəvayət olunur ki, bu ayə Fatimə (s) övladlarından olan Mehdiyə (ə) aiddir. Allah onu bütün dinlərə qalib edəcək.”(٣)

Əbu-Bəsir nəql edir ki, imam Sadiq (ə) buyurmuşdur: “And olsun Allaha, bu ayə hələ ki gerçəkləşməyib və Qaim qiyam edənədək gerçəkləşməz. O, zühur etdiyi vaxt yer üzündə Allahı inkar edən bir nəfər qalmaz.”(۴)

?Sual: ۴١٨. “Vərasət” ayəsi həzrət Mehdinin (ə) zühurunu necə sübut edir

Cavab: Allah-təala buyurur: “Biz zikrdən sonra Zəburda yazdıq ki, mənim saleh bəndələrim yer üzündə varis olacaq.”(۵)

Ayədə Zəbur deyərkən Davuda nazil olmuş səmavi kitab, zikr deyərkən Tövrat nəzərdə tutulur. Zəburda oxuyuruq: “Şər qüvvələrin kökü kəsilər, Allaha təvəkkül edənlər yer üzünə varis olar...”(۶)

Davudun Məzmurun ٢٩-cu ayəsində deyilir: “Salehlər yer üzünə varis olacaq və orada əbədi qalacaqlar.” “Əl-ərz” dedikdə dünya və behişt nəzərdə tutulur.(٧)

İbadiyəs-Salehun” təbiri bütün dövrlərə, məkanlara və qövmlərə aiddir. Məhz həzrət“ Mehdinin (ə) zühur edəcəyi dövrdə bütün yer kürəsi Allahın saleh bəndələrinin .ixtiyarına keçəcək

İbn-Kəsir deyir: “Allah-təala şərif ayədə müjdə verir ki, öz saleh bəndələrini dünya və axirətdə səadət çatdırıb onları yer və behiştdə varis edəcək.”(٨)

Alusu deyir: “Bu ayəni Mehdi (ə) əsrinə və həzrət İsanın (ə) nazil olduğu dövrə aid etsək, digər yanaşmalara ehtiyac qalmır.”(٩)

۱- [۶۷۹] “Təfsire-Fəxr-Razi”, c.۱۲, s. ۱۰۴.

۲- [۶۸۰] “Cameul-bəyan”, c. ۱۳, s. ۱۰۹.

۳- [۶۸۱] “Əl-Füsulul-Mühimmə”, s. ۳۰۰.

۴- [۶۸۲] “Təfsire-Bürhan”, c.۳, s. ۴۰۷.

۵- [۶۸۳] “Ənbiya”, ۱۰۵.

۶- [۶۸۴] “Məzmur”, ۳۷:۹-۱۱.

۷- [۶۸۵] “Əl-Mizan”, c. ۱۴, s. ۴۹۳.

۸- [۶۸۶] “Təfsire-ibn-Kəsir”, c.۲, s. ۵۲۴.

۹- [۶۸۷] “Ruhul-Məani”, c. ۱۷, s. ۹۵.

Suban həzrət Peyğəmbərin (s) belə buyurduğunu nəql edir: “Allah mənim üçün yer üzünü cəm etdi. Mən onun şərq və qərbini müşahidə etdim. Tezliklə mənim ümmətim (ona çatacaq.”(۱

İmam Baqir (ə) buyurur: “İbadiyus-Salihun” dedikdə dünyanın son dövründə həzrət (Mehdinin (ə) səhabələri nəzərdə tutulur.”(۲

?Sual: ۴۱۹. “İztizaf” ayəsi həzrət Mehdinin (ə) zühurunu necə sübuta yetirir

Cavab: Allah-təala buyurur: “Biz istədik ki, yer üzünün müstəzəflərinə minnət qoyaq, (onları öncül və varis edək.”(۳

Sünni və şiə təfsirçiləri bu ayənin Bəni-İsrail qövmü haqqında olduğunu bildirirlər.(۴) Yer üzündə əziyyətə düçar olmuş və Allah tərəfindən fironçulara qalib edilmiş qövm onlar idi. Zahiri baxımdan isə ayə Allahın qiyamət gününədək müztəzəflərlə bağlı iradəsini açıqlayır. Allah istəmişdir ki, xüsusi bir şəraitdə müztəzəfləri yer üzünün təkəbbürlü hakimlərinə qalib etsin. Bəni-İsrailin fironçular üzərində qələbəsi buna misal ola bilər. Uyğun qanunun daha kamil nümunəsi İslamın zühurundan sonra peyğəmbərin hakimiyyətidir. İslami rəvayətlərə əsasən, daha kamil nümunə zühur dövründə həzrət Mehdinin (ə) hakimiyyətidir. Bu mənanı bir sıra dəlillərlə sübuta :yetirmək olar

Allahın iradəsi haqqında danışılarkən “müzare” formadan (felin indiki və ya gələcək .۱ .zaman forması) istifadə edilməsi davam göstəricisidir

Ayədə ümumi şəkildə müztəzəflərdən danışılır və təkcə Bəni-İsrail nəzərdə . ۲ .tutulmur

Bu ilahi sünnənin xüsusi hal üçün nəzərdə tutulmaması şiə və sünni rəvayətlərindən .۳ :aşkar görünür

İmam Sadiq (ə) buyurur: “Həqiqətən, ayə dünyanın sonunda zühur edib zalımların kökünü kəsəcək, şərq və qərbə sahib olacaq, bütün yer üzünü zülm bürüdükdən sonra (ədaləti bərpa edəcək əmr sahibinə aiddir.”(۵

---

۱- [۶۸۸] Həmin mənbə.

۲- [۶۸۹] “Məcməul-bəyan”, c. ۷, s. ۶۶.

۳- [۶۹۰] “Qəsəs”, ۵.

۴- [۶۹۱] “Məcməul-bəyan”, c. ۸, s. ۳۷۵; “Dürrül-Mənsur”, c. ۶, s. ۳۹۲.

۵- [۶۹۲] “Təfsire-Bürhan”, c.۶, s. ۵۸.

Həzrət Əli (ə) buyurmuşdur: “Dünya bizim qarşımızda tərs dəvə kimi azğınlıq etdikdən sonra bizə üz tutar və ram olar.” Sonra həzrət həmin ayəni tilavət etmişdir.(١)

?Sual: ۴٢٠. “İrtidad” ayəsi imam Mehdinin (ə) zühurunu necə sübuta yetirir

Cavab: Allah-təala buyurur: “Ey iman gətirənlər! Sizlərdən hər hansınız öz ayinindən dönsə, Allah elə bir cəmiyyət gətirər ki, onları dost tutar və onlar da Onu sevər. Onlar möminlər qarşısında təvazökar, kafirlər qarşısında sərtdirlər. Onlar Allah yolunda cihad edər və heç bir məzəmmətdən çəkinməz. Bu, Allahın istədiyi kəsə verdiyi fəzldir. Allahın fəzli genişdir və Allah biləndir.”(٢)

Ayədə çevriliş (“istibdal”) qanununa işarə olunur. Yəni bir cəmiyyət vəzifəsinə əməl etmədiyindən başqa bir cəmiyyətlə əvəz olunur. Onlar Allah rəsulunun xəlifəsini rədd edib, cihaddan boyun qaçırdılar. Eləcə də, Allahın dininin tətbiqində səhlənkarlıq .göstərdilər

Rəvayətlərə müraciət etdikdə görürük ki, Əhli-beyt ayənin imam Mehdinin (ə) aid olduğunu düşünür. Süleyman ibn Harun Əcəli deyir: “İmam Sadiq (ə) buyurdu: “Həqiqətən, əmr sahibi hifz olunur. Əgər bütün bəşəriyyət məhv olsa, Allah-təala onun səhabələrini ətrafında toplayar. Allah onların haqqında “hər kəs öz ayinindən dönsə” ayəsini buyurmuşdur.”(٣)

?Sual: ۴٢١. “Qital” ayəsi həzrət Mehdinin (ə) zühurunu necə sübuta yetirir

Cavab: Allah-təala buyurur: “Fitnəni aradan götürüb, bütün din Allaha məxsus olanadək onlarla vuruşun.”(۴)

Ayədə bildirilir ki, şirk və küfrün kökü qazılmalıdır. Din bütünlüklə Allaha məxsus olmalı və yer üzündə bir nəfərdə olsun müşrik qalmamalıdır. Hələ ki, bu məqsəd gerçəkləşməmişdir. Hansı ki, nə vaxtsa yer üzündə fitnənin kökü kəsilməli və din yalnız .Allah üçün olmalıdır

Rəvayətlərə əsasən bu məqsəd həzrət Peyğəmbərin (s) zühuru dövründə .gerçəkləşəcək. “Tövbə” surəsinin ٣٣-cü ayəsində də bu məsələyə işarə olunur

---

۱- [۶۹۳] "Şəvahidut-tənzil", c. ۱, s.۴۳۸; "Yənabiul-Məvəddət", s. ۴۳۷.

۲- [۶۹۴] "Maidə", ۵۴.

۳- [۶۹۵] "Təfsire-Bürhan", c.۲, s. ۴۷۳.

۴- [۶۹۶] "Ənfal", ۳۹.

Alusi yuxarıdakı ayə ilə bağlı deyir: “Məqsəd budur ki, bütün batil dinlər aradan getməli, ya da hər hansı səbəbdən hamı İslamı qəbul etməlidir.”(١) Alim başqa bir məqamda belə deyir: “Qeyd olundu ki, bu ayə hələ ki gerçəkləşməmişdir. O, həzrət Mehdinin (ə) zühuru dövründə həyata keçəsidir. Həmin əsrdə yer üzündə bir nəfər olsun müşrik (qalmaz.”(٢

İmam Sadiqdən (ə) yuxarıdakı ayə haqqında soruşulduqda həzrət buyurur: “Hələ ki ayə gerçəkləşməmişdir. Əgər bizim Qaim qiyam etsə, həmin dövrdə olanlar ayənin gerçəkləşməsini görər. Əlbəttə ki, Məhəmmədin (s) dini gecənin qaranlığı ilə örtülmüş (bütün nöqtələrə çatar. Bütün yer üzündə şirk və bütpərəstliyin kökü kəsilər.”(٣

## Zühurun başlanğıcı

?Sual: ٤٢٢. Haradan bilirik ki, Mehdi (ə) zühur edəcək

Cavab: Əvvəlki söhbətlərimizə əsasən, biz xilaskarı qeyri-müəyyən yox, konkret bir şəxs kimi tanıyırıq. Yəni inanırıq ki, imam Həsən Əsgərinin (ə) Mehdi (ə) adlı övladı məlum zahiri və batini xüsusiyyətlərlə zühur edəcək. Bu səbəbdən də onu kimsə ilə səhv salmağımız mümkünsüzdür. Bundan əlavə, möcüzə də həzrətin vücudunu təsdiqləyir. Əhli-beytdən (ə) olan məsum imamların hər biri həzrət Mehdinin (ə) .xüsusiyyətlərini zikr etmişdir

Əlbəttə ki, bu inancdan sui-istifadə oluna bilər. Necə ki, peyğəmbərlik məqamından sui-istifadə olunmuşdur. Əsrin imamını peyğəmbər və imamlar tərəfindən qeyd olunmuş xüsusiyyətlərlə tanımaq vəzifəmizdir. Yalnız belə bir tanışlıq sayəsində .fırıldaqçılara aldanmarıq

?Sual: ٤٢٣. Həzrət Mehdi (ə) münasib zühur vaxtından necə xəbər tutar

Cavab: Sual həm şiələr, həm də qeyri şiələr tərəfindən verilə bilər. Əgər sualı verən şiə :deyilsə, sualı iki cür cavablandırmaq olar

a) Məhdəviyyət məsələsi digər ictimai mövzular kimi araşdırılmalıdır. Əgər həzrətin .zühuru ictimai zərurətdirsə, bu hadisə hökmən baş verəcək

---

۱- [۶۹۷] “Ruhul-Məani”, c. ۹, s. ۱۷۴.

۲- [۶۹۸] Həmin mənbə.

۳- [۶۹۹] “Təfsire-Safi”, c.۲, s. ۳۰۳.

q) İmamın zühuru Allah tərəfindən müəyyənləşdirildiyi üçün bu zühur üçün məhz .Allahın əmri olmalıdır

.Sualı verən şəxs şiə olduqda ona başqa şəkildə cavab verilir

.Həzrət ata-babalarından nəql olunan rəvayətlərdən xəbərdardır .۱

İmam möcüzə yolu ilə öz zühurundan xəbər tutar. Zühur vaxtı çatdığı vaxt Allah .۲ möcüzə göstərərək həzrəti xəbərdar edər. Bu ehtimala rəvayətlərdə işarə :olunmuşdur

Rəvəndi nəql edir ki imam Kazim (ə) buyurmuşdur: “Həzrətin zühur vaxtı çatanda o bu məsələdən xəbər tutar. Bu batini elm ona nida edər: Ey Allahın vəlisi! Zühur et, Allah düşmənlərini qətlə yetir.” Həzrətin qılıncı var və bu qılınc zühur vaxtı qınından çıxıb ona nida edər: “Ey Allahın vəlisi, zühur et. Allahın düşmənlərini boşlamaq sənə halal (deyil.”(۱

Səduq Müfəzzəl ibn Ömərdən nəql edir ki, imam Sadiq (ə) buyurmuşdur: “Həqiqətən, bizlərdən gizli bir imam var. Allah onu qeybdən çıxarmaq istədiyi vaxt qəlbinə əlamət (qoyar...”(۲

Bir hədisdə həzrət Mehdinin (ə) belə buyurduğu nəql olunur: “Biz Əhli-beytin elmi üç növdür: Keçmişlə, gələcəklə və hadisə ilə bağlı elm. Keçmişlə bağlı elm təfsirdir. Gələcəklə bağlı elm saxlanmışdır. Hədis elmi qəlblərə və qulaqlara zümzümə (çalmaqdır. Bu, bizim elmin ən üstünüdür...”(۳

.Həzrət Mehdi (ə) ilahi zəkası ilə qeyb vaxtını bilər .۳

.Qeyd edək ki, ikinci ehtimal rəvayətlərə və əqlə daha çox uyğundur

?Sual: ۴۲۴. Nə üçün həzrətin zühur vaxtı müəyyənləşməmişdir

Cavab: Bəzən belə bir sual yaranır ki, nə üçün İslam mənbələrində zühur vaxtı :göstərilmir? Cavab olaraq deyə bilərik ki

Bir şəxslə görüş arzusunda olan insan onun nə vaxt gələcəyini bilmədikdə intizar və .۱

.hazırlıq halında olur. Döyüş vaxtı bilindikdə isə həmin vaxtadək hazırlıq görülmür

.Zühur vaxtının bilinməməsi bir növ imtahandır .۲

Qeyb dövrü hansısa əsaslarla tezləşdirilib, yubadıla bilər. Bu isə həmin vaxtın .۳ .müəyyənləşdirilməsinə imkan vermir



---

.Xəraic və cəraih", c. ۳, s. ۱۱۶۷; "Kəmalud-din", s.۱۵۵; "Bihar", c. ۵۲, s. ۳۱۱" [۷۰۰] -۱

.Kəmalud-din", s. ۳۴۹; "Bihar", c. ۵۱, s. ۵۷; "Kafi", c. ۱, s. ۳۴۳" -۲

.Dəlailul-imamət", s. ۵۲۴" [۷۰۲] -۳

.Zühur vaxtı bilinsəydi, həzrətin düşmənləri ciddi hazırlıq görərdi .۴

İmam Sadiq (ə) ibn Nemana buyurur: “Ey Neman oğlu! Sənə hər şeyi bildirmək olmaz... Tələsmə. And olsun Allaha! Zühur hadisəsi üç dəfə yaxınlaşmış, amma siz onu faş etdiyinizdən təxirə düşmüşdür. And olsun Allaha! Sizin elə bir sirriniz yoxdur ki, düşmən ”.onu sizdən yaxşı bilməsin

Zühur vaxtı təyin olunmadığından insanda xüsusi bir diqqət halı yaranır. Zühur vaxtı .۵ .bilinsəydi, uyğun mənəvi halı saxlamaq çətin olardı

Zühur vaxtı müəyyən olunmadığından insanlar zühurun tezləşməsinə təsir .۶ .göstərəcək əməllərə təşviq olunur

Həzrətin zühuru çox uzun çəkə bilər. İnsanların ümidini üzməmək üçün onun vaxtı .۷ .müəyyənləşdirilməmişdir

?Sual: ۴۲۵. Zühur vaxtını təyin etmək düzgündürmü

:Cavab: Zühur vaxtı bir neçə şəkildə təyin oluna bilər

Məsələn, bəyan oluna bilər ki, zühur filan ildə, filan ayda, filan gündə baş verəcək. .۱ .Belə bir ehtimal batildir

Zühur vaxtının ümumi şəkildə müəyyənləşdirilməsi. Məsələn, deyirik ki, zühur Allah .۲ .istəyən vaxt baş verəcək. Belə bir ehtimalda eyb yoxdur

Riyazi yollarla zühur vaxtını müəyyənləşdirmək. Bəzi rəvayətlərdə bu ehtimala yer .۳ .verilsə də, həmin rəvayətlərin sənədi mötəbər deyil

:Rəvayətlərə əsaslanaraq zühur vaxtına işarə etmək .۴

Təbəri nəql edir ki, imam Sadiq (ə) buyurmuşdur: “Qaim tək ildə zühur edəcək. Ya bir, (ya üç, ya beş, ya yeddi, ya da doqquz.”(۱

Başqa bir məqamda imam Sadiq (ə) buyurur: “Ramazan ayının ۲۳-cü gecəsi imamın adı ilə nida çəkiləcək. İmam aşura günü qiyam edəcək. Həmin gün ki, Hüseyn ibn Əli

(şəhadətə çatmışdır!”(٢

Sual: ۴٢۶. Zühurdan öncə yer üzündə zülmün rəvac tapması xalqın saleh olması ilə zidd ?deyilmi

Cavab: Rəvayətdə zülm-sitəm zühur səbəbi kimi yox, zühurun yaxınlaşma şərti kimi təqdim olunur. Məqsəd bu deyil ki, xalq



---

.Elamul-Vəri”, c. ٢, s. ٢٨۶; “Bihar”, c. ۵٢, s. ٢٩١“ [٧٠٣] -١

.Həmin mənbə [٧٠۴] -٢

zühurun tezləşməsi üçün zülmə rəvac versin. Vəzifəmiz ədalətin bərpasıdır. Həmin .ədalət ki, həzrət ondan ötrü zühur edəsidir

?Sual: ۴۲۷. İmam Mehdinin (ə) zühuru nə deməkdir

:Cavab: İmam Mehdinin (ə) zühuru üç baxımdan mənalandırıla bilər

Zühur məxfilikdən sonra aşkarlanmadır. Bu məna imam Mehdinin (ə) qeybinə inanan .۱ .şiələrə məxsusdur

Zühur dedikdə həqiqi İslamı gerçəkləşdirmək üçün qiyam nəzərdə tutula bilər. Bu .۲ .baxış bir çox firqələrin baxışına uyğundur

.Zühur dedikdə yer üzünə hakimiyyət nəzərdə tutula bilər .۳

?Sual: ۴۲۸. Kiçik və böyük zühur dedikdə nəzərdə nə tutulur

Cavab: Kiçik qeybin müəyyənləşdirilməsində məqsəd böyük qeyb üçün zəmin hazırlamaqdır. Böyük zühurdan öncə Allah-təala xalqı uyğun məsələ ilə bağlı məlumat :əldə etməsi üçün şərait yaradır. Belə bir hazırlıq iki yolla əldə edilir

Ümumdünya tövhid hökumətinin zəruriliyini dərk etmək üçün düşüncə inkişafı; belə .bir hökumətin qəbulu üçün xalqın elmi səviyyəsinin yüksəldilməsi

?Sual: ۴۲۹. Ümumdünya tövhid hökumətinə zəmin hazırlayan hansı amillər var

Cavab: Bəziləri elə düşünür ki, bir bu qədər firqə parçalanmaları olan yerdə vahid hökumətin təşkili mümkünsüzdür. Hansı ki, belə bir hökumətin təşkili həm :mümkündür, həm də zəruridir. Bu hökumətə zəmin üçün bir sıra amillər var

Bəşəriyyətin başının üstünü kəsmiş müharibə təhlükəsi yalnız vahid hökumət . ۱ .sayəsində aradan götürülə bilər

Yer üzündəki savaşların əsas səbəbi kimi mənafelərin toqquşması göstərilir. Əgər .۲ həzrət Mehdinin (ə) hökumətində ədalət və insafın şüar olduğunu bilsək, bu hökumətə .meyl göstərərik

Ümumdünya tövhid hökumətinin təşkili amillərindən biri ağıl və düşüncələrin . ٣ inkişafıdır. Daxilən kamilliyə doğru hərəkətdə olan bəşəriyyət həzrət Mehdinin (ə) zühuru dövründə nəhayət kamala çatasıdır. Çünki yer üzərindəki problemləri doğuran .əsas səbəblərdən biri yetərsiz düşüncə və cəhalətdir

səh:٢٥٠

?Sual: ۴۳۰. Həzrət Mehdinin (ə) zühuru üçün “ümumi tutum” nədir

Cavab: Şübhəsiz ki, hər bir ictimai hadisə münasib tutuma ehtiyaclıdır. Zühur böyük :ictimai hadisə olduğundan bir sıra şərtlər ödənməlidir

;İslam ümmətinin dini baxımdan tərəqqisi .۱

;Xalq arasında ümumi azğınlığın artması .۲

;Zülm-sitəmin genişlənməsi və nəticədə xalqın dindən uzaqlaşması .۳

;Elmi-texniki tərəqqi .۴

.Həzrətə yardım üçün həqiqi tərəfdarların hazırlanması .۵

?Sual: ۴۳۱. Həzrət Mehdi (ə) zahirən hansı yaşda zühur edər

Cavab: Şiə və sünni rəvayətlərinə əsasən imam gənc görkəmdə, ۴۰ yaşında zühur .edəcək

İbn Səbbağ Maliki nəql edir ki, həzrət Peyğəmbər (s) buyurmuşdur: “Mənim (övladlarımdan olan Mehdi (ə) ۴۰ yaşındadır.”(۱

Şeyx Səduq nəql edir ki, imam Riza (ə) buyurmuşdur: “O zahirən gənc görünsə də, pir yaşındadır. Ona baxan elə güman edər ki, onun ۳۰ və ya daha az yaşı var. Həzrətin (başqa bir əlaməti vaxt ötdükcə qocalmamasıdır.”(۲

Nemani nəql edir ki, imam Sadiq (ə) buyurmuşdur: “Qaim qiyam edən vaxt xalq onu (inkar edəcək. Çünki həzrət bir gənc görkəmində geri dönəcək...”(۳

Həzrətin ۴۰ yaşda olduğunu bildirən rəvayətlərdə onun fiziki baxımdan kamal həddində olduğu nəzərdə tutula bilər. Bəzi rəvayətlərdə həzrətin ۱۸, bəzi rəvayətlərdə .۵۱ yaşında olduğu bildirilir

?Sual: ۴۳۲. Zühur vaxtı həzrət Mehdinin (ə) hansı fiziki xüsusiyyətləri olacaq

Cavab: Sünni və şiə rəvayətlərinə əsasən zühur vaxtı həzrətin bir sıra xüsusiyyətləri

olacaq: Geniş alın, uca donqar və dəlikləri dar burun, ulduz tək parlaq çöhrə, buğdayı bəniz, dişlərinin arası açıq, dartılmış və nazik qaşlar. Orta boy, güclü bədən, sağ yanağında qara xal.



---

۱- [۷۰۵] "Əl-Füsulul-Muhimmə", s. ۲۱۷.

۲- [۷۰۶] "Kəmalud-din", s.۶۵۲.

۳- [۷۰۷] "Əl-Ğeybət", s. ۱۸۸.

Sual: ۴۳۳. Əgər zühur qəfil olacaqsa, zühurun yaxınlaşmasını göstərən əlamətlərin nə ?mənası var

Cavab: Rəvayətlərə əsasən, həzrət Mehdi (ə) qəfil zühur edəcəkdir. Səmadan nida, Beyda məntəqəsinin öz əhli ilə yerə batması kimi əlamətlər həqiqi möminləri xəbərdar etmək üçündür. Demək, zühur möminlər üçün yox, həzrətin düşmənləri üçün qəfildir. .Həzrət Mehdi (ə) bu qəflətdən istifadə edərək zülmün kökünü kəsəsidir

?Sual: ۴۳۴. Həzrət Mehdinin (ə) qələbəsi üçün Allah-təala hansı yardımlar göstərəcək

;Cavab: ۱. Zühurun qəfil baş verməsi və düşmənlərin qəfləti

;Düşmənlərin qəlbində qorxu yaranması .۲

;Bütün müsəlmanların həzrətin ətrafında toplanması .۳

;Mələklərin yardımı .۴

?Sual: ۴۳۵. Həzrət ilk dəfə harad zühur edəcək

Cavab: Şiə və sünni rəvayətlərinə əsasən, həzrətin ilk zühur məkanı rükn və məqam arasındadır. Süyuti nəql edir ki, həzrət Peyğəmbər (s) buyurmuşdur: “Mehdi (ə) Mədinədən Məkkəyə doğru xüruc edər. Xalq ondan öz aralarından xüruc etməsini ”...istəyər. Həmin vaxt rükn və məqam arasında ona beyət edərlər

Şeyx Tusi nəql edir ki, imam Baqir (ə) buyurmuşdur: “Qaimi sanki aşura, şənbə günü, (rükn və məqam arasında dayanmış görürəm...”(۱)

?Sual: ۴۳۶. Həzrət Mehdi (ə) zühurdan sonra nə edər

Cavab: Rəvayətlərə əsasən, həzrət Mehdi (ə) zühurdan sonra rükn və məqam arasında xütbə oxuyar və xalqı beyətə dəvət edər. Nemani nəql edir ki, imam Baqir (ə) buyurmuşdur: “Qaim həmin gün Məkkədədir, Beytül-hərama sığınmışdır və oradan (nida edər: “Ey insanlar!...”(۲)

Məclisi nəql edir ki, imam Baqir (ə) buyurmuşdur: “Həqiqətən, o Məscidül-hərama

doğru hərəkət edər, orada Məqame-İbrahimin yanında dörd rəkət namaz qılar, -həcərül-əsvədə təkyə ilə Allaha həmd



---

.Nemani, “Əl-Ğeybət”, s. ۱۵۰“ [۷۰۸] -۱

.Nemani, “Əl-Ğeybət”, s. ۱۵۰“ [۷۰۹] -۲

sənə deyər, peyğəmbəri yada salıb, ona salam göndərər. Həmin vaxt kimsədən eşidilməmiş sözlər buyurar...”(١)

?Sual: ۴٣٧. Həzrətə kim birinci beyət edər

.Cavab: Rəvayətlərə əsasən həzrətə ilkin beyət edən Cəbraildir

”.İmam Sadiq (ə) buyurmuşdur: “Həqiqətən, həzrətə ilkin beyət edən Cəbraildir

Təbərsi nəql edir ki, Əbi-Əbdillah (ə) buyurmuşdur: “Allah-təala Cəbraili göndərər ki, ondan soruşsun: “Nəyə dəvət edirsən?” Qaim ona öz dəvətinin mahiyyətini bildirər. Cəbrail deyər: “Mən sənə beyət edən ilk kəsəm.” Sonra onun əlini əlinə alıb beyət edər...”(٢)

:Cəbrailin beyəti ilə bağlı iki ehtimal var

١. Rəmzi məna: Cəbrailin beyəti Allahın təsdiqi mənasındadır. Çünki o Allahın ən böyük nümayəndəsidir.

٢. Geniş yayılmış məna: Cəbrailin beyəti insanların xəlifəyə beyəti kimidir. Bunun iki faydası var: Xalqın diqqətini beyətin zəruriliyinə cəlb etmək; imamın hərəkət və qiyamının təsdiqi.

Sual: ۴٣٨. Həzrət Peyğəmbərin (s) vəfatından sonra Cəbrail yerə enməmək barədə əhd ?etmişdimi

Cavab: Ərbili “Kəşful-Ğəmmə”, kitabında nəql edir ki, imam Sadiq (ə) buyurmuşdur: “Cəbrail həzrət peyğəmbəri yoxlamağa gəldi və ərz etdi: “Salam olsun sənə, ey Məhəmməd! Bu yerə endiyim axırıncı gündür.”(٣)

İmam Baqir (ə) buyurur: “Həzrət Peyğəmbərin (s) vəfatı yaxınlaşanda Cəbrail dedi: “Ey Məhəmməd! Bu mənim dünyaya axırıncı enişimdir...”(۴)

Əvvəla, bu rəvayətlər şərtidir. Yəni arada xilaskar olana qədər enməmək nəzərdə tutulur.

.İkincisi, Cəbrail bir daha vəhy olmayacağını nəzərdə tuturdu

Üçüncüsü, həzrət Cəbrailin nazil olub imam Mehdiyə (ə) beyət etməsi səhih sənədə əsaslanır.

?Sual: ۴۳۹. Həzrət Mehdinin (ə) zühurunun bir gecədə gerçəkləşməsi nə deməkdir



---

.Bihar", c. ۱۳, s. ۱۸۰" [۷۱۰] -۱

.Ehticac", s. ۴۳۱" [۷۱۱] -۲

.Kəşful-Ğəmmə", c. ۱, s. ۱۸,۱۹" [۷۱۲] -۳

.Həmin mənbə [۷۱۳] -۴

Cavab: Şiə və sünni rəvayətlərinə əsasən, Allah-təala həzrət Mehdinin (ə) zühurunu bir .gecədə gerçəkləşdirər

Əbu-Bəsir nəql edir ki, imam Sadiq (ə) buyurmuşdur: "Allah-təala onun əmrini bir ".gecədə islah edəcək

Nəql olunur ki, imam Hüseyn (ə) buyurmuşdur: "Biz Əhli-beytin (ə) qaiminin zühurunu ".Allah-təala bir gecədə gerçəkləşdirər

İbn Macə nəql edir ki, həzrət Peyğəmbər (s) buyurmuşdur: "Mehdi (ə) biz Əhli-(beytdəndir. Allah onu bir gecədə hazır edər."(١

Əvvəla, "bir gecə" dedikdə bu hadisənin sürətlə baş verməsi nəzərdə tutula bilər. .İkincisi, məqsəd həzrətin bir gecədə qələbə çalması ola bilər

Üçüncüsü, "bir gecədə islah" dedikdə zühur üçün müqəddimə hazırlanması nəzərdə .tutula bilər

Dördüncüsü, "bir gecədə islah" dedikdə müxaliflərin qeyri-aid sürətlə məğlub edilməsi .nəzərdə tutula bilər

?Sual: ۴۴۰. Azsaylı yardımçılarla dünyaya qalib gəlmək necə mümkün olacaq

Cavab: Rəvayətlərdə həzrətin məhdud bir qrup, yəni ۳۱۳ nəfər yardımçısına işarə olunsa da, onların həzrətin rəhbərliyi ilə zalımlara qələbəsində gözlənilməyən bir şey :yoxdur. Çünki

Rəvayətlərdə həzrətin ۱۰۰۰۰ yardımçıları olacağı göstərilir. Belə bir qüvvə hazır .۱ .olmayınca həzrət zühur etməyəcək

Həzrət dünyaya möcüzə yolu ilə də qalib gələ bilər. Allah vəd etmişdir ki, .۲ (sabitqədəmlik olan yerdə kiçik bir qrupu böyük bir qrupa qalib edər.(۲

Təbii vasitələrlə də belə bir qələbənin əldə olunması gözlənilməyən iş deyil. Çünki .۳ həzrət nifaqlı bir ictimai-siyasi şəraitdə zühur edəsidir. Həmin vaxt hamı dünyadakı vəziyyətdən narazı olasıdır. Xalq ədalət hökumətinin intizarını çəkəsi, yalnız xüsusi bir

.qrup zühura qarşı çıxasıdır

Dünyanın kiçik bir kənd vəziyyətinə gələcəyi bir vaxtda nəzərdə tutulan hədəfə .۴ çatmaq mümkün olacaqdır. Əsas strateji nöqtələr ələ keçirildikdən sonra həzrətin .ümumdünyəvi ədalət hökuməti bərpa olacaq



---

.Sünəne-ibn Macə”, c. ۲, s. ۱۳۷۶“ [۷۱۴] -۱

.Bax: “Bəqərə”, ۲۴۹ [۷۱۵] -۲

Sual: ۴۴۱. Həzrətin müxaliflərə qələbəsində və hökumətinin bərpasında möcüzənin rolu ?olacaqmı

:Cavab: Bu barədə üç ehtimal var

Həzrətin qələbəsi və ümumdünyəvi hökumətin bərpası başdan-başa möcüzə ilə .۱ :gerçəkləşəsidir. Amma belə bir ehtimala qarşı iradlar var

a) Əgər möcüzə uyğun məqsədə çatmaq üçün doğru yol olsaydı, həzrət elə kiçik qeyb .dövründə bu işi görə bilərdi

.b) Möcüzə olan yerdə çoxsaylı qüvvəyə ehtiyac qalmır

v) Rəvayətlərə əsasən, həzrətlə onun müxalifləri arasında qanlı savaşlar baş verəsidir. .Möcüzə olan yerdə bu sayaq savaşlara ehtiyac qalmır

Allahın iradəsi budur ki, həzrət Mehdi (ə) öz düşmənlərinə təbii yolla qələbə çalsın. Bu .۲ .istiqamətdə heç bir möcüzə nəzərdə tutulmur

Bu ehtimala qarşı da irad var. Çünki həzrət Mehdiyə (ə) Allah-təalanın xüsusi yardımı .vəd olunmuşdur

Əvvəlki iki ehtimalı bir kənara qoysaq, üçüncü ehtimala əsasən, həzrət təbii yolla .۳ qalib gələcək və bu istiqamətdə ilahi yardımlardan da faydalanacaq. Qeyd olundu ki, həzrətin zühur edəcəyi dövrdə zülm-sitəmdən cana yığılmış bəşəriyyət onun səsinə səs verəcək. Bütün bəşəriyyətin bir səslə fəryad qoparacağı zaman, təbii ki, düşmənlər diz çökəcək. Bəşəriyyətin bir səslə həzrəti qəbul etməsində geniş informasiya şəbəkəsinin böyük rolu olacaq. Xüsusi maneçiliklərə qarşı Allah-təala .həzrəti himayə edəsidir

Həzrət Əli (ə) buyurur: “Həzrət Mehdi (ə) zühur edəcəyi vaxt adı dildən-dilə gəzəcək. İnsanların qəlbi Mehdi (ə) eşqi ilə dolacaq. Ondan savay kimsənin adı çəkilməyəcək. ”.Mehdi eşqi ilə ruhlar sirab olacaq

?Sual: ۴۴۲. Həzrət Mehdi (ə) qılınclamı qiyam edəcək

Cavab: Bəzi rəvayətlərdə bildirilir ki, həzrət qılıncla qiyam qaldıracaq. Bu baxış məqbul .deyil. Çünki tək bir nəfər kütləvi qırğın silahlarına qarşı qılıncla dayana bilməz

İmam Baqir (ə) buyurur: “Həzrət Mehdi (ə) babası peyğəmbərə qılıncla qiyamı, Allah və Onun rəsulunun düşmənlərini öldürməsi ilə

səh:۲۵۵

oxşayır…”(۱) Maraqlıdır ki, hədisdə nəzərdə tutulan adi qılıncdır, yoxsa qılınc təbiri ?başqa bir şeyə işarədir

!?Əvvəla, bir şəxsin qılınc və ilahi möcüzə ilə qiyam qaldırmasında nə nöqsan var

.İkincisi, çox ehtimal ki, qılınc dedikdə güc nəzərdə tutulur

Bu halda iki ehtimal yaranır. Həzrət ilahi möcüzə və mövcud silahlarla mübarizə .aparacaq; həzrət nüvə mərkəzlərini möcüzə yolu ilə gücdən salacaq

Üçüncüsü, bəzi rəvayətlərə əsasən, həzrətin səhabələrinin qılıncı bizim düşündüyümüz qılınc deyil. Nəzərdə tutulan qılınc dağı ikiyə bölməyə qadirdir. Bu elə .bir qılıncdır ki, düşmən silahları onun qarşısında acizdir

Dördüncüsü, həzrətin qələbəsi xalqın istiqbalı və düşmənlərin qorxusu ilə gerçəkləşə bilər. Qorxuya düşmüş düşmən silahını yerə qoyub qaçmağa üz tutar. Xüsusi ilə həzrətin möcüzələrini gördükdə anlayarlar ki, onunla mübarizə aparmaq .mümkünsüzdür

Beşincisi, kim bilir ki, həzrət Mehdinin (ə) dövründə bugünkü silahlar mövcud olacaq. .Hansısa hadisələr nəticəsində bu gün mövcud olan silah anbarı məhv ola bilər

Altıncısı, kütləvi qırğın cəhalət nəticəsidir. Əgər həzrətin zühuru dövründə ağıllar .kamilləşəcəksə, kimsə qırğına əl atmayacaq

?Sual: ۴۴۳. Məhdəviyyət rəvayətlərində hansı qırğınlardan danışılır

:Cavab: Rəvayətlərdə iki qisim qırğına işarə olunur

a) Bunlardan bir qrupu zühurdan öncə baş verəsidir və zühur dövrü ilə heç bir əlaqəsi .yoxdur

b) İkinci növ qırğınlar zühur dövrünə aiddir. Bu barədə xəbər verən rəvayətləri iki :qismə ayırmaq olar

Sənədi etibarsız olan rəvayətlər. Bu sayaq rəvayətlər Kəbul-əhbar kimi adi adamlar .۱

.tərəfindən nəql olunmuşdur və onlar peyğəmbər dövründə müsəlman olmamışlar

Əhli-beyt adından nəql olunmuş və ya şiə kitablarında zikr edilmiş, amma qaynağı .۲ .əhli-beytə çatmayan rəvayətlər

Sual: ۴۴۴. Həzrətin qiyamı dövründə baş verəcək qırğınlarla bağlı hansı rəqəmləri ?göstərmək olar



---

.Bihar", c. ۵۱, s. ۲۱۸" [۷۱۶] -۱

Cavab: İddia etmirik ki, həzrətin qiyamı dövründə qətl baş verməyəcək. Şübhəsiz ki, .belə bir böyük hadisə düşməni aradan götürmədən baş verə bilməz

Bəşir ibn Əbu-Ərakə Nəbbal deyir: Mədinədə olduğum vaxt imam Baqirin (ə) yanına gedib ərz etdim: “Deyirlər ki, Qaimin qiyamı vaxtı işlər yoluna düşəcək və qan tökülməyəcək.” Həzrət buyurdu: “Heç vaxt belə ola bilməz. And olsun canım əlində (olana, iş bir yerə çatar ki, biz və siz donmuş tər və qanı pak edərik.”(١

Bu məzmunda başqa rəvayətlər də nəql olunub. Amma tarix şahiddir ki, İslam peyğəmbəri (s) və Əhli-beytdən olan məsum imamlar imkan daxilində qılınca əl aparmamağa çalışmışlar. Çünki onların məqsədi insanların doğru yola hidayətidir. .Deməli, kütləvi qırğınlar baş verəcəyini təsdiqləyən əqli və nəqli dəlillər yoxdur

?Sual: ۴۴۵. Şiə rəvayətlərinə əsasən qətllər nə vaxt baş verəcək

Cavab: Əhli-beyt hədislərinə əsasən, zühurdan az öncə qanlı savaşlar olacaq. Xalq bu .sayaq savaşlardan cana doyduğu üçün xilaskarın intizarını çəkəcək

İmam Sadiq (ə) buyurur: “Xalqın üçdə ikisi məhv olmamış imamın qiyamı baş verməyəcək.” Ravi deyir: “Soruşdum ki, xalqın üçdə ikisi qırılacaqsa kim qalacaq? Həzrət buyurdu: “Məgər razı deyilsinizmi ki, siz salamat qalmış üçdə birdən (olasınız?!”(٢

Zürarə deyir: “İmam Sadiqə (ə) ərz etdim ki, səma nidası həqiqətdirmi? Həzrət buyurdu: “Bəli, and olsun Allaha, hər bir qövm onu öz dilində eşidər. Xalqın onda (doqquzu məhv olmayınca bu iş gerçəkləşməz.”(٣

Süleyman ibn Xalid deyir: İmam Sadiq (ə) buyurdu: “Qaimin qiyamından öncə iki növ ölüm baş verər: qırmızı ölüm və ağ ölüm. Nəhayət, hər yeddi nəfərdən beşi məhv olar. Qırmızı ölüm qılınc, ağ ölüm taunla gerçəkləşər.”(۴) Mənbələri araşdırdıqda belə bir .qənaətə gəlirik ki, bu qırğınlar qiyamdan öncə baş verəsidir

Qeyd etməliyik ki, ümumdünya ədalət hökumətinin bərpası kimi böyük bir hadisə az da olsa ölümsüz başa gələsi deyil. Amma başqa qiyamlarla müqayisədə bu ölümlər .cüzidir

---

.Nemani, “Əl-Ğeybət”, s. ۲۸۳; “Bihar”, c. ۵۲, s. ۳۵۶“ [۷۱۷] -۱

.Kəmalud-din”, c. ۲, s.۶۵۵, ۶۵۶“ [۷۱۸] -۲

.Nemani, “Əl-Ğeybət”, s. ۲۷۴“ [۷۱۹] -۳

.Kəmalud-din”, c. ۲, s.۶۵۵“ [۷۲۰] -۴

?Sual: ۴۴۶. Tərbiyə yolu var ikən nə üçün həzrət Mehdi (ə) qılıncdan istifadə edir

Cavab: Tarixi mənbələri araşdırdıqda əmin oluruq ki, təkamül qarşısında dayanmış maneələri qansız aradan götürmək olmur. Tərbiyəvi üsullar nə qədər böyük rola malik olsa da, yalnız nəcib insanlara təsir göstərir. Bu üsullar iqtisadi, siyasi və hərbi qüvvəyə yiyələnib dünyanı istismar edən qüvvələrə yetərincə təsir göstərmir. Onların hidayəti üçün gücdən istifadə etmək zəruridir. İslam müharibəni məqsəd yox, tövhid və .ədalətin bərpa vasitəsi sayır

Qurani-Kərimdə buyurulur: "Bir daha fitnə olmasın deyə onlarla vuruşun və din (bütünlüklə Allah üçün olsun..."(۱

Bu səbəbdən də aləmlərə rəhmət göndərilmiş İslam peyğəmbəri buyurur: "Bütün yaxşılıq və xeyir qılınc kölgəsindədir. İnsanları yalnız qılınc düzəldir. Qılınclar behişt və (cəhənnəmin açarıdır."(۲

İmam Baqir (ə) buyurur: "Həzrət Qaimin (ə) beş peyğəmbərə oxşarlığı var. Onun öz babası peyğəmbərə (s) oxşarlığı qılıncla qiyam, Allah və Onun rəsulunun düşmənlərini (öldürməsi, qılınc və (düşmənlərin qəlbinə düşmüş) qorxu ilə yardım almasıdır."(۳

?Sual: ۴۴۷. Həzrət Mehdi (ə) zalımlar və düşmənlərlə necə rəftar edəcək

Cavab: Rəvayətlərə əsasən haqqı eşitmiş, amma inadkarlıq göstərib Allahın höccətini .qəbul etməyənlər əsrin imamının qəzəbinə düçar olacaq

İmam Sadiq (ə) buyurur: "Həmin vaxt Qaim zühur edər və Allahın bəndələrə qəzəb ".səbəbi olar. Allah Öz bəndələrindən höccəti inkar etməmiş intiqam almaz

?Sual: ۴۴۸. Həzrətin qətlə yetirdiklərinin çoxu müsəlmanlardır

Cavab: Bəziləri deyirlər ki, bir çox qətllər İslam sərhədlərində baş verəcək. Müşrik və ?kafir haqdan daha uzaq olduğu halda nə üçün müsəlmanlar daha çox öldürülməlidir

Əvvəla, müsəlmanların daha çox qətlə yetiriləcəyini bildirən mötəbər rəvayət yoxdur. .Həzrət yalnız qarşısına çıxan maneələri aradan götürəsidir

---

.Bəqərə”, ۱۹۳“ [۷۲۱] -۱

.Vəsailuş-şiə”, c. ۱۱, s. ۵“ [۷۲۲] -۲

.Kəmalud-din”, c. ۱, s.۷“ [۷۲۳] -۳

İkincisi, bəzilərinin həzrət və onun səhabələri tərəfindən qətlə yetiriləcəyi bildirilsə də, bu o demək deyil ki, digər cəmiyyətlərdə ölüm olmayacaq və həzrət kafirləri və .müşrikləri öldürməyəcək

Üçüncüsü, müsəlmanların daha çox qətlə yetiriləcəyini qəbul etsək belə, bu, məntiqdən uzaq deyil. Çünki bəzi rəvayətlərə əsasən, əksər küfr ölkələri İslama təslim olacaq və müsəlmanlar arasında islah aparılacaq. Müsəlmanlar haqqı daha çox .bildiklərindən onlardan üzr qəbul olunmaz

Həzrət Mehdinin (ə) qarşısına çıxan problemlərdən biri Allah dininin təhrif olunması, xoşagəlməz şəkilə salınmasıdır. Küfrlə mübarizə, yanlış əqidə ilə mübarizədən asandır. İmam Sadiq (ə) buyurur: "Həzrət Qaim elə insanlarla üzbəüz gələr ki, onlar Allah (kitabını öz istədikləri kimi yazar və həzrətə qarşı çıxarlar."(١

?Sual: ۴۴۹. İmam Mehdi (ə) zühur etdikdən sonra ərəblərlə vuruşarmı

Cavab: Məclisi nəql edir ki, imam Sadiq (ə) buyurmuşdur: "Bizimlə ərəb arasında zibhdən (başın kəsilməsi) savay bir şey qalmaz. Sonra həzrət mübarək əli ilə öz (boğazına işarə etdi."(٢

Hədisin zahirindən belə görünür ki, ərəblər əhli-beyt imamlarının hər birini qətlə yetirəcək. İkinci ehtimala əsasən, imam Sadiq (ə) Mənsur Abbasinin peyğəmbər nəsli .və bəni bəni-Haşimi qırmasını nəzərdə tutmuşdur

Demək, həzrət Mehdinin (ə) zühur dövründə ərəblərlə savaşı haqqında mötəbər) .(məlumat yoxdur

?Sual: ۴۵۰. Zühur dövründə imamın ərəblərlə sərt rəftarı necə izah olunur

Cavab: Həzrət Mehdi (ə) öz qiyamına Məkkədən, ərəb torpaqlarından başlayacaq. Təbii ki, imamın məqsədi yolunda maneələr mövcuddur. Süfyanilər, dəccallar və başqa azğınlarla savaş həmin məntəqədə baş verəsidir. Bu səbəbdən də ərəblər üçün .bir çox çətinliklər yaranasıdır

?Sual: ۴۵۱. Həzrət Mehdi (ə) azğınlarla mübarizəyə azğın şiələrdən başlayacaq

Cavab: Müfəzzəl ibn Ömər deyir: İmam Sadiq (ə) buyurdu: “Qaim qiyam etdiyi vaxt şiə yalançılardan başlayacaq və onları qətlə yetirəcək.”

Əvvəla, şiə dedikdə İmamiyyə, İsmailiyyə, Zeydiyyə və digər şiə firqələri nəzərdə tutulur. Bir çoxları Əhli-beytin xəttindən çıxdığı halda şiə sayılmışdır.

Əbül-Xəttab, Mücirə ibn Səid, Əhməd ibn Hilal İbrətani, İbn Əbül-Əzaqir və başqaları bu qəbildəndir. Yuxarıdakı hədisi Xəttabiyyə firqəsini yaratmış Əbül-Xəttab nəql etmişdir. Hədislərdə imamın bu şəxsi lənətləməsi bildirilir. İmam Allahdan diləmişdir ki, bu şəxsə qılıncın istiliyini daddırsın.

Sual: ۴۵۲. Səmadan endikdən sonra həzrət İsanın vəzifəsi nə olacaq?

Cavab: Əbu-Hüreyrə nəql edir ki, həzrət Peyğəmbər (s) buyurmuşdur: “O, səmadan enər... İslama dəvət baxımından xalqla savaşar. Xaçı sındırıb, donuzu öldürər, cizyə qoyar. Onun əsrində Allah-təala İslamdan savay bütün millətləri məhv edər. Məsih Dəccalı da öldürər. Yer üzündə qırx il qalar, vəfatından sonra müsəlmanlar ona namaz qılarlar.”(۱)

Donuzun öldürülməsi onun ətindən istifadənin qadağası kimi başa düşülə bilər. Cizyə qoyulması bütün dinlərin aradan götürüləcəyinə işarə ola bilər.(۲)

Sual: ۴۵۳. Həzrət İsa nazil olduqdan sonra hansı şəriətə əməl edər?

Cavab: Səmərə nəql edir ki, həzrət peyğəmbər buyurmuşdur: “İsa ibn Məryəm Məhəmməd və onun ümmətini təsdiq edən halda nazil olar. Həmin vaxt Dəccalı qətlə yetirər...”(۳)

İbn-Həbban Əbu-Hüreyrədən belə nəql edir: Həzrət Peyğəmbərdən (s) belə eşitdim: “Məsih rükudan qalxdığı vaxt “Səmiəllahu limən-həmidəh” deyər...”(۴)

Sual: ۴۵۴. Ümumdünya tövhid hökumətinin rəhbəri kimdir?



---

۱- [۷۲۶] “Sünəne-Əbu-Davud”, c. ۲, s. ۳۱۹; “Kənzul-ummal”, c. ۱۴, s. ۳۳۳.

۲- [۷۲۷] “Əl-Məsihul-muntəzər və nəhayətul-aləm”, s. ۲۴۰/

۳- [۷۲۸] “Müsnəde-Əhməd”, c. ۵, s. ۱۳.

۴- [۷۲۹] “Səhihe-ibn Həbban”, c. ۵, s. ۲۲۳.

Cavab: Bu hökumətin rəhbəri ilə bağlı üç ehtimal var: rəhbər İsa ibn Məryəmdir; rəhbər İslamdan olan Məsihdir; rəhbər imam Əsgərinin (ə) övladı həzrət Mehdidir (ə).

Ümumdünya tövhid hökumətinin İslamdan olan Məsih tərəfindən idarə olunacağı barədə də mötəbər məlumat yoxdur.

Üçüncü ehtimalla bağlı bir neçə dəlil göstərmək olar:

١. İmam Mehdi (ə) İslam Peyğəmbəri (s) tərəfindən belə bir hökumətə varis seçilmişdir;

٢. Rəvayətlərdə bildirilir ki, həzrət İsa müsəlmanlara imamlıqdan imtina edər və imam Mehdini (ə) imam kimi tanıtdırar;

٣. Ümumdünya tövhid hökumətinin rəhbərinin İslam ümmətindən olması hikmətə əsaslanır;

۴. İncildə göstərilir ki, həzrət İsa "insan övladı" adlı bir şəxsin köməyi ilə səmadan enib, onun yardımı ilə bu hökuməti quracaq.

Sual: ۴۵۵. Həzrət İsa nazil olduqdan sonra nə qədər yaşayacaq?

Cavab: Əbu-Hüreyrə nəql edir ki, həzrət Peyğəmbər (s) buyurmuşdur: "Məsih yer üzündə qırx il qalacaq, vəfatından sonra müsəlmanlar onun üçün namaz qılacaq."(١)

٢. Abdullah ibn Ömər nəql edir ki, peyğəmbər buyurmuşdur: "İsa ibn Məryəm yerə enər, izdivac edər və övlad sahibi olar."(٢)

## İmam Mehdinin (ə) səhabələri

Sual: ۴۵۶. İmam Mehdinin (ə) zühurdan sonra neçə səhabəsi olar?

Cavab: Yetərli həddə çatmış rəvayətlərə əsasən, imam Mehdinin (ə) Bədr savaşındakı səhabələr qədər, yəni ٣١٣ nəfər səhabəsi olar.(٣)

Sual: ۴۵٧. İmam Mehdinin ٣١٣ nəfərdən əlavə səhabəsi varmı?

Cavab: Rəvayətlərdə bildirilir ki, imam Mehdinin (ə) zühurdan sonra on minədək .səhabəsi olar

səh:۲۶۱

---

۱- [۷۳۰] "Müsnəde-Əhməd", c. ۲, s. ۴۰۶.

۲- [۷۳۱] "Əl-Muntəzəm", c. ۲, s. ۳۹.

۳- [۷۳۲] "Yənabiul-Məvəddəd", s. ۵۰۹; "Elamul-vəri", s. ۴۳۳.

Məhəmməd ibn Müslim nəql edir ki, imam Baqir (ə) buyurmuşdur: “Həzrət Mehdinin (ə) ətrafında on min nəfər toplandıqdan sonra yer üzündə Allahdan savay məbud (qalmaz...”(۱)

?Sual: ۴۵۸. Həzrət Mehdinin (ə) səhabələri Məkkəyə necə daxil olar

:Cavab: Yuxarıdakı sualla bağlı bir neçə ehtimal var

.İnsanlar möcüzə ilə, sürətli şəkildə Məkkəyə daxil olar .۱

Digər bir ehtimala görə xalq bir neçə dəstəyə bölünər: bəziləri təbii yolla imamın .۲ xidmətinə yetişər, bəziləri yatdığı yerdə oyanıb özünü Məkkədə görər, bəziləri isə .buludlar üzərində həzrətin xidmətinə gələr

Hamı sadəcə səfərə çıxıb həzrətin xidmətinə çatar. Üçüncü ehtimal həqiqətə daha .۳ .çox uyğundur

?Sual: ۴۵۹. İmam Mehdinin (ə) səhabələri hansı ölkələrdəndir

Cavab: Şeyx Tusi nəql edir ki, imam Baqir (ə) buyurmuşdur: “Rükn və məqam arasında Bədr əhli sayda insan həzrətə beyət edəcək. Onların arasında Misirdən, Şamdan, (İraqdan gələnlər var...”(۲)

İbn Tavus “Əl-Məlahim vəl-fətn” kitabında bir çox səhabələrin və onların şəhərlərinin .adını nəql edir

?Sual: ۴۶۰. İmamın səhabələri arasında ərəblər varmı

Cavab: Mərhum Məclisi nəql edir ki, imam Sadiq (ə) buyurmuşdur: Ərəblərdən uzaq ol, çünki onlar üçün bu xəbər acıdır. Bil ki, Qaimlə ərəbdən bir nəfər olsun ortaya (çıxmayacaq.”(۳)

Amma bu hədisin sənədləri mötəbər deyil. Şeyx Tusinin nəql etdiyi hədisdə bildirildi ki, .imama beyət edənlər arasında Misirdən, Şamdan, İraqdan gələnlər var

?Sual: ۴۶۱. İmam Mehdinin (ə) səhabələri arasında qadınlar vardırmı

Cavab: Nemani nəql edir ki, imam Baqir (ə) buyurmuşdur: “And olsun Allaha! Üç yüz (neçə nəfərin arasında əlli nəfər qadın var.”(۴)

səh:۲۶۲

---

۱- [۷۳۳] Həmin mənbə.

۲- [۷۳۴] Tusi, “Əl-ğeybət”, s. ۲۸۴.

۳- [۷۳۵] “Bihar”, c. ۵۲, s. ۳۳۳.

۴- [۷۳۶] “Nemani, “Əl-ğeybət”, s. ۲۷۹.

Müfəzzəl ibn Ömər imam Sadiqə (ə) istinadən bildirir ki, Qaimin (ə) ətrafındakılar (arasında on üç nəfər qadın var.(١

?Sual: ۴۶۲. Həzrətin qadın tərəfdarları ٣١٣ nəfərdəndirmi

Cavab: Bəzi rəvayətlərdə bildirilir ki, həzrətin əlli qadın tərəfdarı həmin ٣١٣ nəfərdəndir. Cabir ibn Yəzid Cofi nəql edir ki, imam Baqir (ə) buyurmuşdur: "And olsun Allaha! Üç yüz ondan çox şəxs gələr və onların əlli nəfəri qadındır. Onlar Məkkədə bir yerə (toplanar..."(٢

Sual: ۴۶٣. Əgər imamın səhabələrinin adı öncədən bilinirsə, biz hansı əsasla səhabə ?olacağımıza ümid edə bilərik

Cavab: İmamın səhabələrinin sayını və adlarını göstərən rəvayətlər sənəd baxımından zəifdir. İbn-Tavusun rəvayətində ٣١٣ nəfərin yox, ٢۴٠ nəfərin adı göstərilir. Ehtimal var .ki, insan qalan ٧٣ nəfərdən biri olsun

?Sual: ۴۶۴. İmam Mehdiyə (ə) istəmədən beyət edənlər varmı

Cavab: Qutabə nəql edir ki, Peyğəmbər (s) buyurmuşdur: "Mehdi (ə) Mədinədən Məkkəyə doğru xüruc edər, ondan xalqın arasından xüruc etməsi istənilər. O, rükn və "...məqam arasında ikrahla beyət alar

Zürarə nəql edir ki, imam Sadiq (ə) buyurmuşdur: "Qaimin adı ilə nida edilər. Gəlib məqamın arxasında dayanar. Ona deyilər ki, həqiqətən, sənin adınla nida çəkilib, nə gözləyirsən? Onun əlini tutub beyət edərlər. Zürarə deyir ki, həmd olsun Allaha ki, Qaimin kərahətlə beyət aldığını eşitdik. Onun ikrahında heç bir günah olmadığını (bildik."(٣

?Sual: ۴۶۵. Həzrət Mehdiyə (ə) kimlər beyət edəcək

Cavab: Cəbrail, həzrətin yaxın səhabələri, həzrətin ümumi səhabələri, Məkkədə olub .onun dəvətini qəbul edənlər

?Sual: ۴۶۶. İmam Mehdi öz səhabələri ilə hansı əsasda peyman bağlayar

---

.Dəlailul-imamət”, s. ۲۵۹; “İsbatul-hudat”, c. ۳, s. ۷۵“ [۷۳۷] -۱

.Məcməul-zəvaid”, c. ۷, s. ۳۱۵“ [۷۳۸] -۲

.Nemani, “Əl-ğeybət”, s. ۳۴۰“ [۷۳۹] -۳

Cavab: Öz ətrafındakılardan əhd almaq imam Mehdinin (ə) proqramlarından və üsullarındandır. İlkin İslam hökuməti qurulduğu vaxtdan əhd və beyət almaq qayda .olmuşdur. İlk dəfə İslam peyğəmbəri (s) belə bir üsulu tətbiq etmişdir

Həzrət Əli (ə) buyurur: "Həqiqətən, Qaim öz yaxınları ilə peyman bağlayar, onlardan (beyət alar..."(١

?Sual: ۴۶۷. İmam Mehdinin (ə) səhabələri şücaətlidirmi

Cavab: Hakim Nişapuri Məhəmməd ibn Hənəfiyyənin dilindən nəql edir: Biz Əlinin (ə) yanında idik. Ondan həzrət Mehdi (ə) haqqında soruşuldu. Həzrət buyurdu: "O dünyanın sonunda zühur edəcək. Həmin vaxt bir şəxs "öldürülsün" deyə elan edər. Allah onun ətrafında parçalanmış bulud kimi dəstələr toplayar və qəlblərini həmahəng (edər. Onlardan heç birində qorxu görünməz..."(٢

?Sual: ۴۶۸. Həzrətin səhabələri xüsusi bir məntəqədəndirmi

Cavab: Bəzi rəvayətlərə əsasən həzrətin səhabələri dünyanın müxtəlif .nöqtələrindəndir. Allah-təala qısa bir zamanda onları Kəbə ətrafında toplayar

Seyyid ibn Tavus nəql edir ki, imam Əli (ə) həzrət Mehdinin (ə) səhabələri haqqında buyurmuşdur: "Onlar Bədr səhabələri sayda, ۳۱۳ nəfərdir. Allah onları dünyanın (şərqindən və qərbindən Kəbə ətrafına toplayacaq..."(٣

?Sual: ۴۶۹. Həzrət Mehdinin (ə) səhabələrində hansı xüsusiyyətlər var

Cavab: Rəvayətlərdə bildirilir ki, həzrət Mehdinin (ə) səhabələrinin özünəməxsus sifətləri var: İxlas, yəqin və istiqamət, həqiqi allahşünaslıq, gündüzlər şirlik, gecələr .zahidlik, ilahi yardımdan faydalanma

?Sual: ۴۷۰. ۳۱۳ nəfər səhabə dünyanı necə ram edəcək

.Cavab: Əvvəla, həzrətin ۳۱۳ nəfər səhabəsi və on minədək ümumi yardımçısı var

.İkincisi, həzrətin qələbəsi ilahi yardımlarla müşayiət olunur

.Üçüncüsü, həzrətin qələbə çalması Allahın qəti iradəsidir



---

.Muntəxəbul-əsər", s. ۴۶۹" [۷۴۰] -۱

.Mustədrəke-hakim", c. ۴, s. ۵۵۴" [۷۴۱] -۲

.Əl-təşrifi bil-mənən", s. ۲۸۸-۲۹۴" [۷۴۲] -۳

Dördüncüsü, əgər yalnız təbii amilləri nəzərə alsaq, yenə də bu qələbə mümkün sayılmalıdır. Çünki həzrət xüsusi bir şəraitdə zühur edəcək, həmin vaxt bəşəriyyət belə bir şəxsin intizarında olacaq.

Sual: ۴۷۱. Həzrət Mehdinin (ə) nazirləri hansı zümrədəndir?

Cavab: Bəzi rəvayətlərə əsasən, həzrət Mehdi (ə) dövlətində nazirlər gənclərdən təşkil olunacaq. Onların kiçik bir hissəsi yaşlılar olacaq. Həzrət Əli (ə) buyurmuşdur: "Həqiqətən, Qaimin səhabələri gənclərdir..."(۱)

Sual: ۴۷۲. Əgər həzrətin yardımçıları əsasən şərqdəndirsə, geri qalmış şərq inkişaf etmiş qərbə necə qalib gələcək?

Cavab: Əvvəla, həzrətin yardımçıları müsəlmandır və əksər müsəlman məntəqələri şərqdə yerləşir.

İkincisi, həzrət Mehdi (ə) bütün mütərəqqi üsullardan və texnologiyalardan faydalanacaq.

Üçüncüsü, qərbi yalnız texnologiya baxımından şərqdən üstün sayırsınızsa, bilməlisiniz ki, həzrətin məqsədi təkcə maddi inkişaf deyil. Kim iddia edə bilər ki, qərb əxlaq və mədəniyyət baxımından şərqdən üstündür?!

Sual: ۴۷۳. Həzrətin dövlət xadimləri kimlərdir?

Cavab: Rəhbəri həzrət Mehdi (ə) olan hökumətin xadimləri ümmətin böyükləri və salehləridir.

Rəvayətlərdə bildirilir ki, həzrət İsa həzrət Mehdiyə (ə) deyər: "Həqiqətən, mən əmir yox, vəzir olaraq göndərilmişəm."(۲)

Başqa bir rəvayətdə bildirilir ki, həzrət İsa endiyi vaxt Kəhf səhabələri də onun yanında olacaq."(۳) Həzrət Əli (ə) Həmdan qəbiləsinin bu dövlətdə xidmətini qeyd edir.(۴)

Sual: ۴۷۴. Bir bu qədər müsəlman arasında yalnız ۳۱۳ nəfərmi həzrətə yoldaş olacaq?

Cavab: Əvvəla, rəvayətlərdə həzrətin yaxın səhabələrinin sifətləri zikr olunur. Yalnız .bu sifətlərə malik olanlar həzrətə yaxın ola bilər



---

.Tusi, “Əl-ğeybət”, s. ۲۸۴ [۷۴۳] -۱

.Məlaim”, s. ۸۳“ [۷۴۴] -۲

.Həmin mənbə [۷۴۵] -۳

.Əqdud-durər”, s. ۹۷“ [۷۴۶] -۴

İkincisi, qeyd olundu ki, həzrətin ۳۱۳ nəfərdən əlavə on min nəfər civarında yardımçısı .olar

.Üçüncüsü, ۳۱۳ nəfər yardımçının olması zühur üçün yetərli amil yox, sadəcə şərtdir

**Zühurdan sonrakı tarix**

?Sual: ۴۷۵. Zühur dövründə hamı bir əqidədəmi olacaq

Cavab: Vahid cəmiyyət və vahid ümmətin təşkil olunması üçün vahid dünyagörüşü və .vahid etiqada ehtiyac var

.Zühur dövründə bütün yer üzündə vahid bir dünyagörüşü hakim olacaq

Həqiqi xilaskar olan Mehdinin (ə) proqramları əbədi haqq-ədalət qanunları üzərində .qurulmuşdur

İmam Əli (ə) Malik ibn Həmzəyə buyurur: "Həmin vaxt bizim Qaim (ə) qiyam edər və (bütün xalq bir əqidə ətrafında birləşər."(۱

İmam Sadiq (ə) buyurmuşdur: "And olsun Allaha, ey Müfəzzəl! İmam Qaim (ə) millətlər (və ayinlər arasından ixtilafları götürər və hamıya bir din hakim olar."(۲

?Sual: ۴۷۶. İmam Mehdi (ə) dünyaya hansı dinlə hakimlik edər

Cavab: İmam Mehdinin (ə) etiqad etdiyi və zühur dövründə əsaslandığı din İslamdır. Bu :müddəanı bir neçə dəlillə sübuta yetirmək olar

Həzrət Mehdi (ə) İslam peyğəmbərinin (s) son canişini olduğundan onun hakimiyyəti .۱ .İslama əsaslanacaq

Mütəvatir rəvayətlərə əsasən bu hökumət haqq-ədalət hökumətidir. Kamil ədalət .۲ .isə yalnız İslamdadır

Rəvayətlərə əsasən həzrət Mehdi (ə) İslam ümmətinə hakim olacaq. Bu da öz .۳ .növbəsində onun İslama əsaslanacağını göstərir

Bir qrup rəvayətdə bildirilir ki, həzrət Mehdi (ə) zühur etdikdən sonra İslam .۴ hökmlərini və peyğəmbər sünnəsini həyata keçirəsidir.(۳)

İslam peyğəmbəri (s) və əhli-beytdən (ə) nəql olunmuş mütəvatir rəvayətlərə .۵ əsasən, imam Mehdi (ə) yer üzündə ədaləti bərpa edəcək. Bu prinsiplər isə yalnız .İslamda mövcuddur



---

۱- [۷۴۷] "Nemani, "Əl-ğeybət", s. ۲۰۶.

۲- [۷۴۸] "Bihar", c. ۵۳, s. ۴.

۳- [۷۴۹] "Əl haviyyu lil-fətavi", c. ۲, s. ۱۲۶.

?Sual: ۴۷۷. Həzrət Mehdinin (ə) zühur dövründə yer üzündə qeyri-müsəlman qalacaqmı

Cavab: Rəvayətlərdən məlum olur ki, həzrət Mehdinin (ə) hakimiyyəti dövründə qeyri-müsəlman olmayacaq.

İbn-Bəkir nəql edir ki, həzrət Əbül-Həsən "Ali-İmran" surəsinin ۸۳-cü ayəsini təfsir edərkən buyurur: "Ayə Qaimin şənində nazil olmuşdur. Qaim zühur edən vaxt yəhudiləri, məsihiləri, sabiiləri, şərq və qərbin kafirlərini İslam dininə dəvət edər. Öz meyli ilə qəbul edənlərə namaz, zəkat və digər vacib əməllər əmr olunar. İslamı qəbul etməkdən imtina edənlərin boynu vurular. Şərq və qərbdə bir Allaha pərəstiş edənlərdən savay kimsə qalmaz..."(۱)

Amma bəzi rəvayətlərdə bildirilir ki, yəhudilər və məsihilər qiyamət gününədək qalacaq.

Əbu-Bəsir deyir: İmam Sadiqdən (ə) zühur dövründə zimmə əhlinin, yəhudilərin və məsihilərin vəziyyəti haqqında soruşdum. Həzrət buyurdu: "Onlarla peyğəmbərsayaq rəftar olunar, onlar da itaət göstərib cizyə verərlər."(۲)

İmam Baqir (ə) buyurur: "Həzrət Qaim (ə) ona görə Mehdi adlandırılır ki, Tövrat və digər səmavi kitabları Antakiyadakı mağaradan çıxarıb yəhudilərlə Tövrat, məsihilərlə İncil, Zəbur əhli ilə Zəbur, Quran əhli ilə Quran əsasında rəftar edər."(۳)

Bu baxışı Quran ayələri də təsdiqləyir.(۴)

?Sual: ۴۷۸. Zühur dövründə hansı məzhəb hakimdir

Cavab: Heç şübhəsiz ki, İslam Allah tərəfindən təsdiqlənmiş son dindir. Bu səbəbdən də Allah Öz peyğəmbərini "Xatəmun-nəbiyyin" adlandırmışdır. Maraqlıdır ki, zühur dövründə hansı İslam məzhəbi hakim olacaq?

Ayə və rəvayətlərdən məlum olur ki, zühur dövründə İslam dini hakimdir. "İkmal" ayəsini nəzərə aldıqda isə həmin dövrdə şiə məzhəbinin hakim olacağı sübuta yetir. Allah-təala buyurur: "Bu gün sizin dininizi kamil etdim, sizə olan nemətlərimi tamamladım və din olaraq sizin üçün İslamı bəyəndim."(۵)

---

۱- [۷۵۰] “Bihar”, c. ۵۲, s. ۳۴۰.

۲- [۷۵۱] “Bihar”, c. ۵۲, s. ۳۷۶-۳۸۱.

۳- [۷۵۲] “Nemani, “Əl-ğeybət”, s. ۱۲۵.

۴- [۷۵۳] Bax: “Ali-İmran”, ۵۵; “Maidə”, ۱۴.

۵- [۷۵۴] “Maidə”, ۳.

Bəs həmin gün nə baş vermişdir? Rəvayətlərdən məlum olur ki, bu ayə Qədire-Xum hadisəsi ilə bağlı nazil olmuşdur. Qədire-Xum hadisəsi həzrət Peyğəmbərin (s) həzrət Əlini (ə) özünə canişin təyin etməsindən ibarətdir. Deməli, zühur dövründə Allahın bəyəndiyi din bütün dinlərə qalib gələcək. O dövrün hakim məzhəbi isə həzrət Əli (ə) .və onun on bir məsum övladının imamətini qəbl edən şiə məzhəbidir

Sual: ۴۷۹. Həzrət Mehdi (ə) zühur etdikdən sonra əqidə azğınlıqları ilə necə mübarizə ?aparacaq

Cavab: Həzrət Mehdinin (ə) zühur dövründə əsas çətinliklərindən biri cəmiyyətdə Allah dini ilə bağlı yanlış düşüncənin rəvac tapmasıdır. Bu sayaq yanlışlıqlar əsrlər boyu cəmiyyətdə kök atmışdır. Müsəlmanlıq iddiasında olub, dini təlimləri təhrif edən şəxslə mübarizə aparmaq kafirlə mübarizədən daha çətindir. Quran və hədisləri yanlış təfsir edənlər üç hissəyə bölünür: dünyapərəst və asılı ruhanilər; sərmayədarlar və .kübarlar; adı müsəlman olan hökumətlər

İmam Sadiq (ə) buyurur: "Qiyam zamanı Qaimin cahillərdən çəkdiyi əziyyət peyğəmbərin cahil xalqdan çəkdiyi əziyyətdən ağırdır. Peyğəmbər zühur edən vaxt xalq daşa-taxtaya pərəstiş edirdi. Qaim zühur etdikdə isə insanlar öz mövqelərini (Quran ayələri ilə sübut etmək istəyəcək."(۱)

?Sual: ۴۸۰. İmam Mehdinin (ə) hökumətində millətçilik əsas götürülürmü

Cavab: Həzrət Mehdinin (ə) hökumətində heç bir milli və irqi ayrıseçkiliyə yer yoxdur. :Bu müddəanın bir sıra dəlilləri var

Həzrətin dəvəti İslam hökmlərinə əsaslanır və İslam hökmlərində milli, irqi . ۱ .ayrıseçkiliyə yer yoxdur

Həzrət Mehdinin (ə) dəvəti ümumdünyəvidir. Belə bir dəvətdə milli və irqi . ۲ .ayrıseçkiliyə yol verilə bilməz

Bəzi rəvayətlərə əsasən, həzrət Mehdinin (ə) hakimiyyəti ədalət hökumətidir və . ۳ .ayrıseçkiliyə müxalifdir

.Rəvayətlərə əsasən, həzrət Mehdi (ə) Allah rəsulunun yolunu gedəcək .۴

?Sual: ۴۸۱. Həzrət Mehdinin (ə) hökuməti digər hökumətlərə oxşayırmı



---

.Nemani, “Əl-ğeybət”, s. ۲۹۷“ [۷۵۵] -۱

Cavab: Qəti şəkildə iddia etmək olar ki, həzrət Mehdinin (ə) hökuməti dünyanın heç bir :mövcud hökumətinə oxşamır

Əvvəla, həzrət Mehdi (ə) öz zühur dövründə İslamı tam mənada ədalət hökuməti proqramı olaraq bərpa etməlidir. Bildiyimiz kimi, İslam proqramları dünyanın heç bir .mövcud hökumətinin proqramı ilə oxşar deyil

İkincisi, dünyanın mövcud hökumətləri zülm-sitəm üzərində qurulmuşdur. Demokratik hakimiyyətlərdə haqq-ədalətə yox, çoxluğun rəyinə əsaslanır. Bu quruluşlarda azlıqların haqqı pozulur. Ədalətsizliyin aradan qaldırılması Mehdi (ə) hökumətinin əsas .məqsədlərindəndir

Üçüncüsü, dünyanın bütün mövcud quruluşları maddiyyat üzərində qurulmuşdur və bu quruluşlarda ilahi dəyərlər əsas götürülməmişdir. Həzrət Mehdinin (ə) hakimiyyəti isə mənəviyyat, insanın Allahla rabitəsi, cisim və ruhun tərbiyəsi üzərində qurulmuşdur. .Bu səbəbdən də həzrətin hökumətinin bütün qanunları ilahi qanunlar olacaq

Dördüncüsü, İmam Mehdinin (ə) hökumətində bəşəriyyətin bütün maddi və mənəvi ehtiyacları nəzərə alınır. Bu səbəbdən də rəvayətdə bildirilir ki, bu dövlət son (dövlətdir.(١

?Sual: ۴٨٢. İmam Mehdi (ə) zalımlarla və ilahi hədlərin icrası üçün necə rəftar edəcək

Cavab: İmam Mehdinin (ə) hökumətində sazişçilik yoxdur. Bu hökumətdə ilahi hökmlər qəti şəkildə icra olunar. Kimlərinsə qınağı və zoru nəzərə alınmaz və günahkarlar ciddi .şəkildə cəzalandırılar

İmam Baqir (ə) buyurur: "Qaim qiyam ... Ərəblərlə ciddi rəftar olunar, sözü qılınc deyər, (ilahi qanunların icrasında kimsənin qınağı maneçilik törətməz."(٢

İmam Kazim (ə) buyurur: "Allah-təala bizim ailədən olan on ikinci imam üçün bütün çətinlikləri asanlaşdırar. Onun əli ilə hər bir zalım məhv edilər, hər bir azğın şeytan (aradan götürülər."(٣

?Sual: ۴٨٣. Zühur dövründə insanların həyatı sahmana düşərmi

---

.Elamul-vəri”, s. ۴۳۲“ [۷۵۶] -۱

.Nemani, “Əl-ğeybət”, s. ۲۳۳“ [۷۵۷] -۲

.Kəmalud-din”, c. ۲, s.۳۶۹“ [۷۵۸] -۳

Cavab: Həzrət Mehdi (ə) və zühur dövrü ilə bağlı nəql olunmuş ziyarətnamələrdə və rəvayətlərdə bildirilir ki, əsl və düzgün həyat imam Mehdinin (ə) əbədi təlimləri sayəsində təmin olunar. Həzrət Mehdi (ə) haqqında ziyarətnamədə oxuyuruq: "Salam olsun həyat baharına və dövrün təravətinə..."(۱)

İmam Hüseyn (ə) buyurur: "Bizim ailədə on iki Mehdi var... Onların sonuncusu mənim doqquzuncu övladımdır. O haqq olaraq qiyam qaldırar, Allah onun əli ilə ölü yeri dirildər..."(۲)

İmam Sadiq (ə) buyurur: "Yer üzü zalım hakimlərin sitəmi ilə öldükdən sonra Allah onu Qaimin ədaləti ilə dirildər..."(۳)

Sual: ۴۸۴. İmam Mehdinin (ə) proqramlarının sərlövhəsi nədir?

Cavab: Bütün yer üzündə ədalətin bərpası imam Mehdinin (ə) inqilabi amallarının birincisidir. Bu sərlövhə bütün peyğəmbərlərin proqramlarında öndə gəlir. Peyğəmbərlər, adətən, ədalətin bərpası üçün savaşa qalxmış, mübarizə aparmışlar...

İmam Hüseyn (ə) buyurur: "Dünyanın ömründən bir gün qalmış olsa belə, Allah həmin günü uzadar ki, mənim övladlarımdan olan şəxs qiyam etsin və yer üzünü zülm-sitəm bürüdükdən sonra onda ədaləti yaysın."(۴)

Sual: ۴۸۵. Həzrət Mehdinin (ə) ədalətin yayılmasında əldə edəcəyi müvəffəqiyyətə hansı amillər təsir göstərir?

Cavab: Bu quruluşda həm ədalətə əsaslanan qanunlar, həm də bu qanunları icra edən şəxsin kimliyi mühüm rol oynayır. İmamət quruluşunda haqq-ədaləti bərpa etməli olan imam kamil bir nümunədir.

Həzrət Mehdinin (ə) müvəffəqiyyətini təmin edən amillərdən biri zühur dövründə ağılların kamilləşməsidir. Hədislərə əsasən, ədalət ağıl, zülm isə cəhalətin ünsürüdür.(۵)

Sual: ۴۸۶. Zühurdan sonra həzrət Mehdinin (ə) şəxsi keyfiyyətləri necə olacaq?

١- [٧٥٩] “Məfatihul-Cinan”, s. ٥٣١.

٢- [٧٦٠] “Kəmalud-din”, c. ١, s.٣١٧.

٣- [٧٦١] Nemani, “Əl-ğeybət”, s. ٢٥.

٤- [٧٦٢] “Kəmalud-din”, c. ١, s.٣١٨.

٥- [٧٦٣] “Kafi”, c. ١.

Cavab: İmam Mehdi (ə) bütün peyğəmbərlər və ilahi övliyalar kimi sadə həyat tərzi keçirər, ucuz libaslar geyər, sadə xörəklərlə qidalanar.(١)

Sual: ٤٨٧. Zühur dövründə ictimai asayiş necə olacaq?

Cavab: İmam Mehdi (ə) bəşəriyyətin tarix boyu görmədiyi ictimai asayiş yaradacaq. İmam Sadiq (ə) "Nur" surəsinin ٥٥-ci ayəsinin həzrət Mehdiyə aid olduğunu bildirir.

Sual: ٤٨٨. Zühur dövründə insanların əqli inkişafı və elmi tərəqqisi hansı səviyyədə olacaq?

Cavab: Peyğəmbərlərin dəvəti əsasən elm və biliyin, təcrübənin genişlənməsində rol oynayır. İman bilik və mərifətin budaqlarından sayılır. Peyğəmbərlər insanlara yaşayış qanunlarını, onun məqsəd və nəticələrini öyrədirdilər.

İnsanın yaranışında məqsəd onun təkamülü olduğundan bu hədəf nə vaxtsa gerçəkləşməlidir. Bütün məqsədlərin gerçəkləşdiyi zühur dövründə insanın mərifəti, biliyi təkamül həddinə çatır.

Bu yolla iki əsas mehvər gerçəkləşir:

١. Elm artdıqca, kainatın sirləri açıldıqca allahşünaslığın sütunları möhkəmlənir;

٢. Elm və biliyin genişlənməsi bəşər cəmiyyətinin təşkilində və rifah əldə olunmasında zəmin olur.

Həzrət Peyğəmbər (s) buyurur: "Onların doqquzuncusu Qaimdir (ə), Allah onun əli ilə yer üzünü qaranlıqdan işığa çıxarar, ədalətlə doldurar..."(٢)

İmam Baqir (ə) buyurur: "Bizim Qaim (ə) zühur edəcəyi vaxt firqələrin ağıl gücünü mərkəzləşdirər, düşüncələri kamal həddinə çatdırar."(٣)

Sual: ٤٨٩. Həzrət Mehdinin (ə) zühur dövrü tərbiyəvi inkişaf baxımından necədir?

Cavab: Tərbiyəvi təkamül Mehdi (ə) qiyamının mühüm proqramlarındandır. Həzrət digər proqramlarını icraya qoymaq üçün məhz bu nöqtədən başlayır.

---

.Nemani, “Əl-ğeybət”, s. ۲۳۳“ [۷۶۴] -۱

.Kəmalud-din”, c. ۱, s.۲۶۰“ [۷۶۵] -۲

.Bihar”, c. ۵۲, s. ۳۳۶“ [۷۶۶] -۳

(İmam Əli (ə) buyurur: “Bizim Qaim (ə) qiyam edən vaxt qəlblərdən kin çıxar.”(۱

İmam Baqir (ə) buyurur: “Bizim Qaim (ə) zühur edən vaxt əlini xalqın başına çəkər və (onların əxlaqını kamilləşdirər.”(۲

?Sual: ۴۹۰. Həzrət Mehdi (ə) mal-mülkü necə bölüşdürəcək

Cavab: Həzrət Mehdinin (ə) proqramlarından biri də bərabərliyin qorunmasıdır. Həzrət Peyğəmbər (s) buyurmuşdur: “Sizə Mehdi (ə) ilə müjdə verirəm. O mənim ümmətim arasından məbus olar... Göy və yer sakinləri onun gəlişinə sevinər. O mal-mülkü (düzgün bölər – hamı arasında bərabər!”(۳

?Sual: ۴۹۱. Hüzur əsrində xalqın iqtisadi durumu necə olar

Cavab: Bütün yer üzündə iqtisadi baxımdan rifah yaratmaq həzrət Mehdinin (ə) proqramlarındandır. Geriliyin və qıtlığın bir-biri ilə əlaqəli iki səbəbi var: dünyaya hakim .olan istismarçı nizam; millətlərin zərərinə yönəlmiş hakim siyasət

İmam Sadiq (ə) buyurur: “Bizim Qaim (ə) gələn zaman yer ilahi nurla işıqlanar... Siz zəkat verməyə adam axtararsınız. Onu sizdən qəbul edən tapılmaz. Bütün insanlar (ilahi fəzl sayəsində ehtiyacsız olar.”(۴

Həzrət Peyğəmbər (s) buyurmuşdur: “Mənim ümmətim Mehdinin (ə) dövründə heç bir vaxt görmədiyi nemətə çatar. Həmin vaxt göydən bol yağış yağar, torpaq bəhrəsini (gizləməz.”(۵

?Sual: ۴۹۲. Zühur dövründə bolluq hansı yolla yaranar

:Cavab: Bu məsələ ilə bağlı iki ehtimal var

.Yer üzünün var-dövləti möcüzə yolu ilə artar. Bu ehtimal bir o qədər də əsaslı deyil .۱

.Əkinçilik artdığından, ticarət genişləndiyindən nemət bolluğu yaranar .۲

.Böyük kapitallar işə salınar, bu məbləğlər insanlar arasında bərabər bölünər .۳

۱- [۷۶۷] “Muntəxəbul-əsər”, s. ۴۷۴.

۲- [۷۶۸] “Bihar”, c. ۵۲, s. ۳۳۶.

۳- [۷۶۹] “Bihar”, c. ۵۱, s. ۸۱.

۴- [۷۷۰] “Bihar”, c. ۵۲, s. ۳۳۷.

۵- [۷۷۱] Həmin mənbə, c. ۵۱, s. ۸۲.

?Sual: ۴۹۳. Zühur dövründə məscidlərin vəziyyəti necə olacaq

Cavab: Zühur dövründə din və məzhəb əsl hədəfə doğru yönələr və bu hərəkət bəşəriyyəti xoşbəxtliyə aparar. İmam bütün imkanları həqiqi məzhəbin hədəfləri yolunda sərf edər. Ədalət bərpa olar, ümumi rifah yaranar, insanlar əhrimənlərin əlindən xilas edilər. Bu məqsədlə məscid və məbədlərin israfçılıqla bəzənməsinə yol .verilməz, mövcud zinətlər aradan götürülər, ibadətgahlar sadə və bəzəksiz olar

Ömər ibn Cəmi imam Baqirdən (ə) soruşur: «Bəzəkli məsciddə namaz qılmaq olarmı?” İmam buyurur: “Bunu xoşlamıram. İndiki dövrdə bunun sizə zərəri yoxdur. Amma (ədalət hakim olacağı zamanda bununla necə rəftar ediləcəyini görəcəksiniz.»(۱

Sual: ۴۹۴. Həzrət Mehdi (ə) zühur etdikdən sonra Məscidul-həram və Məscidun-nəbini ?dəyişəcəkmi

Cavab: Kuleyni və Müfid Əbu-Bəsirdən, Əbu-Bəsir isə imam Sadiqdən (ə) belə nəql edir: “Qaim qiyam edən vaxt Məscidül-həramı əvvəlki şəklinə salacaq, Məscidun-(nəbiyə əvvəlki görkəmini qaytaracaq...”(۲

Əvvəla, bu rəvayət Şeyx Müfid, Kuleyni, Şeyx Tusi tərəfindən nəql olunsa da, mötəbər .sənədə malik deyil və ona istinad etmək olmaz

İkincisi, həzrət Mehdi (ə) şiə və sünnilərin etimad göstərdiyi şəxsdir. Şiələr onu həm də .məsum sayır. Belə bir şəxsin edəcəyi iş kimsədə şəkk-şübhə yaratmamalıdır

Üçüncüsü, rəvayəti düzgün saysaq, onu belə izah edə bilərik ki, zalım hakimlərin dövründə bu iki məscid haram pullarla zinətləndirilmişdir. Zülmün əsərlərini aradan .götürmək üçün bu zinətlər ləğv edilə bilər

Dördüncüsü, “Səhihi-Müslimdə” nəql olunmuş rəvayətə əsasən həzrət Peyğəmbər (s) Kəbə evini yenidən bina etmək istəmişdir. Amma insanlar İslamı təzəcə qəbul .etdiyindən bu fikrindən daşınmışdır

Sual: ۴۹۵. İmam Mehdi (ə) zühur etdikdən sonra Əbu-Bəkr və Ömərdən intiqam ?alacaqmı

Cavab: Məclisi nəql edir ki, imam Sadiq (ə) buyurmuşdur: “Həzrətin görəcəyi ilk iş o iki (nəfəri oda çəkməkdir…”(١)

:Sualın cavabında bir neçə nöqtəni qeyd etmək lazım gəlir

.Məclisinin istinad etdiyi Bəşir Nəbbal rical kitablarında mötəbər sayılmamışdır .١

.Rəvayətdə bildirilmir ki, həmin iki şəxs kimdir .٣

İmam Mehdi (ə) məsum olduğundan və haqq-ədalətə əsaslandığından sünnə əhli bu .۴ .iki xəlifəyə münasibətinə yenidən baxmalıdır

Bu iki şəxsin dəfn olunduğu yer peyğəmbər hücrəsi sayılır. Həmin iki şəxsi bu .۵ hücrədə dəfn etmək olmazdı. Həzrət haqqı bərpa etmək üçün onları hücrədən .çıxarasıdır

?Sual: ۴۹۶. İmam Mehdi (ə) zühur etdikdən sonra nə üçün Davudun hökmünə əməl edir

Cavab: Kuleyni nəql edir ki, imam Baqir (ə) Xəttab ibn Əba-Übeydəyə buyurmuşdur: “Ey ba-Übeydə! Ali-Məhəmməd Qaimi qiyam edəndə Davud və Süleymanın hökmü ilə (hərəkət edəcək. Bu səbəbdən də dəlil və şahid istəməyəcək.”(٢)

:Yuxarıdakı rəvayətə münasibətimizi bildirək

Rəvayətdən belə görünür ki, imam Mehdi (ə) zühur etdikdən sonra dəlillər yox, öz .١ elmi əsasında rəftar edəcək. Şeyx Müfid deyir: “İmam şəhadətlər əsasında hökm verdiyi kimi, öz elmi əsasında da hökm çıxara bilər. O şəhadətləri batil gördükdə öz (elminə əsaslana bilər…”(٣)

Zühurdan sonra imamın vəzifəsi yer üzündə ədaləti bərpa etmək olduğundan .٢ təbiidir ki, tapdanmış haqları qaytarmaq üçün hökmlər çıxarasıdır. Ədaləti bərpa .etmək üçün isə Allahın verdiyi elmə əsaslanmalıdır. Bu, həmin Davud hökmüdür

İmamın öz elmi əsasında hökm çıxarmasını təkcə şiə alimləri yox, bəzi sünni alimləri .٣ .də caiz sayır

İbn-Qüdamə deyir: "Peyğəmbərdən (ə) eşidilmişdir ki, hakim elmi əsasında hökm verə bilər..."



---

۱- [۷۷۴] "Bihar", c. ۵۲, s. ۳۸۶.

۲- [۷۷۵] "Kafi", c. ۱, s. ۳۹۷.

۳- [۷۷۶] "Bihar", c. ۲۶.

?Sual: ۴۹۷. Həzrət Mehdi (ə) yeni bir din gətirəcəkmi

Cavab: Bəziləri elə düşünür ki, həzrət Mehdi (ə) zühur dövründə yeni bir din gətirəcək. Hansı ki, Quran buyuruqlarına əsasən, İslam peyğəmbəri (s) son peyğəmbərdir, onun dini son dindir. Hədis mənbələrinə müraciət etdikdə görürük ki, həzrətin yeni din gətirməsi ilə bağlı heç bir məlumat verilmir. Həzrətin zühur dövründə məsələləri yenidən araşdırması yeni şəriət kimi başa düşülməməlidir. Həzrət yeni üsullardan .istifadə etsə də, onun məqsədi cəddinin şəriətini dirçəltməkdir

?Sual: ۴۹۸. Həzrət Mehdinin (ə) "yeni sultan" olması nə deməkdir

Cavab: Bir rəvayətdə nəql olunur ki, imam Baqir (ə) buyurmuşdur: "And olsun Allaha! Sanki xalqın rükn və məqam arasında Mehdiyə səmadan enmiş yeni sultan kimi beyət :etdiyini görürəm."(۱) Bu sualla bağlı bəzi ehtimallar var

Yeni sultan dedikdə yeni üsul, yeni yanaşma nəzərdə tutulur. Elə bir üsul ki, . ۱ .bəşəriyyət heç bir dövlətin tarixində bu üsulla rastlaşmamışdır

.Elə bir səltənət ki, bütün səltənət və hökumətlərə münasibətdə yenidir .۲

?Sual: ۴۹۹. İmam Mehdinin (ə) yeni bir əmrlə qiyamı nə deməkdir

Cavab: İmam Baqir (ə) bir rəvayətdə buyurur: "Mehdi xüruc etdiyi vaxt yeni əmrlə :qiyam edəcək."(۲) "Yeni əmr" ifadəsi ilə bağlı müəyyən ehtimallar var

.Yeni əmr" dedikdə yeni tələb nəzərdə tutulur" .۱

.Yeni əmr" dedikdə yeni üsul, düşüncə və əqidə proqramı nəzərdə tutulur" .۲

Yeni əmr" dedikdə xilafət və imamət nəzərdə tutulur. Həzrətin xilafəti başqa" .۳ .xilafətlərdən fərqləndiyi üçün yeni sayılır

?Sual: ۵۰۰. "Yeni mühakimə" nədir

Cavab: İmam Baqir (ə) buyurur: "Ali-Məhəmmədin Qaimi xüruc edəndə yeni sünnə, (yeni mühakimə ilə qiyam edəcək." (həmin mənbə, s. ۳۴۸

:Sualla bağlı iki ehtimal var

;Zühur əsrinə uyğun çeşidli və mütərəqqi proqramlar .١

.Mühakimədə yeni üslub .٢

?Sual: “Yeni sünnə” nə deməkdir

Cavab: İmam Baqir (ə) buyurur: “Mehdi (ə) xüruc edəndə yeni əmr, yeni kitab, yeni sünnə ilə qiyam edəcək.”(١) Hansı ki, həzrət Peyğəmbər (s) buyurmuşdur: “Mehdinin (ə) sünnəsi mənim sünnəm kimidir.”(٢)

Zühur dövründə düşüncələr kamilləşdiyindən və həzrətin hakimiyyəti bütün yer üzünü .əhatə etdiyindən bu hakimiyyət başqa hakimiyyətlərdən fərqlənir

?Sual: “Yeni kitab” nə deməkdir

Cavab: Əbu-Bəsir nəql edir ki, imam Sadiq (ə) buyurmuşdur: “And olsun Allaha! Sanki Mehdinin (ə) rükn və məqam arasında xalqdan yeni kitabla beyət aldığını görürəm...”(٣)
:Bu təbirlə bağlı müxtəlif ehtimallar var

.Yeni bir Quranın gətirilməsi ehtimalı. Belə bir ehtimal batildir .١

Həzrətin Quranı peyğəmbər dövründə olduğu şəkildə gətirməsi. Bugünkü Quran .٢ .peyğəmbər tərəfindən tərtib olunduğu üçün bu ehtimal da qəbuledilməzdir

Nəzərdə Əli ibn Əbi-Talib tərəfindən yazılmış Quran tutula bilər. Bu ehtimal həqiqətə .٣ .daha çox yaxındır

Yeni kitab dedikdə daha uca maarif və mahiyyət başa düşülə bilər. İmam ayələrin bu .٤ .vaxtadək xalqa məlum olmayan yeni mənalarını açıqlaya bilər

?Sual: Həzrət Məsihin ümumdünya ədaləti hökumətində iştirakının hikməti nədir

.Cavab: ١. Həzrətin iştirakı çoxsaylı məsihi dünyasının hidayətinə səbəb ola bilər

.Həzrət Məsihin iştirakı həzrət Mehdinin (ə) qələbəsi üçün zəmin yarada bilər .٢

---

.Həmin mənbə, c. ۵۲, s. ۲۳۰ [۷۷۹] -۱

.Həmin mənbə, c.۵۱, s. ۷۳ [۷۸۰] -۲

.Bihar”, c. ۵۲, s. ۲۹۴“ [۷۸۱] -۳

Həzrət Məsih həzrət Mehdinin (ə) ümumdünya ədalət hökumətində hansısa .٣ .məsuliyyəti öhdəsinə götürə bilər

Sual: Əgər həzrət İsa peyğəmbərdirsə, nə üçün ümumdünya hökumətinin rəyasəti ?həzrət Mehdiyə (ə) məxsusdur

:Cavab: Yuxarıdakı suala bir neçə baxımdan cavab vermək olar

.Həzrət Mehdi (ə) İslam peyğəmbərinin (s) son canişini, şəri varisdir .١

Həzrət Məsih müsəlman olmayan ümmətlərin peyğəmbəridir. Onun dini gücdən .٢ .düşmüş, ardıcıllarına İslam dinini qəbul etmək əmr edilmişdir

?Sual: Həzrət Mehdi (ə) yəhudi və məsihilərlə necə rəftar edəcək

Cavab: Bəzi rəvayətlərə əsasən, həzrət Mehdi (ə) Tövrat əhli ilə Tövratla, İncil əhli ilə İncillə, Zəbur əhli ilə Zəburla, Quran əhli ilə Quranla mühakimə aparacaq. Əlbəttə ki, .söhbət inadkarlıq göstərməyən, həzrətə qarşı çıxmayan kitab əhlindən gedir

?Sual: İmamın zühuru ilə qiyamı arasında fasilə çoxdurmu

Cavab: Şeyx Müfid deyir: "Qaim hakimiyyətə çatdıqdan sonra kimsə üçün hakimiyyət olmayacaq. Rəvayətlərdə işarə olunub ki, yalnız həzrətin övladı ona canişin olar. Amma bu məsələyə qəti dəlil yoxdur. Əksər rəvayətlərdə bildirilir ki, ümmətin Mehdisi (ə) qiyamətdən qırx gün öncə dünyadan köçər və həmin qırx gündə hərc-mərclik (düşər. Bu isə ölülərin dirilmə, hesab saatının başlama əlamətidir."(١

Sual: Əgər həzrətin hökuməti ümumdünya ədalət hökumətidirsə, nə üçün o, şəhadətə ?çatır

Cavab: Həzrətin şəhadəti ilə bağlı mütəvatir dəlil yoxdur. Onun şəhadətə çatacağına inananlar iki dəlilə əsaslanır: a) Rəvayətlərdə ümumi şəkildə göstərilmişdir ki, bütün imamlar qeyri-təbii ölümlə dünyadan gedər; b) Rəvayətlərdən birində məlumat verilir ki, bəni-təmim tayfasından olan Səidə adlı bir qadın həzrəti şəhadətə yetirər. O həzrət .yoldan keçdiyi vaxt böyük bir daşı onun üstünə salar

.Əvvəla, həzrətin şəhadəti onun zühur dövründə islahatçılığı ilə bir araya sığmır

.İkincisi, rəvayətlərdə bildirilir ki, Əhli-beyt (ə) qeyri-təbii ölümlə dünyadan köçəcək

.Üçüncüsü, həzrətin şəhadətini xəbər verən rəvayətin sənədi mötəbər deyil

.Dördüncüsü, bəzi rəvayətlərdə bildirilir ki, həzrət Mehdi (ə) təbii ölümlə köçər

?Sual: Həzrət Mehdinin (ə) hökumətində bütün insanlar islah olacaqmı

Cavab: Bəzi rəvayətlərə əsasən, həzrət Mehdinin (ə) islahatı bütün yer üzünü bürüyəcək. İmam Həsən Müctəba (ə) buyurur: "Allah-təala dünyanın sonunda bütün (azğınları və günahları islah edəcək bir şəxs göndərər."(١

?Sual: Zühurdan sonra həzrət Mehdinin (ə) dəstəsi harada mərkəzləşəcək

Cavab: Bəzi rəvayətlərə əsasən, bu hökumətin paytaxtı Kufə olacaq. İmam Sadiqdən (ə) nəql olunmuş bir rəvayətdə isə imamın Səhlə məscidində məskunlaşacağı (bildirilir.(٢

?Sual: Əgər zühur dövründə ağıllar kamilləşəcəksə, imama nə ehtiyac var

Cavab: Bilməliyik ki, zühur dövründə ağıllar təbii yolla kamilləşəcək. Bu işdə əsas təbii .amil imam Mehdinin vücududur

?Sual: Həzrətin zühurunun hansı təsirləri və bərəkətləri var

Cavab: ١. Bu imtiyazlardan biri insanın imamla bir əsrdə yaşamasıdır. Həmin vaxtda .hazırda əldə olmayan bərəkətlər insana nəsib olar

Həzrət Mehdinin (ə) zühuru dövründə insanlar üçün yer üzündə behişt yaranar. Belə .٢ bir əsr hətta peyğəmbərin (s) dövründə də olmamışdır. Zühur dövründə ideal həyat .üçün tam şərait yaranar



---

.İsbatul-hüdat", c. ٣, s. ٥٢٤" [٧٨٣] -١

?Sual: İmam zühur etdikdən sonra bugünkü texnologiyanı inkişaf etdirəcəkmi

Cavab: İmam həm dövrün texnoloji tərəqqisindən bəhrələnəcək, həm də onu inkişaf etdirəcək. Amma bu tərəqqidə əsas məqsəd insanı yaranış məqsədinə çatdırmaqdır.

?Sual: Həzrətin zühur dövründə hansı əlamətlər müşahidə olunacaq

Cavab: İslam alimləri zühur əlamətlərini iki qismə bölürlər: bu əlamətlərdən bir hissəsi zühurdan öncə gerçəkləşəcək. Zühur vaxtı gerçəkləşəcək əlamətlər sırasında bir dəstənin Beyda çölündə yerə batmasını, səmadan gələn səsi, nəfsi-zəkiyyənin qətlini göstərmək olar.

?Sual: Belə əzəmətli bir hadisəni bir nəfər öz öhdəsinə necə götürə bilər

Cavab: Bilməliyik ki, insan həmişə tarixi şəraitdə formalaşmır. İnsanın qeyb aləmi ilə sıx rabitəsini nəzərə alsaq, bu dərin rabitə insanı xoş gələcəyə istiqamətləndirə bilər. Yeni mədəniyyətin başlanğıcını qoymuş İslam peyğəmbəri keçmiş mədəniyyətin övladı deyildi. Həzrət Mehdinin təcrübəsi İslam peyğəmbərinin təcrübəsidir. İlahi bir şəxsiyyət tarixi gedişatı dəyişməyə qadirdir.

?Sual: Əgər imama imam qüsl verməlidirsə, həzrətə kim qüsl verəcək

Cavab: Rəvayətlərdə bildirilir ki, rəcətdən sonra imam Hüseyn (ə) bu işi görəsidir. İmam Sadiq (ə) buyurur: “Höccətin ölümü çatar, onun qüsl, kəfənləmə, hənut, dəfnini imam Hüseyn (ə) öhdəsinə götürər...”(١)

## Ümumdünya ədalət hökumətinin davam müddəti

Sual: İmam Mehdinin (ə) tövhid hökumətinin müddəti ilə rabitədə ümumi qayda nə tələb edir?

Cavab: Ümumi qaydaya əsasən, imam Mehdinin (ə) ümumdünya ədalət hökuməti üçün geniş vaxta ehtiyac var. Bəşəriyyətin yaranışının ali məqsədini gerçəkləşdirmək üçün geniş vaxta ehtiyac duyulur. Bu mövzunu kiçik bir müqəddimə ilə aydınlaşdıraq:

a) Yaranışın məqsədi bütün yer üzündə xalis bəndəliyin gerçəkləşməsidir. Allah-təala buyurur: “Mən cin və insi (insanı) yalnız ibadət üçün xəlq etdim.”(١)

b) Həzrət Mehdi (ə) ümumdünyəvi hökuməti bərpa etməklə bu məqsədin həyata keçməsində böyük rol oynayır.

v) Belə bir böyük məqsədin həyata keçməsi üçün geniş vaxta ehtiyac var. Çünki bu məqsədin möcüzə yolu ilə həyata keçməsi nəzərdə tutulmamışdır.

Sual: Həzrət Mehdinin (ə) hökumət müddəti haqqında rəvayətlər nə deyir?

Cavab: Bu məsələ ilə bağlı iki qrup rəvayət var:

a) Rəvayətlərin bir qismində həzrətin hökumətinin on il və ya daha az ömür sürəcəyi bildirilir. Belə bir məlumata daha çox sünni mənbələrində rast gəlmək olur.

b) Digər bir qrup rəvayətdə həzrətin hökumətinin on ildən çox ömür sürəcəyi xəbər verilir.

Birinci qrup rəvayətlər “Sünəne Əbu-Davud”, “Səhihi-Termizi” mənbələrində nəql olunmuşdur. İkinci qrup rəvayətlərə “Yənabiul-məvəddə”, “Əl-haviyul lil-fətavi”, “Əl-ğeybət” mənbələrində təsadüf etmək olar.

Sual: Həzrət Mehdinin (ə) hökumət müddəti ilə bağlı fərqli rəvayətlər necə izah olunur?

Cavab: Bu mövzu ilə bağlı üç mövqe var:

١. Bu hökumətin yeddi il davam edəcəyini bildirən rəvayətlər: Bu məlumatın mötəbər sənədləri var, hətta mütəvatir həddə olduğu bildirilir.

٢. Həzrətin həyatı və hökuməti haqqında məlumat verən rəvayətlər: İmam Mehdinin (ə) zühurundan sonrakı həyatı on ildən azdır. Ümumdünya ədalət hökumətinin ömrü on ildən az çəkəcək.

٣. Şiddətli və zəif mərhələlər: Səfarini deyir: Bütün rəvayətləri düzgün saysaq, onları belə izah etmək olar ki, həzrətin hökuməti üç mərhələyə bölünür: Zühur mərhələsi,

.sabitlik mərhələsi, son mərhələ

?Sual: Həzrətin hakimiyyəti haranı əhatə edir



---

.Zariyat”, ۵۶“ [۷۸۶] -۱

Cavab: Rəvayətlərə və dəlillərə əsasən, həzrət Mehdinin (ə) hökuməti bütün yer üzünü :əhatə edəcək

;Yaranışda məqsəd bütün bəşəriyyətin kamala çatmasıdır .۱

;Bəzi rəvayətlərdə həzrətin hökumətinin bütün yer üzünü əhatə edəcəyi bildirilir .۲

Mütəvatir həddə çatmış rəvayətlərə əsasən həzrət Mehdi (ə) bütün yer üzünü .۳ ;ədalətə bürüyəcək

Bəzi rəvayətlərə əsasən, həzrət Mehdinin (ə) hökuməti əhatə baxımından .۴ ;Zülqərneynin hökuməti kimidir

.Bildirilir ki, həzrət yer üzündəki bütün məntəqələri fəth edəcək .۵

?Sual: Ümumi qaydaya əsasən zühurdan sonra bəşəriyyət nə qədər yaşamalıdır

Cavab: Əgər məqsəd təbii yolla kamilliyə çatmaqdırsa, bu, qısa bir müddətdə başa gələn iş deyil. Məqsəd təkcə hökumətin təşkili deyil. Ən mühüm hədəf xalis bəndəliyin gerçəkləşməsidir. Necə ola bilər ki, qısa bir müddət həyata görə bəşəriyyət bir bu !?qədər uzun intizar çəkib, fədakarlıq göstərsin

**Rəcət**

?Sual: Rəcət nə deməkdir

Cavab: İmamiyyə şiələri bu əqidədədir ki, həzrətin zühurundan və ədalət hökumətinin təşkilindən sonra Allahın övliyalarından və Əhli-beyt dostlarından, eləcə də, vəhy düşmənlərindən bir hissəsi dünyaya qayıdacaq. Övliyalar və salehlər ədalət hökumətini görüb sevinəcək, düşmənlər isə öz ləyaqətsiz əməllərinin cəzasını .dünyada çəkəcək

?Sual: Rəcət etiqadı nə vaxtdan mövcuddur

Cavab: Rəcət Əhli-beyt (ə) məktəbinin köklü etiqadlarındandır. Bu əqidə Qurandan qaynaqlanmış, peyğəmbər hədislərində ona işarə olunmuşdur. Sünni kitablarına müraciət etdikdə görürük ki, bu əqidə imamiyyə şiələrinə aid olunur. İmamların

.səhabələri də öz müxalifləri ilə bu mövzuda mübahisə aparmışlar

Şeyx Səduq buyurur: “Keçmiş ümmətlər arasında rəcət əqidəsi olmuşdur. Peyğəmbər (s) buyurur ki, keçmiş ümmətlər arasında baş

verən bu ümmət arasında da baş verəcək. Vacibdir ki, bu ümmət üçün də rəcət (olsun."(١)

Şeyx Müfid buyurur: "Allah-təala qiyamətdən öncə bir qrup Məhəmməd (s) ümmətini (dirildər. Bu əqidə Ali-Məhəmmədə (s) aiddir və Quran da onu təsdiqləyir."(٢)

Seyyid Mürtəza buyurur: "İmam Mehdinin (ə) zühuru zamanı şiələrdən bir qrupunun "...dünyaya qaytarılması, mükafat və cəzaya çatdırılması şiə etiqadlarındandır

?Sual: Rəcət şiəliyin zərurətlərindəndirmi

Cavab: Bəzi şiə alimlərinin nəzərincə, rəcət məzhəb zəruriyyətlərindəndir. Şeyx Hürr Amili bildirir ki, bu əqidə bütün tanınmış şiə alimləri tərəfindən zərurət sayılmışdır. (Mərhum Məclisi, Əllamə Təbatəbai də rəcətin zəruriliyini təsdiqləyir.(٣)

Sual: Nə üçün mütəkəllimlər (kəlam alimləri) rəcət mövzusunu kəlam elmində ?açıqlayırlar

:Cavab: Bunun bir sıra səbəbləri var

.Rəcət bir çox rəvayətlərdə işarə olunmuş etiqadi həqiqətlərdəndir .١

.Rəcətin imamət məsələsi ilə rabitəsi var .٢

.Rəcət qiyamət əlamətlərindən olduğu üçün əqidə mövzusu sayılır .٣

.Rəcət məada etiqada zəmin yaradır .۴

.Rəcətin mükafat və cəza məsələləri ilə də əlaqəsi var .۵

?Sual: Rəcətlə bağlı hansı baxışlar var

Cavab: ١. Rəcət dedikdə dünyadan getmiş Əhli-beyt və mömin ruhlarının yenidən .zühuru nəzərdə tutulur. Belə bir təfsir mənbələrdəki məlumatlara uyğun gəlmir

Rəcət dedikdə imam Mehdinin (ə) zühuru və xalqa üz tutması nəzərdə tutulur. Bu .٢ .hadisə həqiqət olsa da, onu rəcət adlandırmaq düzgün deyil

---

۱- [۷۸۷] "Etiqadats-Səduq", s. ۴۱, ۴۲.

۲- [۷۸۸] "Bihar", c. ۵۳, s. ۱۳۶.

۳- [۷۸۹] "Əl-Mizan", c. ۲, s. ۱۰۷.

Rəcət dedikdə dünyadan gedənlərin bir qrupunun dünyaya qayıtması nəzərdə .٣ .tutulur. Bu baxış ən məşhur və həqiqətə uyğun baxışdır

?Sual: Rəcətin zəruriliyinə əqli dəlil varmı

Cavab: Bir sıra din alimləri rəcətin zərurət olmasını sübuta yetirmək üçün əqli dəlillər :göstərmişlər

Qəsri-daim və əksəri” mahaldır: yəni hər bir həqiqət öz xasiyyətlərindən daimilik və“ .١ ya əksər vaxt məhrum ola bilməz. Peyğəmbərlər və imamlar həyatları dövründə öz .təlim-tərbiyələrini başa vurmadıqlarından onların qayıdışı zəruridir

İslah yolunun davamının zəruriliyi: Hər bir inqilabi şəxsin inqilab hədəflərini həyata .٢ keçirəcək qüvvəyə ehtiyac var. Peyğəmbərdən (s) sonra bu işi on iki imam görmüşdür. .Demək, zühur dövründə Əhli-beytin rəcəti zəruridir

Rəcət fitri bir həqiqətdir: Ədalət hökumətinin ömrü uzun çəkəcək, həzrətin ömründə .٣ .isə məhdudluq var. Demək, kimlərsə onun yolunu davam etdirməlidir

?Sual: Quranda kimlərinsə rəcətinə işarə olunubmu

:Cavab: Quranda rəcət nümunələri mövcuddur

(Allah-təala buyurur: “Allah onlara “ölün” dedi və sonra yenidən diriltdi.”(١ .١

Quranda buyurulur: “Kəsilmiş inəyin bir parçasın ölüyə toxundurun” dedik. Allah .٢ (bütün ölüləri bu qaydada dirildər...”(٢

(Allah-təala buyurur: “Şükr edəsiniz deyə, sizi sonra yenidən diriltdik.”(٣ .٣

Başqa bir ayədə oxuyuruq: “Allah onu yüz il ölü halında saxladı, sonra dirildərək “Nə .۴ (qədər yatmısan” deyə soruşdu”.(۴

?Sual: Rəcətə etiqadın hansı əsərləri var

:Cavab: Rəcətə etiqadın bir sıra faydaları var

.Zühur dövrü yer üzü üçün behiştdir .۱

İnsan zühurdan öncə Mehdinin (ə) zühuru üçün zəmin hazırlamalı olduğundan . ۲ .rəcətin böyük tərbiyəvi və əməli təsirləri var

səh:۲۸۳

---

.Bəqərə”, ۲۴۳“ [۷۹۰] -۱

.Bəqərə”, ۷۳“ [۷۹۱] -۲

.Bəqərə”, ۵۵, ۵۶“ [۷۹۲] -۳

.Bəqərə”, ۲۵۹“ [۷۹۳] -۴

?Sual: Rəcət əqli və fəlsəfi baxımdan mümkün sayıla bilərmi

.Cavab: Bəziləri elə hesab edirlər ki, rəcət əqli və fəlsəfi baxımdan əsassızdır

Əqli baxımdan irad: Vəliyullah Dehləvi deyir: “Günahkarlar axirətdə cəzalanasıdır və .۱ onların dünyada cəzalanması zülm sayılır. Onlar öz müasirlərinin qarşısında ”...cəzalandırılsaydılar, ibrətamiz olardı

İradları belə cavablandıra bilərik ki, günahkarların rəcət dövründə alacaqları cəza onların ümumi cəzalarının bir hissəsidir... Günahkarların müasirləri yox, başqa dövrün .insanları qarşısında cəzalandırılması ibrətamizdir

Fəlsəfi baxımdan irad: Ölümdən sonra dünyaya qayıdış fəaliyyətdən sonra qüvvəyə .۲ .qayıdışdır. Fəlsəfədə belə bir hal batil sayılır

Uyğun irada belə cavab verə bilərik ki, bu irad təbii ölümə aiddir. Qətl və xəstəlik .səbəbindən ölənlər öz fəaliyyətlərini tam başa vurmamışlar

?Sual: Rəcət etiqadı yəhudilərə aid deyilmi

Cavab: Əhməd Əmin Misri deyir: “Yəhudilər öz rəcət etiqadları ilə şiələrə təsir (göstərmişdir.”(۱

Əvvəla, İslamın vəzifəsi yəhudiliyi hər bir işə münasibətdə inkar etmək deyil. Həzrət (Peyğəmbər (s) onlara xitabən buyurur: “Bu Quran sizdə olanı təsdiq edəndir.”(۲

.Əhli-beytin rəcət mövzusunda nəql etdiyi rəvayətlər mütəvatir həddindədir

?Sual: Rəcət hədisləri yalnız şiələr tərəfindən nəql olunmuşdurmu

Cavab: Bəzi sünnilər irad tuturlar ki, rəcət hədisləri yalnız şiələr tərəfindən nəql .olunmuşdur

Əvvəla şiələr bu rəvayətləri peyğəmbər Əhli-beytindən nəql edir. Bu xəbər Quran və .hədislərdə təsdiqlənmişdir. Belə bir etiqad sünnə əhlinə də vacibdir

۱- [۷۹۴] “Fəcrul-İslam”, s. ۳۳.

۲- [۷۹۵] “Bəqərə”, ۴۱.

İkincisi, rəcət hədislərinə sünni mənbələrində yer verilməməsinin səbəbi həmin dövrdə şiə imamlarının zühuru məsələsi ola bilər. İmamlar məhz haqları .tapdandığından rəcət dövründə geri dönəsidir

?Sual: Rəcət tənasüx (ruhların bədənə qayıtması) kimi batil əqidəyə uyğun deyilmi

Cavab: Tənasüx dedikdə ruhun bir bədəndən digərinə keçməsi başa düşülür. Rəcət isə .bəzi ruhların müəyyən bir müddətə əvvəlki bədənə qayıtmasıdır

?Sual: Quran rəcət məsələsini inkar edirmi

Cavab: Dehləvi deyir: “Bəzi Quran ayələrinə əsasən, insanın bu dünyaya rəcəti mümkünsüzdür.” O “Muminun” surəsinin ۹۹-۱۰۰-cü ayələrini dəlil göstərir. Bu ayələrdə .saleh əməl üçün dünyaya qayıtmaq istəyənlərə rədd cavabı verilir

Əvvəla, ayə xüsusi halı nəzərdə tutmamışdır. Rəcət məsələsində yalnız bir qrup .mömin və günahkardan söhbət gedir

İkincisi, ayədə ölümdən öncə ölüm mələyi ilə görüş məqamı nəzərdə tutulur. Rəcət isə .ölümdən sonranı nəzərdə tutur

.Üçüncüsü, ayə kafirlərin tələbi ilə qayıdışı mümkünsüz sayır

.Dördüncüsü, rəcəti təsdiq edən ayələr yetərincədir

.Beşincisi, rəcət kafirlərin tələbi yox, Allahın iradəsidir

?Sual: Rəcət hamıya aiddirmi

:Cavab

Əvvəla, rəcət məad kimi ümumi deyil. Bu hadisə xalis möminlərə və xalis kafirlərə .aiddir

İmam Sadiq (ə) buyurur: “Rəcət ümumi deyil... Yalnız xalis imanı olanlar və xalis (müşriklər geri qaytarılar.”(۱)

İkincisi, rəvayətlərdə xüsusi şəkildə fərdlərin dönüşü qeyd olunur. İmam Sadiq (ə) buyurur: “Yer üzünə qayıdacaq ilk şəxs Hüseyn ibn Əli (ə) olacaq.(۲)

Həzrət başqa bir məqamda buyurur: “Dünyaya rəcət edən ilk şəxs Hüseyn ibn Əlidir (ə)...”(۳)



---

۱- [۷۹۶] “Bihar”, c. ۵۳, s. ۳۳.

۲- [۷۹۷] “İlzamul-nasib”, c. ۲, s. ۳۶۰.

۳- [۷۹۸] “Bihar”, c. ۵۳, s. ۴۶۰.

?Sual: Zühur dövründə qadınlar rəcət edəcəkmi

Cavab: Zühur dövründə həzrətin yardımçılarından bir qismi qadınlardır. Allah imamın zühuru bərəkəti ilə onları dirildəcək və onlar növbəti dəfə dünyaya rəcət edəcək… .Bəzilərinin adı və əlamətləri də göstərilir

Mötəbər mənbələrdə on üç qadının adı çəkilir. Onlar həzrət Mehdinin (ə) zühuru zamanı diriləsidir. Bu qadınlar həzrətin qoşununda yaralılara tibbi xidmət (göstərəcək.(١)



---

.Dəlailul-imamət", Təbəri, s. ٣١۴" [٧٩٩] -١

**Mündəricat**

## Haqqında mərkəzi

Allahın adı ilə

Rəhman və Rəhimli olan Allahın adı ilə.Və bütün həmdlər aləmlərin rəbbi olan Allaha .məxsusdur

.Varlıq aləminin Kövsəri olan Həzrəti Fatiməyi Zəhraya (a) təqdim olunur

(Bilən kimsələrlə (alimlər) bilməyənlər (cahillər) eynidirlərmi? (Zümər surəsi, ayə ۹

:Ön söz

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi ۲۰۰۶-cı ildən Mərhum Ayətullah Seyyid Həsən Fəqih İmaminin nəzarəti altında,elmi mərkəzlərdə tanınan görkəmli tələbələrin vasitəsi ilə məzhəb,mədəniyyət və elmi sahələrdə öz fəaliyyətinə .başlamışdır

:Məramnamə

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi təhqiqatçıların dini biliklərə rahət və tez bir zamanda yiyələnmələri üçün hər bir xidməti onların ixtiyarında qərar vermişdir.Və bu sahədə təəssübkeşlikdən,ictimai,siyasi,fərdi cəryanlardan uzaq duraraq yalnız və yalnız elmi sahədə ixlasla öz xidmətini həyata keçirməkdədir.Bu səbəbdən adı çəkilən müəssisə layihəsini həyata keçirmiş.Və tədqiqat üçün nəzərdə tutulmuş kitabları,məqalələri mütəxəssislər və müxtəlif təbəqələrdən olan insanlar üçün,bir neçə dillərdə və formalarda hazırlayaraq,heç bir məbləğ tələb etmədən sosial .medyada istifadəçilərin ixtiyarında qoymuşdur

:Hədəflər

Quran və Əhli beyt mədəniyyətini və maarifini yaymaq.۱

İnsanları,xüsusən gəncləri tam dəqiq şəkildə dini məsələləri araşdırmağa.۲ sövqləndirmək

Telefon,tablet və kompüterlərdə olan faydasız,yararsız mövzuların yerini .۳ faydalı,mənəviyyatlı mövzularla doldurmaq

.Təhqiqatla məşğul olan tələbələrə xidmət etmək.۴

.Kitab və elmi əsərlər oxumaq mədəniyyətini yaymaq.۵

.Müəlliflərin öz elmi əsərlərini digital formada yaymaq üçün onlara şərait yaratmaq.۶

:İcraçılıq

.Qanunla icazəli olan lisenziyaya malik əsərlərin yayımı.۱

.Bu mərkəz kimi xidmət göstərən oxşar mərkəzlərlə əlaqə.۲

.(Paralel xidmətlərdən çəkinmək (başqalarının etdiklərini təkrarlamamaq.۳

.Yalnız və yalnız elmi məsələləri yaymaq.۴

.Nəşriyyatın mənbələrini qeyd etmək.۵

.Qeyd:Kitabda olanlara görə məsüliyyət o kitabı yazan müəllifin öhdəsindədir

:Müəssisənin fəaliyyəti

.Kitabların çapı və nəşri.۱

.Kitab oxumaq müsabiqələrinin təşkili.۲

.Məcazi sərgilərin istehsalı.۳

.Kompüter oyunlarının istehsalı.۴

Qaimiyyə internet saytının yaradılması:www.ghaemiyeh.com.۵

.Sərgi məhsullarının və moizələrin istehsalı.۶

.Şər'i,əxlaqi və etiqadi suallara cavab.۷

.Mühasibat,mətbuat yaratmaq və sms... sistemlərinin layihəsi.۸

.Təlim kurslarının həyata keçirilməsi.۹

Tərbiyəçi şəxslər hazırlamaq üçün təlim kurslarının təşkili.۱۰

Kompüterdə,tabletdə və telefonlarda icrası mümkün olan minlərlə proqramların.۱۱ dünyada məşhur olan səkkiz formada istehsalı

JAVA.۱

ANDROID.۲

EPUB.۳

CHM.۴

PDF.۵

HTML.۶

CHM.۷

GHB.۸

.v.Qaimiyyə kitab bazarı adına dörd market

ANDROID.۱

IOS.۲

WINDOWS PHONE.۳

WINDOWS.۴

deyilənlər müəssisənin veb saytında Fars,Ərəb,İngilis və Azərbaycan dillərində pulsuz

.istifadəyə verilmişdir

:Sonunda

Mərcəi təqlid müctəhidlərin dəftərxanalarından (ofis),müəssisələrdən,nəşriyyatçılardan,müəlliflərdən və əməyi olan bütün şəxsiyyətlərdən bizlərə hədəfə çatmaqdan ötrü yardım etdikləri üçün səmimi qəlbdən .təşəkkür edirik


:Mərkəzin ünvanı

İsfahan-Əbdurrəzzaq küçəsi-Hacı Muhəmməd Cəfər adına bazar-Şəhid Muhəmməd Həsən Təvəkküli küçəsi-blok۱۲۹/۳۴-birinci mərtəbə

veb sayt:www.ghbook.ir

mail:Info@ghbook.ir

mərkəzin ofis telefonu: ۰۰۹۸۳۱۳۴۴۹۰۱۲۵

Tehran ofisi: ۰۰۹۸۲۱۸۸۳۱۸۷۲۲

Biznes və alqı satqı: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

Mərkəzdə çalışan insanlarla əlaqə yaratmaq üçün nəzərdə tutulan nömrə: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

